Azərbaycan Milli Elmlər Akademiyası
Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutu

**HACI HƏSƏN HÜSEYNİ**

# ŞAH İSMAİL XƏTAİ – 535

*Bu kitab möminlər ağası*
*Həzrəti-Əliyə (ə) ithaf olunur.*

**BAKI – 2022**

***AMEA M.Füzuli adına Əlyazmalar İnstitutunun Elmi Şurasının 12 fevral 2022-ci il (2 saylı) iclasının qərarına əsasən çap olunur.***

Nəşrə hazırlayan
və ön söz müəllifi: **Sona Xəyal**

Redaktorlar: **Mirzə Vərağa Almasov**
*Filologiya üzrə fəlsəfə doktoru*

**Araz Yaquboğlu**
*Tədqiqatçı-jurnalist*

Rəyçilər: **Tahirə Həsənzadə**
*tarix elmləri doktoru*

**Zəkiyyə Əbilova**
*fəlsəfə elmləri doktoru*

**Ağa Həbib Ağazadə**
*İlahiyyatçı*

**Axund Hacı Soltan Əlizadə**
*Din xadimi, tədqiqatçı*

**Hacı Abbas Bağırov**
*Tibb üzrə fəlsəfə doktoru*

**Hacı Həsən Hüseyni. “Şah İsmail Xətai – 535”.**
**Bakı, “İmza” nəşrlər evi, 2022. 535 səh.**

Kitabda görkəmli Azərbaycan şairi, dövlət xadimi Şah İsmail Xətainin soy-kökü, həyatı, ictimai-siyasi və ədəbi mühiti, ədəbi irsi və yaradıcılığında Əhli-beytə (ə.m) münasibəti işıqlandırılmışdır.

**ISBN 978-9952-373-5**

## XƏTAİNİN DİNİ GÖRÜŞLƏRİ

*(Ön söz)*

Allah-təala hər bir insanı dünyaya göndərəndə onun taleyini də müəyyənləşdirir. Faili-muxtar yaradılmış insana öz ağlı ilə seçim haqqı versə də, bəzən insanı bilmədiyi, hətta gözləmədiyi bir məqama çatdırır. Bəzən biz bir qeyri-düzgün yol seçirik, amma Allah bizi bu yoldan döndərir və daha düzgün, bizim üçün daha xeyirli olan bir yola istiqamətləndirir və özümüz də bilmədən heç vaxt düşünmədiyimiz bir yola keçirik.

Birinci Qarabağ müharibəsi əlili, Bakı İslam Universitetinin məzunu, ilahiyyatçı, tədqiqatçı, publisist, bir sıra dəyərli kitabların müəllifi Hacı Həsən Hüseyni də vaxtilə kimya-biologiya təmayüllü orta məktəbdə təhsil alanda, heç təsəvvür belə etməzdi ki, bir zaman Əhli-beyt (ə.m) aşiqi olacaq və əlinə qələm götürüb belə kitablar yazacaqdır.

Mənfur düşmən torpağımıza göz dikəndə, evlərimiz raket atəşinə tutulanda, el-obalar doğma yurdlarından didərgin düşəndə, çoxları kimi Həsən Hüseyni də doğma Zəngilanının müdafiəsinə qalxdı. Döyüşdü, vuruşdu və düşmən gülləsinə tuş gəlib, yaralı halda uzun müddət yataqda qaldı, olduqca böyük sınaqdan keçdi. Hər şeydən əli üzülən bir zamanda Allah-təala ona nicat verdi. Həsən öz gələcək həyat yolunu bəlkə də elə yataqda yaralı yatarkən tapdı. Bəlkə də hansı bir müəddəs varlıq bu yolu ona göstərdi. Bir gün yeni ümidlərlə ayağa qalxıb, yeni arzularla gələcəyə boylandı. Bu ümidlər, arzular onu Bakı İslam Universitetinə aparıb çıxardı. Universiteti bitirənədək bir çox mövzularda qələmini sınadı. Peyğəmbərimizin (s) əziz qızı, iki dünya xanımlarının xanımı Fatimeyi-Zəhranın (s.ə) həyatı ilə bağlı yazdığı diplom işini müvəffəqiyyətlə müdafiə etdi.

Sonra möminlərin əmiri, imamların atası, Fatimənin (s.ə) layiqli ömür yoldaşı Həzrəti-Əli (ə) haqqında ilk kitabını yazdı. “Parlaq ulduz” adlanan və Allah kəlamlarını, müəllifin Əhli-beyt (ə.m) sevgisini, Əhli-beytin (ə.m) həyat yolunu, yaşam tərzini,

Həzrəti-Əlinin (ə) nəhəngliyini, dahiliyini, məsumluğunu əks etdirən bu kitab axarıncı oldu.

Daha sonra Hacı Həsənin İmam Hüseynin (ə) mövludundan şəhadətinə qədər baş verən hadisələri əks etdirən, Kərbəla faciəsinin səbəblərini və mahiyyətini açıqlayan "Xuda Hüseynin Aşiqi" adlı kitabı işıq üzü gördü və bu da ilk kitab kimi oxucu rəğbəti qazandı.

Hacı Həsənin nəşrə hazırladığı, müxtəlif klassik şairlərin və Qurbani Məclisinin bəzi üzvlərinin Aşıq Qurbaninin "Əli" və "Ya Mürtəza Əli" rədifli şeirlərinə yazdıqları nəzirələrin toplandığı "Ya Əli", Nizami Gəncəvidən tutmuş müasir şairlərimizə qədər bir çox görkəmli söz ustalarının Mühəmməd peyğəmbərə (s) həsr etdikləri çox dəyərli şeirlərin toplandığı "Gizli qalmış xəzinə" adlı kitablar da oxucuların marağına səbəb oldu.

İlahiyyatçının Həzrəti-Əlinin (ə) həyatını, nübüvvət və imamətin mahiyyətini, İmam Əlinin (ə) Quranda tərifini əks etdirən, bir sıra şairlərin Əliyə (ə) həsr olunmuş şeir və poemalarının daxil edildiyi "Həzrəti-Əli (ə) müxtəlif baxışlarda", "Bismilləh" ayəsindəki "bə" hərfinin altında olan nöqtənin sirrini Həzrəti-Əliyə (ə) olan böyük məhəbbətlə açıqlayan "Bismillah" ayəsinin incə görüntüləri və "bə" hərfinin altında olan nöqtənin sirri" adlı kitablar da Əlisevərlərə gözəl hədiyyə oldu.

Tədqiqatçının Quran ayələrinin şərhini, şəriət məsələlərini, 14 məsumun (ə.m) və övliyanın həyatını əks etdirən dəyərli məqalələrin toplandığı 2 cildlik "Sığın Haqq dərgahına, oxucunu düşündürən, irfanla, islam fəlsəfəsi ilə, sufiliklə bağlı elmi məqalələrin toplandığı "Ariflərin Haqqa qovuşma məqamı (Şəriət, təriqət, mərifət, həqiqət)" adlı kitabları da böyük sevgi və maraqla qarşılandı.

Hacı Həsənin İmam Hüseynin (ə) Şamda faciəli şəkildə şəhid olan qızı haqqında yazılmış "Həzrəti-Rüqəyyə (s.ə)" adlı kitab da bu mövzuda yazılmış ilk kitab kimi daha çox diqqəti çəkdi.

Nəhayət, Hacı Həsən universitetdə Peyğəmbərimizin (s) əziz

qızı Fatimeyi-Zəhra (s.ə) haqqında yazdığı diplom işini genişləndirib təkmilləşdirir və oxucularına “Ya Zəhra (s.ə) nəzərin ayırma bizdən” adlı olduqca sanballı bir kitab təqdim edir.

Daha sonra ilahiyyatçının “imamət səmasının 8-ci parlaq ulduzu”nun həyat və fəaliyətindən bəhs edən “İmam Rza müxtəlif baxışlarda” adlı dəyərli kitabı işıq üzü görür.

Tədqiqatçının uzun axtarışlarının nəticəsi olan “Müqəddəs Zilhiccə bayramları” adlı çox maraqlı kitabı çap olunmuşdur ki, burada müəllif bir müqəddəs ayda qeyd olunan beş böyük bayram haqqında əhatəli məlumat vermişdir.

Eləcə də müəllifin bu il işıq üzü görən “Novruz bayramı” adlı kitabı da bu zamana kimi yazılmış kitablardan fərqlənir. Belə ki, kitabda Novruz bayramı həm folklori, həm də dini cəhətdən səciyyələndirilmişdir.

Bu il Hacı Həsən üçün çox məhsuldar olmuşdur. Belə ki, bu yaxınlarda onun Aşıq Ələsgərin dini görüşlərinə həsr olunmuş “Əhli-beyt (ə) aşiqi Dədə Ələsgər” adlı kitabı işıq üzü görmüşdür ki, burada da oxucular yeni məlumatlar ala bilərlər.

Göründüyü kimi, Hacı Həsən Hüseyni həmişə yeniliyə can atmış, kitablarında oxuculara nəsə yeni bir məlumat verməyə, onları yeni bilgilərlə savadlandırmağa çalışmışdır.

Budur, növbəti kitab nəşrə hazırdır. “Şah İsmail Xətai – 535” adlanan bu kitabda görkəmli dövlət xadimi, Azərbaycan dövlətçiliyi tarixində özünəməxsus işıqlı yer tutan, gözəl ürfani şeirləri ilə həm də Azərbaycan ədəbiyyatı tarixində görkəmli simalardan sayılan Şah İsmail Xətainin həyatı, soy-kökü, ictimai-siyasi mühiti və şahlığı, ədəbi mühiti və yaradıcılığı yeni çalarda işıqlandırılmışdır.

Şah İsmail Xətainin yaradıcılığı ilə bağlı bu vaxta kimi yazılmış kitabları, məqalələri diqqətlə oxuyub, bəhrələnən müəllif həm də Xətai yaradıcılığında Əhli-beyt (ə.m) sevgisini əhatəli şəkildə qələmə almışdır ki, bu da ilk tədqiqatdır. Hacı Həsən Hüseyniyə qədər Xətai yaradıcılığı yalnız dünyəvi mövzular ba-

xımından tədqiq olunmuş, şairin dini görüşləri diqqətdən kənarda qalmışdı. Bu kitabda isə Xətai yaradıcılığında Peyğəmbərimiz (s) və onun Əhli-beyti (ə.m) ilə bağlı əsərlər araşdırılmış və xətaisevərlərə dəyərli, sanballı bir əsər təqdim edilmişdir.

Kitabın əvvəlində "Müəllifdən" adlı yazıda kitabın yazılma məramı açılqlanmışdır. Müəllif bunun ilk olduğunu və gələcəkdə Xətai ilə bağlı bu istiqamətdə tədqiqatların davam etdiriləcəyini də xüsusi vurğulamışdır.

Kitabın "Şah İsmail Xətai" adlı I fəslində Şah İsmailin soykökündən söz açılmış və tədqiqatçı Şeyx Səfiəddin Ərdəbilidən Şah İsmailə qədər olan bütün səfəvi şeyxlərinin həyatından bəhs etmişdir. Sonra Şah İsmailin həyatı, şahlığı və ictimai-siyasi mühiti işıqlandırılmış və burada qeyri-adi bir insan həyatı oxucuların gözü önündə canlandırılmış, həqiqi dindar hökmdar portreti yaradılmışdır. Öz vətənini sevən, Azərbaycanın bütövləşdirilməsi uğrunda yorulmadan, əzmkarlıqla, Allahın, İslamın istədiyi tərzdə mübarizə aparan Şah İsmailin bütün döyüşləri haqqında məlumat verməyə çalışan müəllif, həm də böyük hökmdarın Azərbaycan mədəniyyətinə verdiyi misilsiz töhfələri diqqətə çatdırmışdır. Azərbaycan dilinin dövlət dili elan edilməsinə, Azərbaycan mədəniyyətinin canlandırılmasına, hər sahədə yüksək inkişafa nail olan Şah İsmailin uğurlarını böyük sevinclə qeyd edən tədqiqatçı müxtəlif tarixi mənbələrə müraciət edərək, bir sıra alimlərin fikirlərinə istinad etmiş və öz fikirlərini daha da təkmilləşdirmişdir.

Kitabın II fəsli "Şair Xətai" adlanır və adından göründüyü kimi, burada müəllif öz sarayında şairlər məclisi təşkil edən, istedadlı, dindar, arif və alim şairləri bir araya gətirən Xətainin ədəbi mühitindən söz açmış, ilkin olaraq səfəvi şairlərinin həyat və yaradıcılığından qısa arayışlar vermiş, hətta ondan bəhrələnən sələfləri də unutmamışdır. Bu fəsildə Şah İsmail Xətainin təxəllüsündən bəhs edən tədqiqatçı bir çox rəvayətləri diqqətə çatdırmış və sonda həqiqi olanı seçərək, tədqiqatını bu istiqamətdə

aparmış və “Xətai” təxəllüsünün əbcəd hesabı ilə Allahın 1001 adına işarə olduğunu vurğulamışdır.

Şah İsmail Xətainin ədəbi irsindən geniş bəhs açan müəllif yenə də şairin yaradıcılığı ilə bağlı bir sıra kitablardan və məqalələrdən bəhrələnmiş, hətta alimlərin əsərlərindən sitatlar verərək, fikirlərini möhkəımləndirmişdir.

Kitabın “Əfli-beyt (ə.m) aşiqi Xətai” adlı III fəsli demək olar ki, əsas qayəni, əsas məramı təşkil edir. Hiss olunur ki, müəllifin əsas məqsədi Xətai yaradıcılığında məhz bu mövzunu işləmək olmuşdur. Bu fəsildə tədqiqatçı çox haqlı olaraq, ilkin Xətaiyə - qədərki Şərq ədəbiyyatında Əhli-beytin (ə.m) tərənnümündən söz açmış, “Kitabi-Dədə Qorqud”dan tutmuş, yazılı ədəbiyyatın dəyərli nümayəndələrinin əsərlərinə qədər əksər mənbələri araşdırmış, Qurani-Kərimin surə və ayələrini sitat verərək, əhatəli açılımlarla oxucuların marağına səbəb olacaq yeni fikirlər söyləmişdir.

Xətainin Əhli-beyt (ə.m) sevgisini ön plana çəkib, onun şəxsiyyətini, səciyyəvi cəhətlərini işıqlandıran müəllif şairin yaradıcılığında Əhli-beytə (ə.m) məhəbbət amilini qabarıq şəkildə diqqətə çatdırmışdır. Hacı Həsən Hüseyni əvvəlcə Xətai qəzəllərində Əhli-beyt (ə.m) sevgisini tədqiq etmiş, şairin dəyərli şah beytlərinin şərhini vermiş və hər dəfə fikirlərini Quran ayələri və hədislərlə zənginləşdirmişdir.

Xətainin heca vəznində yazdığı şeirlərini ayrıca tədqiqata cəlb edən müəllif burada da eyni yolla getmiş, yenə də Quran ayələrinə, hədislərə və klassik şairlərin əsərlərinə müraciət etmişdir.

Şah İsmayı Xətainin poemalarında Əhli-beyt (ə.m) anlayışından bəhs açan tədqiqatçı burada da bir sıra dəyərli mətləbləri açıqlamış və oxuculara yeni məlumatlar verməyə çalışmışdır.

Kitaba daxil edilmiş “Arif Xətai aşıqların mürşidi kimi” başlıqlı yazıda isə Xətai yaradıcılığında Əhli-beyt (ə.m) sevgisindən danışan müəllif Aşıq Qurbaninin, Miskin Abdalın, Abbas Tufar-

qanlının, Xəstə Qasımın şeirləri ilə paralellər aparmış və Azərbaycan aşıq şeirində Əhli-beyt (ə.m) sevgisini əhatəli şəkildə tədqiq etmişdir.

Kitabın sonunda "Nəticə", "Şah İsmail Xətainin ömür yolu xronologiyada", Ərdəbil şeyxlərinin Ağqoyunlularla və Bizans Komnen sülaləsi ilə qohumluq əlaqələrini əks etdirən cədvəl və zəngin ədəbiyyat siyahısı verilmişdir.

Kitab öz sanbalı, mövzu cəhətdən yeniliyi və elmi dəyəri ilə diqqəti çəkir. Ümid edirik ki, ilahiyyatçı Hacı Həsən Hüseyninin "Xətai-535" kitabı xətaisevərlərə misilsiz hədiyyə olacaqdır. Tədqiqatçı qardaşımızı yeni uğuru münasibətilə səmimi qəlbdən təbrik edir, ona müvəffəqiyyətlər arzulayırıq.

**Sona Xəyal**
*AMEA-nın Məhəmməd Füzuli adına*
*Əlyazmalar İnstitutunun böyük elmi işçisi,*
*Azərbaycan Yazıçılar Birliyinin İrs komissiyasının sədri*

# REDAKTORDAN

İlahiyyatçı-tədqiqatçı Hacı Həsən Hüseyninin "Şah İsmail Xətai – 535" adlı böyük həcmli bu əsəri onun sayca 18-ci kitabıdır. Müəllifin bu kitabı digər kitablarından həm həcminə, həm tədqiq müddətinə, həm də yazılma səbəbinə görə fərqlənir. Hacı Həsən Şah İsmail Xətainin vurğunudur, özü də sözün əsl mənasında, çünki Xətai Əhli-beyt (ə) aşiqi olub. Axund Hacı Soltan Hüseynqulu oğlu Əlizadə "Hidayət yolu" kitabında (Bakı, "Ozan", 2000. səh. 225) Hacı Həsənin Xətaiyə olan eşqini belə vəsf etmişdir:

*Bülbülün nəğməsi çəməndən gəlir,*
*Ürəfa nəfəsi Vətəndən gəlir.*
*Xətai eşqinə bağlanan nə çox,*
*Bu eşqin ülfəti Həsəndən gəlir.*

Seyyid övladı olan Hacı Həsən Hüseyniyə 21 oktyabr 2011-ci ildə yuxuda Həzrəti-Əli (ə) belə bir tapşırıq verir: "Xətaidən yaz, özü də əhatəli yaz". Elə o gündən də başlayaraq Hacı Həsən Şah İsmail Xətaini tədqiq etmiş və 11 ilə sevə-sevə oxuyacağımız bu fundamental kitabı ərsəyə gətirmişdir. Müəllif bu kitabı həm də nəzir olaraq, elə İmam Əliyə (ə) xatir çap etdirir.

Şah İsmail Xətai, eləcə də Səfəvilər dövləti Azərbaycan tarixinin onurğa sütunudur – desək yanılmarıq. Bu baxımdan belə bir mövzunu işləmək həm çətindir, həm də ciddi məsuliyyətdir. Mən deyərdim ki, müəllif buna nail ola bilmişdir.

Kitab ümumilikdə girişdən, 5 fəsildən və nəticədən ibarətdir. Müəllif birinci fəsildə Şah İsmail Xətainin soy-kökündən, həyatından, şahlığından geniş söhbət açır. Etibarlı mənbələrə istinad edərək Xətainin necə bir şah olduğundan, onun döyüş yolundan, hətta döyüşlərdə istifadə etdiyi hərbi üsullardan belə yazmağı unutmamışdır.

Hacı Həsən ikinci fəsili "Şair Xətai" adlandırıb. O, bu bölmə-

də Xətainin ədəbi mühitini araşdırmış, təxəllüsü haqqında, onun anlamı barədə açıqlamalar vermiş, özündən əvvəl bu mövzuda yazan digər müəlliflərin fikirlərindən də iqtibaslar gətirərək güman yeri qoymamışdır.

Üçüncü fəsildə Xətainin dini şeirləri təhlil edilmiş, böyük mütəfəkkirin Əhli-beyt (ə) aşiqi olduğu yaradıcılığı əsasında nəzərə çatdırılmışdır. Təhlillər zamanı müəllif Xətaiyə qədərki Şərq ədəbiyyatını da unutmamış, mövzu ilə bağlı müxtəlif şeirlərdən nümunələr vermişdir.

Dördüncü fəsli aşıq ədəbiyyatı ilə bağlayan Hacı Həsən Hüseyni Şah Xətaini aşıqların mürşidi olaraq görür. Əvvəlki fəsildə olduğu kimi bu fəsildə də müəllif müxtəlif aşıq və şairlərin şeirlərini Xətainin şeirləri ilə qarşılıqlı şəkildə təhlilə cəlb etmişdir.

Kitabın sonuncu – beşinci fəsli "Əlavələr"dir. Burada müəllif Şah İsmailin zamanında olan Qızılbaş əmirlərinin siyahısını, Xətai sülaləsinin on dörd məsumə (ə.m) olan sonsuz sevgisinə rəğmən on dörd məsumun ömür yolu xronologiyasını, Səfəvilərin nəsil şəcərəsini və başqa məlumatları nəzərə çatdırmışdır.

150-yə qədər ədəbiyyatdan istifadə edən müəllif Hacı Həsən Hüseyni "Şah İsmail Xətai – 535" adlı əsərinə yazdığı "Nəticə"də də kitab haqqında hansı mətləblərdən söz açdığını vurğulamışdır. Eyni zamanda kitaba ön söz yazan, AMEA-nın Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunun böyük elmi işçisi Sona Xəyalın da kitab haqqında fikirləri əhatəlidir.

İnanıram ki, kitab geniş oxucu kütləsinin ürəyincə olacaq, onu sevə-sevə oxuyacaqlar.

**Araz Yaquboğlu**
*Tədqiqatçı-jurnalist*

## MÜƏLLİFDƏN

***Bismillahir-Rəhmanir-Rəhim***
***Ya Allah, ya Mühəmməd, ya Əli, səndən mədəd!***

*Biz tacir deyilik, alıb-satmarıq,*
*Ərkan gözətərik yoldan sapmarıq.*
*Könlümüz ğənidir kibr tutmarıq,*
*Biz Mühəmməd-Əli deyənlərdənik.*
***Ş.İ.Xətai***

Kitabı yazmaqda məqsədimiz Şah İsmail Xətai yaradıcılığında Qurani-Kərim və 14 məsum sevgisini oxuculara çatdırmaqdır. Materiallarla tanış olduqca məlum olur ki, Ş.İ.Xətainin ədəbi irsi XVI əsrdə İslam dininin, müsəlman mədəniyyətinin, eləcə də qədim və zəngin Azərbaycan ədəbiyyatının ictimai-mədəni təzahürü olaraq meydana gəlmişdir. O, sələfləri və xələfləri içərisində yüksək erudisiyası ilə seçilən dahi şəxsiyyətdir.

Şah İsmail Xətai ilə bağlı tədqiqat işlərinə nəzər saldıqda, şairin yaradıcılığında dünyəvi sevgi, təbiət təsvirləri, ictimaiyyətlə və folklorla bağlı məsələlərin tədqiqini görürük. Amma Ş.İ.Xətainin ədəbi irsinin böyük bir bölümünün sırf dini mövzuda olan əsərlərdən ibarət olması tamamilə qaçılmaz olub, bütün ictimai-mədəni qanunauyğunluqlara cavab verir. Axı, Əhli-beyt (ə.m) məfhumu İslam dininin başlıca aparıcı göstəricilərindən biri kimi məzhəb və təriqət qoymadan bütövlükdə müsəlman mədəniyyətini şərtləndirən başlıca faktor və stimullar sırasında yer alır. Elə buna görədir ki, kitabda Əhli-beyt (ə.m) məfhumunun lüğəvi və istilahi mənaları başlıca dini qaynaqlar üzrə ayrıca araşdırılmışdır. (Odur ki, ədəbi-ictimaiyyətdən bunu qətiyyən qeyri-peşəkarlıq kimi qarşılamamalarını təvəqqe edirik). Digər tərəfdən unutmaq olmaz ki, şairin dünyəvi mövzulu əsərlərində də dini mündəricə geniş yer tutur. Bu isə hər baxımdan təbiidir. Ona görə ki, birincisi dini anlayışlar sırf etiqad, ibadət və əxlaqla məh-

dudlaşmayıb, yəni namaz qılmaq, oruc tutmaq, zəkat və xüms vermək, həccə getmək və nəzir demək və s.-dən ibarət olmayıb həyatın bütün sahələrini əhatə edir. İkincisi, bu, yaxud başqa məsələlər milli filologiyada elmi-nəzəri təsdiqini tapmışdır. Örnək olaraq göstərə bilərik ki, filologiya üzrə fəlsəfə doktoru Vərağa Almaslı hələ 1994-cü ildə mərhum professor Qafar Kəndlinin elmi rəhbərliyi ilə AMEA-nın Nizami adına Ədəbiyyat İnstitutunun Elmi Şurasında "Füzuli yaradıcılığında dini-mənqəbəvi anlayışların yeri və bədii yolları" (Füzuli divanı və "Leyli Məcnun" məsnəvisi üzrə) mövzusunda dissertasya müdafiə etmişdir. Onun ardınca çoxsaylı filologiya kontingenti, Mahirə Quliyeva, Aidə Qasımova, Xanəli Babayev, Ramiz Faseh, Hatəmi Mirzəyev və s. bu problemi həll etməyə girişmişlər.

Ş.İ.Xətai irsi bir çox məqamlarda yaşı əsrlərlə ölçülən Səfəvi ədəbiyyatının ayrılmaz, qopmaz bir parçası olaraq meydana çıxmışdır. Kitabda Xətaiyə qədərki Səfəvi ədəbiyyatına nəzər salmaq da məhz bu zəruri ehtiyacdan irəli gəlmişdir.

Ş.İ.Xətainin şəxsiyyəti və ədəbi yaradıcılığı ilə bağlı həmişə mübahisə doğuran məsələlərdən biri də onun təxəllüsü ilə bağlıdır. Prof.Məhərrəm Qasımlı fundamental və monumental bir əsər olan "Şah İsmayıl poeziyası" monoqrafiyasında "Xətai" təxəllüsünün götürülməsinə yol aça biləcək demək olar ki, bütün məqamları sadalamış və birər-birər araşdırmışdır.

Lakin o da bu versiyaların yekununda qəti bir qərar qəbul etmir, bunların elmin son sözü olması iddiasından uzaqdır. Odur ki, biz kitabın müvafiq hissəsindən prof. Əli Məhəmməd Nəbibəylinin mülahizələrinə söykənərək öz ehtimal və fərziyyələrimizi irəli sürmüşük. Ş.İ.Xətainin Əhli-beyt (ə.m) yönümlü əsərləri qədim və zəngin müsəlman mədəniyyətinin və Şərq ədəbiyyatının XVI yüzilliyə qədərki dolğun və tutumlu analoji nümunələrinə söykəndiyindən kitabda Ş.İ.Xətaiyə qədərki Əhli-beyt (ə.m) məsələsinin bədii əksini işıqlandırmağı da məqsədəuyğun hesab etdik. Zənnimizcə, bu şairin sələfləri ilə əqidə yaxınlığını üzə çıxarmaq üçün də önəmlidir.

Din böyüklərimizin, o cümlədən Həzrəti-Mühəmmədin (s), Həzrəti-Əlinin (ə), Həzrəti-Fatimənin (s.ə) və onların övladlarının parlaq şəxsiyyətlərinin, həyat və fəaliyyətlərinin başlıca məqamlarının tərənnümü şairin əsərlərində aparıcı yer tutduğundan, kitabın əsas hissəsində məhz bu məsələ hərtərəfli surətdə araşdırılmışdır. Bu araşdırma şairin Əhli-beytə (ə.m) Qurani-Kərimin başlıca prinsiplərinin ən qızğın carçısı və ən fədakar icraçısı kimi yanaşdığını sübuta yetirir. Unutmaq olmaz ki, Ş.İ.Xətai özü də var gücü ilə Əhli-beytin (ə.m) yolu ilə getmiş, bu, onun ən böyük amalı olmuşdur. Təəssüflər olsun ki, hal-hazırda da bəzi tanınmış müəlliflər bu qabarıq cəhəti görmək istəmir və Əhli-beyt (ə.m) məsələsinin Ş.İ.Xətai üçün məqsəd yox, vasitə olduğunu iddia edirlər. Məsələn:

*Xətaiyəm, al-atlıyam,*
*Sözü şəkərdən tatlıyam,*
*Mürtəza Əli zatlıyam,*
*Qazilər deyin Şah mənəm!*

dedikdə, "Mürtəza Əli zatlıyam" fikri onun hakimiyyətinin ideologiyasını bildirir. Amma Xətai tədqiqatçıları bunu, ən yaxşı halda, türk dünyasında formalaşan Əli kultu ilə əlaqələndirirlər. Biz bütün bunları obyektiv sürətdə qiymətləndirməyə çalışmışıq.

Səfəvi dövlətini saxtalaşdırmağı sanki öz qarşısına məqsəd qoyanlar onu fars, kürd, ərəb dövləti adlandıraraq Azərbaycanın dövlətçilik ənənəsinə malik olmadığını sübut etməyə çalışırlar. Son dövrlər bu cəhdlər nədənsə bir qədər də artıb. Amma, qəribədir ki, onlar qətiyyən düşünmürlər ki, nə farslar, nə kürdlər, nə ərəblər Səfəvi dövlətinin onlara məxsus olması barədə heç bir şey deməyib. Əslində sahib çıxmalı olduğu dəyəri başqalarının adına çıxarmaqla, görəsən nə məqsəd güdürlər? Halbuki, o dövlətlərin hər biri məmnuniyyətlə Şah İsmail kimi bir hakimin, Səfəvilər kimi bir tarixin onlara məxsus olmasını sevə-sevə istə-

yərdilər. Lakin faktları dəyişməyə çalışmağın mənası yoxdur. Tərəddüd edənlər üçün 10 fakt təqdim etmək istərdik:

1. İmperiya banisi Şah İsmail Səfəvinin 1487-ci il 17 iyul tarixində Azərbaycanın Ərdəbil vilayətində dünyaya gəlməsi;

2. Şah İsmailin özünü Bayandurlu türkmən tayfasından, Ağqoyunlu dövlətinin varisi elan etməsi;

3. Təbrizi dövlətin paytaxtı elan etməsi;

4. Şamaxı yaxınlığında Gülüstan qalasının mühasirəsi zamanı sərkərdələrinə "Sizə Gülüstan qalası lazımdır, yoxsa Azərbaycan taxt-tacı?" sualı ilə müraciət etməsi və onlardan – "Azərbaycan taxt-tacını istəyirik" cavabını alması;

5. Dövlət atributu olan Şah İsmailin adına zərb edilən pulun Təbrizdə zərb etdirilməsi. Culus pulları Şah İsmail taxta çıxandan zərb edilən ilk pullardır;

6.Orduda, sarayda və qismən diplomatik yazışmalarda Azərbaycan türkcəsindən istifadə edilməsi;

7. Ordu rəhbərlərinin və əyanların çoxunun əsasən qızılbaş türkmən boylarından ibarət olunması;

8. Şah İsmailin türkmən tayfalarından olan "Tozqoparan" ləqəbli Piri bəy Qacarı, Məhəmməd bəy Ustaclını və Lələ bəy Hüseyni dövlətin sütunları, yəni ərkani dövləti qahirə adlandırması;

9. Səfəvi dövlətinin yaranmasında iştirak edən qızılbaş tayfalarının şamlı, rumlu, təkəli, bayat, qacar, əfşar, zülqədər, pörnək, baharlı, varsaq, çəkni, xınıslı, qaramanlı, mosullu, bayburt, sədli, evoğlu türkmən boylarından olması;

10. Şah İsmailin öz şeirlərini doğma dilində – Azərbaycan türkcəsində yazması.

Beləliklə, əminliklə demək olar ki, Səfəvi dönəmi nəinki, Azərbaycan dövlətçilik tarixindən kənarda deyil, hətta, onu dövlətçilik tariximizin qızıl erası adlandırmaq olar. Bu şanlı tarix təkcə Azərbaycan xalqının deyil, həmçinin bütün türk dünyasının qürur yeridir.

Tarixçi Dilbər Ağayeva yazır: "Şah İsmailin Sultan Səlimdən və ümumiyyətlə digər hakimlərdən fərqi budur ki, İsmail banidir: Bir-birinə qarşı mübarizə aparan feodal qurumları və tayfaları birləşdirib dövlət yaratmış və onun hakimi olmuşdur. Dövləti miras olaraq qəbul etməmişdir. Feodal dağınıqlığına son qoymuş, mərkəzləşdirilmiş dövlət yaratmışdır. Bu dövlətin yaranması Ön Asiyada vahid dövlət və rəhbərlik missiyasını həyata keçirmiş, feodal müharibələrinin qarşısını almışdır. Onun Allahdan missiyası dövlət qurub bir-birinə zülm edən bəylərin hakimiyyətinə son qoymaq, tapdaq altına gedən məzlum insanların əzilməsini aradan qaldırmaq idi. Şah İmailin digər dövlətlərlə müharibələr aparmaq və işğalçılıq məqsədləri olmamışdır. Bu səbəbdən də ədalətsiz Çaldıran döyüşündən yayınırdı. O, seçilmişlərdən idi və dünyəvi hakim deyildi. Buna görə dövlət idarəçiliyində Allahın qoyduğu qaydaları – Şəriət hökmlərini tətbiq etməklə Peyğəmbərimizin (s) "Vida" həccində buyurduğu "Hədisi-Səqəleyni" (yəni Quran və Əhli-beyt (ə.m)) diriltmək idi. Sultan Səlim və bir çox hakimlər isə hakimiyyəti ata-babalarından miras olaraq qəbul etmişlər".

Əlbəttə, bütün istiqamətlərdə tədqiqat işi davam edir. Xətai irsi son dərəcə çoxqatlı və çoxşaxəli olduğundan bir kitabda onun bütün incəliklərini üzə çıxarmaq qeyri-mümkündür. Şairin ədəbi irsinin indiyədək Əhli-beyt (ə.m) yönündə köklü biçimdə araşdırılmaması bizi dərindən narahat etdiyinə görə, biz bu kitabı bu yolda ilk addım olaraq araya-ərsəyə gətirməyə çalışdıq və onun nöqsansız-qüsursuz olduğunu da düşünmürük.

Biz nəzərimizə çatdırılacaq tənqidi qeydləri məmnuniyyətlə qəbul etməyə hazırıq. Sonda belə iri araşdırmanın meydana gəlməsində zəhməti, əməyi olan hər kəsə təşəkkür edirik.

# GİRİŞ

***Bismillahir–Rəhmanir–Rəhim!***

***Ya Allah (c.c) ya Məhəmməd (s) ya Əli (ə) səndən mədəd!***

İctimai-siyasi xadim, Azərbaycan dilində yazılı ədəbiyyatın inkişafında müstəsna xidmətləri olan və saray ədəbiyyatında, həmçinin bu dilin dövlət dili səviyyəsinə qalxmasına şərait yaradan Şah İsmail Xətai Azərbaycan xalqının ictimai-siyasi və mədəni cəhətdən formalaşmasında əsaslı xidmətləri olan nadir şəxsiyyətlərdəndir. Azərbaycan xalqının orta əsrlər dövrünün ən böyük səhifəsi Ş.İ.Xətainin adı ilə bağlıdır. Həm dövlət başçısı, həm yaradıcı bir şəxs kimi fəaliyyətini əsasən doğma zəmin üzərində quran Şah İsmail – şifahi xalq ədəbiyyatına, aşıq sənətinə həssas yanaşmış, klassik şeir formaları ilə yanaşı xalq şeirinin müxtəlif şəkillərində dillər əzbəri ola biləcək əsərlər yaratmışdır. Ş.İ.Xətainin siyasi fəaliyyəti istər-istəməz həm bir təriqət başçısı, həm bir dövlət xadimi kimi ondan daha çox vaxt tələb etdiyindən ədəbi fəaliyyətini önləyə bilər. Buna baxmayaraq heç vaxt yaradıcılığı ikinci plana ata bilməmişdir. Hətta, "Çaldıran döyüşü" kimi son dərəcə dövlət əhəmiyyətli siyasi bir tədbirdən əvvəl məclis qurub "mən bu gecə şairəm" deməsi sübut edir ki, bu ehtiyac siyasi ayıqlığını bəzən arxa plana ata bilirmiş.

Lakin heç vaxt, döyüş meydanında və siyasi fəaliyyətində ayıqlığı və sərrastlığı itirməyən Şah İsmailin fəaliyyətini izləyəndə hiss edirsən ki, bu sahələr nəinki biri-digərini zəiflədə bilməmişdir, əksinə tamamlamışdır. Çünki, mövzu-məzmun vəhdəti uğur gətirir, bəzən hətta, ən çıxılmaz vəziyyətdə çıxış yolu tapmaq imkanı verir. Onun idarə etdiyi orta əsr Səfəvi dövləti quruluşca mütləqiyyət-Şah quruluşudur, siyasi rejim isə teokratiyadır. Yəni şah-üsuli idarəsində qurulan yuxarıdan idarə olunan dövlətin bütün yükü bir nəfərin – Şahın çiynindədir. Şərqdə bu tip orta əsr dövlətlərini şəriət qanunları idarə edir. Beləliklə,

Şah İsmail Xətainin fəaliyyətinə 535 illik məsafədən baxanda bəzi şeyləri daha aydın görmək olur.

Xətai 1487-ci il iyulun 17-də Ərdəbildə təriqət başçısının ailəsində dünyaya gəlib. Onun şah titulu almasında ən özül səbəblərdən biri budur. Valideynlərinin hər ikisinin əsilzadə olması onun şah titulu alması üçün vacibdir. Şah İsmailin iyirmi beşinci babası Əbülqasım Həmzənin, on beşinci babası Qızılbörk Firuzun qəbirləri Ərdəbil yaxınlığındakı Şeyx-Kəhrəlan kəndində indi də durur. Yerli əhali bu qəbirlərə bir ziyarətgah kimi baxır.

Qeyd edək ki, Darül-İrşad adi bir təriqət xanəgahı olmaqdan çox zamanın tələblərindən irəli gələn bir fikir və ideologiya ocağı idi. Bu ocağa inamla gələn fədakar sufilər, müridlər vaxtilə Şah İsmailin babası Sultan Cüneydə və atası Sultan Heydərə dayaq olmuş, onlara yeni bir dövlətin bünövrəsini qoymaqda yaxından kömək etmişdilər.

Şah İsmailin gənc yaşlarında hakimiyyət uğrunda döyüşlərə atılması, istədiyinə nail olub qüdrətli bir Azərbaycan-Səfəvi dövləti yaratması onun ulu babalarının çoxəsrlik mübarizə və ənənələri ilə bağlıdır. Onların uzun müddət davam edən ardıcıl mübarizələrinin uğurlu nəticəsi və yekunu idi. Ümumilikdə həmin dövr 250 ildən artıq davam etmişdir. Bu dövrdə Azərbaycan dövlətinin sərhədləri Qaraqoyunlular və Ağqoyunlular dövründəki sərhədləri aşıb, çoxmillətli bir dövlətə çevrilsə də, qaynaqlarda yazıldığı və araşdırmalarda etiraf olunduğu kimi, "Qızılbaş-Midiya dövləti" kimi tanınırdı. Bu qeyd və etiraflar Şah İsmaillə başlanan Səfəvilər dövlətinin Azərbaycan torpağında Midiyadan sonra yaranan ən güclü dövlət olduğunu bir daha təsdiq edir.

Bu dövlətin Səfəvilər adlanması isə Xətainin ulu babalarından olan və çox vaxt sadə şəkildə Şeyx Səfi adlandırılan Şeyx Səfiəddin Ərdəbilinin (1252–1335) adından götürülmüşdür. Hələ XIV əsrdə yaşayıb-yaratmış Azərbaycan şairi Arif Ərdəbili Şeyx Səfidən qürurla danışır, onu "din və millət hamisi" adlan-

dırır, onun qəbrinin Ərdəbil şəhərində olmasını bu şəhər üçün əlçatmaz bir məziyyət kimi qeyd edir.

Yuxarıda qeyd etdim ki, valideynləri – atası Şeyx Heydər və anası Aləmşah bəyim əsilzadə olmuşdur. Aləmşah bəyim (Marta) Ağqoyunlu dövlətinin şahzadəsi, Şeyx Heydər isə Səfəvi xanədanının vəliəhdi idi. Hər iki siyasi qurumu vahid dövlətdə birləşdirib onların əsrlərlə əldə etdiyi təcrübəni artırmaq, əhalisini idarə etmək məsuliyyəti artıq Şah İsmailin vəzifəsi idi.

Şah İsmail öz "Fəxriyyəsi"ndə şəcərəsini belə təqdim edir:

*Yəqin bil ki, Xudaidir Xətai,*
*Məhəmməd Mustafaidir Xətai.*

*Səfi nəsli Cüneydi – Heydər oğlu,*
*Əliyyəl – Mürtəzaidir Xətai.*

*Həsən eşqinə meydanə gəlibdir,*
*Hüseyni Kərbəlaidir Xətai.*

*Əli Zeynulibad, Baqiri, Cəfər,*
*Kazım, Musa Rizaidir Xətai.*

*Məhəmməd Təqidir, Əli Nəqi həm,*
*Həsən Əsgər liqayidir Xətai.*

*Məhəmməd Mehdiyi Sahib – Zamanın,*
*Eşiqində gədayidir Xətai.*

*Mənim adım vəli Şah İsmaildir,*
*Təxəllüsü Xətaidir, Xətai.*

Ş.İ.Xətai ana tərəfdən də dövrünün hakim və köklü bir ailəsinə mənsub idi. Onun anası Aləmşah bəyim Ağqoyunlu hökmdarı Uzun Həsənin qızı, Sultan Yəqubun bacısı idi. Ağqoyunlu-

ların Səfəvilərlə qohumluq əlaqələri yaratmaları bu sülalənin get-gedə artan nüfuzu ilə əlaqədardır. Bu qohumluq əlaqələri iki məqsədə xidmət edir:

1. Səfəviləri kəbin diplomatiyası ilə özlərinə qohum etmək. Daha doğrusu onları təhlükəsizləşdirmək.

2. Səfəvilərin xalq arasında artan nüfuzunu dövlətin xeyrinə yönəltmək.

Bu cəhətlər Şeyx Heydərin apardığı uğurlu döyüşlərlə bir daha təsdiq olunurdu. Lakin Ağqoyunluların Səfəvilərə münasibəti sabit qalmır. Səfəvilərin get-gedə artan güc və qüdrəti onları qorxuya salır. Şeyx Heydər xəyanətlə öldürülür, onun xanımı Aləmşah bəyim isə iki oğlu – İbrahim və İsmaillə birlikdə İstəxrdə həbsdə saxlanılır. Sultan Yəqubun ölümündən sonra hakimiyyət uğrunda gedən mübarizə daha da şiddətlənir. Hakim Rüstəm Mirzə Səfəvilərdən istifadə etmək məqsədilə Şeyx Heydərin övladlarını həbsdən azad edir. Ağqoyunlular səhv etdiklərini anladıqları vaxt artıq gec idi. Onlar Ibrahimi və İsmaili bir daha ələ keçirə bilmirlər. Şah İsmail Gilan hakimi Həsən xanın himayəsi altında Lələ bəy Hüseyn tərəfindən tərbiyə olunur, savadlı və əsil bir şahzadə (vəliəhd) kimi yetişdirilir.

1499-cu ildə İsmail ibn Heydər Səfəvi və onun tərəfdarları hakimiyyəti ələ almaq uğrunda qəti döyüşlərə başlayırlar. Bunun üçün yaranmış tarixi şəraiti düzgün qiymətləndirən gənc şahzadə və tərəfdarlar məqam gözləyirdilər. Bu zaman Ağqoyunlu şahzadələri arasında hakimiyyət uğrunda gedən didişmələr kəskinləşərək pik həddə çatir. Şah İsmail və onun tərəfdarları bu yaranmış əlverişli vəziyyəti nəzərə alaraq 70 nəfərdən ibarət bir dəstə ilə ləngimədən Ərdəbilə doğru hərəkət edirlər. Yolboyu onların ətrafına şiə təriqətinə mənsub olan 32 tayfadan – Bayat, Cüneydi, Şamlı, Ustaclı, Təkəli, Varsaq, Zülqədr, Qacar, Əfşar və s. tayfalarından çox sayda döyüşçülər toplaşırlar. Dəstə Ərdəbilə daxil olub Şeyx Səfi məqbərəsini ziyarət edir, burada gələcək döyüşlərin planını hazırlamaq üçün qurultay keçirilir. Blk növbədə Ərdəbil müstəqil bəylik elan edilir. Artıq Ağqoyunlu döv-

lətinə vergi ödəməyəcək və onun bir hissəsi olmayacaqdı. Bu dövlətin qurulmasında marağı olan bütün qüvvələr xəbəri eşidər-eşitməz sürətlə onlarla biləşmək üçün Şah İsmain yanına axışdı. Bir çox ölkə və şəhərlərə səpələnmiş Səfəviyyə təriqətinin ardıcıllarını baş verəcək hadisələrlə əlaqədar xəbərdar etmək üçün elçilər göndərilir. Əsas dəstə Gəncə, Qarabağ və Göycədəniz istiqamətində yola düşür, Çuxursəddən keçərək Sarıqaya yaylağına gəlib çıxırlar.

Silahlı Qızılbaş dəstələrinin Ərzincanda toplanması qərara alınmışdı. Səlahiyyətli şəxslər və onların dəstələri, həmçinin rəğbət bəsləyənlər Ərzincanda birləşmək barədə göstəriş alır. Şah İsmailin tərəfdarları hər yandan axışıb Ərzincana gəlirdilər.

Tarixi qaynaqlarda qızılbaş dəstələrinin Ərzincanda toplanması, Şah İsmailin tərəfdarlarının sayının sürətlə artıb birləşməsi təfərrüatlarla qeydə alınmışdır. Bu qeydlərdə göstərilir ki, Şah İsmailin tərəfdarlarının Ərzincanda toplanması işi bir ilə qədər çəkir. Öz qüvvələrini nəzərə alan Şah İsmail hesab edir ki, əvvəl Şirvanla hesablaşmaq lazımdır. Çünki, Şirvan sultan Yəqubun və onun varislərinin dövlət hüququnu tanıyır və onları qanuni varis hesab etdiyindən onlarla müttəfiqlik münasibətlərini saxlayırdılar. Şirvan o dövr üçün real güc hesab edildiyindən Səfəvilər və Şah İsmail hökmən bu maneəni aradan qaldırmalı idi. Ya sülh bağlanmalı, ya müharibə başlamalı. Birinci imkan mümkünsüz olduğundan – yəni Şirvan Ağqoyunlularla müttəfiq olduğundan ikinci vasitə qaçılmaz oldu. Ordu Kür-Araz qovşağının “Qoyunölümü” adlanan yerinə çatanda payiz daşqınının ordunun yolunu bağladığını görürlər. Bu vaxt suyu necə keçmək, nə etmək ətrafında mübahisələr xeyli uzanır. Vaxt itirməyin onun xeyrinə olmadığını anlayan Şah İsmail əlverişli bir yer seçib suyu keçməyə başlayır. Qızılbaş sərkərdələri və əsgərləri əvvəlcə bu işə heyrət edirlər, sonra onlar da atlarını suya salıb heç bir tələfat vermədən çayı keçirlər. Bu hərəkət gənc sərkərdə olan Şah İsmailin kəraməti kimi qarşılanır və orduda Şah İsmailin nüfuzunu daha da artırır. Əslində isə bir sərkərdədə

şəxsi keyfiyyətlər həmişə onun ordusunu gözlənilməz sürprizlərdən xilas edir və ona uğur qazandırır.

1500-cü ildə Şah İsmailin yeddi minlik ordusu ilə Şirvan şahı Fərrux Yasarın iyirmi min atlı və altı min piyada ordusu üz-üzə gəlir. Şamaxı yaxınlığında Cəbani adlanan yerdə baş verən bu döyüşdə Fərrux Yasar məğlub olur və Biğurd qalasına pənah aparmaq istəyir. O, yolda Lələ bəy Hüseynin cilovdarı Şahgəldi ağa tərəfindən təsadüfən tutulub öldürülür. Onun Fərrux Yasar olduğunu ancaq bir qədər sonra əsirlər söyləyirlər. Elə həmin ildə Bakı qalası alınır və Şirvanşahların xəzinəsi ələ keçirilir. Bakı qalasının alınmasında da Şah İsmail əsl sərkərdəlik və rəşadət nümayiş etdirir. Şah İsmail bundan sonra ordusu ilə birlikdə Şamaxıya qayıdır, Biğurd, Gülüstan və Sürxab qalalarını ələ keçirməyə hazırlaşır. Lakin bu vaxt Əlvənd Mirzənin Culfaya qoşun çıxartması onun planını dəyişdirir.

Şah İsmaillə Əlvənd Mirzə arasında əvvəlcə bəzi yazışmalar olur və bunlar müsbət nəticə vermir. Ağqoyunluların ayrı-ayrı istiqamətlərdə hərəkət edən dəstələri ilə vuruşmalarda qızılbaş dəstələri mühüm qələbələr qazanırlar. Əlvənd Mirzə ilə Şah İsmail arasındakı əsas toqquşma Naxçıvan yaxınlığındakı Şərur düzündə başlayır. Ağqoyunluların ordusunda top və tüfənglərin olmasına baxmayaraq onlar məğlub olurlar. Əlvənd Mirzə zorla canını qurtarıb Ərzincana sarı qaçır. Bu qələbədən sonra Şah İsmail Təbrizə doğru hərəkət edir. Təbrizdə Şah İsmal şah elan edilir və onun adına xütbə oxunur. Bundan sonra Şah Ismailə inam artır və ətrafda bir çox pərakəndə kiçik bəyliklər və müstəqil tayfalar könüllü olaraq yeni dövlətin himayəsinə keçir. Bu isə dövlətin ərazi və əhali tərkibinin artımını və möhkəmliyin təmin edir. Bir qədər sonra Ağqoyunlular dövlətinin ikinci qolu üzərində də qələbə çalan Şah İsmail yeni Səfəvilər dövlətinin sərhədlərini xeyli genişləndirir. 1503-cü ildə Mazandaran, 1504-cü ildə Yəzd, Kirman, Fars, Kaşan, 1506-cı ildə Mərəş, Diyarbəkr, 1508-ci ildə Bağdadla birlikdə bütün İraq fəth olunur. Bağdadın əslində könüllü Şah İsmailin təbəəliyinə keçməsi onun

digər dövlətlər tərəfindən də tanınmağına böyük təsir göstərdi. Elə həmin ildə də Şah İsmail İmam Hüseynin (ə) tərəfinə keçib şəhid olmuş, bəni-Riyah tayfasından olan Hürr ibn Yəzid Riyahinin qəbrini açdırır və o vaxtdan Azərbaycan Səfəvilər dövlətinin ərazisində Məhərrəmlik mərasimlərinin dövlət səviyyəsində keçirilməsi barədə göstəriş verir. Beləliklə, Səfəvi dövlətinin dövlət atributları dəqiq müəyyənləşdirilir. Azərbaycan türkcəsi dövlət dili, şiəlik rəsmi dövlət dini, paytaxt Təbriz seçilir.

Şah İsmailin ordusunun yaxınlaşması xəbərini eşidən Bağdad hakimi əhali tərəfindən müdafiə olunmadığını görüb gecə ikən qaçır. Qızılbaş ordusu hələ Bağdada çatmamış şəhərin came məscidində Şah İsmailin adına xütbə oxunur. "Cahanarayi-Şah İsmail Səfəvi" adlı tarix əsərində Şah İsmailin Bağdada daxil olması belə təsvir edilmişdir: "Şah İsmail "ay ulduz" bayrağı altında Bağdada yaxınlaşdı. İraq əhalisi axınla onu qarşılamağa çıxdı. Sadə camaat Bağdad və başqa şəhərlərdən gəlib şadlıq içində qeyri-adi qələbələr və ilahi təyinatla bağlı hökmdarı alqışlayırdı. Onlar sevinc və bəxtiyarlıq içində idilər. İraqlıların adətincə çoxlu qurbanlıq buğalar gətirilmişdi. Alqış və dua edərək buğaları kəsir, başlarını Şah İsmailin atlılarının ayaqları altına atırdılar. Şah İsmail "Çaharbağ"a düşdü və Bağdad əhalisinə dərin mehribanlıq, mərhəmət və səxavət göstərdi".

Şah İsmail Bağdadda qaldığı müddətdə ziyarətgahlara böyük qayğı göstərir, əhalinin xahişi ilə quldurluqla məşğul olan bədəvilərin hərami dəstələrini darmadağın edir. Şah İsmail qeyri-məhdud səlahiyyət sahibi – Şah idi. Öz hakimiyyəti altında olan rəiyyətin onun tərəfinə könüllü keçməsində marqlı idi. Bunun üçün onun müstəsna bacarığı uğurunu təmin edirdi. Şah İsmail son dərəcə diqqətli idarəetmə qabiliyyətinə malik, dindar bir hökmdar idi. Şəriəti – Allahın idarə etməsini çox yaxşı bilən şah Onun qoyduğu qayda ilə idarə etməyi lazım bilirdi. Bu isə o dövrdə uğur gətirən bir faktor idi.

Şah İsmailin əleyhdarları da az deyildi. Hər şey Bağdaddakı kimi xoşluqla bitməyə də bilərdi. Məsələn Şeybani xan və

Sultan Səlimlə müharibələri də Şah İsmailin həyat və fəaliyyətində mühüm yer tutur. Məlum olduğu kimi, Teymur və onun övladlarının dövründə Azərbaycanın bir çox elm və mədəniyyət xadimləri Səmərqənd, Herat və Buxara şəhərlərinə aparılmışdı. Şah İsmailin Şeybani xan üzərindəki qələbəsi (1510) bu axının istiqamətini dəyişdirdi. Vətənindən ayrı salınmış bir çox sənətkar və yaxud onların varisləri yenidən doğma yurda qayıtmağa başladılar. Şah İsmailin dövlətçilik yolunda mühüm xidmətlərdən biri də budur ki, onun sayəsində mədəniyyət və itirilmiş qiymətli insan kapitalı (sənətkarlar, elm və mədəniyyət xadimləri, ustalar) ölkəyə qayıtdı və onlarla birlikdə sənət, elm və yüksəliş ölkəyə qaytarıldı.

Orta əsrlər başdan-başa feodal çəkişmələri ilə müşayiət olunur. Şərqdə, orta və ön Asiyada feodalizm ən uzun çəkmiş formasiya olmuşdur. Müsəlman dünyasında feodalizmin uzun çəkməsinin bir səbəbi onun kəndliyə ağalar tərəfindən nisbətən daha rəhmli yanaşma olmuşdursa, dağılma səbəbi də feodal çəkişmələri olmuşdur. Natural təsərrüfatın hökm sürdüyü dövrdə kiçik feodallıqlar və feodal hakimlərinin hərc-mərcliyi tarixin hərəkətverici qüvvəsi olur. Həmin feodalların hər biri özünü hakimi-mütləq hesab edir. Xırda çəkişmələr tədricən iri çəkirşmələrə, iri çəkişmələr isə feodal müharibələrinə gətirib çıxarır. Bütün bunlara üsyanlar da əlavə olunduqda anarxizmi idarə etmək mümkünsüz hala gəlir. Bu qarışıqlıq içərisində tapdaq altında qalmamaq üçün kütlə adətən daha güclü, daha ümid verən başçının hakimiyyətinə sığınır. Şah İsmail məhz belə hakimlərdəndir.

XVI əsrin ilk illərində Orta Asiyada da vəziyyət bu səbəblərdən o qədər də yaxşı deyildi. Sultan Hüseyn Bayqara bir yandan öz övladları, başqa bir yandan Şeybani xan tərəfindən sıxışdırılırdı. Belə bir vəziyyətdə Sultan Hüseyn Bayqara öz düşmənləri ilə haqq-hesab çəkmək üçün Şah İsmaillə yaxın dostluq əlaqələri yaradır, onun sarayına elçilər, ozanlar göndərir. Şah İsmail onun bu dostluq təşəbbüslərinə dostluqla cavab verir. Sultan Hüseyn Bayqaranın 1505-ci ildə ölməsi və Şeybani xanın

onun varisi üzərində hiylə və namərdliklə qələbə qazanması vəziyyəti xeyli dəyişdirir. Şeybək xan, Şeybani xan adları ilə tanınan Məhəmməd Şahbəxt xan (1500-1510) Xorasan və Heratı ələ keçirdikdən sonra imperatorluq xülyalarına qapıldı, Şah İsmailə təhqir və təhdidlərlə dolu eyhamlı məktublar göndərməyə başladı.

O, Şah İsmailə özünün əmirlərindən biri kimi müraciət edərək Məkkəyə gedəcəyini bildirir, keçəcəyi yolları sahmana salmaq, adına sikkə vurdurmaq, məscidlərdə xütbə oxutdurmaq, layiqli töhfələr hazırlamaq, pişvazına çıxmaq barədə iddialı göstərişlər verirdi.

Tədbirli bir dövlət başçısı olan Şah İsmail onun sifarişlərinə hörmətlə cavab verir, münasibətləri kəskinləşdirmək istəmirdi. İki dəfə Şeybani xanın sarayına elçilər göndərib münasibətləri qaydaya salmağa çalışır. Şah İsmailin sülh, dostluq münasibətləri yaratmaq təşəbbüsləri Şeybani xan tərəfindən qorxaqlıq və zəiflik əlaməti kimi qiymətləndirilir. Şeybani xan Şah İsmailə əsa və kəşkül göndərərək ona meydan oxumağa başlayır. Ata-babadan şah nəslinə mənsub olmayan Ağqoyunlularla qohumluğuna arxalanaraq şahlıq iddiasına düşən Şah İsmailin hərəkətini, niyyətini qeyri-mümkün bir iş sayır.

Şeybani xanla münasibətlərin dinc yolla nizama salınmayacığı bəlli oldu. Şah İsmail çox zaman qan tökmədən və qüvvə itirmədən məqsədə nail olmanın tərəfdarı idi. Bəzən də iki cəbhədə döyüşməkdən yayınmaqdan ötrü taktik-siyasi gedişlər gənc Səfəvi hökmdarının karına gəlirdi. Əvvəlcə bir tərəfi zərərsizləşdirib sonra ikinci tərəflə hesablaşırdı. Şeybani xanla da bu taktika işə yaradı. 1510-cu ildə Şeybani xana eyhamlarla dolu bir məktub yazıb, Məşhədə nəzir verməyə gəlməyə hazırlaşdığını bildirir və onun diqqətini Məşhədə yönəldib özü sürətlə Xorasan üzərinə yürüş edir. Qızılbaş ordusunun qəfildən Xorasana yetişdiyi xəbərini alan Şeybani xan çaşbaş qalır, qorxusundan Heratdan Mərvə qaçır. Şah İsmail ikinci dəfə hərbi hiylə ilə onu qaladan bayıra çıxarır və ağır məğlubiyyətə uğradır.

Şeybani xan öldürülür. Xorasan və Heratdan başlamış Bədəxşan, Kabul və Qəndəhara qədər böyük bir ərazi Şah İsmailin əlinə keçir. Herat Səfəvilər dövlətinin ikinci mühüm mərkəzinə çevrilir. Şah İsmaiılin böyük oğlu Təhmasib Mirzə Herat mərkəz olmaqla Orta Asiyaya vali təyin edilir. Şah İsmail 1510-cu ilin qışını yaza qədər Heratda keçirir. Bu vaxt o, elm və mədəniyyət xadimləri ilə maraqlanır, onları ətrafına toplayıb məclislər düzəltdirir, onların bir qisminə Xorasan, Bəlx, Mərv, Herat şəhərlərində yüksək vəzifələr verir, bir qismini isə Təbrizə göndərtdirir. Şah İsmailin Heratda "Bağicahanara" sarayında keçirdiyi günlər, qurduğu tarixi məclislər haqqında tarixi qaynaqlarda ətraflı məlumat verildiyi kimi, bunlar müxtəlif sənət əsərlərində də öz parlaq əksini tapmışdır. Bu həm də müsəlman intibahının çiçəklənməsinə, incəsənətin və elmin inkişafına təkan verir.

Səfəvilər dövlətinin sürətli inkişafı, qısa bir müddətdə Şərqin ən qüdrətli dövlətlərindən birinə çevrilməsi, qızılbaşlıq ideologiyasının başqa dövlətlərin əhalisi arasında da geniş yayılması həmin dövlətlərin Şah İsmaıilə və onun ölkəsinə qarşı qorxu, ehtiyat, qibtə, hətta düşmən münasibəti dərinləməsinə səbəb olurdu. Çaldıran müharibəsi bu hisslərin və münasibətin nəticəsi idi. Bu döyüş istər Osmanlı qaynaqlarında, istərsə də Səfəvilərə aid sənədlərdə bütün təfərrüatı ilə təsvir olunmuşdur. Bu qaynaqlardan aydın olur ki, Şah İsmail həmin müharibənin baş verməsində maraqlı deyilmiş.

Şah İsmail istər hakimiyyət uğrunda müharibələr apardığı, istərsə də Çaldıran döyüşünə qədərki dövrdə Türkiyə sultanlığı ilə ehtiyatla davranmışdır. Sultan Bəyazid əvvəllər Şah İsmailə düşmən münasibət bəsləmiş, "qızılbaş yağı tayfalarının fitnə alovunu yüksəlmədən söndürməyə" çağırmışsa da, sonralar Şah İsmaillə onun arasında dostluq münasibətləri yaranmışdır. Sultan Bəyazid qüdrətli Səfəvi dövləti ilə hesablaşmağa başlamışdı. Münasibətlərin yaxşılaşmasında Şah İsmailin xidməti daha böyük idi. Uzaqgörən Səfəvi hökmdarı ümumi vəziyyəti nəzərə alır və Türkiyədəki çoxsaylı tərəfdarlarına xətər toxun-

masını istəmirdi. Lakin, Trabzon hakimi olan, Yavuz ləqəbini almış Səlim, Bəyazidin Şah İsmailə müsbət münasibətinin əleyhinə idi. O, Türkiyədə gündən-günə güclənən, ətrafında çoxlu tərəfdarlar toplayan qızılbaşlıq hərəkatına imperiya üçün təhlükəli bir qüvvə kimi baxırdı. O, həssaslıqla duyurdu ki, bu qüvvə gec-tez Osmanlı dövlətini ələ keçirəcəkdir. Məhz buna görə də qəti tədbirlərə əl atmaq tərəfdarı idi. Beləliklə, sui-qəsin səbəbləri və tərəfdarları bəlli oldu. Yaşlanmış Sultan Bəyazidi[1] aradan götürərərk Sultan Səlimi hakimiyyətə gətirdilər.

Bu hadisələri qaynaqlar əsasında təhlil edən M.Abbaslı yazır: "Həmin illərin tarixi hadisələrindən aydın olur ki, həqiqətən də, əgər Yavuz Sultan Səlim tək hakimi-mütləq, qarşıdakı maneələri aradan qaldırmaqda cəsarətli, fikrindən dönməyən, möhkəm iradəli, eyni zamanda rəhmsiz, qəddar bir şəxsiyyət olmasaydı, hakimiyyət gec-tez Şah İsmail tərəfdarlarının əlinə keçəcəkdi."

Sultan Səlim hakimiyyət başına keçən kimi ölkəni daxilən möhkəmləndirməyə başladı, yeniçərilərin etirazlarına baxmayaraq qızılbaşların siyahısını tutdurub qırx mindən (40 000) çoxunu işgəncə ilə öldürtdü, ibrət olmaq üçün bəzilərinin alnına qızmar dəmirlə damğa vurdurdu. Bundan sonra isə din nümayəndələrini toplayıb qızılbaşlar əleyhinə fitva hazırlatdırdı. Həmin hazırlıq işlərindən sonra Sultan Səlimin iki yüz minlik odlu silah və toplarla silahlanmış ordusu hərəkətə başladı.

1514-cü il avqustun 23-də Maku yaxınlığındakı Çaldıran düzündə iki qoşun üz-üzə gəlir. Döyüş üç gün davam edir. Şah İsmail bu döyüşlərdə qeyri-adi rəşadət göstərir, özünü dönə-dönə qoşunun qəlbgahına vurur, qılıncı ilə topların bağlandığı zəncirləri doğrayır. Qılıncı ilə bir topun lüləsini qırıb yerə salır. Şah İsmailin, onun sərkərdələrinin və əsgərlərinin qeyri-adi bir

---

[1] M.Abbaslı. Şah İsmayıl Xətainin ömür yolu miniatürlərdə, "İşıq", Bakı, 1981. səh. 30

cəsarətlə vuruşmasına baxmayaraq döyüşdə Sultan Səlim qalib gəlir.

Çaldıran döyüşünün böyük tarixi əhəmiyyəti var. Şah İsmailin və Səfəvi imperiyasının tarixində bu döyüş dönüş nöqtələrindən biridir. Tarixçilərdən daha çox filoloqlar belə bir qənaətdədir ki, Şah İsmail öz gücünə həddən artıq inandığından, özünü məğlubedilməz hesab etdiyindən, Şuranın ağıllı məsləhətləri ilə hesablaşmadığından və taktik səhvlərə yol verdiyindən bu döyüş uduzulmuşdur.

Əvvəla, Şah İsmailin rəqibi dövlətçilik ənəsinə malik nəhəng Osmanlı İmperiyasıdır. Sultan Səlim deyildir. Burada iki rəqib deyil, iki böyük tərəf üz-üzə gəlmişdir. Məqsədləri nəzərə alsaq hər iki tərəf üçün bu, ədalətsiz müharibə idi. İstər Sultan Səlim, istər Şah İsmail bu döyüşə başlamaq məcburiyyətində deyildi. Şah İsmailin yeganə üstünlüyü bundadır ki, o, əvvəldən bunu başa düşmüşdü və yayınmaq istəyirdi. Onun bildirçin ovuna getməsi əslində qarşı tərəfə "səni saymıram" mesajı deyil, "bekarsansa ovla əylən" mesajıdır. Şah İsmail qətiyyən qələbələrdən gicəllənmiş, şöhrətinə aludə olmuş hakim deyildir. Bütün uğurlarında da Allahın rizasının olduğunun fərqindədir. Hətta, onun da fərqindədir ki, Osmanlı imperiyasının qarşısında Səfəvi dövləti qocaman ata ilə azyaşlı oğul nisbətindədir. Osmanlı ordusu yetişmiş, dövlətçilik ənənəsinə malik, yeni texnika ilə silahlanmış və mükəmməl təlim görmüş böyük bir ordudur. Osmanlı ərazisində bir qrup şiələrin yaşaması Şah İsmailə Osmanlı ordusuna qalib gəlmə təminatı vermir. Bütün bunları diqqətlə nəzərdən keçirən Şah İsmail bu döyüşdə udmağın mümkünsüzlüyünü əvvəldən bilirdi. Lakin, öz şəxsi keyfiyyətlərini silah edərək bəzən İmam Hüseyn (ə) kimi dözümü ilə (mənəvi cəhətdən) qalib gəlməyə çalışmışdır və buna nail olmuşdur. Sultan Səlimin Səfəvi dövlətini öz vassalına çevirməməsi də bunu sübut edir. Demək o da sadəcə Şah İsmailin şöhrətini qısqanmış və ətrafa "o, mənə rəqib deyildir" mesajın vermək istəmişdir. Onun bu döyüşdən xüsusi bir gözləntisi olmayıbmış. Düzdür, Səfəvilərin

Çaldıran müharibəsində məğlubiyyətinin acı və ağır nəticələri tədricən üzə çıxır. Ən böyük ziyan Səfəvi Ordusunun sıralarında qiymətli şəxslərin itkisidir. Onları itirməmək üşün Şah İsmail Yavuza təkbətək döyüş təklif etmişdi. Diyarbəkr, bir az sonra Ərzincan Şah İsmail hakimiyyətindən qoparılıb Osmanlı torpaqlarına qatılır. Çaldıranda Şah İsmailin ömründə birinci və axırıncı dəfə məğlub olması ona çox güclü mənfi təsir edir.

*Diyari eşqə sultanəm dila, mən də zamanimdə,*
*Vəzirimdir qəmü-qüssə oturmuş iki yanimdə.*

Çaldıran məğlubiyyəti Səfəvi imperiyasına dövlətçilik baxımından ciddi bir sarsıntı gətirməsə də Şah İsmailin şəxsi faciəsinə çevrildi. O, bunu şəxsi məğlubiyyəti kimi qəbul edərək demək olar ki, bir daha silaha əl atmadı.

Səfəvi dövlətini faktik olaraq Şah İsmail Səfəvinin rəhbərliyi ilə oğlu I Təhmasib idarə etməyə başlayır. Şahın faktik hakimiyyətdən tədricən kənarlaşması onu göstərir ki, onun Osmanlı imperiyası barədə həqiqətən də bəzi mülahizələri – nəzərdə tutduğu planları varmış. Həmin məğlubiyyət ona bu planların bünövrəsiz xəyal olduğunu anlatdı. Başqa iddiası olmadığından siyasi fəaliyyətdə meydanı varisinə buraxdı. Şah İsmail Osmanlı daxil daha böyük imperiya yaratmaq iddiasını birdəfəlik qapadı.

Şair hökmdarın həyat sevinci bir də özünə qayıtmadı, üz-gözünə əbədi bir tutqunluq və kədər çökdü. Bu hadisə onun üçün adi bir məğlubiyyət deyildi, ən böyük arzu və istəklərinin puça çıxması demək idi.

Çaldıran müharibəsinin təfərrüatı, tarixi qaynaqlarda əks olunduğu kimi, bədii ədəbiyyatda da müəyyən izlər buraxmışdır. Tarixi qaynaqlardan daha çox bədii ədəbiyyatda onun barəsində bir çox məlumat əldə etmək olur. Əvvəla ona görə ki, Şah İsmail qəlbən şair və yaradıcı bir şəxs olub. İstək və planlarını daha çox şəxsən öz qələmi ilə yazdığından onu yaradıcı insanlar daha çox başa düşə bilir. Digər tərəfdən çox böyük bir boşluq onun şəx-

siyyətindəki ziddiyyətləri tarixilik baxımından izahına mane olur. Bu, dinin dövlətdən ayrılmasıdır. Orta əsr feodal dövlətinin siyasəti isə dinin özüdür. Şah İsmail şəxsiyyətinin dəqiq izahı dini izahdadır. Onu dindən ayrı təsəvvür etmək başqa sözlə rəsmini naturadan çəkmək deməkdir. Bu qədər bəsit izah şəxsin mahiyyətini açmaz. Şah İsmail boş yerə islamı və şiəlik məzhəbini rəsmi dövlət dini elan etməmişdir. Ədəbiyyat və din bunu etiraf edir, tarix isə yox. Şah İsmailin getdiyi yolu ondan əvvəl Seyyid İmadəddin Nəsimi də getmişdir. Onun düşüncələrinin kökündə Nəsimi fəlsəfəsinin bütün izlərini görmək mümkündür. Bu iki böyük şəxsiyyətin arasında bir fərq vardır. Xətaidə güc, Nəsimidə şeiriyyət güclü idi. Amma, hər ikisi bir dövlət qurmaq uğrunda mübarizədə son damla qanına qədər mübarizə aparmışdır.

Çaldıran müharibəsindən aldığı təəssüratı Məhəmməd Füzuli "Bəngü Badə" poemasında dərin ürək ağrısı ilə qələmə almış, iki hökmdarın qürur və mənəmliyi ucbatından törənən Çaldıran müharibəsi ona bu ilk böyük əsərini yaratmaq üçün əsas təkanverici hadisə olmuşdur. Füzuli 1514-1524-cü illər arasında yazdığı bu poemasını Şah İsmailə ithaf etmiş, onu səmimi, ürəkdən gələn misralarla alqışlamışdır:

*Məclisəfruzi-bəzmgahi-Xəlil,*
*Cəmi-əyyam Şah İsmail.*
*Ondan asudədir ğəniyyü gəda,*
*Xəlődəllahü mülkəhü əbəda.*

(Şah İsmailin sayəsində varlı da, kasıb da asudə keçinir. Qoy onun hökmranlığı əbədi olsun! Onun feyz camından naib şadlanmayanlar qoy şərab xıltı kimi çöküb həmişəlik puç olsunlar.)

Çaldıran məğlubiyyətindən sonra Şah İsmail on il yaşasa da, heç bir ciddi hərbi səfər etmir. Onun ölümü ilə bağlı qaynaqlarda belə bir qeyd vardır ki, Şah İsmail ölümündən bir qədər

əvvəl yorğunluq hiss etdiyindən ova çıxır. O, sağalmaq ümidilə Şəki mahalına gəlib çıxır. Şahdağda ov edir. Ona Şahdağda çox qədim zamanlardan qalmış bir çox ev heyvanlarının, vəhşi at ilxılarının olduğunu xəbər vermişdilər. Şah İsmail ova çıxmazdan əvvəl yerli əhali ona həmin yerdə ov etməyin, Şahdağdakı heyvanları ovlamağın sınaqlı olduğunu, yaxşı nəticələr verməmdiyini bildirirlər. Şah İsmail bu sözlərə əhəmiyyət vermir və öz adamları ilə cərgə ovu təşkil edir. Ov şənliyi qurtarar-qurtarmaz o, ağır şəkildə xəstələnir və dərhal Ərdəbilə qayıdır. Burda da onun halı yaxşılaşmır. Tələsik Təbrizə yola düşürlər. Yolda Sarab yaxınlığındakı Mənqutay adlı yerdə halı o qədər ağırlaşır ki, düşərgə salmalı olurlar. Həkimlərin səyi, müalicəsi bir fayda vermir. Hökmdar şair 23 may 1524-cü ildə 38 yaşında vəfat edir. Nəşini Ərdəbilə gətirib Şeyx Səfi türbəsinin yanında dəfn edirlər.

Şah İsmail Xətai 38 yaşında, həyatının, yaradıcılığının, arzularının ən qaynar bir çağında dünyadan köçür, lakin qısa ömrü müddətində gördüyü işlər ona ölməzlik qazandırmış, onu Azərbaycan xalqının siyasi və mədəni tarixinin ən parlaq səhifələrindən birinin yaradıcısı kimi tanıtdırmışdır.[1]

Şah İsmailin apardığı müharibələr onun vahid Azərbaycan dövləti yaratmaq arzu və istəyindən irəli gəlirdi. O, Azərbaycan dilini dövlət və şeir dilinə çevirmiş, ölkənin siyasi, ictimai, iqtisadi və mədəni inkişafı üçün ölçüyəgəlməz dərəcədə böyük işlər görmüşdür.

Xətai barədə ilk məlumatı oğlu Sam Mirzə “Töhfeyi-Sami” əsərində vermişdir. Təəssüf ki, o, atasının zəngin irsindən ancaq farsca yazdığı bir beyti nümunə gətirməklə kifayətlənmişdir. Halbuki Xətai yaradıcılığında ana dilinə üstünlük vermiş, bizə çatan əsərlərini, demək olar ki, büsbütün ana dilində yazmışdır.

---

[1] Xəlil Yusifov. “Ş.İ.Xətainin həyatı və sənət dünyası” // Şah İsmayıl Xətai. “Keçmə namərd körpüsündən” (Şeirlər və poemalar). Bakı, “Yazıçı”, 1988

Bununla bərabər Sam Mirzənin nümunə gətirdiyi beyt özü də müəyyən cəhətdən diqqəti cəlb edir. Burda Şah İsmail Xətainin qəhrəman, əyilməz, məğlubedilməz şəxsiyyəti ifadə olunmuşdur:

*Bisütun naləvü zarəm çü şənid əz ca şod,*
*Kərd fəryad ke Fərhade-degər peyda şod.*

(Bisütun nalə və iniltimi eşitdi, yerindən oynadı, fəryad etdi ki, yeni bir Fərhad peyda olmuşdur.)

Xətai irsinin ümumi məzmun istiqamətinə uyğun olan bu beytin təsdiq etdiyi həqiqət budur ki, şair yeni bir Fərhaddır. Bisütunları yerindən oynada bilən yeni bir hünər sahibidir. Sam Mirzədən sonra Xətayidən bəhs edən təzkirəçilər onun yazdıqlarını təkrar etmişlər. A.Bakıxanov və S.Ə.Şirvani də onun haqqında maraqlı qeydlər etmişlər. Avropa alimlərindən J.Hamper Purqştal, Ş.Ryo, E.Gibb, E.Braun, F.Babinger, V.M.Minorski, T.Gənceyi, rus şərqşünaslarından A.E.Krımski, türk alimlərindən M.F.Köprülü, S.N.Ərgün, Ə.Gölpinarlı və başqaları Xətainin həyat və yaradıcılığının öyrənilməsi ilə əlaqədar xeyli iş görmüşlər. Bu alimlərin heç də hamısı onun irsi ilə eyni dərəcədə dərindən məşğul olmamışlar. V.Minorski, S.N.Ərgün və T.Gənceyinin bu sahədə xidmətləri daha çoxdur.

Azərbaycanda Xətai irsinin öyrənilməsi 1920-ci illərdən başlamışdır. Azərbaycanın tarixçi və ədəbiyyatşünas alimləri Xətainin dövrü, həyatı və ədəbi irsinin öyrənilməsi sahəsində bir sıra qiymətli tədqiqat əsərləri yaratmışlar. S.Mümtaz, H.Araslı, M.Quluzadə, Ə.Məmmədov, O.Əfəndiyev, M.Abbaslı, M.Qasımlı, Axund Hacı Soltan Əlizadə kimi mütəxəssislərin bu yöndə apardıqları araşdırmalar və yürütdükləri mülahizələr xüsusilə diqqəti cəlb edir.

Bununla yanaşı H.Araslı ("Şah İsmayıl Xətainin poeziyası"), Oqtay Əfəndiyev ("Salnaməçi Bicən Şah İsmail Xətai haqqın-

da”), Vəcihə Feyzullayeva (“Xətai ədəbi irsinin tədqiqi tarixindən”), Anar (“Şairin zəfəri”), Ç.Sadıqoğlu (“Azərbaycan təsəvvüfü tarixində “Səfəviyyə” və onun Xətai yaradıcılığında yeri”), M.Qasımov (“Xətainin qəzəllərində real məhəbbətin tərənnümü”), Şahin Fərzəliyev (“Qiyasəddin Xondəmir və Həsən bəy Rumlu Şah İsmail Xətainin fərdi xususiyyətləri haqqında”), Azadə Rüstəmova (“Xalq yaradıcılığı Xətai şeirinin estetik qaynaqlarından biri kimi”), T.Hacıyev (“Qış getdi, yenə bahar gəldi”), Ə.Məmmədov (“Şah İsmail Xətai əsərlərinin əlyazmaları”), C.Əliyev (“Xətai şeirinin vəzni”), M.Cavadova (“Xətai əsərlərinin leksik, semantik və üslubi xüsusiyyətləri haqqında”), V.Quliyev (“Şah İsmail obrazı bədii nəsrimizdə”), İ.Həsənli (“Səfəvilər dövrü Kanada aliminin tədqiqatında”), F.Qurbanov (“Şah İsmail Xətai Məhəmməd Füzulinin sənət güzgüsündə”), L.Musəvi (“Şah İsmail Xətai Eduard Braunun yaradıcılığında”), L.Əlizadə (“Xətai və Füzuli yaradıcılığındakı bəzi alleqorik obrazlar”), Ş.Məmmədova (“Müasir İran tarixşünaslığı Şah İsmail Xətai haqqında”), V.Devitt (“Şah İsmail Xətai Azərbaycan ədəbiyyatı muzeyinin sərgisində”) və Q.Firudin (“Şah İsmail”lər Şah İsmaildirmi?) kimi alimlərin yazdıqları məqalələr də Xətai irsinin öyrənilməsində çox böyük əhəmiyyət kəsb edir.

Şah İsmail Xətai az yaşamasına, vaxtının çoxunu dövlət işlərinə sərf etməsinə baxmayaraq zəngin və çoxcəhətli bir irs yaratmışdır. O, həm əruzla, həm də heca vəznində, həm epik, həm də lirik janrlarda qələmini işlətmiş, yaddaqalan, nümunə, örnək ola bilən əsərləri ilə ədəbiyyatımızı zənginləşdirmişdir.

Şah İsmail Xətainin hakimiyyət dövrü və onun bünövrəsini qoyduğu Səfəvi imperiyası Azərbaycan orta əsrlər tarixinin mühüm bir mərhələsini təşkil edir. Bu dövlət tarixən bəzi deformasiyalara uğrasa da əsasən Şah İsmail vəsiyyətinə uyğun olaraq idarə edilmişdir. Bütün imperiyalar məhvə məhkumdur. Səfəvi imperiyası da silinib getdi. Lakin, tarixdə dərin iz buraxmış və Azərbaycan xalqının milli formalaşmasında əhəmiyyətli rol oynamışdır. I Təhmasibin vaxtında Şah İsmailin yaratdığı impe-

riyanın ərazisi nəinki itirilməmiş, hətta, bir qədər də artmışdır. I Şah Təhmasib Şah İsmailin bütün tapşırıq və tələblərini sonuna qədər icra etmişdir. Ola bilsin ki, Şah İsmail buna arxayın olduğu üçün daha çox dövlət işlərindən kənara çəkilmişdir. Bizə onun məşhur vəsiyyətnaməsi qalmışdır, həmin vəsiyyətində də o, xalqa və varislərinə onun yaratdığı imperiyanı, dili və dini qoruyub saxlamağı tapşırır.

M.Füzuli kimi dahi sənətkar Xətainin bir sıra şeirlərinə cavab yazmış, ilk böyük əsəri olan “Bəngü Badə”ni ona ithaf etmişdir. Görkəmli el sənətkarı, hökmdar şairin müasiri Aşıq Qurbani onu “Mürşidi-kamilim, şeyx oğlu şahim” deyə tərənnüm etmişdir. Şah İsmail Xətainin əsərləri istər əlyazmaları, istərsə də şifahi şəkildə geniş yayılmış, məclislərdə musiqi havalarının müşayiəti ilə ifa olunmuşdur. Bu günə qədər el sənətkarları arasında yaşayan “Şah Xətai” havası onun irsinin xalq arasında nə qədər dərin nüfuz və hörmətə malik olduğunu bir daha təsdiq edir. Onun həyat və mübarizəsi ilə bağlı olaraq məşhur “Şah İsmayıl” dastanı yaranmışdır. Bu dastan əsasında M.Maqomayev eyni adlı opera bəstələmişdir. Yazıçı Ə.Cəfərzadənin “Bakı-1501”, F.Kərimzadənin “Xudafərin körpüsü” romanı və bir sıra başqa bədii əsərlər Şah İsmail Xətainin həyat və fəaliyyətindən bəhs edir. Qeyd edək ki, bu əsərlərin hamısı tarixi şəxsiyyət barədə bədii əsərlərdir. Ş.İ.Xətai kimi çoxcəhətli şəxsiyyətlər, yalnız bədii deyil, tarixi, dini, ictimai-siyasi tərəflərdən də paralel olaraq araşdırılmalı və obyektiv nəticələr oxucuya təqdim olunmalıdır.

Qeyd etmək istərdik ki, bu tədqiqat işinə 21 oktyabr 2011-ci ildə başlayıb, 23 noyabr 2022-ci ildə Allah-təalanın köməkliyi ilə qismən olaraq yekun vurduq. 23-24 noyabr 2017-ci ildə Nizami adına muzeyin direktoru, akademik Rafael Hüseynovun təşəbbüsü ilə Şah İsmail Xətainin 530 illik yubileyi qeyd olundu və mən də həmin konfransa “Xətai təxəllüsü nə ilə bağlıdır” sərlövhəli məqalə ilə qoşuldum. O zaman belə qərara gəldim ki, 2011-ci ildən başladığım bu tədqiqat işini qürur mənbəyimiz

olan şahımızın 535 illik yubileyi ərəfəsində çap etdirim. Sonsuz şükürlər olsun Uca Rəbbimizə ki, bu işi sona çatdıra bildik.

Bu tədqiqatı aparmaqda əsas məqsədimiz Şah İsmail Xətai yaradıcılığındakı Əhli-beytlə (ə.m) bağlı müxtəlif şeirlərin təhlilə cəlb olunmasıdır. Əsərlərindən də göründüyü kimi Ş.İ.Xətai Həzrəti-Əlinin (ə) əqidə və məslək davamçısı olmuşdur:

*Mənəm bir tən vəli canüm Əlidür,*
*Damarümdə gəzən qanüm Əlidür.*

*Mənə bu dəftərü divan gərəkməz,*
*Mənim dəftərlə divanüm Əlidür.*

*Mənəm bir qətrə su onun yanında,*
*Mənim dəryayi ümmanüm Əlidür.*

*Mənəm Yəqübi-sərgəştə cahanda,*
*Mənim Yusifi-Kənanüm Əlidür.*

*Bu söz "Əli" sözüdür ey "Xətai",*
*Mənüm bu sözdə ustadüm Əlidür.*

# I FƏSİL

## 1.1. ŞAH İSMAİL XƏTAİ

Azərbaycan tarixən yerüstü və yeraltı sərvətləri ilə diqqət mərkəzində olmuş və ona görə də bir çox hökmdarların hücumuna, işğalına məruz qalmışdır. Tarixin hər hansı bir zaman kəsiyinə diqqət etsək, savaşlar, müharibələr ön planda görünür. Tarixən hər bir ölkə Azərbaycandan zəngin bir torpaq parçası almağa çalışmış və Azərbaycanın başında duran hökmdarların hərəsi öz şəxsiyyətinə görə bu və ya digər şəkildə seçim edərək, ya torpaq verib başını salamat saxlamış, ya da baş verib torpağı qorumuşdur.

Azərbaycan tarixini vərəqləyəndə bir çox şahların həyatı, yaşam tərzi, şahlıq rejimi, qatıldığı döyüşlər və döyüş strategiyası ilə tanış oluruq. Böyük, müstəqil Azərbaycan uğrunda silaha sarılan, bir qarış torpağın belə düşməndə qalmamasına çalışan, özündən əvvəlki hökmdarların düşmən tapdağına verdiyi bütün Azərbaycan torpaqlarını geri alaraq, Azərbaycan ellərini bir bayraq altında birləşdirən, Azərbaycan hökmdarları içərində öz şəxsiyyəti, hökmdarlığı və vətənpərvərliyi ilə seçilən Şah İsmail Xətai həm də şair hökmdarlardandır. Onun adı bu gün də böyük dünya hökmdarları sırasında çəkilir.

## 1.2. ŞAH İSMAİL XƏTAİNİN SOY-KÖKÜ

Orta əsrlərdə İslam dünyasında geniş yayılmış və xüsusi xidmətləri olan təriqətlərdən biri də Azərbaycanda təşəkkül tapan Səfəviyyə təriqətidir. Bu təriqət öz adını qurucusu olan Şeyx Səfiəddin İshaq Ərdəbilinin (1252-1334) adından götürmüşdür. Fransız alimi Massinnon Səfəviyyə təriqətini Sührəverdiyyə təriqətinin qollarından biri hesab edirdi. Bu fikir o mənada əsaslıdır ki, Səfəviyyə öz köklərini Sührəverdilikdən götürən Zahidiyyə təriqəti əsasında, onun davamı kimi formalaşan bir təriqət statusunda fəaliyyətə başlamışdır. Hətta bu təriqəti İbrahim Zahid Gilaninin adı ilə bağlayanlar da vardır.[1]

Yüksək bəsirət sahiblərindən gizli deyildir ki, bu sülalənin şəcərəsi sonuncu Peyğəmbər (xatəmül-ənbiya) və Əliyyül-mürtəza (İmam Əli - Ş.F.) əleyhüssəlamlarla bağlıdır. [Həmin şəcərə] belədir: Əbülmüzəffər Şah Abbas ibn Sultan Məhəmməd padşah ibn Şah Təhmasib ibn Şah İsmayıl ibn Sultan Heydər ibn Sultan Cüneyd ibn Sultan İbrahim ibn Şeyxşah ibn Sultan Sədrəddin Musa ibn Şeyx Səfiəddin İshaq ibn Əminəddin Cəbrayıl ibn Saleh ibn Qütbəddin ibn Səlahəddin Rəşid ibn Məhəmməd əl-Hafiz ibn Əvəz əl-Xəvas ibn Firuzşah ibn Məhəmməd ibn Şərif ibn Məhəmməd ibn Həsən ibn Məhəmməd ibn İbrahim ibn Cəfər ibn Məhəmməd ibn İsmayıl ibn Məhəmməd ibn Əhmədül Ərabi ibn Əbi Məhəmməd əl-Qasim ibn Əbül-Qasim Həmzə İbnül-İmamül Hümmam Əbi İbrahim Musaül-Kazim ibn İmamün - natiq Cəfərüs-Sadiq ibnül-İmam Məhəmməd əl-Bagir ibnül-İmam Əli Zeynalabdin ibnül-İmam Əbi Abdullah əl-Hüseyn ibn əmirəl-möminin və imamül-məttəqin əsədullahül-qalib Əli ibn Əbu Talib əleyhüssalam. Üləmalar və bəlağətli tarixçilərin hamısı bu fikirdədir ki, o həzrət (İmam Əli - Ş.F.) və həzrət xatəmül-ənbiya Xəlil

[1] Əsgər Əhməd. "Səfəviyyə təriqəti". "Kamal" jurnalı, №3(7), İyun, 2010. səh. 34

gülzarının gülləri və İsmail bostanının fidanlarıdırlar ki, onlara salamlar olsun. Onların əzəmətli ata-babaları və Ədnandan Həzrəti-Əbülbəşər (bəşərin atası - Ş.F.) Adəm əleyhüssalama qədər bir-biriləri ilə əlaqədar olmamışlar.[1]

Səfəviyyə təriqəti (1299-1499) Şeyx Səfiəddin Ərdəbilidən Şah İsmailə qədər bu ardıcıllıqla davam etmişdir:

| | |
|---|---|
| 1.Şeyx Səfiəddin Ərdəbili | 1299-1334 |
| 2.Şeyx Sədrəddin Musa | 1334-1392 |
| 3.Şeyx Xoca Əli | 1392-1427 |
| 4.Şeyx İbrahim – ləqəbi Şeyxşah | 1427-1447 |
| 5.Şeyx Cüneyd | 1447-1456 |
| 6.Şeyx Heydər | 1456-1488 |
| 7.Şeyx Sultan Əli | 1488-1494 |
| 8.Şeyx İsmail Xətai | 1494-1499 |

Şeyx Səfiəddin İshaq Ərdəbili 1252-ci ildə Ərdəbil yaxınlığındakı Kəlxuran kəndində anadan olmuşdur. Belə iddia edilir ki, Şeyx Səfinin nəsli yeddi silsilə vasitəsi ilə İmam Museyi-Kazıma (ə) çatır.[2]

Şeyx Səfinin tutduğu yol haqqında Təvəkkül ibn Bəzzazın "Səfvət əs-səfa" əsərinin XVI əsr türk tərcüməsi olan "Şeyx Səfi təzkirəsi"ndə onun dilindən aşağıdakı şəkildə söylənilir: "Həzrəti-Şeyxə sual verdilər ki, məzhəbin nədir? Cavab verdi ki, dərvişlərin məzhəbi haqqın məzhəbidir və fərzənd gərək atasının məzhəbində ola. Çünki dədələrimizin məzhəbi "siratul-mustəqimdir" və mömin övliyalar bu yola baş vurublar və bir tük qədər olsa da, Mustafa (s) ilə Mürtaza (ə) vəttəhiyyət vəl ikramın buyruğundan çıxmayıblar. Biz belə onların ardınca gəlib doğru yoldan dönməriz, İnşəallah. Bir yola varırıq ki, məhşərin günün-

[1] İsgəndər bəy Münşi Türkman. "Dünyanı bəzəyən Abbasın tarixi" (Tarixe-aləmaraye-Abbasi). (Tərcüməçi: Şahin Fazil). Bakı, "Şərq-Qərb", 2010. səh. 48

[2] Əsgər Əhməd. "Səfəviyyə təriqəti". "Kamal" jurnalı, №3(7), İyun, 2010. səh. 34-35

də Nəbi, Vəsi və Əhli-beytləri yanında xəcalət çəkməyəcəyiz”.[1]

İslami təhsilə başlayan Şeyx Səfi ilk təhsilini dini davamçılarından almışdı. Burada o, dini elmlərin əsaslarına yiyələnir. Ana dilindən başqa, Fars, Ərəb, Gilan və Monqol dillərində də sərbəst danışmağa başlayır. Ömrünün gənclik illərində kamil bir mürşid axtarışında olan Səfiyyəddin bu niyyətlə Şiraz şəhərinə gedərək məşhur sufi şeyxi, görkəmli Azərbaycan alimi Əbu Həfs Ömər Sührəverdinin (1145-1234) şagirdi olan Şeyx Nəcibəddin Bozquşu (o da Azərbaycan türküdür) görmək istəmiş, lakin ora çatan zaman onun ölüm xəbərini eşidərək çox məyus olmuşdur. İbn Bəzzazın yazdığına görə o, burada olarkən məhşur Fars şairi Sədi Şirazi ilə görüşür (öl. 1292) və onunla söhbət edir. Səfiəddini “türk piri” adlandıran Sədi Şirazi şeirlər divanının öz əli ilə yazdığı bir nüsxəsini ona bağışlamaq istəyir, ancaq Səfiəddin qəbul etməyərək bildirir ki, ona ilahinin divanı gərəkdir.[2,3]

Səfiəddin təxminən beş il Şirazda məşhur ilahiyyatçı alimlərdən Rüknəddin Beyzəvi, Əmir Abdullah və başqalarından dərs alır. Nəhayət, iyirmi beş yaşında ikən özünə mürşid seçmək qərarına gələn gənc alim müəllimi Əmir Abdullahın məsləhəti ilə məşhur Gilan şeyxi Hacı Əddin Zahidinin namizədliyi üzərində dayanır. Zahidi Azərbaycandakı, sufi təriqəti olan Sührəverdiyyə ilə münasibətlər saxlayan gəzərgi bir dərviş idi.[4] Səfiəddin onu tapmaqdan ötrü çox səyahətlər edir. Yalnız dörd ildən sonra onlar Gilan dağlarında görüşürlər. Bu görüşdən sonra Zahid Gilani onu müridliyə qəbul edir və Şeyx Səfi 25 il mürid kimi onun ya-

---

[1] Şeyx Səfi Təzkirəsi. “Səfvətüs-səfa”nın XVI əsr türk tərcüməsi. Bakı, Nurlan, 2006. səh. 706

[2] Şeyx Səfi Təzkirəsi. “Səfvətüs-səfa”nın XVI əsr türk tərcüməsi. Bakı, Nurlan, 2006. səh. 10

[3] Əsgər Əhməd. “Səfəviyyə təriqəti”. “Kamal” jurnalı, №3(7), İyun, 2010. səh. 35

[4] Çingiz Qacar. “Qədim və orta əsrlərdə Azərbaycanın görkəmli şəxsiyyətləri”. Bakı, “Nicat”, 1997. səh. 132

nında qalır və onun ən sevimli, etibarlı şagirdlərindən biri olur. O, hələ Zahid Gilaninin yanında olarkən, onun nüfuz və kəramət sahibi olduğu barədə məlumatlar yayılır. Hətta rəvayət olunur ki, onun bu şöhrətini eşidən Şirvanşah Axsitan öz qızını ona ərə vermək istəmişdir. "Şeyx Səfi təzkirəsi"ndə bu barədə deyilir: "Axsitan adlı Şirvan padşahının xatirinə gəldi ki, öz qızını Şeyx Səfiəddinə ərə verə. Bir adam göndərdi ki, Əgər Şeyx Səfiəddin qəbul etsə, ona on dörd min qızıl axça, çoxlu düyü verən bir kənd verərəm. Şeyx Zahid Şeyx Səfiəddinə dedi": Şirvanşahın xatiri belə istəyir, ki, çoxlu mal ilə qızını sənə versin. Nə deyirsən?" Şeyx Səfiəddin dedi: "Mənim sənin yanında nə ixtiyarım? Hakim Şeyxdir. Amma, Şirvanşah bir padşahdır, mən bir dərviş, mən onu neynəyirəm?!" Şeyx Zahid buyurdu: "Bəli, bəli, o, sənin layiqin deyil, mən sənin həmşərün bir kimsəni bulmuşam. Öz qızımı, Bibi Fatiməni halallıq ilə sənə verdim və sənin ondan kamal yiyəsi bir oğlun dünyaya gələcəkdir ki, mənim yerim və sənin məqamın hamısı onun olacaqdır".[1,2]

Şeyx Zahid ağlına və istedadına görə öz oğlu ola-ola (XIII əsrdən etibarən bir sıra sufi təriqətlərində təriqət rəhbərinin varisi bir qayda olaraq onun övladları sırasından olurdu) Şeyx Səfini öz varisi təyin edir. Şeyx Səfiəddin Şeyx Zahidin 1294-cü ildə vəfatından sonra onun yerində rəhbər olur. Lakin, o, Şeyx Zahidin ölümündən sonra yenidən Ərdəbilə qayıdır və burada 35 il "Darül-irşad" (hidayət evi) adlı Səfəviyyə təriqətinin mərkəzi iqamətgahı hesab olunan Xanəgaha rəhbərlik edir, Səfəviyyə təriqətinin qurucusu, başçısı kimi fəaliyyət göstərərək, çoxlu sayda irfan əhli tərbiyə edib yetişdirir.[3] O, burada 35 il irşad və təli-

---

[1] Əsgər Əhməd. "Səfəviyyə təriqəti". "Kamal" jurnalı, №3(7), İyun, 2010. səh. 35-36

[2] Şeyx Səfi Təzkirəsi. "Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi. Bakı, Nurlan, 2006. səh. 130-131

[3] Şeyx Səfi Təzkirəsi. "Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi. Bakı, Nurlan, 2006. səh. 11

matlarla məşğul olub və bir çox tələbə yetişdirməklə bərabər təriqətin ideya əsaslarını da işləyib hazırlayır. Onun ömrünün daha faydalı və təsirli dövrü məhz, həmin illər sayılır. Bu illərdə Şeyx Səfiəddinin təkyəsi bir dini mərkəz kimi çox böyük hörmət qazanır. Onun müridləri arasında şiə və sünnülərlə yanaşı buddistlərlə xristianların da olması onun məzhəblər və dinlər üstü bir sufi olduğuna dəlalət edir. Şeyxin sağlığında Osmanlı hökmdarlarının hər il buraya "çerağ akçesi" adı verilən hədiyyələr göndərməsi bu dinin mərkəzinin ilk dönəmlərdə Osmanlılarla normal münasibətlərdən xəbər verir.[1]

Məşhur "Məfatihul-Cinan" kitabının müəllifi, dəyərli İslam alimlərindən biri olan, "Muhəddis Qummi" kimi də tanınan mərhum Şeyx Abbas Əl-Qummi (1877-1940) özünün "Əl-kunən vəl-əlqab" əsərinin 2-ci cildinin 424-cü səhifəsində Şah İsmailin babası Şeyx Səfiyəddin Əl-Ərdəbili (Şeyx Səfi) haqqında yazır:

"O, "Qutbul-əqtab", "Burhanul-əsfiyail-kamilin" Şeyx Səfiyuddin Əbu-Fəth İshaq ibni Seyyid Əminuddin Cəbrail Əl Ərdəbili Əl-Musəvi (dir), nəsəbi İmam Musa Əl-Kazimin (ə) oğlu Həmzədə bitir".

O, 735-ci ildə Ərdəbildə vəfat etdi və (elə) orda (da) dəfn edildi. Onun yanında övladlarından və nəvələrindən (olan) Şeyx Sədruddin, Şeyx Cuneyd, Sultan Heydər və oğlu Şah İsmail, Şah Muhammәd Xudabəndə və birinci Şah Abbas (kimi şəxslər) və digərləri dəfn edilib. Ridvanullahi əleyhim əcməin (Allah onların hamısından razı olsun).

Səfəvilər sülaləsi öz adını Şeyx Səfiəddin İshaqın (1252-1334) adından götürmüşdür. Şah İsmailin altıncı əcdadı Şeyx Səfiəddin İshaq mərkəzi Ərdəbildə yerləşən nəhəng bir sufi təriqətinin əsasını qoymuşdur. Bir sıra Səfəvi mənbələrində Səfəvi əcdadlarının tarixçəsi Şeyx Səfiəddinin yeddinci əcdadı olan və

[1] Əsgər Əhməd. "Səfəviyyə təriqəti". "Kamal" jurnalı, №3(7), İyun, 2010. səh. 36

XI əsrdə yaşadığı güman edilən Firuzşah Zərrinkülahın həyatının təsviri ilə başlayır və onun yeddinci şiə imamı Museyi-Kazimin nəslindən gəldiyi bildirilir. Hətta onun vasitəsi ilə İslam peyğəmbərinin (s) əmisi oğlu və kürəkəni Həzrəti-Əliyə (ə) çatdırılır. Bəzi Səfəvi alimləri tərtib etdikləri şəcərə cədvəllərinə uyğun olaraq, Firuzşahı İmam Museyi-Kazim vasitəsilə peyğəmbər və imamlar nəslinə də bağlamışlar. Belə şəcərələrdən biri də "Aləmara"nın Y.Şükri tərəfindən əsas götürülmüş nüsxəsində əksini tapmışdır. Lakin araşdırmalar nəticəsində belə bir fikir irəli sürülmüşdür ki, "Firuzşahdan Şeyx Səfiyə qədərki şəcərə cədvəli ümumən səhih olsa da, Firuzşahı yeddinci imam Museyi-Kazimə bağlayan 14 nəsilli şəcərə Səfəvi sarayında yaşamış sonrakı müəlliflərin işidir".

XIII-XIV əsrlərdən Səfəvilərin seyyid nəsəbli olması haqqında çox məlumatlar var idi və Səfəvilər də hakimiyyətə gəldikdən sonra seyidliklərindən dövlətin daha da möhkəmləndirilməsində istifadə etdilər. Bəzi tarixşünaslar Səfəvilərin türk olmamasına dair fikirlər irəli sürmüş onların əcdadı sayılan Firuzşahın Cənubi Ərəbistandan, Kürdüstandan, hətta Fars vilayətindən köçərək Ərdəbildə məskunlaşdığını qeyd edirlər. Əlbəttə ki, bu fikir sonradan dəfələrlə təkzib edilərək sübutlarla onların əsl türk mənşəli olduqları təsdiq edildi.

"Firuzşahın vətəni darülirşad Ərdəbil idi. Şeyx Hüseyn ibn Şeyx Abdal Zahidinin sözlərinə əsasən bu xanədanın başlanğıcını qoyan Firuzşah Zərrinkülah, İran padşahı olan İbrahim Ədhəmin oğlunun göstərişi ilə Ərdəbili və ona tabe olan yerləri ona tapşırdı və bu zamandan etibarən Ərdəbil Səfəvi xanədanın mərkəzi oldu. Burada bir daha təsdiqlənir ki Firuzşah heçdə köçüb gəlməmiş, Ərdəbil bölgəsi Səfəvi nəslinin ən qədim əcdadının öz doğma vətəni olmuşdur.

Firuzşahdan sonra onun xələfləri – Əvəz əl-Xəvas, Məhəmməd əl-Hafiz, Səlahəddin Rəşid, Qütbəddin, Saleh və Cəbrayıl Ərdəbil bölgəsində yaşamış və əsasən ruhani həyat tərzi keçirmişlər.

“Deyirlər ki, Seyid Cəbrayıl da xalqı doğru yola dəvət etdi və şərəfli ömründən otuz il keçdikdə səfərə çıxmaq qərarına gələrək, Şiraz səmtinə hərəkət edib, dərviş libasında özünü Şiraza daxil etdi. Dərvişlərin gözü ona sataşdıqda bir türk dərvişini gördülər ki, Tanrının nurunun parlaqlığı onun camalında parlayır və işıldayırdı”bu sitatda da görünür ki, I Şah İsmailin yeddinci əcdadı Əminəddin Cəbrayıl Şiraza səfər etdiyi zaman orada bir “türk dərvişi” kimi şöhrət qazanmışdı.

Şah İsmyılın altıncı əcdadı Şeyx Səfiəddin İshaq da özünə mürşid qəbul etdiyi, məşhur təriqət başçısı Şeyx Zahid Gilaninin xanəgahına getdiyi ilk gündən etibarən “türk gənci” adlandırılmışdır.

Firuzşah özü çox ağıllı, dərrakəli, nurani, yaraşıqlı, son dərəcə dindar və dövrünün imkanlı şəxslərindən sayılırdı. Deyilənlərə görə İbrahim Ədhəm nəslindən olan və Bəlxdən gələrək İranı və Azərbaycanı fəth edən Sultan Ədhəm şah adlı bir hökmdar Firuzşahı Ərdəbil hakimi təyin etmiş və ona ləl-cəvahiratlarla bəzədilmiş külah (papaq) hədiyyə vermiş və guya Firuzşah məhz bu hadisədən sonra “Zərrinkülah” (Qızılpapaq) ləqəbini qazanmışdı. O, 12 il başçılıq etmək və sərvət toplamaqla məşğul oldu. Firuzşah Ərdəbil vilayətinin Rəngin məntəqəsində vəfat etmişdir. Məqbərəsi də orada yerləşir və davamçılarının ziyarətgahıdı.

Firuzşahın oğlu Əvəz əl-Xəvas Ərdəbildə yaşamış, uzun illər dindar və savadlı şəxs kimi şagirdlərə dərs demişdir. Ərdəbil əhalisinə mühazirələr oxumuşdur. Bir müddət sonra Ərdəbildən İsfərəncan kəndinə köçərək orada vəfat etmişdir.

Əvəz əl-Xəvasın oğlu Məhəmməd əl-Hafizi 14 yaşında artıq “Qurani-Kərim”i əzbər bilirdi. Məhz bu səbəbdən Hafiz ləqəbi almışdı. Məhəmməd əl-Hafizin oğlu Səlahəddin Rəşid də ruhani həyat tərzi keçirmişdi. Sahib olduğu mal-mülkü yerli əhaliyə paylamış və dərviş paltarı geyinərək Ərdəbilin Kəlxuran kəndinə gəlmiş və burada məskunlaşmışdı. Məhz bu dövrdən etibarən Kəlxuran kəndi Səfəvi əcdadlarının məsgəninə çevrilir.

Səlahəddin Rəşidin oğlu Qütbəddinin və nəvəsi Salehin zamanında Azərbaycana gürcülərin hücumu baş verdi. Qütbəddinin hücumda boynundan yaralanması onun oğlu Salehin isə bu hadisələr zamanı qətlə yetirilməsi haqqında da mənbələrdə məlumat var. Salehin oğlu və Səfiəddinin atası Əminəddin Cəbrayıl da əcdadları kimi mömin həyatı yaşamışdı. O, 30 yaşına çatarkən dərviş libası geyinərək Şiraza getmiş və orada fars seyidlərindən birinin qızı ilə evlənmişdi. Orada 2 ilə yaxın yaşayır. Bu nigahdan onun Saleh adında oğlu dünyaya gəlir. Lakin Ərdəbildə yaşayan anası ona məktub yazaraq israrla onu Ərdəbilə dəvət edir. Ərdəbildə onu Dövləti xanım adlı bir xanımla evləndirir. Dövləti xanım Ərdəbilin Baruq kəndindən idi. Cəbrayılın ondan altı oğlu və bir qızı dünyaya gəlmişdi. Səfiəddin onun dördüncü oğlu idi.

Səfiəddin kiçik yaşlarından ağlı və biliyi ilə seçilirdi. Altı yaşında ikən atası vəfat edir və anası Dövləti xanımın himayəsində böyüyür. Səfiəddin gənc yaşlarında məşhur ruhani Şeyx Nəcibəddindən dərs almaq üçün Şiraza yollanır. Həmin ərəfədə Şeyx Nəcibəddin rəhmətə gedir və Səfiəddinin bu istəyi baş tutmur. O, Şirazda olarkən qardaşı Salehi tapır, onun vasitəçiliyi ilə bəzi alimlərlə görüşür. Şair Şeyx Sədi Şirazi ilə də iki saata yaxın söhbətləşir, Mövlana Abdulla Şirazi isə bu gənc türkə Şeyx İbrahim Zahid Gilaninin (1218-1301) yanına getməyi məsləhət görür. (Şeyx Zahid əslən Lənkəranlı idi və onun türbəsi Lənkəranın Şıxakəran kəndindədir).

Şeyx Zahid öz zamanının məşhur şeyxlərindən idi, öz adı ilə “Zahidiyyə” adlanan sufi təriqətinin dini rəhbəri idi. “Onun 100 minədək müridi, 400 xəlifəsi vardı”. Səfiəddin Ərdəbilə qayıdaraq, onun mürşidliyini qəbul etdi və məşhur bir ruhani kimi formalaşdı. Müəyyən zaman sonra gənc türk dərin zəkası və yüksək biliyi sayəsində müridlər arasında seçilərək ən üstün mövqeyə sahib oldu və ustadının qızı Fatimə ilə ailə qurdu. Səfiəddinin belə hörmət qazanması, Zahidin böyük oğlu Cəmaləddini və müridlərin bir hissəsini narahat edirdi. Lakin Zahid daim Səfiəd-

dini dəstəkləyir və ona daim diqqət ayırırdı. Məhz Zahidin bu dəstəyinə görə digər müridlər də Səfiəddinin yolunu gətirirdilər. Zahid hələ ölümündən iki il əvvəl Səfiəddini özünün vəliəhdi elan etmişdi. Oğlu Cəmaləddinin və tərəfdarı olan bir qrup müridinin belə etirazlarına məhəl qoymamışdı. Zahid ölmünə üç gün qalmış öz mürşidlik əbasını və qurşağını Səfiəddinə geyindirərək, onu öz yerinə, yəni irşad səccadəsinə əyləşdirmiş və müridlərinin ona biət etməsini bildirmişdi. Lakin Şeyx Zahidin vəfatından və dəfnindən sonra Səfiəddin Ərdəbilə gəlmiş və orada öz adı ilə "Səfəviyyə" adlanacaq sufi təriqətinin əsasını qoymuşdur. Qısa müddət ərzində Ərdəbil əhalisinin sevgisini qazanmışdır. Şeyx Səfinin birinci arvadı Şeyx Zahidin, ikinci arvadı isə Əxi Süleymanın qızı olmuşdur. Onun birinci qadından üç oğlu, ikinci qadından isə iki oğlu və bir qızı vardı. Sədrəddin Musa onun Şeyx Zahidin qızı Fatimədən doğulmuş ikinci oğlu idi "Aləmara"da Şeyx Səfiəddin "din başçısı", "alimlərin böyüyü" və "ariflərin şeyxi" adlandırılır.

Şeyx Səfiəddinin ölümündən sonra oğlu Şeyx Sədrəddin Musa (1305-1392) mürşidliyi davam etdirmiş və onun dövründə həm təriqətin sıralarına qoşulan dərvişlərin sayı artmış, həm də maddi baxımdan daha da güclənmiş, genişlənmiş və böyük nüfuza sahib olmuşdur.

Sədrəddinin ölümündən sonra isə mürşidlik vəzifəsi onun oğlu Xoca Əlinin üzərinə düşmüşdür. Sultan Xoca Əli dəqiq, dürüst və dindar olmaqla yanaşı həm də qeybdən gələn sirləri açmaqda, riyazi, fəlsəfi və ilahi elmləri bilməkdə üstün bir təbəqəyə sahib olmuşdur. Müridləri ondan neçə-neçə möcüzələr, kəramətlər görmüş və ona sadiq davamçı kimi ətrafında daha da sıx birləmişdilər. O, əksər vaxtlar qara xirqə geyinərdi. Xoca Əli Şeyx Sədrəddinin üç oğlundan ən böyüyü idi. O, şiə imamlarının matəmini saxlamaq üçün qara geyinirdi. Məhz bu səbəbdən ona Xoca Əli Siyahpuş deyirdilər.

Hətta bir rəvayətə görə, Xoca Əli Əmir Teymurla dost münasibətdə olmuş və dəfələrlə onunla görüşmüşdür. Əmir Teymur

Ankara döyüşündən sonra (1402-ci il) Anadoludan qayıdarkən Ərdəbildə olmuş, Xoca Əli ilə görüşüb "Həzrət Şeyx Səfi övladına və onun astanasına vəqf olaraq" Ərdəbil ərazisində torpaqlar bağışlamışdı. Məhz, onun fərmanına əsasən Ərdəbildəki Səfəviyyə xanəgahı "bəst" elan edilmişdi. Bəst elə bir müqəddəs yer idi ki, bu statusu alan məkanlar toxunulmazlıq imtiyazına malik olurdu. Əgər təqib olunan bir kimsə orada sığınacaq alsaydı, onu orada həbs etmək olmazdı və oraya hökumət dairələri zorakı müdaxilələr edə bilməzdilər. Bu fakt Xoca Əli dövründə Səfəvilərin sufi təriqəti daxilində şiəlik meyillərinin tədricən gücləndiyini göstərməkdədir.

Xoca Əli ömrünün sonuna yaxın (təqribən 1427-ci il) Məkkeyi-Müəzzəməyə getmək qərarına gəlir. Oğlu İbrahimə Ərdəbil və Səfəvi məqbərəsini tapşırır, onu mürşid – başçı təyin edərək Məkkəyə yola düşür. Oğlu İbrahim atası ilə birgə Məkkəni ziyarət etməyi qərara alır, onun ardnca yollanaraq Həcc ziyarətini tamamlayır. Daha sonra ata-oğul Beytül-Müqəddəsə (Qüds) yola düşürlər və Xoca Əli burada vəfat edir. Oğlu İbrahim atasını orada dəfn edir (1433, Qüdsi-Xəlil). İbrahim bundan sonra atasının naibi və canişini kimi Ərdəbilə geri dönür.

İbrahim də babaları kimi Əhli-beyt (ə.m) yolunu tutur və daha geniş ərazilərdə nüfuz sahibi olmaq məqsdilə nümayəndələr təyin edərək qısa zamanda əhatəsini istədiyi kimi genişləndirir. İbrahim vəfat edir, babası Şeyx Səfinin məzarı yaxınlığında dəfn olunur. Onun altı oğlundan ən kiçiyi Cüneyd onun yerinə keçir. Belə ki, İbrahim sağlığında Cüneydi müridlərinə tapşırır və ona tabe olmağı bildirir.

Cüneydin hakimiyyəti ələ alması, təriqətin başına keçməsi yeni bir mərhələ, yeni bir cığır açır. O, ilk dəfə olaraq dünyəvi qüdrətə can atdığını biruzə verən "Sultan" ləqəbini seçir. Onun "Bədrəddin" və "Sücaəddin" ləqəbləri də olmuşdur. Ələmaradan (Sahib) alınan məlumata görə, Sultan Cüneyd 20 yaşında ikən atasının yerinə irşad səccadəsinə əyləşmişdir. Şeyx Cüneyd Azərbaycan torpaqlarını şiəlik şuarı altında siyasi cəhətdən bir-

ləşdirmək uğrunda açıq mübarizəyə qalxan ilk şəxs olmuşdur. Bu səbəbdən İraqın, Azərbaycanın hakimi, Qaraqoyunlu türkmənlərindən olan Mirzə Cahanşah təşvişə düşərək müdafiə mövqeyine keçmiş və Təbriz taxtına əyləşmişdi (1436-1467). Çünki, Cüneydin ətrafina çoxlu qüvvənin toplaması onu narahat edirdi. Qaraqoyunlu sarayında uzun-uzadı məşvərətdən sonra Cahanşah Cüneydə xəbərdarlıq məktubu göndərir və bildirir ki, səltənət sevdasından uzaq dursun. Əks təqdirdə onu və müridlərini dəf etməyi özünə vacib biləcək. Cahanşaha cavab məktubu yazmağı Cüneydin müridlərinin məsləhəti ilə elə Cüneydin özünə buraxırlar. Cüneyd sakit tərzdə məktuba cavab yazaraq Cahanşaha arxayın olmasını, onun qiyam etmək fikrinin olmadığını bildirir. Ancaq onu da qeyd edir ki: mən ibadətlə məşğulam, müridlərimlə birgə nə vaxtsa kimsə sənə qarşı qiyam qaldıracaqsa, bu Allahın əmri ilə olacaq və bu zamanda nə sən, nə heç kim bunun qarşısını ala bilməz. Bu cavabdan sonra Cahanşah gözləmə mövqeyinə keçir və Cüneydə toxunmamağı qərara alır.

Lakin iki il sonra çatdırılan məlumatların sonucusunda qəti qərara gələrək Cüneydə daha təhdidedici məktub yazaraq, onun və müridlərinin Ərdəbildən qovulduğunu elan edir. Əks təqdirdə qətliamdan belə çəkinməyəcəyini qeyd edir. Qaraqoyunluların hücumu qarşısında dayana bilməyəcəyini anlayan Cüneyd öz müridlərinə müraciət edir, Ərdəbilin viran qoyulmasına razı olmadığını bildirir və Ərdəbili tərk etmək istədiyini, müridlərinin isə onunla gəlib gəlməməyi seçməkdə sərbəst olduqlarını bildirir. Müridlərin çoxu onunla gedəcəklərini, onu tək qoymayacaqlarını bəyan etdilər.

Şeyx Cüneyd müridləri və böyük Səfəvi dəstəsi ilə birgə Uzun Həsən adı ilə məşhur olan (Əbu Nəsr Həsən bəy) Ağqoyunluların hakimiyyətinin hökm sürdüyü Diyarbəkirə təşrif buyurdu.

Şeyx Cüneyd Diyarbəkirə Uzun Həsənin yanına gəlir. Üç il burada qalır və Uzun Həsənin bacısı Xədicə bəyimlə nikaha girir. Cüneydin Xədicə bəyimdən Heydər, bir çərkəz cariyədən isə

Xoca Məhəmməd adında oglu və Paşa xatun adında qızı olmuşdur. Bəzi digər mənbələrdə onun Cəmşid adında bir oğlunun və 2 qızının olduğu da qeyd olunur.

Cüneyd Şirvanı ələ keçirmək və torpaqlarına birləşdirmək niyyətinə düşür. Şirvanşah Sultan Xəlilin (1417-1465) 20 minlik qoşunu köməyə çağırdığı Qaraqoyunlu Cahanşah və Tabasaran hakimi Əbdül-Məsumxanın 5 minlik qoşunu ilə birləşir və Cüneydin sufi cəngavərləri ilə döyüşürlər. Sultan Xəlil və müttəfiqlər qalib gəlir, Sultan Xəlil Cüneydi əsr kimi Cahanşaha göndərir.

Aləmarada qeyd olunan məlumata görə (Şükri-29-30), bu döyüş 4 mart 1460-cı ildə Tabasaranda Samur çayının sol sahilindəki Qıpçaq kəndi yaxınlığında baş vermiş və Cüneydin nəşi sufilər tərəfindən Ərdəbilə aparılıb orada dəfn olunmuşdur. Lakin məlumdur ki, döyüşdən sonra Şeyxi Qusar rayonunun Həzrə kəndində torpağa tapşırmışlar. Sonradan Şah Təhmasib 1544-1545-ci illərdə qəbrin üstündə türbə tikdirmişdir.

Cüneydin ölümündən sonra 1460-cı ildə azyaşlı oğlu Heydər öz dayısı Uzun Həsənin hərtərəfli qayğısı ilə əhatə olunaraq müridlərin başına gətirilir. Cüneydin öldürülməsi ilə Səfəvi təriqətinin ideologiyası nəinki məhv olmur, hətta, Heydərlə yeni vüsət qazanır. Azərbaycanın fəthindən sonra Uzun Həsən öz qızı Aləmşah bəyimi xüsusi rəğbət bəslədiyi Heydərə (Həlimə bəyim) ərə verir və bu nikahdan Heydərin 3 oğlu dünyaya gəlir: Sultan Əli, İbrahim və İsmail.

Digər şahlardan fərqli olaraq Ş.İ.Xətainin 12 sirli xüsusiyyəti olmuşdur. Burada istərdik ki, həmin xüsusiyyətləri də əziz oxucularımızın diqqətinə çatdıraq.

1. Ən böyük Azərbaycan dövlətini yaratmış şəxsdir. İlk dəfə Azərbaycan dilini dövlət dili elan etmişdir. Halbuki, bundan əvvəl ən böyük türk dövləti olan Osmanlı imperiyasında dövlət dili fars dili olmuşdur. İlk dəfə türk dilində, heca vəznində şeir yazmış şairdir. Türk dilində yazdığı şeirlər yayıldıqca fars dili

arxa plana keçdi. Məhz onun başladığı ənələr nəticəsində Məhəmməd Füzuli kimi dahi yetişdi.

2. Ş.İ.Səfəvi – Xətai ilk dəfə klassik güləşi xalça üzə-rinə gətirdi. Onun vaxtında Zorxanalar – yəni güləş zalları yaradılıb məşqlər təşkil edildi. Buna görə idmanın bu növü çox yayıldı. O, dahi strateq idi. Öz qoşununu 12 imamın şərəfinə 12 yerə bölüb aypara şəklində düzərdi. Zəif mərkəz ortada irəlidə, güclü atlı süvarilər isə cinahlarda yerləşirdi. Döyüş başlanan kimi cinahlardakı süvarilər sürətlə hərəkət edib başı ortaya qarışan düşmən qoşununu mühasirəyə alar və darmadağın edərdi. Bu ənənə sonralar Həzi Aslanov tərəfindən tətbiq olundu. Bu taktika ruslar tərəfindən "Aslanovskaya padkova" (Aslanov nalı) adı ilə məşhur idi.

3. Ş.İ.Xətai bir fateh idi. Tarixi Azərbaycan torpaqlarını Şimali Ağqoyunlu və Şirvanşahlar (Albaniya), cənubi Ağqoyunlunu (Atropatena) və Qaraqoyunlu (Anadolu) dövlətini vahid dövlət halında birləşdirərək güclü dövlət qurdu.

4. Döyüşdə hücum taktikasına üstünlük versə də heç vaxt ətraf ərazilərə işğal məqsədi ilə hücum etməzdi. Onun yürüşləri ya qəsbkarın hücumundan müdafiə, ya da məzlumların yardım imdadı olmuşdur. Bu da fatehlərə xasdır.

5. Şah İsmail zəmanəsinin dindar lideri olub. O, Bağdada daxil olarkən yerli əhali bu səbəbdən Bağdadın darvazalarını könüllü onun üzünə açmışdır. Məhz onun vaxtında əsrlərlə inanclarına görə təqib olunan Əhli-beyt (ə.m) davamçıları rahat nəfəs aldı və öz əqidələrini qoruyub saxladılar.

6. O ilk dəfə olaraq Əhli-beyt (ə.m) məktəbini dövlət dini elan etdi. Onun əmri ilə dövrün fiqh aliminin risaləsi Şəriət Qanunu kimi təsdiq edildi. Onun dövründə bir çox Əhli-beyt (ə.m) alimi yetişərək ölkədən kənarda da İslamı yaymağa başladı. Bunun nəticəsidir ki, bu gün Anadoluda, Hindistanda, Gürcüstanda, Orta Asiyada, Kəşmirdə, Pakistanda Əhli-beyt (ə.m) ardıcılları yaşayır. Oralarda islamı həmin dövrdə yetişən alimlər yayıb.

7. O, ağlasığmaz cəsarətə sahib bir bahadır idi. Başqa dövlətlərin başçıları çadırlarından döyüşü izlədiyi vaxt o, hələ 14 yaşında olmasına baxmayaraq qoşunun önündə gedirdi. Şirvana yürüşü zamanı yağışa düşən qoşun Kür çayının seli qarşısında tərəddüd etməyə başlayır. Ş.İ.Xətai atını çaya vurur və keçir. Bunu görən qoşun cəsarətlənib onun arxasınca gedir.

8. Çaldıran döyüşündən qabaq Ş.İ.Xətai Sultan Səlimə meydan oxuyaraq onu təkbətək döyüşə çağırır. Lakin, Sultan Səlim qorxaraq öz yerinə Osmanlıda yenilməz sayılan sərkərdəsi Malkoçoğlunu göndərir və ona hücum əmri verib, qətiyyətlə tapşırır ki, şahı (Xətaini) xüsusilə öldürsün. Malkoçoğlu irəli atılıb, Şahla təkbətək döyüşmək üçün onu meydana çağırdı. Malkoçoğlu Şahı görüb ona təslim olmasını, bu günə qədər onun əlindən heç kimin sağ çıxmadığını bildirdi.

Ş.İ.Xətai ətrafı “Şaha bir sərkərdə ilə vuruşmaq yaraşmaz” deyib, onu yayındırmaq istəmişdi. Şah cavab verir ki, istəmirəm ki, sonra döyüşdən qorxub meydana çıxmadı desinlər. Şah qılıncı ilə Malkoçoğlunun başına elə bir zərbə endirdi ki, hər iki tərəf heyrətdən “Əhsən” dedi. Şahın zərbəsi Malkoçoğlunun dəbilqəsini, zirehini və qalxanını kəsib keçərək başını iki yerə böldü. Sonra Şah öz yoluna davam etdi. Elə həmin döyüşdə qılıncı ilə topun lüləsini də kəsmişdi (“Çaldıran” döyüşü, 23 avqust 1514).

9. Ş.İ.Xətai ədalətli hakim idi. Osmanlı ilə döyüşmək istəmirdi. Lakin, şərqdə güclü dövlət görmək istəməyən Sultan Səlim Yavuz bu döyüşə qərarlı idi və 200 min ordu ilə yürüşə başlayır. Buna görə də Ş.İ.Xətai onların keçəcəyi yolu uzatmaq və ordunu aclıqla sıxmaq məqsədilə xeyli içərilərə çəkilir və yollar boyu tarlaları sahiblərinin ziyanını ödəmək şərtilə yandırıb ərzaqı məhv edir. Beləliklə, düşmən ordusunu yorğun, ac-susuz qalıb qaytmağa məcbur etmək istəyirdi.

10. O, yenilməz döyüşçü idi. “Ya Əli!” sədası qoşunun ilham mənbəyi idi. Qoşunu özündən dəfələrlə böyük qoşunu məğlub edirdi. Ağqoyunlu hakimi Ağqoyunlu Əlvəndin 30 minlik qoşu-

nuna cəmi 7 min qoşunla qalib gəlmişdi. 12 minlik qoşunla Ağqoyunlu Muradın 70 minlik qoşununu məğlub etmişdi.

Yalnız Çaldıran istisna idi. Burada Səlimin 200 minlik qoşunu və 300 topuna qarşı Şah İsmail 20 minlik süvari ilə çıxmışdı. Üç gün döyüş davam etdi. Burada qızılbaşlar qalib gələ bilərdi. Lakin, Səlim bu rüsvayçı məğlubiyyətdənsə, rüsvay olsa da qalib gəlməyi üstün tutaraq əmr etdi ki, toplardan atəş açılsın. Hər iki tərəfdən çox sayda süvari qırıldı. Çünki, atları hürküdən top səsləri döyüşü dağınıq hala saldı. Daha çox qızılbaş qırıldı. Qızılbaşlar 5 min, Osmanlılar 30-40 min arası döyüşçü itirdi.

11. Ş.İ.Xətai yenilikçi dövlət başçısı idi. Onun dövründə bir çox islahatlar tətbiq olundu. Bayrağımızdakı istiqamətləri ilkin olaraq o tətbiq edib. Türk dilini dövlət dili elan etməklə – türkçülüyü, Şəriəti dövlət qanunu elan edərək – islamçılığı və yeniliklər edərək – müasirliyi simvollaşdırdı.

12. O, Həzrəti-Əli (ə) aşiqi idi. Bütün xüsusiyyətləri ilə özünü İmam Əliyə (ə) borclu hesab edirdi. Onun üçün ideal nümunə İmam Əli (ə) idi. Cəsarətinin, uğurlarının səbəbi bu eşqdə idi.

Ş.İ.Xətaini indiki zamanla mühakimə etmək olmaz. Əgər belə etsək çoxlu hüquq pozuntusu taparıq. Zamanında da onun səhvləri olmamış deyildi. Lakin, Ş.İ.Xətainin böyük üstünlükləri olaola lazımsız xırdalıqları nə üçün axtaraq. Oun Azərbaycan üçün etdikləri danılazdır. Bu günə qədər heç bir Azərbaycanlının hökmü Gürcüstandan Fars körfəzinə, Orta Asiyadan – Bağdada, Anadoludan – Hindistana qədər keçməyib.

Şah İsmail Xətai 1524-cü il may ayının 23-də vəfat etmiş və Ərdəbildə Şeyx Səfi məqbərəsində öz babalarının yanında dəfn edilmişdir. 38 illik qısa, lakin zəngin və mənalı həyatının 24 ilini Azərbaycan Səfəvi dövlətinin istiqlaliyyəti uğrunda mübarizədə keçirmişdir.

## 1.3. ŞAH İSMAİL XƏTAİNİN HƏYATI, ŞAHLIĞI VƏ İCTİMAİ-SİYASİ MÜHİTİ

Azərbaycan Səfəvi dövlətinin banisi olacaq, Şeyx Heydərin sonuncu oğlu İsmail (25 rəcəb 892) 17 iyul 1487-ci ildə sübh çağı Ərdəbildə doğulmuşdur. Atası Şeyx Heydər, anası Aləmşah Bəyimdir.

İtaliya mənbələrinə görə, Heydərin Uzun Həsənin qızından bu 3 oğlu ilə yanaşı 3 qızı da vardı ki, onlar sonradan Şah İsmailin sərkərdələri Bayram bəy Qaramanlunun, Məhəmməd xan Ustaclunun və Həsən-Keyf hakimi Sultan Xəlilin həyat yoldaşları olmuşlar. Bundan savayı, şeyxin digər qadınlardan daha 4 oğlu (Həsən, Süleyman, Davud və Mahmud) vardı. Uzun Həsənə arxalanan Heydər Səfəvi təriqətinin qüvvətlənməsi üçün müxtəlif yollara əl atdı.

Uzun Həsən Heydərə hərtərfli dəstək olur, ona güvənirdi. Bu dövr çox vacib dövr idi. Çünki illər əvvəl təməli qoyulmuş Səfəvi təşkilatının səbrlə hazırlanmış ideoloji dəyərləri üzə çıxırdı.

Heydərin hakimiyyətə gəlişi və əsas tədbirlərdən biri 12 imam məzhəbini qabartmaq və bunun simvolu olaraq rəngli nazik ipək parçadan özü və müridləri üçün 12 guşəli tac hazırlatmaqdan ibarət oldu. Bununla da bu vasitə ilə digərlərindən fərqləndilər. Məhz Heydərin dövründən etibarən Qızılbaşlıq əsas ideyaya çevrilir.

Rəvayətə görə məhz bu qızılbaşlıq 12 yarıqlı al qırmızı tac düzəltmək imam əlaməti kimi ona yuxuda İmam Əli tərəfindən məsləhət olunub. Bu başlığa "Tac-i Heydəri" deyilirdi. Məhz Heydərin dövründən sonra yarım-köçəri türk tayfaları qızılbaş adlandırılır. Qızılbaşlar qırmızı tac qoymaqla yanaşı saqqallarını qırxıb, uzun bığ saxlayır, saçlarını isə kəsərək yalnız bir topa tük saxlayardılar.

Bu tədbirlərin heç birinə Uzun Həsən etiraz etmirdi, əksinə, dəstəkləyir və məsləhətlər verirdi.

Uzun Həsən öldükdən sonra oğlu Sultan Xəlil yerinə keçir, daha sonra qardaşını öldürən Sultan Yaqub hakimiyyətə gəlir

(1478-1490). Yaqubun hakimiyyətə gəlməsi Səfəvi-Agqoyunlu münasibətlərinə pis təsir edir. Şeyx Heydərin şimal xristianlarına qarşı cihad hücumları və uğurlu yürüşləri (1483-1487) onu narahat etməyə başlayır. Yaqub Heydərin yüksək təlim görmüş ordusunu gördükdə, taxt-tacın təhlükədə olduğunu anlayır, hətta bir başa Səfəviləri real təhlükə olaraq qiymətləndirir. Yaqub hakimiyyətə gələn kimi Səfəvi nəslinə düşmənçilik siyasətinə başlayır. Gün keçdikcə ədavət dərinləşir, vəziyyəti belə görən Heydər artıq Ərdəbildə qala bilməyəcəyini başa düşür, 1488-ci ildə həm öz atasının qisasını almaq, həm də çoxdankı Şirvan planını həyata keçirmək üçün Şirvan üzərinə hücum edir. Heydərin bu planından xəbər tutan Yaqub Şirvan hökmdarına xəbər göndərir, Heydəri və müridlərini öldürməyi məsləhət görür. Sultan Yaqub, Süleyman bəy Bicənoğlu, Türkman adlı sərkərdəsini 10 minlik qoşunla şirvanşaha yardım etməyə göndərir, Tabasaran hakimi 5 minlik qoşun ilə gəlir. Onlar Şirvanşahın 25 minlik qoşunu ilə birləşib Şeyx Heydərin müridləri ilə döyüşürlər. 9 iyul 1488-ci ildə Təbərsəranda, Şahdağın ətəklərində baş tutan döyüşdə Şeyx Heydər qətlə yetirilir. Şeyx Heydərin cəsədi ilk öncə Təbərsəranda dəfn olunsa da, 22 il sonra, 1510-cu ildə onun oğlu Şah İsmail tərəfindən Ərdəbilə köçürülmüşdür. A.Bakıxanov "Gülüstani-İrəm" əsərində şeyxin ilkin qəbrinin Təbərsərandakı Ətək mahalında Rubas çayının sol sahilində, Tinid kəndindən 1 fərsəx aralıda olduğunu qeyd etsə də, tədqiqatlar nəticəsində məzarın Xızı rayonunun Tıxlı kəndi yaxınlığında yerləşdiyi müəyyənləşdirilmişdir.[1]

1492 -ci ildə Rüstəm bəy hakimiyyətə gəlir, türkmən camaatını yığaraq məsləhətləşir və onların təklifi ilə Şeyx Heydərin oğlanları azadlığa buraxılır. Azadlığa çıxan qardaşlardan Sultan Əlini qəbul edən Rüstəm şah onları Təbrizə gətirir, xüsusi ehtiramla qarşılayır və Sultan Əliyə "Sultan Əli Padşah" titulunu

---

[1] Məşədixanım Nemət. "Azərbaycanda pirlər". Bakı, "Elm və təhsil", 2010. səh.56

verir. Qızıl at yəhəri, Ərəb atı, tac, qızıl və qiymətli daş-qaşla bəzədilmiş qılınc təqdim edərək artıq sultanlıq dövrünün başladığını elan edir. Rüstəmlə söhbətdən sonra Sultan Əli 6 ay ərzində 11-15 minlik qızılbaş ordusu toplayır və Rüstəm bəylə birgə Şirvanşahlara və Baysunqura qarşı mübarizəyə başlayır. Rüstəm güclü döyüşdən sonra qalib şəkildə Təbrizə qayıdan Sultan Əlini Təbrizin 3 fərsəxliyində qarşılayır. Lakin 6 ay sonra bir ziyafət təşkil edib yemək süfrəsində şahzadələri zəhərləyib öldürməyi planlaşdırır. Sultan Əliyə və Səfəvilərə sevgisi olan Ağqoyunlu rəislərindən biri xəbəri Sultan Əliyə çatdırır. Sultan Əli tez bir zamanda şahzadələr və 400 nəfərlik atlı dəstələri ilə birgə Təbrizi tərk edib Ərdəbilə gəlir. Rüstəm bu xəbərə çox əsəbləşir və onların ardınca Aybə sultanın başçılığı ilə ordu göndərir. Uzaqdan Ağqoyunlu ordusunu görən Sultan Əli bilir ki, bu mübarizədən sağ çıxa bilməyəcək, qardaşı İsmaili Səfəviyyə ordusunun rəhbəri təyin edib tacını onun başına qoyur, babalarının qanını almağı vəsiyyət edir və öz lələsi Hüseyn bəy Şamluya İsmailin lələsi olmağı əmr edir, qardaşlarını 7 nəfər etibarlı qızılbaşla Ərdəbilə yola salır. Ağqoyunlularla qızğın döyüş nəticəsində Sultan Əli məğlub olur və öldürülür. Sultan Əlinin nəşi Ərdəbilə bir qrup sufi tərəfindən gətirilir və anası Aləmşah bəyim Ağqoyunlu xanədanına mənsub olsa belə qarğışlar yağdıraraq lənət oxuyur. Aləmşah bəyim və Səfəvi ağsaqqallarının məsləhəti ilə İbrahim və İsmail 200 nəfər xidmətçı ilə Gilana göndərilir. Gilan valisi Mirzə Əli Karkiya onları ehtiram və böyük sevgi ilə qarşılayır. Mirzə Əli Karkiya Ağqoyunluların tabeliyində olmasına baxmayaraq, Səfəvilərlə və müridləri ilə yaxşı münasibətdə idi. İsmail burada 6 il qalır. Səfəvi tərəfdarları Şeyx Heydərin oğlanlarını çox məharət və əziyyət bahasına qoruyurlar. Bu illər ərzində Quranı öyrənir. Farscanı mükəmməlləşdirir. Tufan Gündüzün dediyinə görə, İsmail möhtəşəm Hafizi-Quran sayılır və şiəliyi də məhz burda tam olaraq mənimsəyir.

Ağqoyunlular hər yerdə şahzadələri küçə-küçə, ev-ev axtarırdılar. Ağqoyunlu casusları Şahzadələri hər yerdə axtarmağa davam edir, müxtəlif yollara əl atırdılar. Casuslardan biri Gilana

gələrək Səfəvi dostu olduğunu və şahzadələrlə görüşüb onların ayağını öpmək istədiyini lakin, yerlərini bilmədiyini bildirərək şəhərdə gəzir. Sadəlövh gilanlılardan biri şahzadələrin Əmir Kiyanın yanında olduğunu deyir. Bu xəbəri tezliklə Rüstəmə çatdırırlar. Rüstəm yenə hiyləyə əl ataraq Əmir Kiyaya məktub yazir və deyir ki, Sultan Əlinin öldürülməsinə çox üzgündür və peşmançılıq duyur. Şeyx Heydərdən yadigar qalan digər övladlarına sahib çıxmaq istədiyini, ona şahzadələri yaxşı qarşılayıb izzət göstərdiyi üçün ənam verməyə tələsdiyini bildirir. Əmir Kiya məktubu oxuduqdan sonra şad olsada hər ehtimalı düşünərək məktubu gətirən atlıya Lahicanda Şahzadələrin olmadığını, əgər olsalar onları özü şəxsən sultanın hüzuruna gətirəcəyini deyib yola salır. Əmir Kiya dərhal məktub barəsində Qızılbaş sərkərdələri ilə məsləhətləşərək onların diqtəsi ilə Rüstəmə cavab məktubu yazaraq bildirir ki, “Padşahım başına and olsun ki, onlar mənim yanımda deyillər və mən sizin razılığınız olmadan nəinki, sizin düşmənləri heç dostlarınızı belə yanımda saxlamaram. “Bu məktubdan sonra qısa müddətlik də olsa Rüstəm Əmir Kiyadan şübhələrini çəkir. Araşdırmaçılar qeyd edir ki, Əmir Kiyadan 3 dəfə şahzadələr tələb olunsa da müxtəlif bəhanələrlə onları təhvil verməməsi 1494-1497-ci illərə təsadüf edir.

Çox keçmədi ki, Ağqoyunlular sarayında qarışıqlıq yaranmağa başladı. Daxili çəkişmələr və hakimiyyət uğrunda mübarizədə Rüstəmin öldürülməsi hakimiyyətə Gödək Əhmədin gətirilməsi vəziyyəti yaxşılaşdırmadı onun siyasətindən narazı qaldıqları üçün taxtdan salıb öldürdülər. Bu hadisə də, Ağqoyunlu sarayında sakitliyi bərpa etmədi. Tarixçilərin dili ilə desək hətta 2 günün biri bir padsah taxta gətirilirdi. Təbii ki, bu vəziyyət Səfəvi övladlarına sərf edirdi. Yetəri qədər aktivləşən Səfəvilərin xəbəri sag qalan iki Ağqoyunlu varisi olan Uzun Həsən nəvələri Muradla Əlvəndin ortaq nöqtədə birləşməsinə səbəb oldu.

1500-cü ildə Murad və Əlvənd Mirzə arasına saziş imzalandı və Ağqoyunlu dövləti rəsmi olaraq iki yerə bölündü.Mərkəzi Şiraz olan ərazilər Murada, mərkəzi Təbriz olan ərazilər isə Əlvənd Mirzəyə çatdı.

İsmail və ətrafındakı Səfəvi sərkərdələri isə bu pərakəndəlikdən istifadə edib, əyalətlərdəki vəziyyətdən tez-tez xəbər alır, tezliklə Ərdəbilə yollanıb yaranmış hərc– mərcliyə son qoyaraq öz dövlətlərini qurmağa can atırdı. Lahicanda qaldığı müddətdə ətraf əyalətlərdən özünə müridlər toplayır və getdikcə güclənirdi. Əmir Kiya İsmailin hələ balaca olmasından narahat olaraq Lahicanı tərk etməməsini istəsə də zaman keçdikcə və siyasi auranın formalaşdığını hiss etdikcə fikri dəyişir və İsmailə dəstək olur.

Hicri-qəməri təqvimlə 905-ci ilin məhərrəm ayının ortasında (təxminən 22 avqust 1499-cu ildə) İsmail hakimiyyət uğrunda mübarizəyə başlayaraq, öz yaxın tərəfdarları ilə birlikdə Lahicanı tərk etdi. Bu xəbər günü-gündən yayılır və türk dilli müxtəlif qəbilələr onun ətarfında toplanırdı. Diyabəkir, Sivas, Əbivərd, Şam, Anadolu məntəqələrindən, Xəzər sahili əyalətlərdən yüzlərlə insan Heydərin oğlunun ətrafında toplanır. Bundan sonra o Deyləm, Taroma, Xal-xal, Qızılüzən sahillərinə yönəlmişdi. 1499-1500-cü illərin qışını o Astaranın Ərçivan kəndi yaxınlığında keçirdikdən sonra Ərdəbilə gəlir. Oradan isə, Qarabağ – Göyçə – Çuxursəəd istiqamətində irəliləyərək, Şərqi Anadoludakı Ərzincana gəlib çıxmışdı.

Qışı burada keçirdikdən sonra İsmail Novruzun əvvəlində (təxminən 1500-cü ilin yazında) Əlixan sultanın xəbərsiz vaxtında qəflətən Ərdəbilə daxil oldu. Qızılbaşların Ərdəbilə gəldiyini eşidən yerli camaat Ağqoyunlulara qarşı üsyana qalxır. Mənbələrdə bu say 14-15 min nəfərə çatdığı göstərilir. Səhərə yaxın Ərdəbil hakimi Əlixan da öldürülür. Ərdəbil şəhərindəki bu birlik İsmaili fərəhləndirsə də o bilirdi ki, şəhər əhalisi oturaq əhalidi və onlarla hərb işi çətin olar. Türklərin köçəri tayfaları ilk çağlarından hərbi işi mükəmməl bildiyi hər kəsə məlumdur. İsmail də, bunu bilirdi və təkcə Ərdəbilin yerli, oturaq əhalisi ilə mərkəzləşmiş dövlət uğrunda mübarizəyə qoşulmaq ağılsızlıq olardı. Bəli, Ərdəbil əhalisi bu dövlətin qurulmasında maraqlı idilər və dəstəklərini hər zaman göstərirdilər. İsmail bunların hamısını göz önünə gətirərək Ağqoyunluların Şərqi Anadoludakı

torpaqlarına üz tutaraq oradakı türkmən, yarımköçəri türk tayfalarını özünə cəlb etmək və böyük ordu yaradaraq hakimiyyət uğrunda mübarizəyə qatılmağa qərar verir. Onu da qeyd edək ki, İsmail Ərdəbili tərk edəndə şəhər İsmailin gəlişi ilə Ağqoyunlulara üsyan etmiş əhalinin nəzarəti altında olur. Ağqoyunluların nəzarəti öz öhdəsinə götürməsinə icazə verilmir.

Ərzincana gedən yolda o, Qaraqoyunlu Cahanşahın nəvəsi Sultan Hüseyn Barani ilə üzləşir. 20 min evlik elata rəhbərlik edən Baraninin də Ağqoyunlu taxtına iddiası var idi. O, istəyirdi ki, Ağqoyunluları hakimiyyətdən uzaqlaşdırıb yenidən Qara Yusif nəslini davam etdirsin. Lakin Barani İsmaillə üz-üzə gəlməyə çəkinirdi. O, hiyləyə əl ataraq, İsmaili ərazisinin bir neçə fərsəxliyində qarşılayır, hətta ona ziyafət söz verir və deyir ki, 15 minlik qoşunu ilə dəstək verib Təbriz taxtına oturmaqda ona kömək edəcək. Səhəri gün ziyafətə dəvət olunan İsmail sərkərdələrinin məsləhəti ilə xəstəlik bəhanəsi adı altında ziyafətə getməkdən imtina edir və gecə ikən Çuxursəd istiqamətinə yol alır. Bu plandan xəbər tutan Barani onlari təqib edərək döyüşə bir başa zəmin yaradır və toqquşma zamanı 4 minə yaxın döyüşçüsünü itirir. İsmail yoluna davam edir. Göyçə, Qarabagdan keçir və burada ordusu get-gedə artırdı. Hətta, bir türk araşdırmaçısı onun ata babalarının dövründən Qarabağda müridlərinin toplaşdığını yazıb...

Ərzincana çatanda İsmailin ordusunun sayı artıq 7 minə çatmışdı.Tarixçilər bu tayfalar arasında şamlu, rumlu, təkəli, ustaclı, varsaq, zülqədər, qacar, əfşar tayfalarının adını qeyd edir. Göründüyü kimi bütün tayfalar türk tayfalarıdı. Dünya tarixçilərinin bəziləri Səfəvilər dövləti yarandıqdan sonra dövləti kürd, yəhudi, fars kimi qələmə vermək istədilər. O.Əfəndiyev ilkin mənbələr əsasında Səfəvilərin təməl döyüşçülərinin kimlərdən təşkil olunduğunu sübut etdi. Aləmarada bu barədə qeyd olunur. Qarabağlı köçəri maldarlıqla məşğul olan türk tayfaları yaylaq kimi Qarabağı, qışlaq kimi isə Ərdəbildə məskunlaşması göstərilir və bu tayfalar bu ərazilərin siyasi cografiyasında mühüm rol oynayırlar..Bu barədə Tufan Gündüz yazır ki, Səfəvi dövlətinin yara-

dılmasında Azərbaycan başda olmaq üzrə Ağqoyunlu ölkəsinə daxil olan vilayətlərin (qismən də Suriyanın) türk tayfaları əsas rol oynamışdır.

Səfəvi dövlətinin qurulmasında, əlbəttə ki, Anadolu türklərinin də rolu var. Sadəcə o dövrdə Anadolu və ya Azərbaycan türkü deyib iki qola ayırmırdılar. Ümumilikdə türkmən sayılırdılar və yaşadıqları ərazidə Azərbaycan daha dəqiq desək Ağqoyunlu, Qaraqoyunlu və Səfəvilər dövlətini qurmuş türkmən elləri idi.

Ərzincanda olan qızılbaş dəstəsi Şirvan üzərinə yürüş qərara alır. Buna səbəb kimi 2 nüans var.

1.Şirvanşahlardan ata-babasının intiqamını almaq

2.Öz ordusunu Əlvənd Mirzənin güclü ordusunun qarşına çıxarmadan öncə nisbətən zəif Şirvanşahların üzərində sınaqdan keçirmək.

1500-cü ilin dekabrında nəhayət ki, Yasərin ordusu ilə İsmailin ordusu toqquşur. Bəzi tarixçilər bu ərazini Cabanı bəziləri isə Çobanı adlandırırdılar. Döyüşə 7 min nəfərlə qatılan İsmailin ilk qələbəsi, ilk uğuru idi. Tarixçilər Şirvanşah ordusunun qat-qat artıq olduğunu deyirlər. Məğlub olan Yasər qaçarakən öldürüldü. Oğlu Şeyxşah isə bütün xəzinəsini Gülüstan qalasına toplayıb, özü Şahdağına çəkilərək xəzinəsini qulamı Xosrova tapşırdı. O, sonradan Xəzər sahilindəki limandan gəmi ilə Biye-pəs Gilanına qaçmış, 1502-ci ildə Şirvana qayıdaraq, hakimiyyətə keçmişdi...

Qara Piri bəy 4 minlik qoşunla Gülüstanı mühasirəyə alsa da çətin olduğunu anlayıb İsmailə xəbər göndərir. Gülüstanı mühasirəyə alarkən İsmailə belə məlumat gəlir ki, Naxçıvanda Əlvənd Mirzə ordu toplayır. Sərkərdələri ilə məsləhətləşən İsmail Gülüstanın mühasirəsini dayandırıb Azərbaycan uğrunda mübarizəyə atılır. İsmailin Şirvanı tutması Əlvəndi qorxuya saldı. Naxçıvandakı ordu hazırlıqlarını gücləndirir və 30 min ordu toplayır. O, öz yaxın sərkərdəsi Osman sultan Türkmənə İsmailə yarı yolda zərbə vurub geri çevirməsi üçün 10 minlik qoşunla onun yolunu kəsməyə yollayır. İsmail bu maneəni dəf edərək Osman və oğlu Məhəmməd daxil 5 min Ağqoyunlu ordusunu öl-

dürür, böyük qənimətlər ələ keçirir. Bu xəbərin Əlvəndə çatması ilə geri çəkilməyə qərar verməsi çox çəkmir. Əlvənd qorxaraq İsmailə sülh müqaviləsi təklif edir. İsmailə məktub yazaraq "əcdadlarının qisasını aldın, Şirvanşahları zəbt etdin, Ərdəbili də sənə biz bağışlayarıq" deyərək bu güzəştin qarşılığında Ağqoyunlu taxt-tacına toxunmamağı təklif edir. Hətta Əlvənd Mirzə yad ölkələri tutmağı onda nöqsan görmədiyini və bu yolda ona kömək edə biləcəyini də deyir.

İsmailin cavab məktubu gecikmir. İsmail Şeyx Səfi övladlarına etdikləri hörmətsizlikləri bağışlamağa hazır olduğunu qeyd edərək padşahlıq iddiasının olmadığını, yalnız və yalnız doğru dinə rəvac verəcəyinin yeganə qayəsi olduğunu xatırladır. Məktubda yeganə istək Əlvənd Mirzənin şiəliyi qəbul etməsinin, "Əliyyən Vəliyullah" deməsinin tələbi olur. Əks təqdirdə müharibə meydanında qanlar töküləcəyini və günahsız qardaşı Sultan Əlinin də intiqamını alacağını deyərək hədələyir.

Bu cavabdan hiddətlənən Əlvənd "bunu heç vaxt etməyəcəyini və müharibəyə hazır olduğunu deyir. İsmailə isə əlindən gələni əsirgəməməyi təklif edərək güclü döyüşə hazırlaşır. Bu cavabın ertəsi günü Şərur döyüşü baş verdi. Ağır məğlubiyyətə məruz qalan Əlvənd Mirzə Gəncə ərazisində möhkəmlənmək istəsə də, mümkün olmadı və məcbur qalaraq Diyarbəkr və Qara-Həmid bölgələrinə qaçaraq Əlbistan əyalətinin hakimi Zülqədərlə ittifaq qurur.

Qaynaqlarda məhz Şərur döyüşündən sonra İsmailin Təbrizə yollanaraq taxt-taca sahib olduğu göstərilir. Bununla da Azərbaycan Səfəvilər dövlətinin əsası qoyulur. Səfəvilər dövlətinin bir Azərbaycan dövləti olmasını isə ilk dəfə elmi əsaslarla sübut edən O.Ə.Əfəndiyev olmuşdur. Bir sıra əcnəbi tədqiqatçılar isə İsmailin hakimiyyətə gələrkən özünü Azərbaycan Şahı kimi qələmə verdiyini deyir. Bu da onun Azərbaycana necə bağlı olduğunun bariz nümunəsidir.

Əlvənd Mirzənin Əlbistan hakimi Əlaüddövlə Zülqədərlə ittifaqa girib, ona qarşı ordu topladığını eşidən İsmail 1502-ci ildə Təbriz taxtını və sarayını İlyas Həlvacıoğluna tapşıraraq Ərzin-

cana doğru yol alır. Əlvənd yenə hiyləyə əl ataraq digər yolla Təbrizə daxil olur, şəhəri dağıdır və şiə əhalisini öldürməyi əmr edir. Müəyyən qaynaqlarda dəqiq sayla bağlı müxtəlif fikirlər mövcuddur. 7 min göstərilən say var ki, bununla da bəzi tarixçilər razılaşmırlar. Əlvəndin ordusunun vəhşiliyini qabartmaq üçün belə rəqəmlərin şişirdilmiş olduğunu düşünürlər.

İsmail taxta oturan kimi ilk işi, Əlvəndin topladığı xəzinəni qızılbaşlara paylaması oldu. Daha sonra isə şiəlik[1] islahatlarına başladı. Cümə günü oxunacaq xütbənin xalq arasında narazıçılığa səbəb ola biləcəyini İsmailə xatırlatsalar da o fikrindən daşınmadı. Hətta qan tökülməsi bahasına olsa belə dediyindən dönmədi. Öz ardıcıllarına məscidə yaraqlı gəlməyi və hər iki Təbrizlinin arasında bir qızılbaşın dayanmasını əmr etdi. Təbrizin əhalisinin 2/3-si sünni idi və bu qızılbaşları narahat etməyə bilməzdi. Şiə islahatlarına qarşı etiraz olarsa dərhal qətlə yetirilməli idi.

Qeyd edək ki, Şah İsmail istər ana, istərsə də ata tərəfdən olan üstünlüyündən maksimum istifadə edirdi. Ana tərəfdən Uzun Həsən, ata tərəfdən isə şəcərəsi şiə imamlarına bağlanan İsmail öz hakimiyyətini bərqərar etməsi üçün bütün mümkün ünsürlərdən istifadə edirdi. Şərqi Anadoluya üz tutan Əlvənd Mirzə orada Uzun Həsənin qardaşı Cahangir Bəyin oğlu Qasım bəy Bayandur ilə toqquşmalı olur. Onlar arasında olan döyüşdə Mardin ətrafında Qasım bəy əsir alınaraq öldürülür.

Şah İsmailin ərazisi genişlənmiş olsa da hələ də ağqoyunlulardan tabe olmayan bir neçə əyalətlər və hakimlər var idi. 1504-cü ilin 28 fevralında Rey şəhərinə gələn İsmail bu istiqamətdə hücumlarını başladılar. Vəramin ələ keçirildi. Daha sonra Gülxəndan qalasına yaxınlaşan qoşun qalanın müdafiəçisi Kiya Əş-

---

[1] "Əliyyi vəlliollah" kəlməsi Şah İsmail Xətaidən 100 illər öncə neçə-neçə dövlətlərin sikkələrində yazılıb. Nümunə olaraq: Ərğun xan 1281-ci və Qazan xan 1302-ci illər.
Deməy əvvəldən bu torpaqlarda "Şiə" (Həzrəti-Əlinin (ə) ardıcıl və tərəfdarları) olub. Şah İsmail Xətai qılınc və zor gücünə bizi şiələşdirməyib. Gəlin ədalətli olaq.

rəfə elçi göndərərək təslim olmasını istədi. Cavab olaraq Kiya Əşrəf elçini öldürdü. Hiddətlənən İsmail yürüşə özü şəxsən rəhbərlik edir və Ramazan bayramı günündə (mart 17) Gülxəndan fəth olunur. Şahın əmri ilə qala yerlə yeksan olundu. Şəvval ayında İsmail Firuzkuh qalasına yürüş edir. Qala çox möhkəm müdafiə olunurdu. Çox çətinliklə də olsa 3 günlük ağır hərbi manevrlərdən sonra qala məğlub edildi. Qalanın müdafiəçisi Əmir Əli Firuzkuh Səfəvi sarayındakı qohumu Əmir Nəcm Rəştinin xahişi ilə şaha itaət etdiyini bildirir. Üzrxahlıq edərək şiə olduğunu xatırladir və canının bağışlanmasını istəyir. Əfv edilən Əmir Əli Şah İsmaillə görüşür. Şah İsmail onu hətta Hüseyn Kiyanın əvəzinə hakim təyin edir. Firuzkuh qalası isə darmadağın edilir.

Şah İsmail bir çox nailiyyətlər əldə etsə də o, babası Uzun Həsənin sahib olduğu torpaqların hamısını ələ keçirmək məqsədi ilə İraqi-Ərəb və Şərqi Anadolu ərazilərini hələ tuta bilməmişdi. Əlvənd Mirzə və Muradı məğlub etməsi onun Şərqi Anadolu, xüsusən də Diyarbəkir ərazisinə meylini gücləndirdi. Diyarbəkir strateji olaraq İsmailin bir çox niyyətlərini həyata keçirməyə böyük qapı açırdı. Belə ki, Diyarbəkir bir başa olaraq Osmanlı sərhədlərini keçməyə imkan verir, Anadolunun və Suriyanın yarımköçəri şiə türk tayflarının Səfəvilərə olan meyillərindən istifadə edərək təbliğatı gücləndirməyə təkan verir, Anadoludakı türkmən oymaqlarını Səfəvi bayrağı altinda birləşdirir və nəhayət, Anadoludan keçən karvan yollarına birbaşa nəzarət Səfəvilərin xəzinəsinin artmasına səbəb olurdu...

İsmail ordusunun yüksək səyi və qəhrəmanlığı nəticəsində 1507-ci ildəki yürüşdən sonra Şərqi Anadolu Bütünlükdə Səfəvilərin tərkibinə qatıldı. Hətta, bir çox Ağqoyunlu əmirləri İsmailin hakimiyyətini qəbul edir. Məhz, bu hadisələrdən sonra Şah İsmailin fərmanı ilə Məhəmməd xan Ustaclu Diyarbəkir hakimi təyin edildi...

Beləliklə, “tamam Diyarbəkir mülkü Azərbaycan məmləkətinin əlavəsinə çevrildi”. Diyarbəkrin Səfəvi dövlətinin tərkibinə birləşdirilməsi böyük əhəmiyyət kəsb edən hadisə idi. Bu məsə-

ləni şərh edən O.Əfəndiyev yazır: “Babası Uzun Həsənin vətəni Diyarbəkirin Qızılbaş dövlətinin hakimiyyəti altına girməsi Şah İsmail üçün çox önəmli idi. Çünki İsmail özünü Ağqoyunlu dövlətinin qanuni varisi sayırdı”...

Şərqi Anadolu ələ keçirildikdən sonra Məhəmməd xan Ustacluya verilmiş Diyarbəkir vilayəti Səfəvi dövlətinin hərbi-strateji baxımdan ən önəmli ərazilərindən birinə çevrildi. Məhəmməd xanın üzərinə ağır yük düşürdü: o, həm Səfəvi hakimiyyətini tanımayan Ağqoyunlu əmirlərinə, həm qiyamçı kürd tayfalarına, həm Zülqədər bəyliyinin aramsız basqınlarına qarşı mübarizə aparır, bəzən isə Osmanlı və Məmlük dövlətlərinə qarşı sərhəd münaqişələrinə girməli olurdu...

Bu dövr gənc bir dövlət üçün əslində çətin idi. Dövlətin mövcud olub genişlənməsi üçün çox mübarizələrə girməli həm də siyasi cəhətdən daha çox təcrübə qazanması lazım idi. XVI əsrin əvvəllərində dünya tarixinə nəzər salsaq Səfəvilərin və ümumiyyətlə türk tarixində böyük irəliləyişləri görə bilərik. Səfəvilər genişlənməsi və mövqeyini daha da möhkəmləndirməsi üçün qonşu dövlətlərin təzyiqlərinə tab getirməsi çox vacib idi. Bu dövrdə istər siyasi, istər dini, istərsə də hərbi manevrləri düzgün etməyə hər bir dövlət diqqət yetirirdi. Nəzər salsaq Misirdən Hindistana qədər türklərin hakimiyyəti bu dövr üçün səciyyəvidir. Sadalanan ərazilərdə Osmanlılar, Məmlüklər, Səfəvilər və Şeybanilər mövcud idi və hər biri qeyd etdiyimiz məsələlərə diqqətlə yanaşır və siyasi səhv etməməyə nəzarət edirdilər. Əslində Səfəvilər kimi qisa müddətdə belə genişlənib güclənəcək bir dövlətin yaranması qonşuluqda hec bir dövlətin gözlədiyi bir hadisə deyildi. Səfəvilər onlar üçün bir növ sürpriz oldu. İsmail bunu dərk edərək eyniylə babası Uzun Həsənin xarici siyasəti ilə eyni siyasəti davam etdirir. Fərq sadəcə İsmailin həm də dini-ideoloji aspektləri də nəzərə çarpdırması olur. Məhz buna görə də sünni olan Şeybanilər və Osmanlılar Səfəviləri qəbul edə bilmirdi. İtalyan tarixçi A.Bauzani yazır ki, onlar müxtəlif dini ideologiyadan çıxış etsələr də onları birləşdirən türk olmaları idi. İsmail

məhz şiə olmasından və seyid nəslindən gələn gücündən istifadə edərək qonşu dövlətlərə təzyiq edib orada şiəliyi yaymağa çalışırdı. Düşünürdü ki, onlar müsəlmandılar və məni lider kimi qəbul etməlidirlər.

Öz şeirlərində peyğəmbər və imamlar nəslinə mənsubluğunu qabardan Şah İsmail "müsəlmanəm deyənə rəhbərəm mən" misrasından da göründüyü kimi, özünü bütün islam aləminin lideri hesab edirdi...

Məhz bu mənbədən yola çıxaraq qeyd etmək istərdik ki, Şah İsmail özünün də qeyd etdiyi kimi müəyyən mərhələdən sonra onun ərazi iddiaları genişlənmiş, hətta Fransaya qədər uzanmışdır. 1510-cu ildə Şeybaniləri məğlub etdikdən sonra Osmanlılara, daha sonra Hindistana, oradan Çinə, oradan isə Fransaya müxtəlif söz göndərir. Bunu qeyd edəcəyimiz kiçik şeir parçasında açıq –aydın görmək olur.

*Qamu Rum-u Çin-ü Xorasan-u Şam,*
*Açar bir bəy igid bunları tamam".*
*"Alıb Şam-u Rumı müsəxxər qılıb,*
*Pəs ondan həva-yi Firəng eylərəm"*

H.Braun da İsmailin bu istiqamətdəki fikirləri təsdiqləyir və bildirir ki, İsmail öz hakimiyyətini mümkün dərəcədə ən uzaq ərazilərə yaymaqda maraqlıdır. Bu istiqamətdə hətta dindən belə istifadə etməkdən çəkinmir.

Şeybani xanı İsmailə qarşı istər siyasi, istərsə də mənəvi-dini təzyiqlərini artırıırdı. O, 1501-ci ildə Səmərqənddəki çıxışında dini zibilliyənləri məhv edəcəyini bildirmişdi ki, burada da bir başa Şah İsmail nəzərdə tutulurdu. Hakimiyyətə gəldiyi ilk vaxtdan etibarən İsmailə alçaldıcı göstərişlər verərək ona İraq daruğası və mirzə deyə müraciət edir. Niyyətinin Məkkə, Mədinəni ziyarət etməsi olduğunu qeyd edərək deyir ki, Səfəvi əsgərləri nahamar yolları və körpüləri təmir etsin.

Hətta daha irəliyə gedərək iztehza ilə məqsədinin xaraba qal-

mış İraq və susuzluqdan çöllüyə çevrilmiş Ərəbistan olmadığını bildirərək əsas məqsədinin Hələb mülkü, Misir olduğunu yazdığı məktubda beytlə əks etdirir.

*Xaraba İraq deyildir məqsədim,*
*Gərək Məkkə, Mədinəni zəbt edim!"*

Ona cavab olaraq İsmail belə cavab verir.

*"Hər kim deyil candan Əli qulamı,*
*Yüz min Məkkə tutsa, yoxdur anlamı!"*

Cam şəhərindəykən Şeybanı xanın məktubunu alan İsmail Herata yönəlmədən Mərvə yollanır.

1510-cu il 22 noyabrda İsmail Mərv qalasını mühasirəyə alır...

3 gündən sonra İsmail Şeybanı xana məktub yazaraq açıq döyüşə girməyə sövq etsə də bir nəticəsi olmur.

Məhz burada Məhmudabad adlanan ərazidə, Mərvdən 3 fərsəx aralıda hər iki tərəf arasında həlledici döyüş baş verir.

Döyüşdə qüvvələr nisbəti qaynaqlarda fərqli qeyd olunur.

Əlləri Mazandaran hakiminə, başının soyularaq saman yığılmış dərisi isə Sultan II Bəyazitə göndərildi.

H.Roemer bu barədə yazırdi ki, qədim türk inancına görə qalib sərkərdə öldürdüyü düşmənin kəllə sümüyündən piyalə kimi istifadə etdiyi an düşməninin bütün gücü ona keçir. İsmail da belə edir. O, Özbək xanın kəlləsinin sümüyü qızıl suyuna salınıb, kasaya və piyaləyə çevrilərək İsmailin özü tərəfindən məclisdə istifadə olunurdu.

Digər məlumatda isə bildirilir ki Şeybani xanın ordusu geri çəkilərkən ayaqlar altında qalaraq ölüb və bozcalu tayfasından olan Əziz ağa tərəfindən başı kəsilərək şaha göndərilib…

Bu qələbə İsmailin həm siyasi, həm cografi arenada nüfuzunun yüksəlməsinə gətirib çıxartdı. Avropa mənbələrində bu qə-

ləbə haqqında İsmailə böyük rəğbətlər olduğu qeyd olunmuş, yayılan xəbərin Osmanlı və Misir məmlükləri saraylarında qorxu ab-havası yaratdığı yazılmışdı...

Şah İsmail yeni fəth olunmuş ərazilərdə mövqeyinin möhkəmləndirilməsinə xüsusi diqqət yetirirdi. O, Mərvi Abdal bəy Dədəyə, Heratı Hüseyn bəy Lələyə, Bəlxi öz yeznəsi Bayram xan Qaramanluya verdi və orada qızılbaş orduları yerləşdirildi.

Fransız tarixçisi F.Braudel də bu barədə faktı təsdiqləyir və qeyd edir ki, Osmanlıların əsas məqsədi Asiyanın mərkəzindən gələn ticarət yollarına nəzarəti ələ keçırmək idi...

Hətta özbəklərin başçısı Übeydulla xanın Sultan Səlimlə məktublaşmasından bəlli olur ki, O, Səfəvilərin şərq sərhədlərinə olan marağından əl çəkməmiş və davamlı torpaq iddialarına atılırdı...

Übeydulla xan ərazidə ağalığı ələ keçirmək məqsədilə Çaldıran döyüşündən sonra Türküstan və Xorasan vilayətlərində İsmailin öldürülməsi ilə bağlı şayə yayır. Bunların heç biri nəticə verməmiş hətta 1521-ci ildə Səfəvilərin zəiflədiyini düşünən Übeydulla xan Heratı mühasirəyə almış, lakin, yenə də məğlubiyyətlə rastlaşıb geri çəkilmişdir.

Bu dövrdə İsmail daha çox qərbə maraq göstərir Aralıq sahillərinə qədər ərazini öz torpağına qataraq Avropadan gələn ticarət və gəmi-dəniz yolu ilə olan bütün gömrük yollarına nəzarəti ələ keçirmək istəyirdi.

Səlimin 1508-ci ildə Ərzincana və Gürcüstana yürüşləri haqqında İbn Kamal ətraflı bəhs etmişdir.[1]

Bundan sonra İsmail İstanbulda Bəyazitin sarayina elçi göndərərək Səlimdən şikayət edir. Bəyazit yenidən oğluna bir sıra göstərişlər versə də yenə faydası olmur və 1509-cu ildə Ərzincana yürüş edib, qənimətlər əldə etməsi ilə bağlı faktlar da mövcuddur.

---

[1] Tevârîh-i Âl-i Osmân, səh.259-260, 272-276

Hər dəfəsində Səlimdən şikayətlənən İsmail Xorasandakı qalibiyyətindən sonra da onun bu özbaşınalıqlarının səngimədiyini görür. Bu dəfə o Bəyazitə məktub yazaraq öz iradını bildirir və Səlimi bu cür münasibətlərə son verməyə çağırmasını tövsiyə edir. İsmail Bəyazitə iki dənizin sultani deyə müraciət edir.

1512-ci ilə qədər Bəyazit və İsmail açıq döyüşə girməkdən boyun qaçırmışdı. İki dövlət arasında ciddi, həm siyasi, həm də dini məzhəb fərqlilikləri olsa da münasibətləri stabil saxlamağı bacardılar. 24 aprel 1512-ci ildən etibarən bütün idarəetməni əldən verən Bəyazit artiq qoclamış və hec bir səriştəsi qalmamışdı. Səlim məhz bu tarixdə atasına qarşı qiyam qaldırıb II Bəyaziti taxtdan saldı və regionda vəziyyət gərginləşdi.

Bu hadisədən sonra Səlim açıq savaşa girir. İsmail Səlimin bu fikrini çoxdan anlamışdı və artıq ön tədbirlər görürdü. İsmail bu məqsədlə Nurəli xəlifədən məktub yollayaraq Rum sufiləri və Anadolu Ələviləri üçün ona tapşırıqlar vermişdi…

Anadolu qızılbaşları İsmaili müqəddəsləşdirib ona pərəstiş edirdilər.

Nurəlinin ətrafına əfşar, varsaq, qaramanlu, turqudlu, bozoxlu, təkəlü, həmidelli əşirətlərindən mühüm bir qüvvət toplanmışdı.

Şahzadə Murad (qardaşı oğlu) Səfəvilərə sığınaraq Sultan Səlimə qarşı onunla birləşməyi istədi. Sultan Səlim 1512-13-cü ilin qışında öz elçisini İsfahanda qışlayan Şah İsmailin yanına göndərib ondan şahzadə Muradı təhvil verməyi, Diyarbəkr vilayətindən əl çəkməyi tələb etmişdi. Əks təqdirdə Rum ordusu ilə birgə savaşa gələcəyini və buna hazır olmağı istəmişdi. İsmail bu dəfə də onunla qarşıdurmadan çəkinir, Beyazitlə olan dost münasibətləri xatırladaraq istəklərini rədd edir. Diyarbəkir məsələsində isə Səlimə bildirdi ki, Diyarbəkir Uzun Həsənə məxsus olub və buranın davasını onunla apara bilmə iqtidarında deyil.

Şahzadə Muradın isə onun yanında qonaq olduğunu, onu verməyəcəyini bildirdi. Gələcəkdə ondan istifadə etməyi düşünsə də bu mümkün olmadı. Çünki Murad ağır xəstələndi və vəfat et-

di. Xorasana göndərilərək orada dəfn olundu.

Səlimin Səfəvilərə olan nifrəti onun Avropaya olan meyillərini azaltdı və bütün fikrini Şərqə yönəltdi.

Bütün Avropa iki türk dövləti arasında olanları izləyir və onlar üçün hansı tərərfin qalib olacağı o dərəcədə də maraqlı deyildi. Çünki nəticədə türk dövlətinin məhvi idi. Onlar ayrı-ayrılıqda gah İsmailə babası Uzun Həsənə verdikləri vədləri verir, gah da Səlimə dəstək olacaqlarını söylərdilər. Səlimi təhrik edənlərin içərisində Sünni Kürd əmirləri də var idi.

Səlim Əcəm üzərinə yürüş etməzdən öncə bu döyüşə dini-siyasi don geyindirərək bildirir ki, İsmail ilk 3 xəlifəni təhqir edib və bu yolverilməzdir. İlk 3 xəlifəyə küfr etməyin cəzasının ağır olması barədə hətta sünni üləmalarına fətva da çıxartdırır. Fətvada, "bir nəfər şiəni öldürməyin 70 nəfər İsəvinin qətlindən savab" olduğu qeyd olunur…[1]

Səfər boyunca İsmailə 3 təhqiramiz məktub yazan Səlim yalnız 3 cu məktuba cavab ala bilir. Döyüşə hazır olmasa da Səlimə layiqli cavab veren İsmail Beyazitin zamanımndakı munasibətləri misal gətirərək onu müharibədən yayındırmaq istəsə də döyüşə hazır olduğunu da qeyd edir. Təxminən avqust ayının sonlarında 4-cu və bu savaşın sonuncu məktubu yazılır. Yenidən təhqirlərinə davam edən Səlim bu dəfə İsmailə, döyüşdən qaçsan "kişi adı sənə haramdır və yaxşı olar ki, dəbilqəni yaylıqla, zirehli paltarı çadra ilə əvəz edəsən, başçılıq və sərkərdəlik sevdasından əl çəkəsən, çünki sən bu işə, bu iş də sənə yaraşmır"…

İsmail döyüşə hazır olmasa da Təbrizə gəlir və Xoy ətrafında Çaldıran çölündə düşərgə salır və ovla məşğul olur. Nəhayət, 23 avqust 1514-cü ildə iki türk dövləti qarşı-qarşıya gəldi. Ordular nisbəti mənbələrdə fərqli göstərilmişdir. 100 min osmanlılar, 40 min isə səfəvilər gostərilsə də, Ədayi Şirazi isə 100 minlik Os-

---

[1] Tahirə Həsənzadə. "Marağalı Məhəmmədhəsən xan Etimadüssəltənənin əsərlərində Azərbaycan tarixi məsələləri". Bakı, 2001. səh.181

manlı ordusuna qarşı Şah İsmailin “50 min nəfərdən çox olan güclü və dayanıqlı bir ordu” çıxardığını göstərir…

Osmanlı ordusunda 500 top və 12 min tüfəngçi ilə təşkil olunsa da Səfəvilərdə yalniz süvarilərdən ibarət ordu idi.

İsgəndər bəy Münşi yazır ki, Məhəmməd xan Ustaclı İsmailə gecə basqın etməyi, meydana yerləşməzdən öncə onları haqlamağı təklif etsə də heç bir nəticəsi olmur. Durmuş xan ilk olaraq etiraz edir. Sonda İsmail “hərami-yi qafilə” (karvanbasan quldur) deyiləm Allah necə istəyirsə elə də olacaq deyərək verilən təklifi rədd edir.

Şah Təhmasib də atasının məğlubiyyətində həmişə Durmuş xanı lənətləyərək onun səbəbkar olduğunu xatırlayaraq deyir: “Çaldıran müharibəsindən söz düşəndə mən həmişə Durmuş xana pis dua (lənət) edirəm ki, atam həzrət Şah İsmaili aldadıb müharibəyə sövq etdi”…

Müharibə başladı və İsmailin böyük şücaəti nəticəsində Sultan Səlimin güclü və sayılıb seçilən sərkərdəsi Malqucoğlu ilə təkbətək döyüşdə onu iki yerə böldü. İ.H.Uzunçarşılının məlumatlarında da bu hadisə təsdiqlənir Turəli bəy Malqoçoğlu şəxsən İsmailin həmləsi ilə öldürülüb.

İsmail böyük şücaət göstərib Osmanlı topxanasına kimi savaşa-savaşa gedir, lakin, qəfil hücumla Sultanəli bəy Əfşarın özünü şah kimi təqdim etməsi ilə əsirlikdən xilas olur.

Sultan Səlimin çadırına aparılan Sultanəli Şah İsmailə o qədər çox bənzəyirdi ki, hətta elçi kimi Səfəvi sarayında olub şahla görüşmüş Qazı Xəlil Çələbi də onun İsmail olduğunu təsdiq etmişdi. Lakin Sultanəlinin əsl kimliyi bəlli olduqdan sonra Səlim onun öldürülməsini əmr etdi…

Əxi Sultan Şamlu İsmail meydandan çıxarıldıqdan sonra döyüş bayrağını da qurtara bilir. Məğlub olan Səfəvi ordusu pərakəndə şəkildə Təbrizə tərəf üz tutub qaçanlardan savayı mənbə-

lərdə 7 minə yaxın Səfəvi ordusunun həlak olduğu göstərilir…[1]

Aləmarada Osmanlılarda topçularin olması onların hərbi üstünlüyü kimi qeyd edilir.

Səfəvilərin məğlub olmasına səbəb özunəarxayınlıq kimi göstərilsə də bir mənbədə döyüşdən öncə İsmailin Səlimlə sövdələşməsi qeyd olunur və savaşda odlu silahdan istifadə edilməyəcəyi barədə qərar qəbul olunduğu deyilir. Səlim bu təklifi qəbul etsə də döyüş zamanı bu vədinə əməl etmir…

Məhz bu səbəb və odlu silahın mövcudluğu səfəvilərin məğlubiyyətinin əsasını təşkil edir. İtaliya mənbələrində də bu barədə qeyd olunaraq deyilir ki, əgər Osmanlı topları olmasaydı Səfəvilər mütləq qalib idi və onların qarşısında heç bir dövlət dayana bilməzdi. Onun gücü Teymurləngin gücündən də yüksək olacaqdı və Şərqin mütləq hakiminə çevriləcəkdi…

Şah İsmailin bu işi təkcə siyasi məqsəd daşımırdı. O, şiəliyə dərindən inanır və bu təriqəti yaymaq üçün bütün gücünü sərf edirdi.

Əldə olan bu sənədlər onu göstərir ki, Şah İsmail çox çalışsa da ki, ortada olan ixtilaflar döyüşə gətirib çıxarmasın, amma artıq Sultan Səlim Şah İsmailin qurduğu hakimiyyəti aradan qaldırmaq fikrinə düşmüşdü. Şah İsmailin çalışmaları isə nəticə vermədi və döyüş rəcəb ayının ikisi 920-ci ildə rəsmən başladı.[2]

Diqqət edin: Rəcəb ayı dörd haram aydan biridir. Allah-təala şanlı kitabında buyurur: "Həqiqətən, Allahın yanında ayların sayı göyləri və yeri yaratdığı gündən on ikidir. Onların 4-ü haram aylardır. Bu, sabit və möhkəm dindir. Bu aylarda özünüzə zülm

---

[1] Aləmara (Sahib), səh.524; Aləmara (Şükri), səh.491. Müasir İran alimi F.Musəvi Çaldıran döyüşündə Səfəvilərin 27604 nəfər, Osmanlıların isə 41 min nəfər itki verdiklərini yazır (Tarix-i Ərdəbil və daneşməndan. I cild. səh.95-96). Onun bu cür "dəqiq" statistikanı haradan götürdüyünü bilməsək də, araşdırdığımız mənbələrin heç birində bu rəqəmlərə rast gəlmədik.

[2] Əhəd Qəzai. "Ön söz" // Şah İsmail Səfəvi (Xətai) külliyyatı. Qəzəllər, qəsidələr, nəsihətnamə, dəhnamə, qoşmalar. (Tərtibatçısı: Mirzə Rəsul İsmailzadə). Bakı, Əlhuda, 2004. səh. 11

etməyin…” (“Tövbə”, 36). Dörd haram ay Rəcəb, Zilqədə, Zilhiccə və Məhərrəm aylarıdır. Bu ayların haram hesab edilməsi İbrahim peyğəmbərin (ə) dininə əsaslanır, sonradan ərəblər cahiliyyət və bütpərəst vaxtlarında da bu ənənəni davam etdirmişlər. İlk ay Rəcəb tək, qalan üç haram aysa ardıcıl gəlir. İslam hərtərəfli din olduğundan həm əmin-aman məkanı (Məkkə şəhəri), həm də əmin-aman zamanı (haram aylar) var.

Çaldıran faciəsi yarandı. 14 gündən sonra Osmanlı ordusu Təbrizi işğal etdi.

Əlbəttə, bu qələbə uzun çəkmədi. Sultan Səlim Təbrizdə qala bilmədi. Osmanlılar kafirlərlə döyüşməkdə daha ciddi və daha könüllü bir ordu kimi şöhrət qazanmışdılar. Osmanlı ordusunda olanlar Təbriz əhalisinin də müsəlman olduğunu gördükdə onlarla döyüşməyə həvəskar olmadılar. Hətta tarixi rəvayətlərə əsasən qoşun adamları gecələr məktub yazıb ox-kamanla Sultan Səlimin çadırına tullayaraq onu müsəlmanları öldürüb qırmaqdan vaz keçməyə çağırırdılar. Həmin kağızların birində belə yazılmışdı:

“Sünnilər kimi beş vaxtda azan deyən, dəstəmaz alıb namaz qılan, oruc tutan, Quran oxuyan, həccə gedib “La ilahə illəllah, Muhamməddən rəsulullah” deyən ölkənin əhalisini hansı şəriət qanun və dəlilinə əsaslanıb qırmaq olar... biz İranlıların əleyhinə din adına savaşmayacağıq...”[1]

Bu kimi səbəblərə görə Sultan Səlim səkkiz gündən artıq Təbrizdə qala bilməyib şəhəri tərk etdi və şəhər yenə də Şah İsmailin əlinə keçdi. Buna baxmayaraq o, müharibədən sonra siyasi və dövləti işlərinə ciddi çəkildə qoşula bilmədi və deyilənlərə

[1] Əhəd Qəzai. “Ön söz” // Şah İsmail Səfəvi (Xətai) külliyyatı. Qəzəllər, qəsidələr, nəsihətnamə, dəhnamə, qoşmalar. (Tərtibatçısı: Mirzə Rəsul İsmailzadə). Bakı, Əlhuda, 2004. səh. 11-12

görə, ömrünün sonuna kimi daha ürəkdən gülmədi”.[1]

Bir çox mübahisəli cəhətlərə malik olmasına baxmayaraq Əhəd Qəzainin bu fikirləri bizim üçün ona görə qiymətlidir ki, onlar Ş.İ.Xətainin şəxsiyyətinin ayrılmaz tərkib hissəsini təşkil elən islami dünyagörüşünü və Əhli-beyt (ə.m) məhəbbətini bütün aydınlığı və genişliyi ilə özündə əks etdirir. Şairin ədəbi irsinin böyük bir hissəsinin dini əsərlərin təşkil etməsi də elə buradan irəli gəlir. Halbuki, Sovet ideologiyasının bəlli tələbləri üzərində qurulan Azərbaycan ədəbiyyatşünaslığı uzun müddət bu aparıcı cəhətə göz yummuşdur.

***

XVI əsrin əvvəllərində Səvəfilər dövlətinin hakimiyyəti dövründə Azərbaycan mədəniyyəti yenidən canlanmağa başladı. Azərbaycan dilinə yüksək maraq, bu dilin rəsmi dövlət dili elan edilməsi Şah İsmailin Vətənə, xalqa olan böyük xidmətlərindən biridir. Bu bacarıqlı dövlət xadimi köhnə ənənələrə qarşı çıxaraq yaratdığı dövlət və sarayda Azərbaycan dilinin həyati əhəmiyyətini bir daha qətiyyətlə göstərdi.

Bu zaman sarayda danışıq dili Azərbaycanca, dövlətlərarası yazışmalar Azərbaycan və Fars dillərində, hərbi rütbə və divanxana istilahlarının çoxu yenə də Azərbaycan dilində idi. Bu tarixi həqiqət haqqında məşhur rus alimi, şərqşünas V.V.Bartold belə yazırdı: “…Xanədanın təşəkkül etdiyi yerdə Azərbaycan əhalisi hələ o zaman türkcə (azərbaycanca – Əzizağa Məmmədov) danışırdı və türkcə yazırdı. Nəticədə Səfəvilər dövlətində türk dili saray və ordu dili olaraq qaldı”.[2,1]

---

[1] Əhəd Qəzai. “Ön söz” // Şah İsmail Səfəvi (Xətai) külliyyatı. Qəzəllər, qəsidələr, nəsihətnamə, dəhnamə, qoşmalar. (Tərtibatçısı: Mirzə Rəsul İsmailzadə). Bakı, Əlhuda, 2004. səh. 12

[2] Vasili Vladimiroviç Bartold. “Xəlifə və sultan”. “İslam dünyası”, I cild, №3, Peterburq, 1912. səh. 318

Səfəvi dövlətinin siyasi hüdudları daxilində yaşayan və əhalinin tərkib hissəsinə görə yerlərdə əksəriyyət təşkil edən azərbaycanlı hakimlərinə saray tərəfindən rəsmi fərmanlar, əmrnamələr azərbaycan, fars əhalisinin hakimlərinə isə fars dilində göndərilmişdir. İlk mənbələrdən aydın olur ki, Şah İsmail və sonra onun oğlu Şah Təhmasib xarici dövlətlərlə olan yazışmalarını azərbaycan və fars dillərində aparmışdır. Bu baxımdan Leninqraddakı (Peterburq) Şərqşünaslıq İnstitutunun əlyazmalar bölməsində mühafizə olunan (Ali Mustafa Çələbinin tərtib etdiyi – Əzizağa Məmmədov) "Münşəat" çox qiymətli bir mənbədir.[2,3]

[1] Əzizağa Məmmədov. "Şah İsmayıl Xətainin əsərləri" // Şah İsmayıl Xətai. "Əsərləri". İki cilddə, 1-ci cild. (Tərtib, müqəddimə, lüğət və izahlar: Əzizağa Məmmədov). Bakı, "Azərnəşr", 1975. səh. 8
[2] Vasili Vladimiroviç Bartold. "Xəlifə və sultan". "İslam dünyası", I cild, №3, Peterburq, 1912. səh. 8
[3] Əzizağa Məmmədov. "Şah İsmayıl Xətainin əsərləri" // Şah İsmayıl Xətai. "Əsərləri". İki cilddə, 1-ci cild. (Tərtib, müqəddimə, lüğət və izahlar: Əzizağa Məmmədov). Bakı, "Azərnəşr", 1975. səh. 8

## 1.4. ŞAH İSMAİL XƏTAİNİN BAĞDADA DAXİL OLMASI

Hicri-qəməri təqvimi ilə 914-cü il cəmadiyül-axir ayının 25-i, hicri-miladi təqvimi ilə 21 oktyabr 1508-ci ildə Şah İsmail Bağdad şəhərinə daxil olur. Bu zaman əhali "dövlət – Şah İsmail Bahadır xanın dövlətidir, qılınc – qızılbaş qazilərinin qılıncıdır" deyərək küçələrə tökülür. Şahın fərmanı ilə Xadim bəy Xüləfa Bağdad hakimi təyin edilir.[1] Bunula da Şah İsmailin öz babası Uzun Həsənin məmləkətinə sahib olmaq istiqamətində apardığı fəaliyyət əsasən başa çatır. Abbasilər sülaləsindən olan keçmiş ərəb hökmdarlarının beş əsr ərzində paytaxtı olmuş Bağdad şəhərinin öz türkman döyüşçüləri tərəfindən fəthinə xüsusi əhəmiyyət verən Şah İsmail bu tarixi hadisəni bir şeirində belə vəsf etmişdir:

*Yetdikcə tükənir ərəbin kuyi-məskəni,*
*Bağdad içində hər necə kim türkman qopar.*[2]

Bu beytə istinad edən M.Qasımlı haqlı olaraq yazır ki, "Xətai özünün mənəvi kökünü Həzrəti-Əliyə (ə) bağlasa da ərəb mənşəli olmağı qəbul etmir və ərəblərə təəssübkeşlik hissi ilə yanaşmır". Tədqiqatçının fikrincə, yuxarıda qeyd olunan "misralar onun məhz türk-türkman oymaqlarından qürur duyduğunu açıq şəkildə göstərməkdədir".[3]

---

[1] Aləmara (Sahib). səh. 165, Əhsənüt-təvarix (Seddon), səh. 103. digər bir məlumata görə, Şah İsmail Bağdada cəmadiyül-axir ayının 20-də daxil olmuşdu: Tarix-i aləmara-yi Abbasi (Bakı), səh. 99

[2] Şah İsmayıl Xətai. "Əsərləri". İki cilddə, 1-ci cild. (Tərtib, müqəddimə, lüğət və izahlar: Əzizağa Məmmədov). Bakı, "Azərnəşr", 1975. səh. 154

[3] Məhərrəm Qasımlı. "Şah İsmail Xətainin poeziyası". Bakı, "Elm", 2002. səh. 63

Mühüm şiə mərkəzlərinin yerləşdiyi İraqın fəthi dini-ideoloji cəhətdən də önəmli idi. Şah İsmail Nəcəf, Kərbəla, Samirə və Kazimeyndəki şiə ziyarətgahlarında olub, həmin məqbərələrə qiymətli hədiyyələr bağışladı, həmçinin orada bəzi təmir-tikinti işləri apardı.[1] Şah həmçinin İraqi-Ərəbdə əvvəllər mövcud olmuş bir suvarma kanalını bərpa etdirib, onu Həzrəti-Əlinin (ə) Nəcəfdəki məqbərəsinə vəqf etdi. Bu kanal “Nəhri-şahi” (Şahın çayı) adı ilə məşhurlaşdı.[2,3]

***

1508-ci ilin sonlarında İsmailin ordusu İraqdan İranın cənub-qərb bölgələrinə daxil oldu. Həmin regionda Səfəvi hakimiyyətini tanımayan iki müstəqil əmirlik mövcud idi: Məlikşah Rüstəmin başçılığı ilə mərkəzi Xürrəmabad olan Luristan əmirliyi və paytaxtı Hüveyzədə yerləşən, Sultan Fəyyaz tərəfindən idarə olunan Xuzistandakı Müşəşəi əmirliyi. Xandəmirin və Bicanın məlumatına görə Şah İsmail Hüveyzə üzərinə gedərkən yolüstü Məlikşah Rüstəmə qarşı Əmir Nəcməddin Məsud, Bayram bəy Qaramanlu və Hüseyn bəy Lələ başda olmaqla 10 minlik qoşun göndərmiş, özü isə əsas qüvvələrlə birgə Müşəşəi ordusunu məğlub edib, Hüveyzəni tutmuşdu.

Daha sonra Məlikşah Rüstəm onun Şüştər yaxınlığındakı düşərgəsinə gəlib itaətini bildirmişdi.[4]

Lakin bizim müəllifin şərhinə əsasən Şah İsmail özü şəxsən əvvəlcə Rüstəmin, sonra isə Fəyyazın üzərinə getmişdi. Mənbədə qeyd olunur ki, Bağdadın fəthindən sonra Xürrəmabad bölgəsində hökmranlıq edən və 40 min evlik Lur tayfasının başçısı olan Məlikşah Rüstəm, Səfəvi hakimiyyətini tanımaqdan imtina

---

[1] Aləmara (Sahib). səh. 166-168, Aləmara (Şükri), səh. 127-129

[2] Zühur-i dövlət-i Səfəviyan, v. 67b

[3] Namiq Musalı. “I Şah İsmayılın hakimiyyəti” (“Tarix-i aləmara-yi Şah İsmayıl” əsəri əsasında). Bakı, “Elm və təhsil”, 2011. səh.172-173

[4] Həbibüs-siyər, səh. 496-499, Cahanguşa-yi xaqan, səh. 293-296

etdi. Bu irandilli tayfa şiə məzhəbli olub, heç bir dövlətin birbaşa tabeçiliyinə keçməmiş, hətta fürsət düşdükcə Qaraqoyunlu və Ağqoyunlulara da xərac verməmişdi. Tacir karvanlarına aramsız basqınlar təşkil edən Lurlar bölgədən keçən ticarət yollarını iflic vəziyyətinə salmışdılar.

Zəncir qalasına gələn Şah İsmail oradan Luristan hökmdarına qarşı əməliyyatlara başladı. Qızılbaş ordusunun yaxınlaşdığını eşidən Rüstəm öz sərkərdəsi olan əmisi oğlu Şah Mənsuru 15-20 minlik qoşunla yolun üstünü kəsməyə göndərdi. Şah İsmail isə Həsən bəy Halvaçıoğlunu qızılbaşların 5 min nəfərlik ön dəstəsinə komandan təyin edib irəli yolladı. Əksəriyyəti piyada olan və dağlarda yaxşı döyüşə bilən Lurlardan fərqli olaraq, qızılbaşların hamısı süvari olduqlarından və düzənlikdə döyüşməyə alışdıqlarından onlar üçün dağlarda hərbi əməliyyat aparmaq çətin idi. Qızılbaşları dağlara cəlb edən və yüksəkliklərdə əlverişli mövqe tutmuş Lurlar döyüşün əvvəlində Səfəvi ordusunu ağır itkiyə məruz qoydular və qızılbaşlardan 500 nəfəri qətlə yetirdilər. Lakin Qızılbaş komandanlığı "Turan taktikası" və ya "Qurd oyunu" adlanan qədim türk savaş üsuluna uyğun hərbi manevr edərək, yalandan yarım fərsəx geri çəkilib Lurları tələyə salmağa nail oldu. Belə ki, Lur ordusunun yalnız ¼ hissəsi süvari, qalanları isə piyada idilər. Qızılbaşlar geri çəkilərkən onları təqib edən Lurların piyadaları öz süvarilərindən xeyli arxada qaldılar, bəzi Lur döyüşçüləri qızılbaşların atıb getdikləri malları toplamağa başladılar və Lur ordusu arasında böyük bir nizamsızlıq və pərakəndəlik yarandı. Qızılbaşlar Lur süvarilərini məğlub etdikdən sonra rəqibin piyadalarının da öhdəsindən gəldilər. Nəticədə, Lurlardan minlərlə döyüşçü qətlə yetirildi. Qolundan yaralanmış Şah Mənsur qoşununun qalıqları ilə meydandan qaçdı və özünü zorla yaxınlıqdakı dağlara yetirdi. Bu qələbədən sonra Şah İsmailin başçılıq etdiyi əsas qüvvələr gəlib çatdı. Qızılbaş ordusunun Xürrəmabad üzərinə yeridiyini görən Rüstəm öz paytaxtını tərk edərək, Sədmərə dağına çəkildi. Xürrəmabadı döyüşsüz ələ keçirən İsmail Sədmərəyə hərəkət etdi.

Bu döyüşlərdə Durmuş xan Şamlu, Həsən bəy Halvaçıoğlu, Məntəş sultan Ustaclu, Div sultan Rumlu, Mirzə Məhəmməd Talış, Mənsur bəy Qıpçaq, Hüseyn bəy Lələ, Abdal bəy Dədə, Çayan sultan Ustaclu, Köpək sultan Ustaclu, Badımcan (Badıncan) sultan Rumlu kimi adlı-sanlı qızılbaş sərkərdələri, həmçinin, şahın qardaşı İbrahim Mirzə də iştirak edirdi. Şah İsmail Sədmərəyə yaxınlaşıb, Rüstəmə məktub yazaraq, özünün Həzrəti-Əli (ə) nəslindən olduğunu, şiəliyə rəvac verdiyini vurğulayaraq, şiə məzhəbli Luristan hökmdarını itaət etməyə və "qalxıb, xəlayiqin pənahı olan dərgaha gəlməyə" dəvət etdi. Lakin Rüstəm vaxtı ikən Şeyx Heydərin qulamlarından olmuş qızılbaş elçisi Fərrux ağaya şahın təklifini rədd etdiyini bildirdi. Bu cavabdan sonra şahın başçılığı altında Qızılbaş ordusu piyada olub, çətin, lakin qəti əməliyyat nəticəsində Sədmərəni fəth etdi. Əsir alınmış Rüstəm bağışlanmasını xahiş edərək Səfəvi hakimiyyətinə keçdiyini bildirdi və İsmailə biət etdi. Şah İsmail onu əfv edərək, Luristan hakimiyyətinə təsdiq etdi, həmçinin ona hədiyyələr bağışlayaraq, onun saqqalının cavahirlə bəzədilməsini əmr etdi. Rüstəm də öz növbəsində şaha çoxlu peşkəş (cavahir, at, qatır, dəvə, qızıldan və gümüşdən hazırlanmış, daş-qaşla bəzədilmiş məclis ləvazimatı, üzərinə qiymətli qaşlar vurulmuş yəhər və yüyən) təqdim etdi.[1,2]

Xuzistandakı Müşəşəi hərəkatını ram edilməsi Şah İsmail üçün daha vacib idi. Bədəvi ərəb mühitində yaranmış Müşəşəi hərəkatının banisi Seyid Məhəmməd ibn Fəllah 1441-ci ildə öz dövlətini qurmuş və ondan sonra nəsli həmin bölgədə hökmranlıq etmişdi. Müasir italiyalı şərqşünas B.S.Amorettinin tədqiqatlarından bəlli olur ki, Əliallahı əqidəsində olan Müşəşəi liderləri ifrata vararaq, hətta, özlərini ilahiləşdirirdilər.[3]

---

[1] Aləmara (Sahib) səh. 171-179; Aləmara (Şükri), səh. 130-135

[2] Namiq Musalı. "I Şah İsmayılın hakimiyyəti" ("Tarix-i aləmara-yi Şah İsmayıl" əsəri əsasında). Bakı, "Elm və təhsil", 2011. səh.173-175

[3] The Cambridge History of İran, vol. VI, p. 625-629

“Aləmara”da Müşəşəi hərəkatının dini-inancları ilə bağlı unikal məlumatlar mövcuddur. Bu baxımdan Müşəşəi barədə İsmaili məlumatlandıran Məlikşah Rüstəmin informasiyası maraq doğurur: “Cənub vilayətində bir ölkə var ki, oraya Hüveyzə deyərlər. Oranın ərəb camaatı bundan əvvəl Əliallahı dininə etiqad edirdi. İndi isə onların arasında Məlik Fəyyaz Müşəşəi adlanan bir şəxs peyda olub ki, Firon kimi tanrılıq iddiasına düşüb və hal-hazırda ona sitayiş edirlər”. Şiəliyin “isna-əşəri” (12 imam) cərəyanını rəsmi dövlət dini elan etmiş şah İsmail üçün seyid mənşəli bir sülalənin başçılıq etdiyi belə ifrat hərəkat ideoloji cəhətdən olduqca təhlükəli idi.

Yerli şəraiti yaxşı bilən Lurların bələdçiliyi ilə Xuzistana daxil olan qızılbaşlar elə ilk döyüşdəcə ərəb ordusunu ağır məğlubiyyətə uğratdılar. Döyüşün əvvəlində Hüseyn bəy Lələnin çərxçi dəstəsi ərəblərə həmlə etdi. Ərəb sərkərdələri Neəm ibn Numan və Sultan Məni başda olmaqla 5 min ərəb döyüşçüsü qətlə yetirildi. Fəyyazın döyüşə əlavə qüvvələr qatması da onun vəziyyətini xilas edə bilmədi. Şah İsmailin başçılığı altında ehtiyatda durmuş qızılbaş ordusu qəti həmlə ilə ərəb qoşunlarını darmadağın etdi. Səfəvi hökmdarının şəxsi igidliklərindən bəhs edən “Aləmara” müəllifi yazır ki, “o həzrət atını mahmızladı, iti qılıncının qəbzəsinə əl ataraq, o bədbəxtlərin başlarına vurmağa başladı, qılınc zərbi ilə həmin qoşun dəryasını yardı və onların hamısını tar-mar eylədi”. Döyüşün gedişində bir sıra ərəb döyüşçülərini öldürən İsmail Fəyyazın kürəkəni Nəimin başına qılınc zərbəsi vurub, onu qətlə yetirdi, həmçinin Pəhləvan Möhsün adlı ən məşhur ərəb sərkərdələrindən birini atdan aşırıb, onu yaxınlıqda olan şamlu tayfasının bir döyüşçüsünə tapşırdı.

Vahiməyə düşən Fəyyaz ordusunun qalıqlarını götürüb Hüveyzə şəhərinə çəkildi. Hüveyzədə keçirilən müşavirədə ərəb sərkərdələri sabah səhranın dərinliklərinə çəkilib gözdən itməyi, şahın Hüveyzəyə yeni hakim təyin edib getməsindən sonra yenidən hücuma keçib Hüveyzəyə daxil olmağı planlaşdırdılar. Lakin, belə bir variantın mümkünlüyünü anlayan İsmail gecə

ikən səhraya gedən yolu bağladı. Səhəri gün baş vermiş həlledici döyüşdə ərəb ordusu tamamilə darmadağın edildi. Döyüşün qızğın çağında Fəyyazla üzləşən İsmail onu qətlə yetirdi: "Məlik Fəyyazın gözü o həzrətə sataşdıqda onu tanımadı, gördü ki, bir qızılbaş cavanı ərəblərə qılınc vuraraq cəsarətlə döyüşür. O həzrətin üzərinə gəldi və öz nizəsini onun mübarək sinəsinə tuşladıqda o həzrət onun nizəsini özündən rədd edib, öz nizəsini Məlik Fəyyazın qarnına soxdu". Bu qələbə nəticəsində Xuzistanı tabe edən qızılbaş ordusu xeyli qənimət ələ keçirərək, Təbrizə yollandı. Şah İsmail qayıdarkən Məlik Fəyyazın qohumlarından Səfəvi tərəfdarı olan sultan Vəhhab adlı birisini Xuzistana vali təyin etdi.[1] Bununla da Müşəşəi hökmdarlarının Xuzistandakı müstəqil hakimiyyətinə son qoyuldu və Səfəvilərin vassalı olmuş Müşəşəi hakimlərinin dövrü başladı.[2,3]

***

Şah İsmailin cəddi (ulu babası) Şeyx Səfiəddin Ərdəbili Şeyx Zahid Gilaninin şagirdi idi. Şeyx Zahidin övladları hal əhli olmadığından atalarının yolunu apara bilmirdi. Bunu hiss edən Şeyx Zahid Gilani Şeyx Səfiəddin Ərdəbilini öz yerində mürşid təyin etmək üçün onu Sultani-Aləmin hüzuruna göndərdi ki, Sultani-Aləmə baş versin, kəmərbəst olsun və ondan sonra mürşidinin yerində əyləşsin. Yəni, Şeyx Zahidin vəfatından sonra müridlərin ixtiyarını əlinə alsın və həmin müridlərə mürşid olsun. Şeyx Səfiəddin mürşidinin əmri ilə Sultani-Aləmin hüzuruna gedir, Sultani-Aləmin cəmdə əyləşdiyini görür və gördüklərindən təəccüb edir. Belə ki, Sultani-Aləmin məclisində qadın

---

[1] Aləmara (Sahib). səh. 179-188, Aləmara (Şükri), səh. 135-138

[2] Fəqət H.R.Roemer Sultan Fəyyazın qardaşı Seyid Fəllahın Səfəvi vassalı olan ilk Xuzistan hakimi olduğunu yazmışdır. The Cambridge History of İran, vol. VI, p. 217.

[3] Namiq Musalı. "I Şah İsmayılın hakimiyyəti" ("Tarix-i aləmara-yi Şah İsmayıl" əsəri əsasında). Bakı, "Elm və təhsil", 2011. səh. 175-177

və kişinin eyni yerdə əyləşdiyinin şahidi olur, məhrəm və namərəm olduqlarını güman edir və Sultani-Aləmin hüzurunu tərk etmək istəyir. Batinən Sultani-Aləm bunu hiss etdiyindən onu saxlatdırır və ona bir dənə cəbə (qutu) verir və buyurur ki, “bu cəbəni aparıb verərsən Şeyx Zahid Gilaniyə”. Şeyx Səfiəddin cəbəni alır və Şeyx Zahid Gilaninin yanına qayıdır. Gətirdiyi cəbəni Şeyxə verir. Mürşidi cəbəni açır və içərisində su, od, pambıq olduğunu görür. Od pambığı yandırmayıb, su isə odu söndürməyib. Batin sirrindən agah olan Şeyx Zahid Gilani deyir ki, “Şeyx Səfi, sən şəkk eləyibsən, nə üçün şəkk edibsən?”

Şeyx Səfi dedi ki, Cəmxanada arvadla kişi yanaşı oturmuşdu. Ona görə də şəkk elədim. Şeyx Zahid buyurdu: “O yerdə ki, Sultani-Aləmin zatı Sultani-Sərcəm olsa, orada xəta olmaz. Şeyx səhv eləyibsən. Get tövbə eylə. Bəlkə bu dəfə kəmərbəstliyi ala biləsən”.

Şeyx Səfi yenidən Sultani-Aləmin xidmətinə qayıdır, ikinci dəfə kəmərbəstliyini ala bilir. Sonra Şeyx Zahidin yanına qayıdır. Şeyx öz qızını ona verir və öz yerində mürşid təyin edir. Buyurur ki, bundan sonra müridlərin mürşidi sənsən.

Rəvayətlərdə deyildiyinə görə, iki böyük şəxs Sultani-Aləm Zamanı Sultani-Aləmə “sərsupur”də (baş verib) olubdur: Şeyx Səfiəddin Ərdəbili və Şah Nemətullah Vəli.

Şeyx Səfiəddin Sultani-Aləm hüzurunda olarkən Sultani-Aləmə baş verir və kəmərbəst olur. Sultani-Aləm Şeyx Səfiyə buyurur: “Şeyx Səfi sənin övladlarından 11-nə padşahlıq vermişəm”.

Tarixə nəzər saldıqda bu deyilənlərin həqiqət olduğunun şahidi oluruq. Belə ki, 1501-ci ildən 1736-cı ilə qədər 235 il ərzində 11 şah olmaqla Azərbaycan Səfəvilər dövlətinə rəhbərlik etmişlər.

Həmin şahlar bunlardır:

**Azərbaycan Səfəvilərinin dövlət dövrü (1501-1736)**

| Sıra sayı | Səfəvi şahlarının adları | Hakimiyyət dövrü |
|---|---|---|
| 1 | Şah İsmail Xətai | 1501-1524 |
| 2 | I Şah Təhmasib | 1524-1576 |
| 3 | II Şah İsmail | 1576-1577 |
| 4 | Şah Məhəmməd | 1578-1587 |
| 5 | I Şah Abbas | 1587-1629 |
| 6 | I Şah Səfi | 1629-1642 |
| 7 | II Şah Abbas | 1642-1666 |
| 8 | Şah Süleyman | 1666-1694 |
| 9 | Şah Sultan Hüseyn | 1694-1722 |
| 10 | II Şah Təhmasib | 1722-1732 |
| 11 | III Şah Abbas | 1732-1736 |

Sultani-Aləmin (Sultan Sahak) zamanı qurtarandan sonra Şah Qırmızı vücuda gəlibdir. Böyüyüb Sultani-Aləmin yerində mövlalıq eyləyib, şəhadət məqamına çatıb. Deyilənlərə görə onun cəsədin doğrayıb Servan çayına töküblər. Bu, zahirən belə olsa da batinən Şah Qırmızı pərdə çəkir. Oğlu Şah Məhəmməd bəy dünyaya gəlir. Zahir aləmində Şah Məhəmməd bəy böyüyüb sərdar olur və Xuzistan mahalında şiə hökuməti yaradır. Şah Məhəmməd bəy öz dövlətini Müşəşəi (şölə verən) adlandırır.

Şah Məhəmməd bəyin zamanında yaşı yuxarı bir seyyid var idi. Həmin seyyidin adı Seyyid Məhəmmədi Nurbəxş (nur bəxş edən) idi. O, çox böyük qövm-qəbiləsi olan ağsaqqal bir seyyid idi. Hamının hörmət və məhəbbətini qazanmışdı. S.M.Nurbəxş özü də yeddinci imam Museyi-Kazımın (ə) nəslindəndir. Şah Məhəmməd bəy cavan idi. O, həmin dövrdə Seyyid Nurbəxşlə görüşdü. Seyyid Şah Məhəmməd bəyi tanıdı, ona mürid oldu. İstədilər ki, Əsrari-həqiqət (həqiqət sirrləri) açılmasın, ta ki, Şah Məhəmməd bəyin şəcərəsi və kimliyi gizli qalsın. Onu da qeyd edək ki, Şah Məhəmməd bəy öz zamanında adına sikkə vurdurmuş və müridlərinə təbərrük kimi bəxş etmişdir. Sikkənin üzə-

rində ərəb dilində "Sahib-əz Zaman" sözləri yazılmışdır. Bu sikkə ancaq "Əhli-həqq" təriqətinə mənsub olan şəxslərə verilirdi.

Kumeyl ibn Ziyad mömünlər ağası Həzrəti-Əlidən (ə) "Həqiqət nədir?" – deyə sual etdi. Həzrəti-Əli (ə) Kumeylə buyurdu: "Sən hara, həqiqət hara?" Həzrətin (ə) bu sözündən narahat olan Kumeyl bir ləhzə fikrə getdi, sonra Mövla Əli (ə) onun əlindən tutub bir səhraya apardı və həmin səhradakı quyunu ona göstərib buyurdu: "Ey Kumeyl!, Mən həqiqəti quyuya deyirəm, quyu tab gətirə bilmir". Göründüyü kimi həqiqət o qədər gizlin bir məqamdır ki, hər insan o məqama yetişə bilmir.

Divan ədəbiyyatımızın dahi söz ustadı Mövlanə Məhəmməd Füzuli həqiqət sirrinin gözlərdən gizli olduğunu "Ənisül-qəlb" (Qəlbin güzgüsü) qəsidəsində bir beytdə belə ifadə edir:

*Elə gizlənməmişdir ki, həqiqət sirri gözlərdən,*
*Ki, açsın hikmət əhli əql üzündən bu müəmmanı.*

(Həqiqət sirri gözlərdən elə gizlindir ki, hətta hikmət əhli əql üzü ilə bu sirrə vaqif ola bilməz.)

Sələfi Füzulinin bu beyti ilə səsləşən, əslən Cənubi Azərbaycandan olan "Əhli-həqq" təriqətinə mənsub, mərhum Miskin Rüstəm Nəvazinin "Həqiqət" rədifli kəlamı da yuxarıda deyilən fikirlərin bir növ təsdiqidir:

*Əzəldən sirri-pünhandır həqiqət!*
*Dərin dəryayi-ümmandır, həqiqət!*

*Qalıb Sultani-Sərcəmdən sərəncam,*
*Olubdur cümlə Yarıstana elan.*
*Ürək həqdən alır dəsturi-ilham,*
*Könül təxtində sultandır, həqiqət!*

*Qəvidi çün o həqqin təşkilatı,*
*Batindən həll edər hər müşkülatı,*
*Yəqin hasil olar qəlbin bəratı,*
*Dəvasız dərdə dərmandı, həqiqət!*

Hüseyn Cavid "Şeyx Sənan" dram əsərində öz qəhrəmanı Sənanın arxasında gizlənərək onun dililə Həqiqət barədə fikirlərini belə izhar edir:

*Şəriətdən, Təriqətdən bezaram,*
*Həqiqət istərəm, yalnız həqiqət!*

Şair Şeyx Sənanı həqiqət arxasınca müsəlman üçün yolverilməz olan işlərin dalınca qürbət ölkəyə göndərir. Burada ölümü qəbul edən Sənan – yəni Cavid əfəndi deyə bilmədiyini Molla Nurun dililə belə deyir: "Şeyx Sənanın kafirliyi sizin mömünlüyünüzdən daha üstün idi" – yəni Sənan (Cavid) Həqiqət yolunda seyri-süluk etdi və şəriət əhlinin görə bilmədiyi sirrləri Təriqət bataqlıqlarından keçərək, Haqqa qovuşmaqda tapdı. Bu da Əhli-Həqqlərin, aşiqlərin, ariflərin və sufilərin canları və qanları bahasına əldə etdikləri mərhələdir.

Dədə Ələsgərin "Ya Əli" rədifli şeirinin 3-cü bəndinə nəzər saldıqda dörd qapının (Şəriət, Təriqət, Mərifət, Həqiqət) hikmətinin sirri nisbətən aşkar olur:

*Ələsgərə nişan verən almanı,*
*İslam edən Qənbər ilə Salmanı,*
*Musaya öyrədən turda kəlməni,*
*Cəbrailə ustad olan, Ya Əli!*

Alma dörd qatdan ibarətdir, üz qabığı Şəriətdir, hamı onu görə bilir. Əti – Təriqətdir, çox az adam ondan istifadə edir. İçərisindəki özək Yunis İmrənin dilincə desək, gəmiyə bənzəyir, özəkdə gizlənmiş qara tum – Mərifət, onun içindəki ağ tum isə Həqiqətdir.

*Şəriət, təriqət yoldur gedənə,*
*Həqiqət, mərifət ondan içəri.*

*(Yunis İmrə)*

Bildiyimizə görə sufilər təriqət əhlidirlər. Onların məramlarında Allah ilə insan arasında olan fasilə aradan götürülmüşdür. Ən əvvəl sufilər təriqəti şəriətə lazım bilir və təriqətsiz şəriəti naqis sanırdılar. Şah İsmail dövründə "həqiqət" isə onlara artırılmışdır. Necə ki, sonralar "mərifət" bu məsləklərin dördüncü mərhələsi kimi nəzərdə tutuldu. İndi də "Əhli-həqq"lər (görənlər) bu dörd mərhələni şərti olaraq məzhəbə girmək üçün lazım bilirlər. Şah İsmailin şeirlərində də bunu görürük:

*Şəriətdir, Təriqətdir, Həqiqət,*
*Mərifət bir gözündür can içində.*

Peyğəmbər (s) İslamın bu qapıları barəsində belə buyurur: "Əşşəriətu əqvali, vat-tariqatu əfali, vəl-haqiqatu əhvali" – "Şəriət mənim sözlərim, təriqət əməllərim, həqiqət isə göstərdiyim yerə çatmaqdır".[1]

Ş.İ.Xətai eyni halda Peyğəmbər (s), xüsusilə də Həzrəti-Əli (ə) və övladlarına hörmət bəsləyir. Qalibən Həzrəti-Əlini (ə) "şah" kəlməsi ilə xatırlayır.[2]

*Dünyada hər kim qılır bir padişahın xidmətin,*
*Bu Xətai bəndədir, sidq ilə şahın çakəri.*[3]

Və ya:

*Xətainin deyil həqqi şaha qulam deyə bilmək,*
*Əgər xidmət qəbul olsa, anın mövlası Qənbərdir.*

Əhli-həqlərin (görənlər) etiqadlarına görə Allah-təala ilk dəfə xas bəndələrini yaradarkən "yövmü ələst"də onlara söz vermiş-

---

[1] Seyyid Kazım Pərpənci. "Üsuliddin". Bakı, "MBM", 2008
[2] Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. "Şah İsmayıl Xətai" (xronoloji-tarixi məlumatlar). Bakı, "Ozan", 1997. səh. 331
[3] çakəri – nökər

dir ki, bir zaman insan surətində onların içinə gələcək. Onların zənnlərincə iki dəfə Allah əhdinə vəfa edərək Həzrəti-Əlinin (ə) şəklində yerə nüzul etmişdir. Ondan sonra dəfələrlə ayrı cildlərdə, o cümlədən "Şah Xoşin" şəklində (Ləristanda) və sonralar Bəhlul Danəndə, Fəzlullah Nəimi, Sultan Səhhak (İshaq) və neçə-neçə ayrı donda bəndələrin arasına gəlmişdir. Onların nəzərincə bu qəliblərin ya donların biri də Şah İsmail imiş. Bunun üçün onun müridləri ona bir insan kimi yox, bəlkə də Allah gözü ilə baxırmışlar. Hətta onun, qoşununda bəziləri "mürşidi kamil" – yəni Şah İsmail özü bizi mühafizə edəcək – deyə silahsız olaraq savaşa gedirmişlər. Şah İsmailin özündə də belə bir etiqad varmış. O da Həzrəti-Əlini (ə) Allahın məzhəri kimi vahid bilirmiş:

*Bu Xətai xəstə dil birliginə iqrar edir,*
*Vahidi-yekta imişsən, ya Əli, səndən mədəd!*

Zahirən onun hətta. Peyğəmbərin (s) barəsində də belə bir əqidəsi varmış:

*İrişdi mürşidi-kamil, qamu əhli-aman oldu,*
*Sevindi ğazilər cümlə, ki, xətmi-ənbiya gəldi.*

*Həqqə məzhərdürür Adəm, sücüd et, uyma İblisə,*
*Ki, Adəm donuna girmiş, Xuda gəldi, Xuda gəldi.*[1]

***

Ş.İ.Səfəvi o zaman cavan bir padşah idi. Onun Xuzistandan keçməsinin səbəbi məmləkəti-İraqa gedib Hürrün qəbrini açmaq olmuşdur. Çünki belə bir rəvayət eşitmişdi ki, İmam Hüseyn (ə) kiçik yaşlarında olarkən göydən bir dəstə mələk gəlib İmam Hüseyni (ə) apardılar göy üzünə ki, orada onu mələklər ziyarət

[1] Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. "Şah İsmayıl Xətai" (xronoloji-tarixi məlumatlar). Bakı, "Ozan", 1997. səh. 332-333

etsinlər. Mələklər imamı ziyarət edib, qurtardıqdan sonra aləmi-qeybdən İmam Hüseynin (ə) boynuna bir dəsmal bağlanmışdı. O dəsmal Kərbəla meydanına qədər İmam Hüseynin (ə) boynunda idi. Hicrətin 61-ci ilində İmam Hüseyn (ə) Kərbəla meydanına varid olur. Onun qarşısını min nəfər ordu ilə Bəni-Riyah tayfasının əzəmətli pəhləvanı Hürr-ibn Yəzidi Riyahi kəsir. Məhərrəm ayının 2-dən 9-na qədər düşmən mövqeyində dayanan Hürr-ibn Yəzidi Riyahi "Aşura" gecəsi səhvini bilib, su gətirmək bəhanəsilə gecə ikən öz əqidsində olan insanlarla (30-32 nəfər) birgə İmam Hüseynin (ə) xeymələrinə tərəf yollandılar. Hürr çəkmələrini çıxarıb içini torpaqla doldurub, boynuna asır, dizin-dizin İmamın (ə) xeyməsinə tərəf gedir. Peyğəmbər övladı – Zəhra balasından onu bağışlanmasını istəyir. İmam Hüseyn (ə) onun tövbəsini qəbul edir və Məhərrəm ayının 10-u Kərbəla çölündə haqq (İmam Hüseyn və tərəfdarları) və batil (Yezid və tərəfdarları) tərəflərin arasındakı qanlı döyüşdə ilk olaraq meydana getməyi Hürr İmam Hüseyndən (ə) istəyir. İmam əvvəl razılaşmasa da, sonra icazə verir. Hürr meydana gedir, qeyri-adi şücaət göstərir, lakin, başından yaralanan Hürr atdan yerə yıxılır. İmam Hüseyn (ə) onun başı üzərinə gedir və boynunda olan həmin hədiyyə yaylığı Hürrün başına bağlayır ki, qanı kəsilsin.

Bu rəvayəti eşidən Şah İsmail həmin dəsmalı əldə etmək fikrinə düşür. Hesab edir ki, o, İmam Hüseynin (ə) nəslindən olduğu üçün qanuni miras kimi dəsmal Hürrə deyil, məhz, Şah İsmailə yetişməlidir. Bu məqsədlə qoşun toplayır və Xuzistandan keçməklə Kərbəla düzünə daha rahat çatacağını düşünür. Şah İsmail Hürrün qəbrini açıb, həmin dəsmalı özünə götürmək niyyəti ilə Kərbəlaya yola düşür.

Şah İsmaillə Şah Məhəmmədin qoşunları Xuzistan ərazisində toqquşur və müharibə baş verir. Şah İsmailin qoşunu çox güclü olduğundan Şah Məhəmməd bəyin qoşunundan 700 nəfəri öldürürlər. Şah Məhəmməd bəyin qoşunu kiçik bir dəstədən ibarət idi. Şah Məhəmməd bəy Şah İsmailə namə (məktub) yazdı ki, əgər sənin müşkülün, cəngin var, müharibə istəyirsənsə gəl mənim meydanıma. Şah İsmail gördü fürsət var, özü də cavandır. Şah

Məhəmməd bəy də həmin zaman nisbətən yaşlı idi (zahirdə). Şah İsmail tez bu naməni qəbul edərək meydana getdi. Meydanda çadır qurdular. Bunlar ikisi çadırın içərisində cəng elədilər. Şah Məhəmməd bəy Şah İsmailin kürəyini yerə vurdu. Şah İsmail bundan çox narahat oldu ki, mən ilahi gücə malikəm, sən məni necə yıxdın? Məndə Mövla Əlinin (ə) nişanəsi var, mən aləmin mövlasıyam – deyərək bu "tuyuq"unu[1] oxuyur:

*Zati-həqq məfhumi-nəssi lafəta,*
*Qullara səndən gərək lütfü əta.*
*Bəndədən kəsmə inayətlən nəzər,*
*Bu Xətai bir qulundur pür xəta.*

*Mən Hüseyni məzhəbəm, Şahın qulu,*
*Yəni kim, mənidir Allahın qulu.*
*Ey Xətai, padşah olmaz kişi,*
*Olmayınca uş bu dərgahın qulu.*[2]

Şah Məhəmməd bəy dedi: "Əgər sən Mövla olsaydın yıxılmazdın". Şah Məhəmməd bəy zati-Xudavəndi idi – yəni zatı-Mövla Əli idi. Xətai isə sifati-Mövla Əli idi. B.B.Minorskinin dili desək: "Yeddi zatın biri Şah Məhəmməd bəy idi". Həmin yeddi zatın sahibi olan əziz kimsənələr bunlardır: 1.Şah Xavəndikar; 2.Murtəza Əli; 3.Şah Xoşin; 4.Sultan Sahak; 5.Şah Qırmızı; 6.Şah Məhəmməd bəy; 7.Xan Ataş.

Şah Məhəmməd bəy gördü ki, Şah İsmailin məqsədi şiə hökuməti təşkil verməkdi öz hökümətin yığışdırdı, bir şaxə (budaq) kimi Şah İsmailə verdi ki, onun ordusunda döyüşsünlər. Şah İsmail də Şah Məhəmmədə çox yalvardı ki, mənə bir qüdrət ver, kömək ver ki, heç bir cəngdə şikəst yeməyim (yəni, məğlub olmayım) çünki, şiə nümayəndəsiyəm. Şah Məhəmməd bəy onun xa-

---

[1] Tuyuq – rübaiyə bənzər dörd misralıq şeir növü.

[2] Şah İsmayıl Xətai. "Keçmə namərd körpüsündən" (Şeirlər və poemalar). Bakı, "Yazıçı", 1988. səh. 206

hişini qəbul etdi, oğlu Xan Əbdalı (Əbdül Rza) ki, onun batin camiyəsi var idi. Buyurdu ki, “Ey İsmail, Xan Əbdal sənin ləşkərinin fərmandehidi (sərdarı). Hər yerdə Xan Əbdal getdi qabağa, gedin, hər yerdə ki, dayandı, getməyin. Əgər getsəz məğlub olarsız”. Şah Məhəmməd bəy ağanın naibi olan Xan Əbdalı Şah İsmail Xətai “Xoş gəldin” rədifli varsağısında belə vəsf edir:

*Qaibdən dəlil göründün,*
*Dədəm, xoş gəldin, xoş gəldin.*
*Bizi sevib sevindirdin,*
*Dədəm, xoş gəldin, xoş gəldin.*

*İki can idik, birləşdik,*
*Məhəbbət qapısın açdıq,*
*Şükür didara irişdik,*
*Dədəm, xoş gəldin, xoş gəldin.*

*Üstümüzə yol uğratdın,*
*Gövhər aldın, gövhər satdın,*
*Ərliyini isbat etdin,*
*Dədəm, xoş gəldin, xoş gəldin.*

*Bir ağacda güllər bitər,*
*Dalında bülbüllər ötər,*
*Şahıma bərgüzar gedər,*
*Dədəm, xoş gəldin, xoş gəldin.*

*Böylə, Şah Xətaim, böylə,*
*Pirim dəstur versin, söylə.*
*Şaha məndən niyaz eylə,*
*Dədəm, xoş gəldin, xoş gəldin.*[1]

[1] Şah İsmayıl Xətai. “Keçmə namərd körpüsündən” (Şeirlər və poemalar). Bakı, “Yazıçı”, 1988. səh. 325

O tarixdən sonra Şah İsmail heç bir cəngdə məğlub olmadı. Çünki həqqin nümayəndəsi Xan Əbdal ləşkərin içində idi. Belə bir sual ortaya çıxa bilər ki, bəs bu iki şəxs hər ikisi ilahi gücə malik şəxsləri arasındakı fərq nə idi. B.B.Minorskinin dediyinə görə, Şah Məhəmməd bəy zati-xudavəndidir, Şah İsmail isə sifati-xudavəndidir. Belə ki, zatın içində sifat var, amma, sifatın içində zat yoxdur. (Yəni – hər rəsul nəbidir, lakin, hər nəbi rəsul deyildir).

Xətainin öz dili ilə desək:

*Adəmin xatəmin zatı Fəzlullah,*
*Əşyayi qərq etmiş, bu bir sirrullah.*
*Şahənşahı qütbi-aləm zilullah,*
*Qüdrəti, nəzəri mömin quldadır.*

*Şah Xətai aydır: Sirrini yayma,*
*Qıla gör namazın, qəzaya qoyma.*
*Şu yalan dünyada heç sağam deymə,*
*Tənim tənaşirdə, sirin saldadır.*[1]

Şah İsmailin mürəbbisi Lələ bəy Hüseyn (ki, Hüseyn Əbdal adı ilə məlumdur) əhli-həqq idi. Yəni batini sirlərdən xəbərdar olub və ilahi kəlamlar yazıb, Allahı vəsf edib. Şah İsmail Xətai özünün də etiraf etdiyi kimi əhli-təriqət idi. (Təriqətə qulluq etdim əzəldən). Çünki Şah İsmail Xətai Şah Məhəmməd bəylə mübarizədən sonra Şah Məhəmməd bəy Hüseyn Əbdalı be ünvanü-mürəbbe kimi (yolgöstərən kimi) qərar verdi ki, Şah İsmaili istiqamətləndirsin. Şah İsmail da sifati Mövla olduğundan Hüseyn Əbdal da bir çox kəlamlarında Şah İsmaildən çox tərif-lər edib.

[1] Şah İsmayıl Xətai. "Keçmə namərd körpüsündən" (Şeirlər və poemalar). Bakı, "Yazıçı", 1988. səh. 316

Həmçinin Hüseyn Əbdal öz kəlamlarında Şah Məhəmməd bəydən və ondan əvvəlki zatlardan da bəhs edərək kəlamlar yazıb ki, bu gün də Cənubi Azərbaycanda məxsusən Qaradağ tayfaları içərisində həmin kəlamlar tənbur üstündə məxfi məclislərdə (cəmxanalarda) oxunur. Nümunə olaraq "Qatdılar məni" kəlamını əziz oxucuların diqqətinə çatdırırıq:

*Yatmışıdım oyatdılar,*
*Diriyə qatdılar məni!*
*Qoyun oldum səsə gəldim,*
*Sürüyə qatdılar məni!*

*Qəssaba satdılar getdim,*
*Daraları məkan tutdum.*
*Canı haqqa təslim etdim,*
*Huluya qatdılar məni!*

*Can içində can eylərəm,*
*Şirin dili lal eylərəm,*
*Çiçəklərdən bal eylərəm,*
*Ariyə qatdılar məni!*

*Haq kəlamına yazıldım,*
*Haq qatarına düzüldüm.*
*Bal oldum şərbət əzildim,*
*Uluya qatdılar məni!*

*Xan Əbdal piri-Sultanəm,*
*Həqqın məhəbbəti məndə.*
*Bu cəhanda, o cəhanda,*
*Alıya qatdılar məni!*

# II FƏSİL

## 2.1. ŞAİR XƏTAİ

Azərbaycan torpaqlarını birləşdirmək uğrunda bir ömür mübarizə aparan, İslami yolla irəliləyərək, insanları düzlüyə, mərdliyə, vətənpərvərliyə çağıran, mənəviyyat uğrunda daim çarpışan Şah İsmail həm də bir şair kimi müxtəlif janrlarda qələmə aldığı əsərlərində insanlıqdan, mənəviyyatdan, islami əxlaqdan, bəşəri ideallardan obrazlı şəkildə bəhs etmiş, klassik poeziyamızda özünəməxsus mövqe qazanmışdır.

Sarayında dövrünün ən istedadlı şairlərini, ən savadlı alimlərini bir araya gətirib məclislər quran, dini və dünyəvi elmlərin, Azərbaycan poeziyasının inkişafına çalışan Xətainin öz yaradıcılığında da elmi, dini, ürfani mövzular daha diqqətəşayandır.

Xətai yaradıcılığında istər əruz vəznli qəsidələr, qəzəllər, istərsə də heca vəznində qələmə aldığı qoşmalar, gəraylılar, bayatılar, tiyuğlar öz bədii sanbalı, bədii təsvir və ifadə vasitələrinin işlənməsi cəhətindən olduqca zəngindir.

Xətainin ədəbi irsi dəfələrlə nəşr olunmuşdur. Lakin, Xətai yaradıcılığı ilə bağlı məqalə topluları, kitablar çap olunsa da, etiraf etməliyik ki, bunlar Xətai yaradıcılığı üçün çox azdır. Xətai hələ tədqiqatçısını gözləyən şairlərdəndir.

## 2.2. ŞAH İSMAİL XƏTAİNİN ƏDƏBİ MÜHİTİ

Şeir, poeziya Ş.İ.Xətainin soy-kökünə də yad olmamışdır. Onun özü kimi sələfləri də səfəvilik idealını dönə-dönə tərənnüm etmişlər. Onların birinciləri sırasında yer alan sənətkarlardan biri də Şah İsmailin ulu babası Şeyx Səfiyəddin ibn Şeyx Əminəddindir.[1]

Mənbələrdən məlum olur ki, Şah İsmailin ulu babası – təriqət başçısı Şeyx Səfiəddin özü də Azərbaycan dilində şeirlər yazmışdır:

*Qoydu qəm ləşkəri yüz könlümə hamin-hamin,*
*Qara beydəqlu ələmlər içi gülgün-gülgün.*

*Ürəgimdən ginə od qəynədi duzəx-duzəx,*
*Sigərimdən genə qan qaynadı Çeyhun-Çeyhun*

*Çağırdım qati avaz ilə: Leyli, leyli!*
*Dağ səs verdi cavabında ki, Məcnun, Məcnun!*

*Bu nə viranə könüldür, Səfi, ey vay-ey vay,*
*Sərvlər var idi bu bağda, mövzun-mövzun.*[2]

Fəxrəddin Musəvi Ərdəbili – Nəcəfinin "Tarixi Ərdəbil və Danişməndan" əsərində mühafizə olunmuş bu ana dilli şeirimizin nadir nümunəsi demək olar ki, ifadə və üslub imkanlarına görə o dövrün sadə xalq danışıq dilinin ab-havasını özündə yaşadan bir səlnaməni xatırladır.

[1] Seyidağa Onullahi, Yaqub Mahmudov. Paniranistin "kəşfi" və ya Xətai şair "deyilmiş". "Azərbaycan" jurnalı, №2, 1988. səh. 90

[2] Şöhrət Bədəlov. "Səfəviyyə və Xətai yaradıcılığı". "Folklor və etnoqrafiya" jurnalı, №2. Bakı, 2005. səh. 78

1. Məhəmmədəli Tərbiyəti də “Danişməndani-Azərbaycan” təzkirəsində onun üç rübaisini verir:

*Səhvsiz, yanlışsız camalın Quran olmuş,*
*Qəzavü qədər müşk ilə onu yazmış.*
*Gözün, ağzın vəqf ayəsi, qaş məddə tək,*
*Kirpik erab, xal yanağında nöqtə tək.*

***

*Ayıq ol Səfi, incitməyəsən bir könül,*
*Çalış ki, daim şad ola səndən hər könül.*
*Qayda ənənə böylədir Səfi, bunu bil,*
*Ayıq ol Səfi, yüz görən buna ver könül.*

***

*Yüz günahı bağışlayan kərəmli o Yaradan,*
*Günahımızı bağışlar, çəkinmə Səfi, ondan.*
*Ürəyində arpa qədər Əli sevgisi olsa,*
*Bağışlar Allah günahı, buna şübhə olmadan.*[1]

Göründüyü kimi rübailərin islami tutumu olduqca genişdir. Belə ki, əgər onların birincisi Qurani-Kərimin gözəllik yönündə mənalandırılması və səciyyələndirilməsi üzərində qurulmuşdursa, üçüncü rübaidə Əhli-beyt (ə.m) sevgisi leytmotiv təşkil etməkdədir.

2. Ş.İ.Xətainin dost-doğma dayısı olan Sultan Yaqub da poeziyaya biganə qalmamış, hətta, diplomatik münasibətlər zamanı belə müşairədən, şeirləşmədən çəkinməmişdir. Aşağıdakı rübai bunu göstərir:

[1] Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. “Şah İsmayıl Xətai” (xronoloji-tarixi məlumatlar). Bakı, “Ozan”, 1997. səh. 447

*Bu dünya ki, davamını mən kəm görmüşəm,*
*Hər şənliyində onun min-min qəm görmüşəm.*
*Bir düşərgəyə oxşayır ki, hər tərəfdən,*
*Aparır yoxluğa, sonu ədəm görmüşəm.*[1]

(Bu rübaini Sultan Yaqub Sultan Bayqaraya yazmışdır).

3. Məhəmmədəli Tərbiyəti "Silsilətün nəsəbi-Səfəviyyə" əsərindən götürüb təzkirəsinə saldığı aşağıdakı qəzəl Səfiyəddin Ərdəbilinin də istedadlı şair olduğunu öyrənməyə yol açır:

*Təmiz, Sufi məslək könlüm "ənəlhəqq" deyir,*
*Təqlid, riyakarlıq etmir, Allah çağırır.*
*Əbədi badə içmişəm, saflıq xumundan,*
*Ürəkdən odlu fəryadım göylərə qalxır.*

*Haqq izilə gedən bir gün çatar diləyə,*
*Diləksiz adam –uzaqdan vaq-vaqlayır.*
*Əzəldən haqq əlindən mən badə almışam,*
*"Sədəqallah" deyə, daim könlüm səslənir.*

*Haqq yolunda gedən mürüd mürşidsiz sanki,*
*Bir cahil başına bilik yeləyi tikir!*
*"Ənəlhəqq" səsi eşitmək istəsən əgər,*
*Eşit Səfi oğlundan, haqdan söyləyir.*[2]

Göründüyü üzrə qəzəl "Ənəlhəqq" ideyasının tərənnümü baxımından Nəsimi poeziyası ilə yaxından səsləşir.

---

[1] Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. "Şah İsmayıl Xətai" (xronoloji-tarixi məlumatlar). Bakı, "Ozan", 1997. səh. 448
[2] Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. "Şah İsmayıl Xətai" (xronoloji-tarixi məlumatlar). Bakı, "Ozan", 1997. səh. 448

4. Ş.İ.Xətainin sələfləri kimi, xələfləri də şeirə-sənətə olduqca yüksək qiymət vermişlər. Təzkirədə Şah İsmailin oğlu I Şah Təhmasibin belə bir şeiri verilir:

*Bir zaman biz seyqəlli zümrüdü axtardıq,*
*Bir zaman belə sulu yaqut ardınca vardıq.*
*Boylanmışdıq biz əgər rəngarəng günahlara,*
*Özümüzü tövbə ilə təmizliyə çıxardıq!*[1]

5. Birinci Şah Təhmasibin oğlu II Şah İsmail "adil" təxəllüsü ilə şeirlər yazırdı:

*Oxun məni şad edir, bir çox ox atanların,*
*Vardır səndə gizlincə nəzərləri onların.*
*Qönçə tək gizlənirsən, sən naz ilə xəlvətdə,*
*Nə bilirsən ardınca göz tikib bir bədbəxt də.*

*Ləl tək dodağında olan təbəssümlərin,*
*Bildirir, aşiqindən vardır sənin xəbərin.*[2]

Bu parçalar özlərinin yüksək lirikası ilə seçilir.

6. Ş.İ.Xətainin xələflərindən biri də I Şah Təhmasibin oğlu olan mənzum və mənsur əsərlər yazan Mustafa Mirzə olmuşdur:

*Mən vurğunam, bu taqsırla öldürməyə aparırlar,*
*Çıx sən dama tamaşa qıl, nə qovğalar qoparırlar.*
*Nə olur-olsun deyə, bir neçə söz deyərəm,*
*Öz eşqimi bu dəfə birtərəflik edərəm.*[1]

---

[1] Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. "Şah İsmayıl Xətai" (xronoloji-tarixi məlumatlar). Bakı, "Ozan", 1997. səh. 448

[2] Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. "Şah İsmayıl Xətai" (xronoloji-tarixi məlumatlar). Bakı, "Ozan", 1997. səh. 449

7. Ş.İ.Xətainin xələfləri sırasında peşəkar ədəbiyyatşünaslıqla məşğul olan Sam Mirzədir. O I Şah İsmailin oğludur. Sam Mirzə “Töhfeyi-Sami” adlı bir təzkirə yazmışdır ki, onda öz müasiri olan 664 şairin tərcümeyi-halını vermişdir. Bu qəzəl ondandır:

*Hürkdün məndən, sanki dəlidən, ey pəri, tək mənim yarım,*
*Səninlə bir söz danışmadım, nə eşitdi bu qulağım.*
*Vay o aşiqin əhvalına, olub məhrum söhbətindən,*
*Görür səni min dəfə, sanki görməmişdir əvvəldən.*

*Odlu baxışımdan incimiş o lətif ayağın sənin,*
*Heyflər olsun ki, göz dəymişdir, ayaqlarına, nazənin!*
*Saminin könül quşu vəslin həvəsiynən çox uçmuşdur,*
*Bircə dən dadmadan o yazıq bəla toruna düşmüşdür.*[2]

8. Əlqas Mirzə I Şah İsmailin oğludur. Aşağıdakı bir rübai onundur:

*Yırtıcı şirlər kimi həmişə ovdayıq,*
*Həmişə özümüzlə maraqlanmaqdayıq.*
*İşlərin üzərindən pərdə götürülsə,*
*Onda bilinəcəkdir ki, bizlər nə haldayıq.*[3]

Bu rübai müəllifin şəxsiyyətcə qatı Səfəvi mövqeyi tutduğunu və diplomatik bacarığa malik olduğunu sübuta yetirir.

9. Bəhram ya Bəhrami – hər iki ləqəb I Şah İsmailin oğlu

[1] Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. “Şah İsmayıl Xətai” (xronoloji-tarixi məlumatlar). Bakı, “Ozan”, 1997. səh. 449
[2] Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. “Şah İsmayıl Xətai” (xronoloji-tarixi məlumatlar). Bakı, “Ozan”, 1997. səh. 449
[3] Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. “Şah İsmayıl Xətai” (xronoloji-tarixi məlumatlar). Bakı, “Ozan”, 1997. səh. 450

Bəhram Mirzənin təxəllüsüdür. O da o biri qardaşları Sam Mirzə və Əlqas Mirzə kimi həm söz ustası, həm də xəttat olmuşdur. Aşağıdakı rübai və qəzəl onundur:

*Bəhram, bu qalmaqallı, davamsız dünya köşkündə,*
*Nə qürrə olursan, bu ömür sayılan beş gündə.*

*Bu badiyədə əcəl ovçuları məskən salmış,*
*Minlərlə sən tək Bəhram ovlamışlar hər bir gündə.*

*Saqi, işrət meyindən doldur sən bir cami-cəm,*
*Tabdan düşmüş könüldə qoy qalmasın heç bir qəm!*

*Yolunda torpaq olub, çıxmaram mən yolundan,*
*Vay ol zaman baxtımdan sən keçməsən o yoldan.*

*Cövrün aşdı həddindən ey zülmkar dilbər,*
*Cəfa görmüş aşiqə sən cövr etmə bu qədər.*

*Zülfün layında könül etmiş mənzil ölüncə,*
*Görüb zülfünü, sıxma o, taqətdən düşüncə.*

*Bəhram, düşdün dillərə artıq umma həyatdan,*
*Yollan ədəm yurduna, düş sən bu fərsiz atdan!*[1]

Bu nümunələr Bəhram Mirzənin daha geniş və daha zəngin ədəbi irs qoyub getdiyini göstərir.

10. Səfəvi padşahlarının 6-sı olan Şah Səfi Sam Mirzə ibn Səfi Mirzə ibn Şah Abbas da şeir yazmışdır. Aşağıdakı şeirlər ondandır:

---

[1] Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. "Şah İsmayıl Xətai" (xronoloji-tarixi məlumatlar). Bakı, "Ozan", 1997. səh. 450

*O zaman ki, dilbərim məni tək buraxır, gedir,*
*Dalğalı çay tək gözlərdən yaşlar axır gedir.*

*Uğursuzluq sürməsi çəkibmiş gözlərimə,*
*Bütün aləm gözümdə zülmətə batır, gedir.*

*Fələk çərxi dolandı, dolu badə içmədik,*
*Məstlik, xumarlıq dövrü də bitir, axır gedir.*

*Səfi, qəm yemə, səbr et, eşqin təriqətində,*
*Həyat hər yolla keçsə o, sona çatır, gedir.*[1]

11. Sultan Məhəmməd Xudabəndə oğlu I Şah Abbasın da şairliyi olmuşdur:

*Məhəbbət quşu qəfildən sinəm evinə yanaşdı,*
*Mehmanınam deyib, könlüm qapısın açdı.*

*Nə diriyəm mən diri tək, nə də heç yoxam bilmirəm,*
*Kiməm, nəçiyəm, kafirəm, ya müsəlmanam, bilmirəm.*

*Kafir olmuşam əgər mən, bəs zünnarı kim bağlamış,*
*Dinə bağlıyamsa neçün heç bəhrə dindən almamış.*

*Aşiqəm, aşiq, deyiləm mən bunların heç birisi,*
*Namüsəlman etmiş məni bircə dildarın sevgisi.*

*Heçəm, heçdən də heçəmsə, bu həyatın səhrasında,*
*Yeganə cavahiriyəm, geniş imkan dəryasında.*

---

[1] Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. “Şah İsmayıl Xətai” (xronoloji-tarixi məlumatlar). Bakı, “Ozan”, 1997. səh. 451

*Məhəbbət odundan iki gündür yanmışdır bu canım,*
*Vurulmuşam bir qönçəyə, tək odur mənim imanım.*

*Çətindir qurtara bilmək, Abbasa belə dərddən can,*
*Dərd dərd üstündən gəlmiş, yoxdur artıq ona dərman.*[1]

Şeirin məzmunundan rindanəlik və laübalilik açıq-aşkar duyulur. Şeir bu baxımdan Məhəmməd Füzulinin "Rindü zahid" əsəri ilə yaxından səsləşir. Şeir dini anlayışların zəngin işləmə məqamları ilə seçilir.

12. II Şah Səfinin oğlu II Şah Abbas da Sani təxəllüsü ilə şeirlər yazmışdır. Bu iki beyt və rübai də ondandır:

*Sərv altında qamətini yad edib gözdən yaş axıtdım.*
*Kirpiyim tək yarpaqları tək-tək göz yaşımla islatdım.*
*Səba yeli utandıqdan baxa bilmir qönçə üzünə,*
*Qönçənin köynəyini o açdı, yığa bilmədi yenə.*

*Ayrılığında sənin gözlərimdən qan axar,*
*Sənsiz mənim könlümün əhvalı çox bulanar.*
*Mənim sevimli yarım, Sani səni örərsə,*
*Heç bilirsən başına necə dönüb, dolanar?*[2]

13. Səfəvi şahzadələrindən olan Zeynalabdin Mirzənin də şeir sənətində səlis təbi olmuşdur:

*Sən həlak edirsən məni, xəyalın can verir,*
*Səninlə xəyal fərqini tək bu ayıracaq.*
*("Şəmi əncümən").*

[1] Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. "Şah İsmayıl Xətai" (xronoloji-tarixi məlumatlar). Bakı, "Ozan", 1997. səh. 451
[2] Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. "Şah İsmayıl Xətai" (xronoloji-tarixi məlumatlar). Bakı, "Ozan", 1997. səh. 452

14. Azərbaycan türkmənlərindən olan şair Ceyşi də Ş.İ.Səfəvinin müasiri olmuş və aşağıdakı beyt də onun yaradıcılığındandır:

*Sənsən mənim öz gözüm, gözümdən də çox əziz,*
*Sən necə bir gözsən ki, əhvalımdan xəbərsiz!*[1]
*("Təzkireyi-Yusif Əlixan")*

Bu deyilənlər danılmaz biçimdə göstərir ki, Ş.İ.Xətainin istər sələfləri, istərsə də xələfləri dərin ədəbi bilik və bədii bacarıq yiyəsi olmuş, söz-sənət meydanında Səfəvilərə layiq ad-sanları ilə at çapdıra bilməşlər. Lakin, ədalət naminə deyilməmiş qalmasın ki, sələfləri və xələfləri fars dilində yazmış, xələfləri Şah İsmail Xətainin ana dili siyasətini həyata keçirməmişlər. Bu isə çox güman ki, fars dilinin o əsrlərdəki güclü ədəbi mövqeyindən irəli gəlmişdir.

[1] Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. "Şah İsmayıl Xətai" (xronoloji-tarixi məlumatlar). Bakı, "Ozan", 1997. səh. 452

## 2.3. ŞAH İSMAİL XƏTAİNİN TƏXƏLLÜSÜ VƏ ONUN ANLAMI

*Allah, Allah, den, qazilər,*
*Qazilər deyin Şah mənəm!*
*Qarşı gəlin, səcdə qılın,*
*Qazilər deyin Şah mənəm.*

*(Q.240, səh.135)*[1]

– deyən görkəmli din və dövlət xadimi, ana dilimizdə yaranan şeirin inkişafında xüsusi xidmətləri olan, özü də bu dildə ölməz sənət incələri yaradan, 13 yaşında 235-illik (1501-1736) Azərbaycan Səfəvilər Dövlətinin əsasını qoyan, doğma torpaqların – "Məmləkət Azərbaycanın" bütövlüyü uğrunda mübarizə aparıb böyük qələbələr qazanan, adı Şərqdən-Qərbəcən bütün dünyaya yayılan qılınc və qələm dahisi, ozan-aşıq sənətinin dərin bilicisi, Əhli-beyt (ə.m) aşiqi, könüllər sultanı, Həzrəti-Əlinin (ə) əqidə və məslək davamçısı Ş.İ.Xətainin təxəllüsü nə ilə bağlıdır? Bəhsimiz məhz Xətainin təxəlüsü barədədir. Əbdülbaqi Kölpünarlı Xətainin təxəlüsü barədə heyrətlə deyirdi: "Xətai təxəlüslü hər hansı bir şeir oxunarkən məclisdə olan qadınlar ayağa qalxar, kişilər diz çökərdi".

Azərbaycan Səfəvi-Qızılbaş dövlətinin qurucusu və banisi, Səfəvi təriqətinin son şeyxi (1494-1499) olan Ş.İ.Xətai (17.07.1487-23.05.1524) tarixi mənbə və ədəbiyyatlarda "Əbdülmüzəffər", "Xaqan", "Sahibqıran" yaxud "Sahibquran", "Sahibəz-Zaman", "Xətai" ləqəb və təxəllüsləri ilə tanınır.[2]

Mövlanə Məhəmməd Füzuli Ş.İ.Xətaiyə həsr etdiyi "Bəngü

---

[1] Bu və bundan sonrakı bu cür mənbələr "Şah İsmail Səfəvi (Xətai) külliyyatı. Qəzəllər, qəsidələr, nəsihətnamə, dəhnamə, qoşmalar. (Tərtibatçısı: Mirzə Rəsul İsmailzadə). Bakı, Əlhuda, 2004" kitabından götürülmüşdür. İlk rəqəm qəzəlin nömrəsi, sonrakı isə kitabın səhifəsidir.

[2] Ceyhun Bayramlı. "Azərbaycan hökmdarları: Səfəvilər". Bakı, 2015. səh.17

badə" əsərində yazırdı:

*Məclisəfruzi-bəzmgahi-Xəlil,*
*Cəmi-əyam Şah İsmail.*
*Ondan asudədir ğəniyyü, gəda,*
*Xələdəlləlahü mülkəhü əbəda.*

(Şah İsmailin sayəsində varlı da, kasıb da asuda keçinir. Qoy onun hökmüranlığı əbədi olsun! Onun feyz camından naib şadlanmayanlar qoy şərab xıltı kimi çöküb həmişəlik puç olsunlar).

Bu gün cəmiyyətdə oxucuları düşündürən suallardan biri məhz Şah İsmail Xətainin təxəllüsüdür.

Professor Məhərrəm Qasımlı "Şah İsmail Xətainin poeziyası" monaqrafiyasında Xətainin təxəllüsü barədə son dərəcə ətraflı məlumat verir:

*Mənim adım vəli şah İsmaildir,*
*Təxəllüsüm Xətayidir, Xətayi.*[1]

Adını və təxəllüsünü yuxarıdakı beytdə aydınca göstərən Şah İsmail Xətai Azərbaycan klassik poeziyasının bir çox başqa görkəmli nümayəndələri kimi özünə təsadüfi təxəllüs seçməmişdir. Xəqani, Nizami, Nəsimi, Füzuli təxəllüsləri kimi Xətayi təxəllüsü də sənətkar dünyagörüşü, onun həyat mövqeyi və poetik məramı ilə bağlıdır. Bədii materialın elmi müşahidəsi göstərir ki, şairin təxəllüsü bir neçə məna tutumuna malikdir.

1) Xətai öz təxəllüsünü ulu babalarının yer-yurdundan Türküstan elinin Xətay mahalının adından götürmüşdür. Tanınmış foklorşunas Mirəli Seyidovun araşdırmasına görə "Xətai - türk-

---

[1] Məhərrəm Qasımlı. "Şah İsmail Xətainin poeziyası". Bakı, "Elm", 2002. səh. 532

dilli qəbilənin adıdır. Bu türk qəbiləsindən çıxmış bir çox sənətkarlar həmin qəbilənin adını Şah Xətai kimi özlərinə təxəllüs və ad götürmüşlər". Elə buradaca qeyd etmək lazımdır ki, bu təxəllüs Şah İsmail Xətaiyə qədər bir sıra sənətkarlar tərəfindən də qəbul olunmuşdur. İlk anadilli məsnəvilərdən sayılan "Yusif-Züleyxa"nın (XV əsr) müəllifi də Xətai təxəllüslü şairdir. Salman Mümtaz Təbriz yaxınlığında Xətay adlı böyük və abad bir kəndin mövcud olduğunu göstərir.

Yəqin ki, həmin kənd də qədim türk tayfasının adını yaşadır.

Xətai şeirində Xətay mahalının adı dönə-dönə çəkilir və gözəllik məskəni kimi göstərilir. Şairin Xətay torpağına məhəbbəti o qədər sonsuz və tükənməzdir ki, hətta sevgilisinin ona verdiyi cəfalardan sonra Xətaya getməklə təskinlik tapır.

*Sənin cövrindən, ey sultani-aləm,*
*Xətai baş alur, varur Xətayə.*[1]

Xətay mahalının gözəlliyi Xətai könlünün istəyincədir:

*Aldı şikəstə könlünü miskin Xətayinin,*
*Çindir vəfalı bulmağı xubi-Xətay olan.*[2]

Şairin bəyəndiyi ən gözəl məkanlar sırasında Xətayın yeri ayrıcadır:

*Bu Xətai yüzini ta gördü, ey Xubi-Xötən,*
*Ol Xətavü Hind elində padişah olmuşdurur.*[3]

---

[1] Məhərrəm Qasımlı. "Şah İsmail Xətainin poeziyası". Bakı, "Elm", 2002. səh. 585
[2] Məhərrəm Qasımlı. "Şah İsmail Xətainin poeziyası". Bakı, "Elm", 2002. səh. 414
[3] Məhərrəm Qasımlı. "Şah İsmail Xətainin poeziyası". Bakı, "Elm", 2002. səh. 175

*Ta ağ yüzində çin saçındır məqami-dil,*
*İqlimi Rumü-Çinü Xətadır Xətainin.*[1]

"Xətaylı, Xətay elindən olan" anlamları "Xətai" təxəllüsünün əsas məzmun yüküdür. Bu sözün çox mənalığını nəzərə aldıqda, onda "xəta edən, günahkar, xətalı" məna çalarlarının da qərar tapdığını müəyyənləşdirmək olar.

2) a) Dini-ürfani təlim alan, ulu babalarından qalma təriqət ənənəsini davam etdirən Şah İsmail təsəvvüf dünya görüşünə uyğun olaraq bütün mömin bəndələr kimi özünü tanrı qarşısında günahkar (Xətai-xətalı) sayırdı. 1508-ci ildə İraqın fəthi zamanı İmam Hüseynin (ə) ilk yaralanıb ölən əskəri Hürrün qəbrini açmasıyla o öz günahını bir qədərdə artırmışdır:

*Şah Xətai seyrə çıxdı, açdı Hürrün qəbrini,*
*Bar-İlahi, əfv qıl kim, tövbəkarəm, doğrusu.*[2]

b) Lirik-aşiqanə şeirlərdə "yarın xətrinə dəymək, sonra da öz günahını, xətasını boynuna almaq" – aşiq-məşuq münasibətlərindəki məlum qəliblərdəndir. "Xətai" təxəllüsü həmin etiraf məqamı üçün də yerində səslənir:

*Bağışlagil Xətai günahın, aya pəri,*
*Bəxş edə şah necə ki, quldan xəta gəlür.*[3]

Göründüyü kimi, beytdəki "Xətai" sözü həm şairin təxəllüsü-

---

[1] Məhərrəm Qasımlı. "Şah İsmail Xətainin poeziyası". Bakı, "Elm", 2002. səh. 304
[2] Məhərrəm Qasımlı. "Şah İsmail Xətainin poeziyası". Bakı, "Elm", 2002. səh. 588
[3] Məhərrəm Qasımlı. "Şah İsmail Xətainin poeziyası". Bakı, "Elm", 2002. səh. 151

nü, həm də sevgili qarşısında xəta edən, günahkar olan mənasını bildirir. Klassik şərq poeziyasında qəzəlin tapşırma məqamında işlədilən təxəllüslər bəzi hallarda sonuncu beytin sözlərinin məzmun sırasına da daxil olur. Bu zaman həmin söz həm təxəllüs kimi işlənir, həm də oradaki ümumi məzmuna xidmət edən sıravi sözlərdən birinə çevrilir. Təxəllüsün klassik şərq poetikasında "hüsnü-təxəllüs" hesab olunmuşdur. "Xətai" sözü çoxmənalı tutuma malik olduğundan şair öz təxəllüsünü işlədərkən bir sıra hallarda yuxarıdakı beytdə olduğu kimi "hüsnü-təxəllüs" yaratmışdır. Həmin "hüsnü-təxəllüslər" Xətai təxəllüsünün geniş şərhi üçün yaxşı bir açardır.

c) Xətainin "Xətalı, günahkar" mənası daşıdığı "hüsnü-təxəllüs" nümunələrinin çoxunda tanrı qarşısındakı bəndə günahkarlığından söhbət gedir. Çox güman ki, müqəddəs Hürrün qəbrinin açılması əhvalatı bu semantik tutumun şəbəkəsini xeyli genişləndirmişdir:

*Bu Xətainin günahın sən gətirmə yüzinə,*
*Şahi-mərdan, Şiri-Yəzdan, Sirri-Sübhanım, mədəd.*[1]

*Gər günahın çoxdur, ey miskin Xətai, qəm yemə,*
*Rəhmətinə Xaliqin ümmidvar olmazmısan.*[2]

*İxlasi dildən ayəti – "təviz" oxur müdam,*
*Yad eyləgəc cahanda Xətai xətasını.*[3]

q) Dünya nemətlərini sevən, təbii gözəllik və həqiqi eşq vur-

---

[1] Məhərrəm Qasımlı. "Şah İsmail Xətainin poeziyası". Bakı, "Elm", 2002. səh. 116
[2] Məhərrəm Qasımlı. "Şah İsmail Xətainin poeziyası". Bakı, "Elm", 2002. səh. 310
[3] Məhərrəm Qasımlı. "Şah İsmail Xətainin poeziyası". Bakı, "Elm", 2002. səh. 507

ğunu olan həyat aşiqi də zahid gözündə günahkardır, xətalıdır. Xətai özünü bu cür xətalı, günahkar da sayır və öz xətası, günahı ilə öyünür:

*Başdan-ayağa bəndə Xətai xətalıdır,*
*Zahid, xaçan ki, xubları sevən genah ola?!*[1]

g) orta əsrlər şərq tarixçisi Mirxondun "Rövzətüs-Səfa" əsərində Xətai barədəki"... türkcə şeirlər yazardı. Əmir Əlişir Nəvai ilə həmqafiyə olsun deyə "Xətai" təxəllüsü işlədərdi" – qənaəti də Xətainin xəta, günah mənasında olduğuna işarə edir. "Nəva" və "xəta" sözlərinin üslubi-semantik yaxınlığı buna əsas verir.

Görkəmli ədəbiyyatşunas Salman Mümtaz "ədəbiyyatımıza Nəvai təsiri" adlı məqaləsində Xətai təxəllüsünə Nəvai təxəllüsünə qarşılıq olaraq göründüyü barədə bir qədər başqa səpkidə fikir yürütmüşdür: "Şah Xətai farsca ilə bərabər cığataycanın da qarşısını almaq istədi. Azərbaycan ləhcəsi ilə şeir söyləyən şairlər yetişdirərək özü də bir "Divan" yaratdı, "Nəvai" təxəllüsü qarşısına "Xətai" təxəllüsünü qəbul etdi". Azərbaycan dilini böyük məhəbbətlə sevən və onu dövlət dili səviyyəsinə qaldıran hökmdar-şairin belə bir mövqedə dayana bilməsi ehtimalı əslində ağla batan məntiqdir.

3) Orta əsrlərdə, xüsusən də XV-XVI yüzilliklərdə şərqdə xəttatlıq və miniatür sənəti böyük bir vüsətlə inkişaf edir. Həmin dövrün sənətşunas tarixçisi Qazi Əhməd orta əsrlərdə təsviri sənətin dəbdə olan yeddi növünü göstərir: islimi, Xətai, fərəngi, fəsali, əbr, əkrə, salami. Deməli, "Xətai" həm də gözəl təsvir (naxış) növü olmuş, özünəməxsus cizgi, xətti və rəngi başqa növlərdən seçilmişdir. Olsun ki, bu həm də "Xətay" elinə məxsus naxış anlamındadır. Görünür, bu səbəbdən də həmin naxış

---

[1] Məhərrəm Qasımlı. "Şah İsmail Xətainin poeziyası". Bakı, "Elm", 2002. səh. 88

növü üçün xətlərin incəliyi, cizgilərin zərifliyi səciyyəvi sayılmışdır və sözü gedən təsvir cizgiləri, naxışlı xətlər müəyyən qədər xəttatlığı, gözəl xət nümunələrini də xatırlatmışdır. Xətainin:

*Xətaiyəm xəttarəm,*
*Həqq sirrinə səttarəm,*
*Həkimlərin dərmani,*
*Təbiblərə əttarəm.*[1]

bayatısından "Xətaiyəm xəttarəm" – ifadəsi bu baxımdan olduqca maraqlıdır. Bu ifadə göstərir ki, Xətai təxəllüs götürdüyü sözün qərar tutduğu üçüncü qaynaqdan da xəbərdar olmuşdur. Burada "Xətai"nin "xəttar"la bağlılığını bayatının bədii sistemi də təsdiqləyir. Çünki, birinci misradakı tərəflərarası əlaqə sonrakı misralarda da eyni qaydada davam etdirilir. Misra boylarındakı əlaqələnmə (xətt-xəttar; sirr-səttar; həkim-dərman; təbib-əttar) yuxarıdakı qənaətin təsadüfi olmadığını göstərir. Bayatıdakı qarşılaşdırılıb əlaqələndirilən digər ifadələrdən fərqli olaraq şair birinci misrada öz təxəllüsünü verdiyindən burada həm də "hüsnütəxəllüs" yaratmışdır. Təsadüfi deyildir ki, Xətai təxəllüsündəki bu məna tutumundan xəbərdar olan I Sultan Səlim Şah İsmailə yazdığı məktub şeirdə öz təxəllüsünü "İslami" kimi verir. "İslami" Səlim sözünü müəyyən qədər xatırlatsa da, daha çox Qazı Əhmədin təqdim etdiyi yeddi gözəl təsvir (rəsm) növündən biridir. O yeddi növdən ki, başqa birisinin də adı "Xətai"dir.

"İslami" – "Xətai" qarşılaşdırmalarını orta əsr müəlliflərindən Sadiq bəy Əfşar və Mövlana Ümidinin də yaradıcılığında görmək olur. Sadiq bəy Əfşar təsviri sənətə aid nəzmlə yazdığı "Qanunüs-süvər" əsərində təsvir (rəsm) növlərindən söz açarkən "İslami" və "Xətai"ni xüsusi şəkildə vurğulayır:

---

[1] Məhərrəm Qasımlı. "Şah İsmail Xətainin poeziyası". Bakı, "Elm", 2002. səh. 64

*Çenin gərg ustadəm rəhnümayi*
*Ke həst eslimiya digər Xətai.*

(sətri tərcüməsi: Ustadım iki naxış vurub başa saldı ki, bunun biri "İslami"dir, o biri "xətai").

Mövlana Ümidi isə bu təsvir (rəsm) növlərinin adlarından bədii manera kimi istifadə edərək 1513-cü ildəki ürəkağrıdıcı çaldıran döyüşünün acı mənzərəsini diqqət önünə çəkmişdir:

*Qəza dər kargahi-kəbyayi,*
*Fəkəndə tərhe "islimi" – "Xətai".*

(Sətri tərcüməsi: "Tale qəza xanasına "islimi" və "xətai" naxışlarını saldı").

Beləliklə, Xətai təxəllüsündə üç məna tutumunun a) yer-yurd, tayfa adı; b) xəta, günah; v) təsvir (rəsm-naxış) növü) yaşadığı aydın olur. Böyük sənətkar öz təxəllüsünün məna tutumundakı bu incəlikləri çox gözəl bilmiş və yeri gəldikcə təxəllüsün tarixi semantikasını özünəməxsus maneralarla poetik şəkildə mənalandırmışdır.

Görkəmli Azərbaycan şairi və dövlət xadimi Ş.İ.Xətainin təxəllüsü barədə dövri ədəbiyyatda fərziyyələr səngimək bilmir. Gah Hürrün qəbrinin açılması, gah şairin taleyi, gah da yer adı ilə əlaqələndirilən Xətai təxəllüsünə sadəcə kiçik bir aydınlıq gətirmək istəyirik[1]. Belə ki, Türkiyə ərazisində yerləşən Xətay adlı

[1] Şah İsmailin təxəllüsü barədə geniş məlumat üçün bax: Axund Hacı Soltan Hüseynqulu oğlu "Şah İsmail Xətai" (Bakı, 1997. səh. 58, 200, 204); Axund Hacı Soltan Hüseynqulu oğlu. "Xətaişünaslığa hədiyyə". Bakı, "Ozan", 1998. səh. 11, 165

vilayət guya Şah İsmailin təxəllüs götürməyinə səbəbdir. Halbuki, yer adları "təxəllüs" deyil, "nisbə" adlanır.

Jurnalist Flora Xəlilzadənin aşağıdakı müsahibəsindən aydın olur ki, şah İsmail öz təxəllüsünü Xətay vilayətinin adından deyil, Xətay vilayəti öz adını şah İsmailin təxəllüsündən götürüb. Lakin, bir çox mənbələrdə Xətay vilayətinin Şah İsmaildən qabaq mövcud olduğu bəyan edilir.

2001-ci ildə Bakıda Dünya Azərbaycanlılarının qurultayında Almaniyadan gəlmiş soydaşımız Başar Kömürün verdiyi müsahibə (ixtisarla).

"Qurulay günlərində söhbətləşdiyim müsafirlərdən biri də Almaniyadan gəlmiş soydaşımız Başar Kömür oldu. Təpədən-dırnağacan vətən adamı olan, bütün varlığından Böyük Vətəninin – Azərbaycanın həsrəti tökülən Başar bəy çox maraqlı bir şəxsiyyətdir. Onun söylədiklərini olduğu kimi oxucuların nəzərinə çatdırıram: "Türkiyənin Xətai vilayətindənəm. Almaniyada yaşayıram. 1993-cü ildə Mayns şəhərində təsis edilmiş Mayns-Azərbaycan cəmiyyətinin rəhbəriyəm və yəqin bilməmiş deyilsiniz ki, Uzun Həsənin övladı Xətainin Türkiyədə böyük bir nəsli yaşayır. Bax, mənim doğulduğum Xətai vilayəti də elə o böyük şəxsiyyətin adı ilə əlaqədardır və o bölgədə yaşayanların hamısının kökü azəridir. Mən də həmin nəslin övladıyam. Birinci dəfədir ki, Bakıya gəlirəm, özü də 50 ildən sonra. Qurultayda dedilər ki, dünyada 50 milyona yaxın azəri var. Mən bu sözlərdən bir üzüntü duydum. Dünyada 300 milyon azəri var. Bu, niyə 50 milyon olmuşdur. Bizlər deyərik ki, Türkiyədə 60 milyon azəri, Azərbaycanda isə 8 milyon türk vardır. Bax, mənim doğulduğum Xətai bölgəsində hər kəs kəndini türk adlandırır. Amma, əslində kökü azəridir. Bu gün Azərbaycanda, bu qurultayda bu qədər aydın qafalı adamı bir arada görmək mənim qürurumu artırdı. Mən dünyanın heç yerində bu qədər gözəl insanlar görməmişəm. Mən bütün arkadaşlarıma üzümü tutaraq bu sözləri demək istəyərdim: Ana yurdumuzun şərəfinə, Ana yurdumuzun

gələcəyi naminə bir-birinizi tutun, bir-birinizlə dost, bir-birinizə arxa olun”.[1]

Tədqiqatçı alimlərdən olan Nizami Gəncəvi adına Elmi Araşdırmalar və Dil-Ədəbiyyat İnstitutunun müəllimi Əli Məhəmməd Nəbibəylinin araşdırmaları nəticəsində tamamilə başqa inandırıcı fakt meydana çıxmışdır. Belə ki, tədqiqatçı alimlərin mənasız saydıqları nöqtəli “T” hərfi ilə yazılmış xəta sözünə məna tapılmışdır. Ərəb əlifbasının düzülüş formasından biri əbcəd adlanır. Xətai sözündəki ərəb əlifbası ilə ilk üç hərf (XTA) əbcəd düzülüş formasında hər hərfin eyni zamanda bir rəqəmi ifadə edən və əbcəd hesablama üsulu adı ilə məşhur olan, ən qədim zamanlardan bütün şərqdə geniş istifadə edilən vasitəyə müraciət etdikdə məlum olmuşdur ki, bu üç hərfin birincisi (X hərfi), 600 rəqəminə, nöqtəli T hərfi 400 rəqəminə, A (əlif) hərfi isə 1 rəqəminə bərabər olur. Cəmi 1001 rəqəmi alınır. Axırıncı “İ” hərfi isə mənsubiyyət bildirən şəkilçidir – 1001 rəqəminə bərabərdir.

Nizami Gəncəvi “Sirlər xəzinəsi”nin 2-ci münacatının sonunda Allaha müraciətlə “Nizaminin adında şərəfli adın vardır!” – deyir. “Nizami” sözündə də hərflərin rəqəm qiyməti 1001-dir. Bunu Əlişir Nəvai də təsdiq edir. İslam fəlsəfəsinə görə 1001 rəqəmi müqəddəsdir və Allahın müqəddəs adlarının sayına işarədir. Şah İsmail da həmin məqsədlə özünə Xətai təxəllüsünü götürmüşdür.

Azərbaycan ədəbiyyatı tarixində iki böyük ədib var ki, onların təxəllüslərinin əbcəd sayı 1001 rəqəmini ifadə edir. (Nizami, Xətai – H.H.)[2]

---

[1] Axund Hacı Soltan Hüseynqulu oğlu Əlizadə. “Duayi-Heydəri və ya Həzrəti-Əli (ə) zirvəsinə bir baxış”. Bakı, “Tural-Ə” NPM, 2002. səh. 249-251

[2] Hacı Həsən Hüseyni. “Xətai” təxəllüsü haqqında fikirlər // Şah İsmayıl Səfəvinin anadan olmasının 530 illiyinə həsr olunmuş “Xətainin qılıncı və qələmi” mövzusunda respublika elmi konfransının materialları”. Bakı, “Elm və təhsil”, 2017. səh. 255-256

Ş.İ.Xətainin öz yaradıcılığına müraciət etsək “Xətai” sözünün mənası tam aydınlığı ilə üzə çıxar.

*Yəqin bil ki, Xudaidir Xətai,*
*Məhəmməd Mustafaidir Xətai.*

*Səfi nəsli Cüneydi – Heydər oğlu,*
*Əliyyəl – Mürtəzaidir Xətai.*

*Həsən eşqinə meydanə gəlibdir,*
*Hüseyni Kərbəlaidir Xətai.*

*Əli Zeynulibad, Baqiri, Cəfər,*
*Kazım, Musa Rizaidir Xətai.*

*Məhəmməd Təqidir, Əli Nəqi həm,*
*Həsən Əsgər liqayidir Xətai.*

*Məhəmməd Mehdiyi Sahib – Zamanın,*
*Eşiqində gədayidir Xətai.*

*Mənim adım vəli Şah İsmaildir,*
*Təxəllüsü Xətaidir, Xətai.*

Birinci misrada açıq-aydın yazılmış “Yəqin bil ki, Xudaidir Xətai” sözündə tədqiqatçı alimləri beş əsr çaşdıran məhz ərəb əlifbasında olan iki “T” hərfinin mövcud olması və Xətai təxəllüsünün dəstəli “TA” hərfi ilə yazılması olmuşdur ki, bu da savadsız, əbcəd hesabından başı çıxmayan katiblərdən birinin təqsirindən törənmişdir.

Burada M.Füzulinin:

*“Qələm olsun əli ol katibi-bədtəhririn*
*Ki, fəsadi-rəqəmi surumuzu şur eylər.*

*Gah bir hərf qüsuruyla edər nadiri nar,*
*Gah bir nöqtə süqutuyla gözü kur eylər".*

sözü yerinə düşür.

Beləliklə, nadan bir katibin kobud səhvi üzündən böyük şairimizin təxəllüsü təhrif edilmiş, oxucu və tədqiqatçıları çaşdırmış, nəticədə Ş.İ.Xətainin adına və şəxsiyyəsinə yaraşmayan uydurmalar meydana çıxmışdır.[1]

Təəssüflər olsun ki, bir çox tədqiqatçılar bu sözləri yanlış anlamış, şairin xətasını Hürrün qəbrinin açılması ilə əlaqələndirib, təxəllüsü barədə yanlış nəticəyə gəlmişlər. Lakin biz burada sübut etməyə çalışdıq ki, şairin təxəllüsü günahla deyil, müqəddəsatla bağlıdır. Belə ki, şair "Dəhnamə" poemasını 1506-cı ildə 18 yaşında olarkən yazmış və poemadakı qəzəllərdə "Xətai" təxəllüsünü işlətmişdir. Lakin Hürrün qəbrini isə 1508-ci ildə açmışdır.

Böyük şəxsiyyətlərin tarixi araşdırmalarında zamanla kimlərinsə səhvlərini yenidən araşdıraraq oxucunu düzgün istiqamətləndirmək yazarın borcudur. Biz də bu borcumuzu yerinə yetirmək üçün müxtəlif mənbələrə istinadən şairin məhz öz yaradıcılığında təxəllüsünün nəyə dəlalət etdiyini diqqətinizə çatdırdıq. Aydınlaşdırmağa çalışdıq ki, böyük insanlar kobud səhvlərə yol verməzlər. Əgər irfan sahibi onu özü bu cür anlamağımızı istəmişdir və biz onu düzgün anlamamışıqsa, demək yanlış bizdədir. Şükürlər olsun ki, gec də olsa bu yanlışlıq aradan qaldırıldı...

[1] Əli Məhəmməd Nəbibəyli // "Ədəbiyyat və incəsənət" qəzeti, 01.06.1990

## 2.4. ŞAH İSMAİL XƏTAİNİN ƏDƏBİ İRSİ

Xətai əsas etibarilə Azərbaycan xalqının ədəbi-bədii irsi ilə tərbiyələnmiş və əsrlərdən bəri yaranan zəngin Azərbaycan ədəbiyyatı ənənələri ilə yaxından bağlı olmuşdur. O, sələfləri olan Nizami Gəncəvi, Əfzələddin Xaqani, Əvhədi Marağayi, İmadəddin Nəsimi, Kişvəri Təbrizi, Həbibi Məlik üş-Şüəra və başqa bu kimi qüdrətli Azərbaycan şairlərinin əsərlərini oxuyub öyrənmişdir. Şair, İran ədəbiyyatı ilə də yaxından tanış idi. O, Sədi, Hafiz kimi klassik şairlərin əsərlərini xüsusi bir hiss ilə sevmişdir. Lakin, Xətai yaradıcılığının təşəkkül və inkişafında Nəsimi şeiri çox mühüm rol oynamışdır. Nəsiminin üsyankar, döyüşkən ruhu Xətaidə daha da inkişaf edərək siyasi bir məna kəsb etmişdir. Xətai Nəsiminin fədakarlığına heyran qalmış, faciəli ölümünü acı-acı xatırlamış və şairin qənimi olan zahidlərə qarşı öz nifrətini bildirmişdir.

*Mehrü vəfa biri birindən azdı,*
*Bəhlul bequşliyin viranda gəzdi.*
*Seyyid Nəsimini zahidlər üzdi,*
*İncimədi həqdən gələn cəfayə.*

Klassik ədəbi irsin sənətkarlıq sirlərinə yaxından bələd olan Xətai Nəsiminin bir çox şeirlərinə nəzirələr də yazmışdır.[1]

Şah İsmail Xətai qısa həyat sürməsinə baxmayaraq, zəngin ədəbi irsə malikdir. “Xətai” təxəllüsü ilə şeirlər yazan şairin ədəbi irsi içərisində Azərbaycan dilində yaratdığı “Divan”, təlimi-didaktik və fəlsəfi mahiyyətdə yazdığı mənzumələr, lirik qoşmalar, bayatılar, “Dəhnamə” adlı poeması və “Nəsihətnamə” əsəri

[1] Əzizağa Məmmədov. “Şah İsmayıl Xətainin əsərləri” (ön söz) // Şah İsmayıl Xətai. “Əsərləri”. İki cilddə, 1-ci cild. (Tərtib, müqəddimə, lüğət və izahlar: Əzizağa Məmmədov). Bakı, “Azərnəşr”, 1975. səh.14-15

vardır.[1]

Tədqiqat göstərir ki, Ş.İ.Xətai hələ sağlığında ikən "Divan" yaratdığını özü xəbər vermişdir. O, bir neçə şeirlərində bakir fikirlərini "əşarə", "nəzmü nizamə", başqa sözlə şeir sənətinə "sərf etdiyini" və şairin bu "şeir dəftəri" ilə "Divan"ının şöhrəti irfan məclislərini tutduğunu" böyük bir iftixar hissi ilə qeyd etmişdir.

*Ey Xətai, fikri-bikrin eylədin əşarə sərf,*
*Dutdu ürfan məclisin dəftərlə divan şimdidən.*

Çox təəssüf ki, şairin öz sağlığında tərtib edilmiş, bəlkə də avtoqraf "Divan"ı olan bu qədim nüsxə elm aləminə məlum deyildir.

Xətai divanının İstanbulda Əli Əmiri kitabxanasında saxlanılan, əlyazma nüsxəsi ilə tanış olan görkəmli rus türkoloqu akademik B.A.Qordlevski hələ 1929-cu ildə Xətai əsərlərinin mühüm ədəbi abidə kimi qədim əlyazmaları əsasında hazırlanması və tezliklə nəşr olunması zərurətini irəli sürərək demişdir:

"Asiya xalqları muzeyində (SSRİ EA Şərqşünaslıq İnstitutunun Leninqrad şöbəsi – Əzizağa Məmmədov) mühafizə olunan "Divani-Xətai" əlyazması heç şübhəsiz böyük qiymətə malikdir. Mən burada Xətaini birdə ona görə xatırladıram ki, şairin divanının tezliklə nəşr olunması zəruridir".[2]

B.F.Minorski isə "I Şah İsmayılın poeziyası" adlı ingilis dilində qələmə aldığı tədqiqatında şairin əsərlərinin Avropadakı mükəmməl nüsxələri haqqında məlumat verir, şairin şeirlərinin

---

[1] Əzizağa Məmmədov. "Şah İsmayıl Xətainin əsərləri" (ön söz) // Şah İsmayıl Xətai. "Əsərləri". İki cilddə, 1-ci cild. (Tərtib, müqəddimə, lüğət və izahlar: Əzizağa Məmmədov). Bakı, "Azərnəşr", 1975. səh. 23

[2] Əzizağa Məmmədov. "Şah İsmayıl Xətainin əsərləri" (ön söz) // Şah İsmayıl Xətai. "Əsərləri". İki cilddə, 1-ci cild. (Tərtib, müqəddimə, lüğət və izahlar: Əzizağa Məmmədov). Bakı, "Azərnəşr", 1975. səh. 24-25

dil-üslub xüsusiyyətləri, vəzni, məzmun və mündəricəsindən geniş söhbət açır. Yazının sonunda Xətainin azərbaycanca 19 şeiri və bunların ingilis dilinə tərcüməsi verilmişdir.

B.F.Mirnorski Avropa müəlliflərinə nisbətən Xətai irsindən daha ətraflı bəhs etmiş, şairin Avropada tanınmasında mühüm rol oynamışdır. Bununla yanaşı tədqiqatda Xətai irsi xalqımızın ümumi təkamül prosesindən təcrid olunmuş şəkildə öyrənilir, şeirlərinin əsas qisminin dini-siyasi mahiyyətdə olduğu göstərilir.[1]

Türkiyədə buraxılan "İslam" ensiklopediyasında da Xətaiyə xüsusi yer ayrılmışdır. Əsasən Şah İsmailin bir hökmdar kimi fəaliyyətini əks etdirən bu yazıda onun ədəbi sahədə müvəffəqiyyət qazandığı qeyd edilir.

Ensiklopediyasının Təhsin Yazıçı tərəfindən qələmə alınmış Xətai bölməsində şair türk-fars və ərəb dillərində şeir yazmağa qabil olan bir ədəbi sima kimi qiymət alır. Şairin köklü-budaqlı bir zəmin üzərində yetişdiyinə işarə edən müəllif göstərirdi: "Xətai başda Nəsimi olmaqla Nizami Gəncəvi, Əvhədi Marağayi, Kişvəri Təbrizi kimi Azərbaycanda yetişmiş şairlərin şeirlərini oxumuş, bunlardan bilxassə ilkinin – yəni Nəsiminin təsiri altında qalmışdır… Nəsiminin üsyankar ruhu, onda daha da inkişaf etmiş və siyasi bir məna qazanmışdır".

*Şah Xətai didara bax,*
*Mənsur ipin boynuna tax.*
*Nəsimi oldu haqla haqq,*
*O üzülən dərisidi.*

Müəllif Ş.İ.Xətaini Azərbaycan ədəbiyyatının Nəsimi və Füzuli arasındakı dövrünün qüvvətli bir siması kimi təqdim edir.

[1] Vəcihə Feyzullayeva. "Xətai ədəbi irsinin tədqiqi tarixindən" // "Şah İsmayıl Xətai". (Məqalələr toplusu). Bakı, "Elm", 1988. səh. 34-35

Ensiklopediyada şair haqqında verilmiş biblioqrafiyadan onun əsərlərinin siyahısı və etiva etdiyi qayə və məqsəd, Xətai əsərlərinin Türkiyədə nəşri və öyrənilməsi haqqında məlumat almaq mümkündür. Şair haqqındakı bu biblioqrafiq məlumatda Xətai sənətinin nəşri və öyrənilməsində xidmətləri olan şəxsiyyətlər içərisində Hifzi Tövfik, Həmmamizadə Rüfət Gözmənin adları xüsusi yad edilir.

Türk müəllifləri içərisində Ziya Şakirin də Xətaiyə həsr etdiyi "Şah İsmayıl və məzhəblər tarixi" adlı əsəri maraqlı və oxunaqlıdır.

Kitabın müəllifi məzhəblər tarixinə qısa bir nəzər saldıqdan sonra qızılbaşlığın tarixi köklərini araşdırmağa çalışmış, bunu çox qədim tarixlərə aparıb çıxarmışdır. Əsərdə şiəlik, sünnilik, ələvilik, qızılbaşlıq və həmin məzhəblərin yaranma tarixi qısa şəkildə nəzərdən keçirilir. Şah İsmailin keçdiyi tarixi və eyni zamanda keçmə-keçli həyat yolu hekayəvari bir şəkildə nəql edilir.

Müəllif hökmdar-şairin uşaqlığından başlayaraq hakimiyyət başına keçənə qədərki həyat və fəaliyyətindən böyük hüsn-rəğbət və maraqla söhbət açır. Kitaba salınmış və bəzən artıq görünən bəzi təfərrüatlar da müəllifin nəzərdə tutduğu əsas məqsəd və qayəyə xidmət edir.

Bütün bu müsbət keyfiyyətlərlə yanaşı Türkiyədə Xətainin tarixi şəxsiyyət kimi rolunun, şeir-sənət aləmində tutduğu mövqeyi təkzib edən yazılarla da rastlaşmaq olur. Bu baxımdan İsmail Hikmətin şair haqqında qeyri-obyektiv, ziddiyyətli fikirləri "Həyat" ensiklopediyasında Xətaiyə verilən qiymət həqiqətdən uzaqdır.

Şairin siyasi və ədəbi fəaliyyətini təhrif edən müəlliflərə cavab olaraq deyə bilərik ki, Ş.İ.Xətai tarixə görkəmli dövlət xadimi, istedadlı sərkərdə və qüdrətli şair kimi daxil olmuşdur. Onun poeziyası Azərbaycan dilinin qüvvətlənməsində, bu dildə yaradılmış ədəbiyyatın yüksəldilməsində böyük rol oynamışdır.

Həyat gözəlliklərindən zövq almaq, mənəvi təkamül, insan gözəlliyinin, məhəbbətin müqəddəs bir nemət kimi tərənnümü

Xətai lirik dühasını səciyyələndirən xüsusiyyətlərdəndir.[1]

Görkəmli dövlət xadimi, ana dilində yaranan şeirin inkişafına xüsusi qayğı ilə yanaşan, özü bu dildə ölməz sənət inciləri yaradan Ş.İ.Xətai Azərbaycan xalqının ictimai-siyasi və mədəni yüksəlişində müstəsna xidmətləri olan nadir şəxsiyyətlərdəndir. Xalqımızın inkişafının ən mühüm mərhələlərindən biri onun adı ilə bağlıdır. Ş.İ.Xətai doğma zəminə möhkəm bağlı olan bir adam kimi ozan-aşıq sənətinə rəğbətlə yanaşmış klassik şeir formaları ilə yanaşı xalq şeirinin müxtəlif şəkillərində dillər əzbəri ola biləcək əsərlər yaratmışdır. Bir yandan yazılı ədəbiyyatın, başqa bir yandan xalq yaradıcılığının zəngin ənənələrindən bəhrələnən bu sərkərdə – şair ədəbi fəaliyyətində məzmunla formanı həmişə vəhdətdə götürmüş, hər formadan, janrdan, vəzndən yerinə görə istifadə etmişdir. Sadəlik, aydınlıq, səmimilik, həyata, onun tələblərinə dərindən bağlılıq Ş.İ.Xətai poeziyasının səciyyəvi keyfiyyətləridir. Bu poeziya saf mənəvi aləmin, aydın məfkurənin, sabaha dərin inamın, hər cürə şərə odlu nifrətin parlaq ifadəsidir.[2]

***

Xətainin yaradıcılığı Azərbaycan mədəniyyətinə, xüsusilə Azərbaycan şeirinin büllurlaşmasına və ədəbi dilimizin çiçəklənib rəvac tapmasına təqdirəlayiq xidmətlər göstərmişdir.

Azərbaycan ədəbiyyatı Şah İsmail Xətaiyə qədər çoxəsrli parlaq bir tərəqqi yolu keçmişdir. Bu ədəbiyyat xalqımızın təmiz və nəcib duyğularının, ali və vətənpərvərlik hisslərinin, ləkə qəbul etməyən namus-vicdanının yenilməz qüdrət və qırılmaz iradəsinin bədii əksi olan “Dədə Qorqud” dastanlarına malik idi. Bu

---

[1] Vəcihə Feyzullayeva. “Xətai ədəbi irsinin tədqiqi tarixindən” // “Şah İsmayıl Xətai”. (Məqalələr toplusu). Bakı, “Elm”, 1988. səh. 38-39

[2] Xəlil Yusifov. “Ş.İ.Xətainin həyatı və sənət dünyası” // Şah İsmayıl Xətai. “Keçmə namərd körpüsündən” (Şeirlər və poemalar). Bakı, “Yazıçı”, 1988. səh. 5

ədəbiyyatın möhtəşəm kəhkəşanında Qətran Təbrizi, Məhsəti xanım Gəncəvi, Əbül Üla, Xaqani Şirvani, Nizami, Fələki, Arif Ərdəbili, Nəsimi, Həbibi və b. bu kimi işıqlı ulduzlar parlamışdır. Xətainin xidmətlərinin böyüklüyü ondadır ki, bu iradəli insan əsrlər boyu yaranıb gələn zəngin mədəniyyətimizi xalqın malı etmək yolunda tarixi addımlar atmışdır.

Xətai dilimizdə və ədəbiyyatımızda olan yad təbirlər əleyhinə qəti mübarizə açdı və şairlərimizə öz ana dilində yazmaq, xalqa onun başa düşdüyü dil ilə xitab etmək imkanı verdi. Şah İsmail təkcə dil sahəsində deyil, demək olar ki, mədəniyyətimizin bütün sahələrində həqiqi bir inqilab yaratdı. Onun dövründə Azərbaycan ədəbiyyatı, müsiqisi, rəssamlığı, memarlığı, fəlsəfə, fikqh və riyaziyyat sürətlə tərəqqi etməyə başladı.[1]

Xətai təxəllüsü ilə gözəl şeirlər yazan Şah İsmail “Divan” yaratmış, mənaqibül-əsrar və behcətül-əhrar kimi qoşmalar məcmuəsi, “Dəhnamə”, “Nəsihətnamə” kimi məsnəvilər yazmışdır.[2]

Xətai divanında onun siyasi məqsədləri, yolu, açıqdan-açığa əks olunmuşdur:

*Yolumuz incədir, incədən-incə,*
*Bu yolda baş vermək ərkanımızdır.*

– deyə həyat yolunu müəyyənləşdirən şair –şah öz tarixi mövqeyini də dəqiqləşdirir.

*Mənəm Sultan Xətai Heydər oğlu,*
*Mənim yolumda qovğalər gərəkdir.*

Hələ körpə yaşlarında onun yolunda çox qurbanlar gedib.

---

[1] Həmid Araslı. “Şah İsmayıl Xətainin poeziyası” // “Şah İsmayıl Xətai”. (Məqalələr toplusu). Bakı, “Elm”, 1988. səh. 9

[2] Həmid Araslı. “Şah İsmayıl Xətainin poeziyası” // “Şah İsmayıl Xətai”. (Məqalələr toplusu). Bakı, “Elm”, 1988. səh. 10

Xətai ulu babası Şeyx Səfiəddindən bəri babası Şeyx Cüneyd və atası Heydərə qədər bütün Səfəvi şeyxlərinin, müridlərinin qəlbində yaşayan və həyata keçməmiş bir arzu kimi nəsildən nəsilə ötürülərək Şah İsmailə qədər gəlib çatmış, onun həyat qayəsinə çevrilmiş fikri belə ifadə edir:

*Səfər qıl, dur, oturma, ey Xətai*
*Ki, şəhri Ərdəbildə bir xanədan var.*

Ərdəbil şeyxlərinin xanədanına vərəsəlik xəyalı bu şəhərdə İsmaildən iki yüz il qabaq yaranmış bir əqidənin təntənəsinə nail olmaq – ən körpə çağından İsmailə təlqin edilən və onun ürəyində kök salmış bir məslək idi.

Şah İsmailin ömür yolu – İnsanın Tarixdə yeri haqqında, Tarixin və Taleyin çarpazlaşması haqqında müxtəlif düşüncələr oyadır. Sanki, bu şəxsiyyət doğulduğu gündən çox-çox qabaq dünyaya varid olub. Axı Şah İsmailə yalnız konkret bir varlıq, insan, hökmdar, şair deyil – o, həm də müəyyən tarixi məqsədin və məsləkin daşıyıcısıdır, bu məqsəd və məslək isə onun düyaya gəlməsindən çox-çox əvvəllər meydana çıxmış, cücərməyə, boy atmağa başlamışdır. Bu məsləkin ilk rüşeymi – mövcud olan siyasi-ictimai mühitdən narazılıqdır, barışmazlıqdır.[1]

Şairin əsərləri içərisində Səfəvi dövlətini möhkəmləndirməyə xidmət edən, bu dövlətin istinad etdiyi dini görüşlərin təbliğinə həsr olunmuş əsərlər də mühümdür.

*Ululuq istər isən qulluq eylə,*
*Ayaq bir-bir basarlar nərdivanə.*
*Cahanı açdı Sultan Heydər oğlu,*
*İrişdi qazilər dürri-məkanı.*

[1] Anar. “Şairin zəfəri” // “Şah İsmayıl Xətai”. (Məqalələr toplusu). Bakı, “Elm”, 1988. səh. 42-43

kimi fəxriyyəsində və ya

*Üç gün imiş bu dünyanın səfası,*
*Səfasından artıq olur cəfası,*
*Gerçək ərənlərin eşqi havası,*
*Biri qırxdır, qırxı birdən sayılır.*

*Gerçək aşiq mənzilində durursa,*
*Çıraq kimi yanıb şəmi ərirsə,*
*Əksikliyin kəndisində bilirsə,*
*Ol aciz olsa da, ərdən sayılır.*

kimi təbliği misralarında biz şair-hökmdarın xalqa yaxınlaşmaq, xalq qüvvələrini mərkəzləşdirmək, özünü təvazökar bir dövlət xadimi kimi tanıtmaq səylərini görürük.

Xətai sənəti iki yolla inkişaf etmişdir. Bu yolların birinci və başlıcası xalq yaradıcılığı yoludur. Bu yolla Xətai sadədən-sadə və hər bir ifadəsində o qədər səlisdir ki, hər kəs onu çox asanlıqla başa düşür. O, təbliği əsərlərində də, lirik əsərlərində də bu yoldan çox geniş istifadə etmişdir.

*Çıxdım qırxlar yaylasına,*
*Çağırdım üçlər eşqinə,*
*Üzümü yerlərə sürtdüm,*
*Yeddilər, qırxlar eşqinə.*

misralarında şair-hökmdar sadə bir xalq aşığıdır.[1]

Şah İsmail Xətai el ədəbiyyatı, aşıq qoşmaları ilə yanaşı klassik şairlərimizin irsindən də ehtiram və məharətlə istifadə edən

[1] Həmid Araslı. “Şah İsmayıl Xətainin poeziyası” // “Şah İsmayıl Xətai”. (Məqalələr toplusu). Bakı, “Elm”, 1988. səh. 15

bir şair olmuşdur. O, xalqımızın zəngin ədəbiyyat və mədəniyyət tarixini bilirdi. Qətranların, nizamilərin, xaqanilərin, nəsimilərin, yaratdığı qiymətli mədəniyyət xəzinəsinə bələd idi. Xətainin Azərbaycan şairlərindən Xəlili, Həbibi, Nəsimi, Hamidi və başqalarına nəzirələr yazmasının sirri də bunda idi.[1]

Şah İsmail Xətainin yaradıcılığına əsl qiymət bizim zəmanəmizdə verilmişdir. Şairin ədəbi irsi çox yüksək qiymətləndirilmiş, ona milli vüqarımızı yüksəldən bir sərkərdə kimi ölməz əsərlər müəllifi bir şair kimi ehtiram və məhəbbət bəslənmişdir. Onun ədəbi irsi dəfələrlə nəşr edilir, haqqında elmi ədəbi əsərlər yazılır. Şairə zəngin Azərbaycan ədəbiyyatı və mədəniyyəti tarixində görkəmli yer verilir.[2]

Bu deyilənlərdən fərqli olaraq Sovetlər Birliyi dönəmində bir çox şairlərimizin yaradıcılığında dini motivlərin kölgədə qalınması Şah İsmail yaradıcılığından da yan keçməmişdir. Yazıçılar Birliyinin sədri, xalq yazıçısı Anarın "Xətai yaradıcılığına ən düzgün qiymət bizim zəmanəmizdə verilmişdir" cümləsini yuxarıda bu səbəbdən vermişdik. Belə ki, Sovet dönəmində ədəbiyyat qarşısına senzura "ateizmə riayət" tələbi qoymuşdur. O tələb pozulan hər hansı bir əsər çapa getmirdi. Orta əsr siyasi düşüncəsi isə yalnız dindən ibarətdir. Bu ana xəttdən kənara çıxan tədqiqat əslində beli sındırılmış zavallı bir cümlə yığınıdır. Bu səbəbdən Xətaini fateh, Füzulini ateist bilmişik. Bu cür şairlərin yaradıcılığının əsas qayəsi Qurani-Kərimə və Əhli-beytə (ə.m) istinaddırsa onu ateizm ruhunda necə tədqiq etmək olar? Başqa sözlə bizə onu yarımçıq, bir qədər anlaşılmaz, bir qədər də təcavüzkar bir imperator olaraq təqdim edə etmişlər. Təəssüf ki, bu günə qədər Şah İsmail Xətai barədə tədqiqat aparan Həmid Araslıdan tutmuş bir çox sovet dövrü tədqiqatçılarının heç biri

---

[1] Həmid Araslı. "Şah İsmayıl Xətainin poeziyası" // "Şah İsmayıl Xətai". (Məqalələr toplusu). Bakı, "Elm", 1988. səh. 16

[2] Həmid Araslı. "Şah İsmayıl Xətainin poeziyası" // "Şah İsmayıl Xətai". (Məqalələr toplusu). Bakı, "Elm", 1988. səh. 17

onu bütöv şəkildə tədqiqata cəlb edə bilməmişlər.

Bu tədqiqatçılardan dünyasını dəyişmiş alimlərimizin ruhuna Allahdan rəhmət, qalanlarına isə can sağlığı diləyirik. Bu monoqrafiyanı yazmağa bizi təhrik edən əsas səbəblərdən biri də bu olub ki, həmin tədqiqatların nəticələrini müasir tədqiqatın ana xətti ilə birləşdirib Xətainin bütöv bir portretini yaradaq. Nəhayət, Xətaini olduğu kimi cəmiyyətə təqdim edək. Çünki, Xətai yaradıcılığının ana xəttini Həzrəti-Əliyə (ə) məhəbbət motivi təşkil edir. Həmçinin şairin yaradıcılığında Quran və Əhli-beyt (ə.m) sevgisinin də bariz şəkildə şahidi oluruq. Bu monoqrafiyanın yazılmasında da əsas məqsəd Xətainin Əhli-beytə (ə) olan sonsuz eşqinin olmasıdır.

# III FƏSİL

## 3.1. ƏHLİ-BEYT (Ə) AŞİQİ XƏTAİ

Şah İsmailin həyat və fəaliyyətinə müxtəsər bir nəzər salmaq belə, onun Əhli-beytə (ə.m) məhəbbət ruhunda böyüyüb, boya-başa çatdığını inkar olunmaz surətdə subuta yetirir. İstər orta əsr məxəzləri, istərsədə həmin məxəzlərin araşdırıldığı çox saylı elmi nəzəri tədqiqatlar belə dəlillərlə doludur.

Kimin hansı tərəfə yozmasından asılı olmayaraq belə dəlillərin çoxluğu Şah İsmailin şəxsiyyətinin formalaşmasında Əhli-beytə (ə.m) məhəbbət amilinin geniş yer tutduğunu iddia etməyə imkan verir.

Bəs, Əhli-beytə (ə.m) məhəbbət dedikdə hansı cəhətlər nəzərdə tutulur?

Burada ilk növbədə Seyyidlik, mükəmməl təhsil alma, Həzrəti-Əliyə (ə) xususi ehtiram, xəvariclərə və Yezidə nifrət, Kərbəla şəhidlərinin təəssübkeşliyi, 14 məsuma (ə) məhəbbət, on ikinci İmamın (əc.f) zuhuruna dəlil və inam, Əhli-beytə (ə.m) dərin məhəbbət bəsləyərək şəhid edilmiş ata-babalarının intiqamını almaq hissi ilə yaşamaq və s. cəhətlər daxildir. Əlbəttə, bu cəhətlərin hər biri ilə bağlı ayrı-ayrılıqda mühakimə yürütmək mümkündür. Lakin tədqiqat işimizin məqsədi bilavasitə bu olmadığı üçün indiki halda bundan sərfi-nəzər edirik. Bununla belə şairin əsərlərini lazımınca təhlil edə bilməkdən ötəri bu cəhətləri müxtəsər surətdə olmuş olsa belə nəzərdən keçirməyi zəruri hesab edirik.

Əhli-beytə (ə.m) məhəbbət amilinin Şah İsmail Xətai şəxsiyyətinin tərkib hissəsi kimi mühümlüyünə dəlalət edən başlıca cəhət onun seyyid olub-olmamasıdır. ("Ağa, böyük, ağsaqqal, qəbilə və tayfa başçısı hörmətli və nüfüzlu şəxs" – kimi lüğəvi mənalara gələn Seyyid sözü dini-islami istila olaraq "Sonuncu Peyğəmbərin (s) nəslinə mənsub olma" mənasını bildirir.) Sözün lüğəvi mənaları Qurani-Kərimdə əksini tapmışdır. Belə ki, müba-

rək “Ali-İmran” surəsinin 38 və 39-cu ayələrində bu söz Həzrəti-Yəhya (ə) ilə bağlı rəhbər mənasında verilmişdir: “Elə oradaca (Məryəmdəki ləyaqəti gördükdən sonra) Zəkəriyya (ə) Rəbbini çağıraraq dedi: “Ey Rəbbim! Öz tərəfindən mənə (də) pak bir övlad bəxş et! Sən duaları eşidənsən” – “O, mehrabda durub dua edərkən mələklər onu çağırdılar: “Allah səni Yəhya (ə) ilə Allahın kəlməsini (İsanı) təsdiq edən, rəhbər olacaq, üsyankar nəfsinə hakim və əməli salehlərdən olacaq bir peyğəmbərlə müjdələyir”.[1]

Vaxt ötdükcə söz müxtəlif mövzu, məzmun və məfkurə cizgiləri alaraq özünü məzhəb və təriqət dairəsini genişləndirmişdir. Qətiyyən təsadüfü hal hesab edilməməlidir ki, Hənəfilik məzhəbində İmam Həsənin (ə) nəslindən gələn dini müqəddəslərə “Şərif”, İmam Hüseyn (ə) soyundan olan bu qəbilli şəxslərə isə “Seyyid” deyilmişdir. Yaxud Qurani-Kərimdəki məşhur “Hürufi-Müqəttəə” (kəsik-kəsik hərflər) – buna hürufil-hecaiyyə (heca hərfləri) və “Fəvatüs-süvar” – (surə açılışları, surələrin başlanğıcları) da deyilir məfhumun əsas əlamətlərindən hesab edilən mübarək “Yasin” surəsinin əvvəli “Yasin” – Ya seyyidəl mursəlin” (ey Mürsəl Peyğəmbərlərin ağası, rəhbəri) şəkilində yozulmuşdur. Bu yozum Xətai irsində də bədii əksini tapmışdır məs:

*Sureyi-“Taha” vü “Yasin”ü “Təbarək” hüsnünə,*
*Gör nə təzim eyləmişdür Həq-təala, Rəbbəna.*[2]

*(Q. 13. Səh.49)*

və yaxud,

---

[1] Ayətullah-üzma Nasir Məkarim Şirazi. “Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı”. (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, “Nurlar”, 2017. səh. 55

[2] Şah İsmail Səfəvi (Xətai) külliyyatı. Qəzəllər, qəsidələr, nəsihətnamə, dəhnamə, qoşmalar. (Tərtibatçısı: Mirzə Rəsul İsmailzadə). Bakı, Əlhuda, 2004

*Xətai, sirridür "Taha"vü "Yasin",*
*Durubdur ortada, mizan deyilmi? (Q. 401; s.255)*

Bu təsəvvür bu gün də canlı olaraq yaşamaqdadır. Digər tərəfdən **"Yasin"** sözü Həzrəti-Mühəmmədin (s) yeddi ən məşhur adından biri kimi də başa düşülür. Aşağıdakı ümumiləşdirilmiş təfsir bu deyilənləri əsaslı surətdə təsdiq edə bilər:

**"Yasin"** surəsi də digər 28 surə kimi, Müqəttəə (Müqəttəə hərfləri Quranın 29 surəsində "Bismillahir-Rəhmanir Rəhim" ayəsindən sonra gələn və adı ilə oxunan hərflərə deyilir) hərifləri ilə başlayır.

Bu həriflər **"Ya"** və **"Sin"** hərifləridir bu həriflər barədə bir neçə təfsirlər verilmişdir. Ancaq **"Yasin"** surəsi barədə bu təfsirdən əlavə digər təfsirlərdə olmuşdur. O, cümlədən bu kəlmə (yəni Yasin kəlməsi) **"Ya"** və **"Sin"** həriflərindən təşkil olunmuş bir kəlmədir. **"Ya"** hərifi (ərəb dilinin qırammatikasında) nida hərifi, **"Sin"** hərifi isə Peyğəmbər (s) həzrətlərinə xitabdır. Beləliklə, Allah-təala Peyğəmbəri (s) sonrakı ayələr üçün müxatət qərar verir. Müxtəlif hədislərdə gəlmişdir ki, **"Ya-sin"** Peyğəmbərin (s) adlarından biridir.[1]

**"Sin"** hərfi barədə başqa bir nəzəriyyə isə budur ki, burada xitab Peyğəmbərin (s) özünə yox, bütün insanlaradır. Lakin, bu etimal sonraki ayələrlə uyğun gəlmir. Çünki, sonraki ayələrdə bütün xitablar yalnız Peyğəmbərə (s) olunub. Belə ki, **"Ya"** hərifi (ərəb dilinin qramatikasında) nida ədatı, **"Sin"** hərifi isə bəşərin Seyyidi olan Həzrəti-Peyğəmbərə (s) xitabdır. Əgər bu hərifləri bir kəlmə kimi oxusaq **Ya-sin** ümumilikdə Həzrəti-Peyğəmbərin (s) adıdır.

Bu barədə İmam Sadiqdən (ə) belə bir rəvayət vardır:

**"Ya-sin"** ismu Rəsulillahi (s) vəddəlilu əla zalikə qəvluhu təala: **"İnnəkə ləminəl mursəlin. Alə siratin müstəqim"**

---

[1] "Nurus-səqələyn". 4-cü cild. səh. 374-375

**- “Ya-sin”** Allahın Rəsulunun **(**Muhamməd (s) Peyğəmbərin) adıdır. Bunu sonrakı **“Sən həqiqətən Peyğəmbərlərdənsən. Doğru və düz yoldasan”** ayələri də təsdiq edir.[1,2]

Bu qədər geniş və dərin anlam incəliklərinə və məna-məzmun şəbəkəsinə baxmayaraq məfhumun Şah İsmail şəxsiyyəti ilə əlaqəsi əldə olan qaynaqlarda hələ ki, bir mənalı fakt kimi qəbul edilmir:

“Bu məsələni aydınlaşdırmağın mürəkkəbliyi onunla əlaqədardır ki, Səfəvilərin uzaq əcdadları barədə məlumatları özündə əks etdirən yeganə mənbə Təvəkkül ibn İsmail ibn Bəzzazın “Səffat Əs-səfa” (saflığın-saflığı) adlı agioqrafik əsəridir. Dərviş Təvəkkülün əsəri möcüzələr haqqındadır, tipik sufi kitabıdır və XVI əsrin ikinci yarısında tərtib olunmuşdur.

Tədqiqatçıların belə bir fikri diqqətə layiqdir ki, bu əlyazmalar müxtəlif dəyişikliklərə və saxtalaşdırmalara məruz qalmışdır. Bu qəzaya “Səffat-əs-səfa” nüsxələri də məruz qalmışdır.[3]

Beləliklə, aydın olur ki, hansı baxış bucağından yanaşılırsa yanaşılsın Seyyidlik amili istər-istəməz Ş.İ.Xətainin nəsəbi, soyu, keçdiyi ömür yolu, şəxsiyyəti, ədəbi kimliyi və apardığı mübarizə tarixcəsi ilə bu və yaxud başqa dərəcədə bağlıdır:

*Xətayiyəm, al atluyam,*
*Sözü şəkərdən tatluyam.*
*Murtəza Əli zatluyam,*
*Ğazilər deyən şah mənəm.*[4]

Məxəzlərdə əksini tapmış çox saylı məlumatlara əsasən Şah

---

[1] Ayətullah-üzma Nasir Məkarim Şirazi. “Ya-Sin” surəsi. (tərcümə və təfsiri). (Mütərcim: M.Ağaverdiyev). Bakı, 1998. səh. 9-10
[2] Seyyid Əli Əkbər Ocaq Nejat. “Ya sin” surəsinin təfsiri. Bakı, 2014. səh. 15
[3] Oqtay Əfəndiyev. “Azərbaycan Səfəvilər dövləti”. Bakı, “Azərnəşr”, 1993
[4] Şah İsmayıl Xətai. “Keçmə namərd körpüsündən” (Şeirlər və poemalar). Bakı, “Yazıçı”, 1988. səh. 326

İsmail Xətai uşaqlıqdan geniş dini təhsil almışdır ki, onun Əhli-beytə (ə.m) məhəbbət ruhunda yetişməsində bu amil də böyük rol oynamışdır. Məsələn: Rəştə gələn İsmaili müridləri hakimin sarayında deyil, (Ağ Məscid) də gizlədirlər. Məscidin yaxınlığında zərgər dükanı saxlayan Əmir Nəcm adlı bir şəxs kiçik İsmailə yaxından xidmət edir.

Lakin Rəşti də təhlükəli hesab edən qızılbaşlar buranı tərk edərək Lahıcana, qərqiyyə Mirzə Əlinin sarayına gəlirlər burada qonaqlar böyük rəğbət və ehtiramla qəbul edilirlər. Yerli üləmalardan Şəmsəddin Lahıcı İsmailin tərbiyəçisi kimi onunla məşğul olurdu. O, İsmaili Ərəb və Fars dillərini öyrədir. Qurani-Kərimi oxutdururdu.[1]

İsmail 6 ilə yaxın Lahicanda qaldı. Burada qaldığı müddət ərzində o, Ərəb və Fars dillərini öyrənmiş, Quranı əzbərləmişdir. İtalyan müəlliflərinin verdiyi məlumata görə Şeyx Heydər öldürüldükdən sonra Səfəvi qardaşları dörd il yarım Van gölündə olan Axtamar monastrında yaşamışdılar. Onlar orada qalarkən bir keşiş İsmailə Tövrat və İncili öyrətmiş, "İslam dininin bihudə bir din olduğunu başa salmışdır.

"Bu məlumatlardan aydın olur ki, İsmail on-onbir yaşına qədər İncil, Tövrat və Quranı öyrənmiş, Ərəb və Fars dillərini mənimsəmiş, müxtəlif təhlükələrə məruz qalmışdır. Şübhəsiz, uşaqlıq illərindən başlayaraq dünya görüşünün yetginləşməsi, onu çətin vəziyyətlərdən vaxtında yaxa qurtarmağa hazırlamışdır".[2]

Göründüyü kimi məxəzlərdəki məlumatlar Şah İsmailin dini təhsilinin genişliyini möhkəm surətdə təsdiq edir. Belə ki, bu məlumatlar ancaq İslamla məhdudlaşmayıb başqa dünya dinlərini də əhatə edir. Deməli Şah İsmailə Əhli-beyt (ə.m) məhəbbəti

---

[1] Oqtay Əfəndiyev. "Salnaməçi Bicən Şah İsmail Xətai haqqında" // "Şah İsmayıl Xətai". (Məqalələr toplusu). Bakı, "Elm", 1988. səh. 20

[2] Şahin Fərzəliyev. "Qiyasəddin Xondəmir və Həsən bəy Rumlu Şah İsmayıl Xətainin fərdi xususiyyətləri haqqında" // "Şah İsmayıl Xətai". (Məqalələr toplusu). Bakı, "Elm", 1988. səh. 81

zorakılıqla və məcburi surətdə yox, sərbəst iradə əsasında aşılanmışdır.

*Bu Xətai der: "Əzəldən mən İmamın quluyam",*
*Ol İmami-həq Əliyyül-Mürtəzasından mədəd!*[1]

Bu cəhətlər sonralar şairin yaradıcılığında əsaslı surətdə öz əksini tapmışdır. Məsələn:

*Həqq təala dörd kitabı gögdən endirdi yerə,*
*Mən anı istəməzəm çün küllü fürqan məndədir.*

*Katiba, ağü qəraya baxma, səni azdurur,*
*Aç qulaq, dinlə sözün, avazi Quran məndədir.*[2]

---

[1] Şah İsmayıl Xətai. "Keçmə namərd körpüsündən" (Şeirlər və poemalar). Bakı, "Yazıçı", 1988. səh.58
[2] Şah İsmayıl Xətai. "Keçmə namərd körpüsündən" (Şeirlər və poemalar). Bakı, "Yazıçı", 1988. səh.52

## 3.2. ŞAH İSMAİL XƏTAİYƏ QƏDƏRKİ ŞƏRQ ƏDƏBİYYATINDA ƏHLİ-BEYTİN (Ə.M) TƏRƏNÜMÜ

Bütün varlıqları ilə İslami dəyərlərə bağlı olan müsəlman ədiblər həmişə Peyğəmbəri (s) və Əhli-beytini (ə.m) özləri üçün örnək saymış, fürsət düşər-düşməz Əhli-beytin (ə.m) məziyyətlərini dönə-dönə tərənnüm etmişlər. Onların Əhli-beyt (ə.m) məhəbbəti gör nə qədər güclü olmuşdur ki, bu, həmin ədiblərin mənsub olduqları xalqların fokloruna da, şifahi ədəbi abidələrinə də sirayət etmişdir. Kitabi-Dədə Qorqudda ki, İslami motivləri məhz bu baxımdan dəyərləndirmək gərəkdir.

"Dədə Qorqud" dastanında Qurani-Kərimin xüsusi fəzilətlərə malik "**Ən-nəbə**" və "**Ya-sin**" surələri zikr olunur. Dastanda Əhli-beyt (ə.m), xüsusən, Həzrəti-Əlinin (ə) vilayəti barədə buyurulur: "Qılınc çaldı, din açdı mərdlər şahı Əli − əhsən".

Həzrəti-Əli (ə) Peyğəmbərdən (s) sonra həm kəlamı, həm də qılıncı ilə dinimizı qüvvətləndirən və şöhrətləndirən, şücaəti, səbri, təqvası ilə islamı yaşadan ikinci böyük şəxsiyyət idi. Dastanda "**Ən-nəbə**" və "**Ya-sin**" surələri barədə deyilir:

*Quranın son fəslində "Əmmə" surəsi gözəldir!*
*Höccətlənib düz oxunsa, "Yasin" gözəldir!*

Təfsir alimlərinin fikrincə, "**Əmmə**" surəsində əsas məqsəd Qiyamət günü olsa da, Peyğəmbər (s) surənin əvvəlinci iki ayəsinin təfsirində "Onlar (müşriklər) bir birindən nə haqda soruşurlar?", "Böyük bir xəbərdən" "Elə bir xəbər ki, onun haqqında ixtilafdadırlar". Peyğəmbər (s) buyurur ki, "Böyük xəbər" İmam Əlinin (ə) vilayət məsələsidir ki, bu barədə bütün insanlardan qəbr evində də soruşulacaqdır.

Şərq dünyasının dahi şairlərindən biri də Əbülqasim Firdovsidir. Şair məhşur "Şahnamə" əsərində dəfələrlə İmam Əlinin (ə) mübarək adını xatırlayaraq, ona qarşı olan sevgi və məhəbbətini

Peyğəmbərin (s) dili ilə vəsf edir.

*Xəlifə olub növbət ilə Əli,*
*Muhəmməd onu vəsf edibdir, bəli!*
*Demiş ki, Əli olmasaydı əgər,*
*Qazanmazdı İslam bunca zəfər.*[1]

Firdovsi "Şahnamə" əsərinin müqəddiməsində İslam Peyğəmbərinin (s) şəninə təriflər söylədikdən sonra Peyğəmbərin (s) Əhli-beytinə (ə.m) ehtiram və məhəbbətini belə ifadə edir:

*Peyğəmbərin söylədiyi yolla get,*
*Ürəyini bu saf su ilə pak et.*
*And içirəm: Bu sözləri o deyib,*
*Qulaqların onun səsin dinləyib.*
*Elmin şəhri mənəm, qapısı Əli,*
*Peyğəmbər söyləyibdir bu sözləri.*
*Mən Peyğəmbər Əhli-beytinə qulam,*
*Onlara dua etməklə məşğulam.*

Sultan Mahmuda ünvanladığı başqa bir şeirdə Firdovsi özünü Peyğəmbərin (s) qulu, yolunun isə hər zaman Əli (ə) yolu olduğunu xatırladır:

*Kimin ki, Əliylə düşmənliyi var,*
*Hər iki dünyada olacaqdır xar.*

*Mən kiməm? Nəbinin kiçik bir qulu,*
*Yolumdur hər zaman Əlinin yolu.*

*Əlinin, Nəbinin yazdım adından,*
*Dürr yağar şeirimin hər qanadından.*

---

[1] Əbülqasim Firdovsi. "Şahnamə". Bakı, "Öndər nəşriyyat", 2004

Böyük keçmişə və qədim mədəniyyətə malik olan Azərbaycan xalqının ictimai-bədii təfəkkür tarixinin görkəmli nümayəndələrindən biri də Qətran Təbrizidir (1012-1088). Qətran da orta əsr Azərbaycan şairləri kimi, Həzrəti-Əlini (ə) tərifləmiş və onu bir qəhrəman kimi vəsf etmiş, bir ordunu məhv edən qəhrəman adlandırmışdır. Şair deyir:

*Yüksək hümmətilə fələklərə hücuma keçən o Əli,*
*Min cəngavər ordunu bircə döyüşündə məhv edər.*[1]

Şair başqa bir şeirində İmam Əlinin (ə) döyüş meydanlarındakı düşmənə hücumlarından xüsusi bəhs edir və onu tərənnüm edir. Şair bu münasibətlə deyir:

*Məclisdə Hətəmin səxavəti yada düşür,*
*Meydanda Heydərin hücumları yada düşür.*

Heydər – birinci İmam Əlinin (ə) adlarından biridir. Qətran Təbrizi "Əli qızıl bağışlayan, qılıncı ölkə fəth edəndir" deyir.

*Əli yanında Dəclə və Fərat bircə damla kimidir,*
*Qılıncı qarşısında fil və kərgədan bir ağcaqanad kimidir.*

Şair başqa bir şeirində İmam Əlinin (ə) açıqürəkli olmasından, adamların ona həsəd aparmasından xüsusi bəhs edir. Şair bu münasibətlə deyir:

*"Əli və ürəyi daima açıq olsun,*
*Həsəd aparanı müdam palçığa batsın,*
*Bahar buludu Əlinin bəxşişi yanında daima xəcil olsun.*

---

[1] Qətran Təbrizi. "Divan". Bakı, 1967. səh. 338

Misal gətirdiyimiz şeir parçalarından aydın olur ki, İslam aləmində məşhur olan İmam Əlinin (ə) gördüyü işlər Qətran Təbrizinin diqqətini cəlb etmiş və şair ona öz məhəbbətini bədii boyalarla ifadə etmişdir. Bunun la da şair İmam Əlinin (ə) tarixi şəxsiyyət kimi gözəl keyfiyyətlərini verə bilmişdir.[1]

Klassik ədəbiyyatımızda xüsusi yeri olan şairlərimizdən biri də Xaqani Şirvanidir. Şair Mövla Əlini (ə) yüksək elm və mərifət sahibi kimi tanıtdıraraq yazır:

*Qoysalar da şeirimə qarşı çürük hədyanları,*
*Bu Turabın qarşısında bu Ləhəbin yox yeri.*

Şair Həzrəti-Əlinin (ə) müqabilində Əbu Ləhəb kimi müşriklərə yer olmadığını qeyd etməklə bir tərəfdən Həzrəti-Əlinin (ə) danılmaz fəzilətlərinə işarə edir, digər tərəfdən də bir şair kimi özünün dövrün yalançı, riyakar qələm sahiblərindən ölçüyəgəlməz üstünlüyünü və alicənablığını dilə gətirir.

Beytdə adı çəkilən Əbu Ləhəb Peyğəmbərin (s) əmisi olmasına baxmayaraq iman gətirməmişdir. Bu barədə Qurani-Kərimin 111-ci "Məsəd" surəsində məlumat verilmişdir: 1. "Əbu Ləhəbin əlləri kəsilsin"; 2. "Nə var-dövlətinin nə də qazandıqlarının ona faydası olmayacaq"; 3. "Tezliklə o, alovlanan oda girəcək"; 4. "Onun odun daşıyan arvadı da"; 5. "Arvadının boynunda xurma lifindən kəndir olacaqdır".

Surədə İslamın iki düşməni, yəni Əbu Ləhəb və onun arvadından danışılır, onların imansız və Cəhənnəmlik olduqları açıq şəkildə ifadə edilir. İbni Abbasa istinad edilən bir məlumatda qeyd edilir ki, **"Yaxın qohumlarını qorxut"** ("Şüəra", 214) ayəsi nazil olduqdan və Peyğəmbərə (s) yaxın qohumlarını qorxutmaq və İslama dəvət etmək əmri verildikdən sonra O, Səfa

[1] Məhəmməd Balayev. "İmam Əli (ə) şairlərin gözü ilə" // "Həzrəti-Əlinin (ə) həyatı və şəxsiyyətinə həsr olunmuş beynəlxalq elmi konfransının materialları". Bakı, 2001. səh. 361-362

dağına çıxıb camaatı səslədi. Camaat dağın ətəyinə toplaşdıqdan sonra buyurdu: "Mənə deyin görüm, əgər sizə xəbər versəm ki, düşmən süvariləri səhər tezdən sizə hücum çəkəcək və ya gecə basqın edəcək, mənə inanarsınızmı?" Onlar "Biz səndən heç vaxt yalan eşitməmişik" – deyə cavab verdilər. O, dedi: **"Mən sizi Allahın şiddətli əzabından xəbərdar edirəm".** Əbu Ləhəb bu sözü eşidən kimi dedi: "Ölüm olsun sənə! Bizi elə bunu demək üçün toplamısan?" Bu surə elə həmin vaxt nazil oldu. Bəziləri əlavə olaraq qeyd edirlər ki, Əbu Ləhəbin arvadı (Ümmü Cəmil) bu surənin əri ilə onun haqqında nazil olduğunu eşitdikdə Peyğəmbərin (s) yanına gedir. O, Peyğəmbəri (s) tapa bilmir, əlinə bir daş götürüb deyir: "Eşitmişəm Muhamməd mənim haqqımda pis danışıb. And olsun Allaha! Əgər onu tapsam, bu daşı onun ağzına çırpacağam. Mən də şairəm". bunu deyib Peyğəmbər (s) və İslam haqqında həcvlər deyir. Əbu Ləhəb və arvadının İslama qarşı olan ədavət və düşmənçiliyi bununla bitmirdi. Əgər Quran onlara kəskin münasibət bildirib açıq şəkildə pisləyibsə, deməli, daha tutarlı səbəblər var. Deyilənə görə o, Peyğəmbər (s) haqqında pis sözlər danışaraq haqq axtarışında olan camaatı onun yanına getməkdən çəkindirər, Peyğəmbər (s) camaatı dinə dəvət edərkən ayağına daşla vurub onu yaralayar, "ay camaat, bu kişi yalançıdır, ona inanmayın!", – deyə hay salarmış. Həyat yoldaşı isə İslam Peyğəmbərini (s) incitmək üçün tikan kollarını belində daşıyıb onun yoluna tökərmiş. Əbu Ləhəbin başı aldığı bir zərbə nəticəsində yaralanıb irinləmiş, sonda həmin yaradan ölmüşdür.

Hətta deyilənə görə bədəninin üfunəti elə həddə çatır ki, camaat ona yaxın durmur, Məkkədən çıxarıb uzaqdan üstünə su tökürlər. Onun üstünə bədəni daşların altında görünməz olana qədər daş atırlar.[1]

---

1 Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 603

*Ey hidayət Əlinin Zülfüqarı, pas at ki,*
*Elmin Əbu Turabı torpaqda oldu pünhan.*

Bu beytdə isə şair Həzrəti-Əlinin (ə) elmin və hikmətin ən yüksək zirvəsində olduğunu söyləyir.

Dahi şair şeyx Nizami Gəncəvi “Olar” rədifli qəsidəsində Həzrəti-Əlinin (ə) yüksək hərbi məharətini və qəhrəmanlığını qələmə alaraq yazır:

*Bəhmənin qollarını əjdaha bölmüşdür iki,*
*Burda Heydər biləyiylə o, əziyyətdə olar.*

Bəhmən şərq pəhləvanlarından biri olmuşdur. O, əjdaha ilə döyüşdə bir qolunu itirmişdi. Rəvayətlərdə deyilir ki, həmin əjdaha yalnız Heydərin, yəni Əlinin (ə) qılıncı ilə ikiyə bölünmüşdür.

Nizami bu rəvayətə istinad edərək nəticə çıxarır ki, həyatda heç bir zülm, pis əməl cəzasız qalmır, hər kəs gec-tez öz işinin cəzasını və mükafatını alır. Şair demək istəyir ki, Şərq pəhləvanı Bəhmənin qolunu şər qüvvəsi əjdaha kəsmişdirsə, xeyir qüvvəsi Həzrəti-Əlinin (ə) qılıncı da o əjdahanı məhv etmişdir.

XII əsrin görkəmli nümayəndələrindən olan, rübai janrının dərinliklərinə bələd olan şairələrdən biri də Məhsəti Gəncəvi olmuşdur. Şairənin müəmmalı rübailərindən birini açıqlaması ilə təqdim edirik:

*Name-əvvəle-hərfe-si vo əvvəle naməş si,*
*To bedin əql o bedin fəhm o bedin dər nərəsi,*
*Vəsəte-name-vey əzəvvəl (hərfe)-si yek nime,*
*Vaxere-name vey əz axere-si, axere-si.*

Tərcüməsi:

*Adının əvvəli "sin"dir, gəl onun üstünə "ya",*
*Bu ağılla onu sən fəhm edəməzsən əbəda.*
*Adının ortası "sin"dir, "sin"i böl, üstünə gəl*
*Adının axırı da "sin"dir, "ya"nın axırı da.*

Bu müəmma da bir ad gizlənib. Rübai-müəmmanın əvvəlinci misrasına nəzər salaq: Bu adın əvvəl hərfi "**Sin**"dir. "**Sin**" hərfinin üstünə "**Yə**" gələk və nəticəyə baxaq: Əbcəd hesabı ilə "Sin" 60, "**Ya**" 10 rəqəminə uyğundur. Toplam 70. 70 rəqəmi Əbcəddə "**Ayn**" hərfinin qiymətidir. Demək adın ilk hərfi "Ayn"dır. Adın ortası "Sin"dir, fəqət bu hərfin yarısını da ona əlavə edəcəyik. **"Sin"** hərfinin yarısı 30-dur. 30 əbcəddə **"Ləm"** hərfinə uyğundur. Beləcə adın ikinci hərfi də məlum oldu. Sonuncu misra daha müəmmalıdır. Belə ki, bu rübai fars dilindən tərcümə olunmuşdur. Orijinaldakı səlislik, rəvanlıq ən mahir tərcüməçi qələmindən çıxsa da yenə də öz səlisliyin, rəvanlığın saxlaya bilməz. Tərcümədəki qüsurlar nəzərə çarparsa aciz qələm əhlini məzur tutun. Sonuncu misrada belə buyurulur: Bu adın axırı "Sin" hərfi ilə "**Yə**" hərfinin axırıdır. Bu hərflərə nəzər salaq: "**Əlif**", "**Ləm**" və "**Yə**". Beləliklə, bu hərf də məlum oldu ki, "**İ**" hərfidir. Nəticədə rübai-müəmmada müəmmalı qalan ad aşkar olunur. Bu ad Həzrəti-Əlidir (ə).

***

Xətaiyə qədərki, Türk ədəbiyyatında da sevimli Peyğəmbərimizin (s) və onun nəslindən olan ulu şəxsiyyətlərin ədəbi-bədii obrazları ilə tez-tez qarşılaşırıq. Təsəvvüf şeirinin nəhəng simalarında olan Yunis İmrə yaradıcılığından bəzi örnəklərə diqqət yetirək:

*Tanrı aslanı Əli,*
*Sağında Məhəmmədin.*

*Həsən ilə Hüseyni,*
*Solunda Məhəmmədin.*[1]

Könlü Peyğəmbər (s) və Əhli-beyt (ə.m) sevgisi ilə çağlayan Dərviş Yunus bu beytlərdə üç Əhli-beyt (ə.m) imamının (Həzrəti-Əli, Həsən və Hüseynin (ə) Həzrəti-Muhamməddən (s) fiziki və mənəvi baxımdan ayrılmaz olduğunu, xususən də Məhəmməd-Əli vəhdətini ön plana çəkir. Bununla yanaşı bu misraları oxuyarkən əziz Peyğəmbərimizin (s) Həzrəti-Əliyə (ə) və öz oğulları kimi baxdığı Həsən və Hüseynə (ə) mehriban, səmimi və diqqətli münasibətindən soraq verən bir çox şirin hədislər və rəvayətlər də oxucunun gözləri qarşısında canlanır. "Ya Məhəmməd, könlüm arzular səni" rədifli şeirində verilən bir bəndə diqqət yetirək:

*Əli ilə Həsən, Hüseyn anda,*
*Sevgisi könüldə, eşqi bu canda.*
*Sabah məhşər günü o haqq divanda,*
*Ya Məhəmməd, könlüm arzular səni.*[2]

Bu bədii parçada da şair Peyğəmbərin (s) obrazını onun yaxın ailə üzvləri ilə canlandırır və hər bir etiqadlı müsəlman kimi öz qəlbinin Peyğəmbər (s) və Əhli-beyt (ə.m) məhəbbəti ilə aşıbdaşdığını dilə gətirir. Digər tərəfdən "sabah məhşər günü o haqq divanda, ya Məhəmməd, könlüm arzular səni" – deməklə Yunis İmrə Peyğəmbərimizin (s) və onun övladlarının uca şəfaət məqamlarına da işarə edir.

*Yandı gönlüm Mustafanın aşkına,*
*Ol Rasuli Muctebanın aşkına,*

---

[1] Yunis İmrə. "Güldəstə". Bakı, "Yazıçı", 1992. səh. 44
[2] Yunis İmrə. "Güldəstə". Bakı, "Yazıçı", 1992. səh. 42

*Lütf et Allahım kerem kıl bizlere*
*Hem Aliyyel Murtezanın Aşkına.*

*Yandı gönlüm Fatıma evladına,*
*Ehli-beytin suzi dil feryadına,*
*Bu Hüseynin gel yetis imdadına,*
*Ol Hüseyni Kerbelanın aşkına.*[1]

Əziz İslam Peyğəmbərinin (s) və onun pak Əhli-beytinin (ə.m) parlaq bədii tərənümü Bayrək Quşçuoğlu yaradıcılığının da səciyyəvi xüsusiyətlərindəndir. "İbrahim milləti, İbn Adəməm, Məhəmməd həbibim, Əli vəlimdir" (44, 153) – misralarını özü üçün şuara çevirən şair həm İbrahim (ə) ümmətindən olması na, həm də bütün insanlarla qardaşlıq və dostluq duyğularına işarə edir. Digər tərəfdən sevimli Peyğəmbərimizə (s) sadiq olması və Həzrəti-Əlinin (ə) vilayətini qəbul etməsi ilə fəxr edir.

Başqa bir bədii örnəyə diqqət yetirək:

*Dedim: Ya Əli gəl, sən ver muradım,*
*Dedi: Verrəm muradın ha bu gecə.*
*Quşçuoğlu oxur Əli vəsfini,*
*Uğrayıb gənci-nagaha bu gecə.*[2]

Burada şairin öz mənəvi rəhbəri Həzrəti-Əli (ə) ilə ruhi mükaliməsi qələmə alınmışdır. Quşçuoğlu bütün dərdlərə dərman olan Əli (ə) sevgisini, Əhli-beyt (ə.m) məhəbbətini gizli və əsrarəngiz bir xəzinəyə bənzədir, niyyəti pak olan, dininə və mənəvi rəhbərlərinə səmimiyətlə, sədaqətlə bağlı olan hər bir şəxsin bu böyük, bitib-tükənməyən xəzinədən istədiyi hər şeyi əldə edə biləcəyini söyləyir. Buna bənzər bir motivi müəllifin digər qəzələ-

[1] Yunis Emre. "Eskişehir buluşması", 2-4 Mayıs, 2014. səh. 8
[2] Aynur Cəlilova. "Bayrək Quşçuoğlu". Bakı, "Səda", 2005

rindən birində də görürük:

*Əlinin Düldülü vardır,*
*Qənbər kimi qulu vardır,*
*Hər kimin müşkülü vardır,*
*Dursun cəmin ayağında!*

Orta əsrlərdə yaşayıb-yaratmış şairləri məşğul edən ədalət məsələsi Bayrək Quşçuoğlunu da dərindən düşündürmüşdür. Şair bəzi Qur`an ayələrinin təfsirinə və bir sıra hədislərə əsaslanmaqla bu problemin də Əhli-beyt (ə.m) əliylə həll olunacağını dilə gətirir:

*Qurular təxti-alişani, bilinməz ləşkərin sanı,*
*Qırarlar sultanı-xanı, bir belə tufan gələcək.*

*Quşçuoğlu, Məhəmmədi tanı, həq bilir yaxşı-yamanı,*
*Qurular Mehdi divanı, bir adil divan gələcək.*[1]

Bu beytlərdən Quşçuoğlunun gələcəyə ümid və inam dolu nikbin nəzərlərlə baxdığı bir vaxt zülm və qəddarlığın ədalət və vicdan qanunları ilə əvəz olunacağına və bu işdə Peyğəmbər (s) nəslindən olan böyük şəxsiyyətlərin mühüm rol oynayacağına sonsuz inam bəslədiyi aydın olur.

Həzrəti-Əli (ə) görkəmli söz və qələm sahibi olduğu üçün həm öz xilafətindən əvvəlki zamanlarda, həm də öz xilafəti dövründə bir çox parlaq məzmunlu xütbələr oxumuş, məktublar yazmış, müxtəlif hadisələr barəsində qısa, dolğun və hikmətli fikirlər açıqlamışdır. Onun hikmət və nəsihət dolu bu açıqlamaları öz gözəlliyi, şirinliyi və axıcılığı ilə qəlblərə nüfuz edərək bu günümüzə qədər gəlib çatmışdır. Mövlanə Cəlaləddin Ruminin

[1] Aynur Cəlilova. “Bayrək Quşçuoğlu”. Bakı, “Səda”, 2005

dediyi kimi, Əlinin (ə) elmi dəlilə yox, yəqinə əsaslanır:

*Rahi-istidlaliyan cupun bovəd,*
*Rahi-cupin səxt bitəmkin bovəd.*

(Dəlillərlə hərəkət edənin yolu taxtadandır. Taxta yol isə çox etibarsızdır).

Həzrəti-Əlinin (ə) necə bir yüksək elm, ixlas, əməl sahibi olmasını bilmək üçün yenə də Mövlanaya müraciət edək:

*Əz Əli amuz ixlasi-əməl,*
*Şiri-həqra dan münəzzeh əz dəğəl.*

*Con to babi an mədini-elm ra,*
*Con şoayi afitabi-helm ra.*

*Baz baş, ey babi-rəhmət ta əbəd;*
*Barqahi-ma ləhu kufvən Əhəd.*

*Dər şocaət şiri-Rəbbanisti,*
*Dər morovvət xod ki, danəd kisti.*

(Xalis niyyətli olmağı Əlidən öyrən; Haqqın şirini hiylədən münəzzeh (uzaq) bil. Sən, ya Əli, o elm şəhərinin qapısısan; çünki, helm günəşinin nurusan. Ey rəhmət qapısı, ey bərabəri olmayan Allah barigahı, bağlanma, əbədi olaraq açıq qal. İgidlikdə Allahın şirisən, ərlikdə isə kimliyini kim bilər?)

Böyük filisof-şair S.İ.Nəsimi bir çox şeirlərində Həzrəti-Əliyə (ə) və Əhli-beytə (ə.m) olan sonsuz məhəbbətini qələmə alıb və öz yaradıcılığında 14 Məsuma (ə) xüsusi yer ayırmışdır. Şairin dərin məzmunlu qəzəlinin bir beytini şərhi ilə diqqətinizə çatdırırıq:

*"İnnəma" vü "Həl-əta" vü "la fəta" şəhrinə gir,*
*"Əyn"ü "lam"ü "yey"dən özgə varmıdır canan bizə.*

Bu beytin birinci misrasında "innəma *vəliyyukumullah*"[1] ayəsi, **"Həl-əta"** surəsi və Peyğəmbərin (s) buyurduğu "La fəta illa Əli, la seyfə illa Zülfüqar" – "Əli (ə) kimi igid və Zülfüqar kimi qılınc yoxdur" hədisinə işarə edir. Şair 2-ci misrada bu fəzilətlərin sahibi olan Həzrəti-Əlinin (ə) mübarək adının "Əlif", "Lam" və "Yə" həriflərinə vurğu olmaqla açıqlayır.

Ustad-şair vilayət və imamət ayələrinə, saysız-hesabsız İslami hədislərə işarə etməklə Həzrəti-Əlinin (ə) çox yönlü və rəngarəng fəzilətlərini ön plana çəkir, onun İslam Peyğəmbərinin (s) vəfatından sonra yeganə həqiqi və ləyaqətli rəhbər olduğunu tərənnüm etməyə çalışır.

Başqa bir qəzəlində isə şair Peyğəmbər (s) və Həzrəti-Əli (ə), Nübuvvət və İmamət vəhdətinə bədii işarə edir:

*Bu Nəsimi binəvadır, vəsfinizdə neyləsin,*
*Sübhü şamü sözlərisiz, ya Muhəmməd, ya Əli.*

Şərqin dahi şairi, 14 üslubda Quranı əzbərdən oxuyan Hafiz Şirazi Həzrəti-Əlinin (ə) Xeybər müharibəsindəki, qələbəsini qələmə alaraq, onun şücaətindən, igidliyindən söz açır, eyni zamanda belə bir cismani qüvvət və şücaət sahibinin nə qədər mərhəmətli və əliaçıq olduğunu dilə gətirir:

*Mərdi ze könəndeyi dəre-Xeybər pors,*
*Əsrare-kərəm ze xaceye-Qənbər pors.*

(*İgidliyi Xeybər qapısını çıxarandan soruş,*
*Səxavətin, əliacıqlığın sirlərini də Qənbərin ağasından soruş).*

---

[1] "Maidə", 55

Digər bir qəzəlində isə Hafiz Əhli-beyt (ə.m) və İmamət yolunda səmimiyyətlə və möhkəm addımlarla irəliləyənlərin mütləq Həzrəti-Əlinin (ə) mərhəmət və şəfaətini qazanacaqlarını bizə çatdırır:

*Hafez, əgər qələm zəni dər rəhe-xanedan be sidq*
*Bedərqeye rəhət şəvəd hemmete-şehneye-Nəcəf.*

*(Hafiz, əgər xanadan yolunda sədaqətli olsan,*
*Nəcəfin himmət sahibi sənin yol göstərənin olar).*

Hər iki beytdən aydın olur ki, ustad şair Peyğəmbərin (s) pak Əhli-beytinə (ə.m), xüsusən də Həzrəti-Əliyə (ə) dəruni bağlılıq və tükənməz heyranlıq içərisində vurğun olmuşdur.

## 3.3. ŞAH İSMAİL XƏTAİ ŞƏXSİYYƏTİNDƏ ƏHLİ-BEYTƏ (Ə) MƏHƏBBƏT AMİLİ

Şah İsmail Xətai şəxsiyyətində Əhli-beytə (ə.m) məhəbbət amili ilə bağlı olan, digər cəhətləri isə belə ümumiləşdirmək mümkündür:

"Silsilətən-nəsəbi Səfəviyyə"də Səfəvilər sülaləsi dəftərində və İbrahim Əminin "Fətuhat-i Şahi" əsərində Şah İsmail Xətainin Həzrəti-Əli (ə) nəslindən olması göstərilir.[1]

Oqtay Əfəndiyevin "Azərbaycan Səfəvilər dövləti" adlı əsərində bir sıra maraqlı tarixi faktlara rast gəlirik: "Pul dövriyyəsinə şiə etiqad rəmzini bildirən yeni sikkələr buraxıldı: "Allahdan başqa tanrı yoxdur, Məhəmməd – Allahın elçisidir. Əli Allahın dostudur". Pulların üstündə on iki şiə imamının adları və "Müqəddəs şahın (yəni, Əlinin (ə) – Oqtay Əfəndiyev) qulu ifadəsi ilə, kiçildilmiş formada Şah İsmailin adı göstərilmişdi.nPul islahatı da imami şiəliyinin təbliğat məqsədlərinə, onun Səfəvilər dövlətində hakim mövqeyinin möhkəmləndirilməsinə xidmət edirdi..."[2]

Həzrəti-Əliyə (ə) böyük məhəbbəti olan Xətai, hətta bir neçə rəsmi sənəddə özünü "Səgi-dəri-Əli" – Əli (ə) qapısının iti adlandırmışdır. Onun Həzrəti-Əli (ə) nəslindən olmasına öz əsərlərində gözəl subutlar tapırıq:

*Səfi nəsli, Cuneydi-Heydər oğlu,*
*Əliyyəl-Mürtəzayidir Xətayi.*

Və yaxud başqa bir yerdə:

---

[1] Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. "Şah İsmayıl Xətai" (xronoloji-tarixi məlumatlar). Bakı, "Ozan", 1997. səh. 113

[2] Oqtay Əfəndiyev. "Azərbaycan Səfəvilər dövləti". Bakı, "Azərnəşr", 1993. səh. 48-49

*Qırmızı taclı, boz atlı,*
*Ağır bir ləşkər nisbətli,*
*Yusif peyğəmbər sifətlü,*
*Qazilər deyən şah mənəm.*

*Xətaiyəm al atlıyam,*
*Sözü şəkərdən datluyam,*
*Mürtəza Əli zatlıyam,*
*Qazilər deyin şah mənəm.*

deyə özünü Əlinin (ə) nəslindən olduğunu açıq-aydın nişan verir. Tarix kitablarında çox yerdə Əhli-beyt (ə.m) aşiqi olan bu şəxsin özünün və havadarlarının nişanələrindən danışılanda deyilir: "Səfəvilər və onların tərəfdarları islamın şiə məzhəbini təbliğ edir və 12 şiə imamının şərəfinə 12 qırmızı zolaqlı baş geyimini fərqlənmə nişanəsi kimi geyirdilər".[1]

Şah İsmailin Əhli-beyti (ə.m), Peyğəmbəri (s) təbliğ edən şeirləri əsasən xalqı uğrunda mübarizə apardığı məsləki, əqidə saflığını ədalətli və düzgün bir şəkildə qoruyub gələcək nəsillərə çatdırmaq idi:

*Gəl dilər isən olasan adəm,*
*Xəlq içrə sözün ola mükərrəm;*
*Yad et ki, duayi-ismi-əzəm,*
*Allahü Muhəmmədü Əlidir.*

Xətai Həzrəti-Muhamməd (s) onun qızı Fatimeyi-Zəhraya (s.ə) və onun övladlarına həqiqi mənada məhəbbət və sədaqətini və bu yolda sabitqədəm olmasını, bir daha zatının müqəddəslərə bağlılığını belə ifadə etmişdir:

[1] Azərbaycan tarixi (Ən qədim dövrlərdən XX əsrin əvvəllərinə qədər). Bakı, "Azərnəşr", 1994. səh. 160

*Adım şah İsmail, həqqin siriyəm,*
*Ki, bunca qazilərin sərvəriyəm.*

*Anamdür Fatimə, atam Əlüdür,*
*Bu on iki imamın peyraviyəm.*

*Atamın qanını Yeziddən aldüm,*
*Yəqin bilin ki, nəqdi-Heydəriyəm.*[1]

"Salnaməçi mərhum I Şah İsmail haqqında yazırdı: "Əlahəzrət özünün həyatı və şahlıq illərində öz təbəələri və rəiyyətlə ədalətlə, mərhəmətlə rəftar edirdi. Onun qorxusu qarşısında heç kəs əhalinin sıxışdırılması darvazasını aça bilmirdi. O, 38 il yaşadı, 24 il hökmdar oldu. O, döyüş meydanında şirə bənzəyirdi, qılınc oynadırdı, təntənəli məclislərdə mirvari yağdıran bulud idi. O, səxavətinin çoxluğu üzündən yüksək əyarlı qızılla adi daş arasındakı fərqi görmürdü. Dünyanın bütün sərvəti onun birgünlük bəxşişinə çatmazdı buna görə də belə hökmdarın xəzinəsi adətən boş olurdu. O, ovu ehtirasla sevirdi. Onun əmri ilə şiri izləyənlər yəhərli at, pələng (parsı?) izləyənlər isə yəhərsiz at alırdılar. Əlahəzrət elm və maarif xadimlərinə hər cür hamilik göstərirdi. O, gözəl şeirlər yazırdı. Hökmdarın türk və fars dilində şeirlər divanı vardır. Həmin dövr şairlərinin çoxu onun şərəfinə xeyli qəsidə həsr etmişlər.[2]

Hər hansı bir ölkəyə yürüş edəndə, müharibələrdə şəhərləri, kəndləri alanda, dinc əhaliyə toxunmaz, yurdları viran etməzdi. Qocalara, qadınlara, körpələrə aman verər, əqidəsində puç olan-

---

[1] Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. "Şah İsmayıl Xətai" (xronoloji-tarixi məlumatlar). Bakı, "Ozan", 1997. səh. 114
[2] Azərbaycan tarixi (Ən qədim dövrlərdən XX əsrin əvvəllərinə qədər). Bakı, "Azərnəşr", 1994. səh. 164

ları, hətta üləmada (alim) olsa belə ölümlə cəzalandırardı.[1]

Şah İsmail və Əhli-beyt (ə.m) mövzusu baxımından bu tarixi məlumatlar Əli (ə) rəhminin Ş.İ.Xətainin ürəyində, həqiqətən, dərin kök saldığını, Əhli-beyt (ə.m) məhəbbətinin onun dünyagörüşünü formalaşdıran başlıca amilə çevrildiyini göstərir.

Tarixdə məşhur olan Çaldıran döyüşündən qabaq Şah İsmail Xətainin Sultan Səlimlə məktublaşmaları da çox maraqlıdır. Sultan Səlim öz kobud təhqirlə dolu uzun-uzadı məktublarında onu hədələyir və təhqir edir. Lakin Xətai sülhsevər, insanpərvər bir xasiyyətdə öz cavab məktublarında ona nəsihət edir və onu haqqa, ədalətə, nahaq qan tökülməməsinə və sülhə çağırır. Sultan Səlimin Fars dilində yazdığı mənzum məktublara Xətai Azərbaycan dilində mənzum məktubla cavab verir:

*Diyari-eşqə sultanəm, dila, mən də zəmanimdə,*
*Vəzirimdir ğəmü qüssə, oturmuş iki yanimdə.*

*Fəraqü atəşü dərdü ələmlər bağrımı yaxdı,*
*İliklər qarə su oldu, əridi üstüxanimdə.*

*Mən ol canbaz sərbazəm, fələk fövqindədir darim,*
*Necə Həllac-Mənsuri yurutdum risimanimdə.*

*Mən ol şəhbazi-kuhsarəm, baş əgməm qulleyi-Qafə,*
*Necə ənqa kimi yavru uçurdum aşiyanimdə.*

*Həmən el arxası yerdə cahanın padşahidir,*
*Xətai həp keçən sərdən, qədəm qoyan nişanimdə.*[2]

---

[1] Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. "Şah İsmayıl Xətai" (xronoloji-tarixi məlumatlar). Bakı, "Ozan", 1997. səh. 115-116

[2] Şah İsmayıl Xətai. "Keçmə namərd körpüsündən" (Şeirlər və poemalar). Bakı, "Yazıçı", 1988. səh. 163

Bu şeirdə Xətainin böyüklüyü, alicənablığı və qorxmazlığı bariz bir şəkildə tərənnüm olunur. Bəzi adamlar çaldıran döyüşündə Xətainin "Şəb-xun" gecə qan tökmək, naqafil gecə hücumunu rədd etməsində səhv etdiyini göstərirlər. Amma onlar yanılırlar. Döyüşdə qalib gəlmək üçün hər bir hiylə fənddən, kələkdən istifadə etməyi Şah İsmail da çox gözəl bilirdi. Amma nə üçün gecə basqını etmirdi? Çaldıran döyüşündə belə bir fəndə əl atmaq istəyirdilər. Qızılbaş sərkərdələrinin bu təklifini bəzi sərkərdələr və Şah İsmail rədd edir: "Bu namərdlikdir, mən karvanbasan quldur deyiləm". Şah İsmail heç kimin fikri ilə hərəkət etmir. Çünki şir və pələng ovuna təkbaşına çıxan şah, heç vəhşini də qəfildən ovlamır.[1]

Xətai on dörd yaşından iyirmi dörd yaşına qədər apardığı dörd döyüşdə qalib gəlib qüdrətli bir dövlət yaratmışdı. Bu dövləti təsis etmək, möhkəmlətmək, idarə etməkdə elə müvəffəqiyyətlər qazanmışdı ki, muasirləri onu "Xətaini – İskəndər şah" və "Xəqani Süleyman şah" deyə İskəndər Kəbirə, Süleymana (ə) oxşatmağa başlamışdılar.[2]

Həsən bəy Rumlu yazır ki, o, döyüş meydanlarında əli qılınclı şirə bənzəyirdi, ziyafət məclislərində isə mirvari yağdıran buluda çevrilirdi. Xətainin ən çox sevdiyi şeylərdən biri qiymətli hədiyyələr bağışlamaq idi.

İ.P.Petruşevski yazır:

"Tarixçilər qeyd edirlər ki, gənc şahənşahın ilk tədbirlərindən biri rəiyyətin vəziyyətini yüngülləşdirməkdən ibarət olmuşdur".[3]

Xətai əzəmətli dövlət yaratmış, Azərbaycan dilində yazıb-yaradan bütün sənətkarları da öz himayəsinə altına almış, doğma

---

[1] Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. "Şah İsmayıl Xətai" (xronoloji-tarixi məlumatlar). Bakı, "Ozan", 1997. səh. 116-118

[2] İlya Pavloviç Petruşevski. "Azərbaycan XVI-XVII əsrlərdə. Azərbaycan tarixi toplusu". Bakı, 1949. səh. 243

[3] İlya Pavloviç Petruşevski. "Azərbaycan XVI-XVII əsrlərdə. Azərbaycan tarixi toplusu". Bakı, 1949. səh. 243

ədəbiyyat üçün doğrudan da “tikandan bərgi-gül izhar edən nobahar” yaratmışdı.

Xətai çox mürəkkəb mənəviyyatlı bir şəxsiyyət olmuşdur. O, bir tərəfdən bir barmaq işarəsilə minlərlə muridi ayağa qaldıran bir murşid, xalqı üçlər, yeddilər, qırxlar, ərənlər uğrunda candan keçməyə çağıran din xadimi, bu işdə ona düşmən çıxanlara heç bir güzəştə getməyən, heç bir incik və acını unutmayan, kiçik bir saymazlığı cəzasız buraxmayan məğrur bir Şah, döyüş meydanlarında ən heybətli pəhləvanlarla təkbətək vuruşan, meşələrə, dağlara tək başına, şir pələng ovuna gedən bir cəngavər, bir tərəfdən də hər şeyi eşqə, məhəbbətə qurban verməyə hazır olan bir aşiq, şeirə, sənətə qurban verməyə hazır olan bir şair idi. Əgər onun bir neçə əsr əvvəl yaşamış sələfi “Mehrabı eşqdir uca göylərin” demişdisə, o da “Məhəbbətdən keçən haqdan da keçər” deyirdi.[1]

Beləliklə, Xətai özünün mürəkkəb, əhatəli, çox cəhətli keyfiyyətləri ilə cəmiyyətin bütün təbəqə və zümrələrinin məhəbbətini qazanmış, hətta Əli kültü ilə birləşməyə başlamışdı. Təsadüfü deyil ki, misal üçün, şair Tüfeyli:

*Heydəri-Kərrarsən, gəldin mükərrər aləmə,*
*Zülfiqari-Şahi-Mərdan çün sənin dəstindədir.*

- deyə onu Həzrəti-Əliyə (ə) oxşadırdı.

Məlum olduğu üzrə, bəzi təriqətlər Həzrəti-Əlini (ə) hətta Allahın təcəllası hesab edirdilər. Onu Mehdi (əc.f) kimi qələmə verənlər də az deyildi. Buna görə də Xətai aşıqlar və aşıq tərzində yazan şairlər nəzərində get-gedə şeirin, sənətin hamisinə çevrilir, hətta qədim Xızırı əvəz etməyə başlayırdı. Bu “müqəddəsləşdirmə”nin əlamətlərini biz hətta bir neçə əsr ondan sonra ya-

[1] Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. “Şah İsmayıl Xətai” (xronoloji-tarixi məlumatlar). Bakı, “Ozan”, 1997. səh. 124

şamış müştərək Zaqafqaziya şairi Sayat Novanın şeirlərində də görürük:

*Dedilər ki, şah-Xətai-kulli-aləm yaradan,*
*Yoxdan var etdin dünyanı, salam-kəlam yaradan.*[1]

Yaxud:

*Dedilər ki, şah Xətai çağırıram haqq mədəd!.*[2]

Yaxud:

*Dedilər ki, şah Xətai çağırıram: şah, şah!*
*Qalxar bu divanə könül, düşər dərdə kah-kah.*[3]

H.Araslının verdiyi məlumata görə, hətta Aşıq Əsəd də məclisdə ilk əvvəl:

*Şah Xətai eşqə düşdü, açdı Hürrün qəbrini,*
*Ya ilahi, günahkaram, günahkaram, günahkar!*

- beyti ilə bitən şeirini divani üstündə oxuyarmış.[4]

Bu hörmət, xususi ilə aşıq, şair, dastançıların bu münasibəti doğrudan da onun haqqında xususi dastan qoşulmasına gətirib çıxara bilərdi. Bu, elə belə də olmuş və "Şah İsmayıl – Taclı" dastanı yaradılmışdı.[5,6]

---

[1] Sayat Nova. Bakı, "Azərnəşr", 1963. səh. 63
[2] Sayat Nova. Bakı, "Azərnəşr", 1963. səh. 64
[3] Sayat Nova. Bakı, "Azərnəşr", 1963. səh. 65
[4] Həmid Araslı. "Müqəddimə" // Sayat Nova. Bakı, "Azərnəşr", 1963. səh. 11
[5] Məmmədhüseyn Təhmasib. "Azərbaycan xalq dastanları" (orta əsrlər). Bakı, "Elm", 1972. səh. 185-187
[6] Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. "Şah İsmayıl Xətai" (xronoloji-tarixi məlumatlar). Bakı, "Ozan", 1997. səh. 125-126

## 3.4. XƏTAİ LİRİKASININ PEYĞƏMBƏR (S) SORAQLI PAYI

Xətai lirikasının Peyğəmbər (s) soraqlı payı yektin (bir cins) olmayıb, müxtəlif ad, bilgi, anlayış və motivləri özündə birləşdirir. Belə ki, şairin lirikasında "Ya Mustafa, Ya Rəsul, Ya Nəbi, Ya Muhəmməd, Ya Əli" tək məşhur rədiflər olduğu kimi daha çox obrazlar üzərində qurulan mücərrəd nümunələrdə vardır. Bu şeirlərdə ənənəvilik də təriqət poyeziyasının tam ayrıldığı da müşahidə edilir, üzvü vəhdət təşkil etdiyi də. Biz konkret şeirin təhlilinə keçməmişdən öncə Xətai divanındakı Peyğəmbərlə (s) bağlı nümunələrin qısa təsnifini vermək istəyirik.

***1-ci (qəzəl)***
*Hüsnün bəyani-sureyi – "Yasin"ü, "Həl-Əta",*
*Ey Kəbeyi-mübarəkü vey Mərvəvü Səfa. (3; 44)*

On bir beytlik bu qəzəl sırf ənənəvi ruhdadı. Belə ki, bu şeirdə təriqət təmayülü yox dərəcəsindədi.

***2-ci (qəzəl)***
*Vəchində peydadır sənin ənvari-zati-kibriya,*
*Ol yüzə qarşuda dura şərməndədür "Şəmsüz-Züha". (14; 49)*

Yeddi beytlik bu qəzəlin Həzrəti-Muhəmmədin (s) şəninə yazılması yalnız işarələrdən bilinir. Şeirdə şairin lirik "mən"i öndə olub, əsərin təriqət təmayülü özünü açıq göstərir.

***3-cü (qəzəl)***
*Ey sənəm! Neyçün sənin vədün xilaf olmuşdurur?*
*Mehrin az olmuş, vəli qəhrin müzaf olmuşdurur?*
*(127; 112)*

Şeirin Həzrəti-Muhmmədə (s) aid olması son dərəcədə mübahisəlidir. Çünki, əsərin leksik-semantik tutumu onu Həzrəti-Əliyə (ə) və on ikinci İmama (ə) aid olmağa imkan verir. Lakin qəzəldə Quran ayələrindən istifadə olunması, bizi şeiri sonuncu Peyğəmbərə (s) həsr edilmiş əsər hesab etməyə sövq edir.

***4-cü (qəzəl)***
*Dilbəra, "Şəmsüz-zühа"dı şöleyi-rüxsarınız!*
*Ayəti-"Taha"-vü "Yasin" surəti-didarınız! (165; 132)*

Öncəki, şeir kimi bu qəzəlində kimin şənində deyildiyi mübahisəlidir. Lakin "Ayeyi-"Taha"vu "Yasin" surəti didarınız!" – şəklində ki, ikinci misrada Peyğəmbərin (s) adları sırasında yer alan "Taha" və "Yasin" sözlərinin işdədilməsi bu qəzəlin Həzrəti-Muhəmmədə (s) ithaf edildiyini söyləməyə imkan verir.

***5-ci (qəzəl)***
*Həq ləbindən qönçəni gülşəndə xəndan eyləmiş,*
*Leyk bu nazikliyi lütf ilə çəndan eyləmiş. (168; 134)*

Bu qəzəlin Həzrəti-Muhəmmədin (s) nəti olması etimadı daha qüvvətlidir. "Həqq ləbindən", "xatəmi möhrü Süleyman", "Zülməti zülfündə içmiş ləblərin abını-Xızr" "birçəyin qılın", "Xəlil" tərkibləri buna dəlalət edir.

***6-cı (qəzəl)***
*Görklü yüzün aşiqi Həzrət-Xudadır, ya Rəsul,*
*Şol mübarək xülqünə canlar fədadır, ya Rəsul!*
*(188; 144)*

Təkcə "Ya Rəsul" rədifi yox, şəfaət və səlavat kimi məfhumlar da şeirin büsbütün nət olub, Rəsulullahın (s) şənində yazıldığını subuta yetirir.

***7-ci (qəzəl)***
*Ta ki düşdüm, dilbəra, eşqinə, heyran olmuşam,*
*Ruzü şəb ah eylərəm, həm çeşmi giryan olmuşam.*
*(198; 149)*

Şeirin məzmunu mücərrəd olduğundan onu asanlıqla Həzrəti-Əli (ə) və on ikinci İmama (ə) aid etmək olar. Bu mücərrədlik o qədər genişdir ki, Xətainin bu qəzəli Səfəviyyə təriqətinin min bir əzab-əziyyətini çəkmiş öz ata-babasına da ithaf etdiyini düşünmək olar. Lakin şeirdə Peyğəmbərin (s) tez-tez müqayisə planında xatırlanılması onun ithaf obiyektinin Rəsulullah (s) olduğu fikrini önə çəkməyə sövq edir.

***8-ci (qəzəl)***
*Şol mübarək zatına işim sənadır, ya Nəbi!*
*Asilik bimarına adın şəfadır, ya Nəbi! (363; 233)*

Şeirin bütün mövzu, məzmun və üslub inceliklərinin "Ya Nəbi" rədifinə doğru yönəldilməsi şairin Həzrəti-Muhəmməd (s) soraqlı duyğu və düşüncələrindən doğduğunu inkar olunmaz surətdə sübuta yetirir.

***9-cu (qoşma)***
*Ənib göydən yerə bina quranlar,*
*Əli ilə Muhammədin eşqinə.*
*Mələklər misalı səcdə duranlar,*
*Əli ilə Muhammədin eşqinə. (3; 329)*

Qoşma şəklində olan bu şeirdə şair Rəsulullah (s) – Əliyyən Vəliyullah (ə) bölünməz bütöv olaraq, bədii qavrayışa təqdim edir. Bu müxtəsər araşdırmanın özü belə danılmaz biçimdə göstərir ki, Xətai poyeziyasının Peyğəmbər (s) soraqlı payı son dərəcə dolğun və tutumlu, əlvan və rəngarəng, kəskin və kəsərlidir. Odur ki, necə ümumiləşdirmə aparılırsa aparılsın bu payın malik olduğu ideya-bədii keyfiyyətlərin sonadək əhatə etmək mümkün olmayacaq.

Belə olan surətdə biz məcburiyyət qarşısında qalıb tədqiqatı yuxarıdakı nümunələrin biri üzərində qurmaqla kifayətlənirik və bunun üçünsə biz "Ya Nəbi" rədifli qəzəl-nəti seçirik.

***Şol mübarək zatına işim sənadır, ya Nəbi!***
***Asilik bimarına adın şəfadır, ya Nəbi!***

***Ayağın torpağının qədrin nə bilsin hər kişi,***
***Kun-fəkan ol torpağa kəmtər bəhadır, ya Nəbi!***

***Ol məqamın kim, mələk yetməz süqufi-nəlinə,***
***Ayağın altında ol bir xaki-padır, ya Nəbi!***

***Qaldı sidrül-müntəha, keçdin fələkdən ta zəmin,***
***Kim yetər bu qədri-həqqə, müntəhadır, ya Nəbi!***

***Ey günəş yüzlü, səni hər kimsə ki, həq bilmədi,***
***Danla məhşərdə anın yüzü qaradır, ya Nəbi!***

***Çün sənin xoşluğuna yaratdı sane aləmi,***
***Ayağın torpağına canım fədadır, ya Nəbi!***

***Hər münafiq kim, səni könlündə inkar eylədi,***
***Ta əbəd yanmağ cəhənnəmdə rəvadır, ya Nəbi!***

***Həm sənin tərifin etdi, həm Əlinin ol İlah,***
***Nişə kim, sən Müstəfa, ol Mürtəzadır, ya Nəbi!***

***Möcüzatın qatına Musa misalı-murçə,***
***Gərçi Fironun əsası əjdahadır, ya Nəbi!***

***Bu Xətai xəstəyə qılgil şəfaət ruzi-həşr,***
***Çünki əslindən səninlən aşinadır, ya Nəbi!***

Şair şeiri Rəsulullahın (s) ilahi mənşəyinin və adının şəfa olması fikrinin tərənnümü ilə başlayır:

***Şol mübarək zatına işim sənadır, ya Nəbi!***
***Asilik bimarına adın şəfadır, ya Nəbi!*** *(363; 233)*

(Ey Peyğəmbər (s) gecə-gündüz mənim işim Sənin şərəfli zatın üçün dua etməkdir. Mən gecə-gündüz Allaha şükür edirəm ki, səni lütf edərək, İlahi mənşədən bizim üçün göndərmişdir. Digər tərəfdən ey Peyğəmbər (s) sənin o əziz adın Allaha qarşı çıxan nankor və günahkar bəndələrin pənah apardığı yeganə şəfa qaynağıdır.)

Nəinki, bu beytin, bütövlükdə nətin ideya, bədii keyfiyyətlərini lazımınca qavramaqdan ötürü, hər şeydən öncə, şeirin rədifi üzərində dayanmaq qaçılmazdır.

“Nəbi” sözü ərəb mənşəli söz olub “Nəbəə” kökündən gələn bir sözdür və “Nəbi” sözü peyğəmbərliklə bağlı məna, məzmun tutumundakı bu incəlikdə diqqət mərkəzində saxlanıla bilər.

1. Yüksəklik.
2. Bir yerdən çıxıb başqa yerə getmək. Deyilənlərə görə bir bədəvi Rəsulullaha (s) Məkkədən Mədinəyə gəldiyinə işarə etməklə, xoş niyyətlə ya Nəbiyallah dediyi zaman o, mənən Nəbiyullah mən köçkün yox, Allahın Peyğəmbəriyəm deyərək, bu sözü həmzə ilə oxumamağı məsləhət görmüşdür.
3. Xəbər vermək, xəbər çatdırmaq, astaca səslənmək.
4. Yalançı Peyğəmbərlik iddia etmək.
5. Gələcəkdən və qeybdən xəbər vermək.
6. Peyğəmbər dəvəsi “deyilən dəvə”.
7. Yalançı Peyğəmbərlik iddiası edən şəxs.[1]

---

[1] “Əlmütənəbbiyyu” Mövlud sari əlməvarid Ərəbcə, Türkcə lüğət. İstanbul, 1982

Ulu Yaradan şanlı kitabında Həzrəti-Mühəmmədə (s) hər iki sözlə üz tutmuşdur.

Məsələn:

"Ya Nəbi! Kafirlərə qarşı (qılıncla), münafiqlərə qarşı (sözdə) cihad et (onlarla sərt rəftar et). Onların məskəni cəhənnəmdir. Ora necədə pis sığınacaqdır!" ("Təhrim", 9)

"Ya Rəsul! Rəbbin tərəfindən sənə endirilmiş olanı (Quranı təbliğ et!)" ("Maidə", 67)

"Rəsul" və "Nəbi" sözlərinin İslam qaynaqlarında qazandıqları geniş məna-məzmun şəbəkəsi ilə bağlı daha sanballı bilgi almaqdan ötəri Ayətullah Məkarim Şirazinin ("Pəyami-Quran" kitabından "Rəsul və Nəbi arasında fərq" bölümünü xülasə etməyidə lazım bilirik: bir sıra Alimlərin fikirincə, "Nəbi" sözü "ucalıq və aliliyə can atma" anlamlarını bildirən "nəbvə" kökündən gəlir, sözün bu anlamı Peyğəmbərlərə (ə) onların məhz yüksək dərəcələrinə malik olmalarına görə verilmişdir.

"Rəsul" sözünün kökü isə "ris"dir "Ravid Müxrəda"da yazır ki, sözə "qarma-qarışıqlardan sükunətə doğru can atma" mənasının verilməsinin səbəbi İlahi elçilərinin, Allah bəndələrini əbədi asayişə çatdırmaqla vəzifələndirilmələrindən irəli gəlmişdir. Ancaq "Rəsul" sözünün məzmunu daha geniş olub, Qurani-Kərimdə Peyğəmbərlərlə (s) yanaşı, Mələkləri bildirmək üçün də ("Təkvir", 22) işlədilmişdir.

"Rəsul və Nəbi arasındakı fərq nədir?" – sualıyla bağlı Əhlibeyt (ə.m) İmamlarından da çox saylı səhih xəbərlər nəql edilmişdir. Məsələn: "Nəbi İlahi vəhyi yuxu da görüb bu yolla alan, səsini eşitməsinə baxmayaraq, vəhy mələyini görməyən kim sədir. "Rəsul" isə həm səsi eşidən, həm yuxuda görən, həm də oyaqlıqda vəhy mələyini müşahidə edən kimsədir.

Bu mərhum Kuleylinin Zurarədən, onunda İmam Baqirdən (ə) nəql etdiyi hədisdir.[1]

[1] Şeyx Kuleyni. "Üsuli-kafi". I cild. Bakı, 2005. səh. 176

Quran ayələrinə diqqət yetirməklə görmək olar ki, bir çox məsələlərdə "Nübuvvət" və "Risalət" dərəcələri eyni şəxsə aid olunur – İslam rəhbəri kimi ("Əraf", 157; "Əhzab", 45,) Qurani-Kərim də Musa (ə) ("Məryəm", 54) və İsmail Peyğəmbərlər (ə) barəsində də bu iki səciyyəni eyni vaxtda gəldiyini görürük"... Lakin bəzi ayələr də bu iki anlayış biri o birinə qarşı olan anlayışı yerində işlənilmişdir. ("Həcc", 51) Belə olan surətdə, "Nəbi" təbliğə məmur edilməyən şəxs kimi davranılır. "Rəsul" isə əksinə, təbliğ səlahiyyətli, müjdələyici, əks çəkindirici, eləcədə camaatı ilahi sifarişlərə doğru yönəldən fəal bir Rəhbər olaraq dərk edilir.

Bu dəlillərdən belə nəticə çıxarırıq ki, bu iki sözün hər birinin iki anlamı var; Belə ki, hərdən bu anlamlardan biri o biriylə birləşir. Hərdən də onların biri o birinin qarşısında yer alır.[1,2]

Beytin ümumi məzmunu və fikiri axarını bütün aydınlığı və genişliyi ilə başa düşmək üçün "şol mübarək zatına" tərkibinə ayrıca diqqət yetirmək gərəkdir. Ərəb dilin də "Bərəkə" kökündən gələn "Mübarək" sözünün bərəkət, artımlı mənalarıyla yanaşı, müqəddəs və əziz anlamlarınıda verməsi Xətainin gözündə Rəsulullahın (s) ən kamil bəşər övladı kimi öz başlanğıcını tanrı qatından götürdüyünü, İlahi mənşədən aldığını göstərir. Bu baxımdan beyt Füzulinin:

*Ey qübari-qədəmin ərşi-bərin başina tac,*
*Şərəfi-zatına ədnai-məratib merac!.*

(Ey addımının tozu, sonuncu göyün başının tacı olan.
Merac sənin zatının ucalığının aşağı mərtəbəsidir).

---

[1] Məkarim Şirazi. "Pəyami-Quran". X cilddə, 7-ci cild. Tehran, 1377. səh. 365-367

[2] Vərağa Almasov. "Peyğəmbər (s) aşiqi Füzuli". Bakı, "Çaşıoğlu", 2007. səh. 36-37

Öyülənin ayaq tozunun əl çatmaz olan ən uca göyün başının tacına çevrilməsi bir yandan Rəsulullahın (s) böyüklüyündən soraq verir, bir yandanda onunun gəlişi, Meracı ilə Ərşibəri şərəfləndirməsi kimi başa düşülür. İkinci misrada Peyğəmbərin (s) zatının onun merac üstünlüyündən belə yüksək tutulması, öyülənin böyüklüyünün buradakı bədii ifadəsini daha qabarıq etmişdir. Odur ki, Peyğəmbər (s) zatı anlayışı beytin məzmunu içində bir müstəsnalıq qazanıb, önə keçir.

Rəsulullahın (s) zatı birbaşa İlahi aləmlə – Allah dərgahındakı Lövhi-Məhfuz (qorunan lövhə) ilə (İslami qaynaqlara görə İlahi hökmlərin yazıldığı kitabdır) bağlı olduğundan şairin onu burada, başqa nətlərində də sevə-sevə tərənnüm etdiyi meracdan üstün tutması dini baxımdan əsassız deyil. Deməli, Füzuli nəti ilk baxışda göründüyü kimi öyülənin Merac üstünlüyünü yox, zat üstünlüyünü bədii ifadəsi ilə başlamışdır. Meracı da bu yöndə köməkçi bir motiv kimi şeirə gətirmişdir.[1,2]

Göründüyü kimi Xətai lirik "mən"i öz canından belə əziz tutduğu Həzrəti-Muhəmmədin (s) kainatı şərəfləndirməsinə görə durmadan şükür etməyi özünə əzəli-əbədi borc bilir. Deməli burada "səna" sözü duadan çox "şükür" mənasındadır. Dilimizdə ki, "həmd-səna" ifadəsinin də geniş yayılması bundan soraq verir. Digər tərəfdən şair bu əsl məqsədini başqa "Nət"lərində də sevə-sevə qələmə almışdır. Məsələn:

*Gəldi Cəbrəil, sənə hər dəm gətirdi Həq sözün,*
*Bəzi peyğəmbərlərə gələn nidadır, Ya Rəsul!*

(Mələk Cəbrail (ə) durmadan sənin hüzuruna gələrək Ulu Yaradanın bütün buyurduqlarını sənə çatdırmağı şəxsən özü üçün

---

[1] Məhəmməd Füzuli. "Əsərləri". V cilddə, 1-ci cild. Bakı, "Elm", 1985. səh. 97

[2] Vərağa Almasov. "Peyğəmbər (s) aşiqi Füzuli". Bakı, "Çaşıoğlu", 2007. səh. 98

şərəf bilmişdir. Lakin Peyğəmbərlərin (ə) çoxu bu şərəfə nail olmamış, Allah-təala onlara yalnız nida göndərərək, vəhy etməklə kifayətlənmişdir).

"Vəzifəsi Tanrının buyuruqlarını Peyğəmbərlərə (s) çatdırmaq olan Cəbrail dörd böyük mələkdən biridir...[1] Həzrəti-Rəsulullahdan (s) başqa bir Peyğəmbərə (ə) də öz görkəmində görünməmişdir".[2]

Cəbrail (ə) Qurani-Kərimdə barəsində xüsusi ehtiramla danışılan bir məfhumdur. "Cəbrailə (ə) düşmən olan şəxsə söylə ki, həqiqətən o, (Cəbrail) özündən əvvəlkiləri (Tövratı və İncili) təsdiq edən, möminləri doğru yola yönəldən, (onlara) müjdə verən, Quranı Allahın izni ilə sənin qəlbinə çatdırmışdır (nazil etmişdir). Hər kim Allaha, onun mələklərinə və Peyğəmbərlərinə, Cəbrailə və Mikailə düşməndirsə, şüb həsiz, Allah da (belə) kafirlərə düşməndir" ("Bəqərə", 97-98).

Yaxud Ulu Yaradan gecə yanıb, gündüz sönən ulduzlara, gah görünən, gah görünməyən səyyarələrə, qaralmaqda olan gecəyə, sökülməkdə olan dan yerinə – belə zəruri anlayışlara and içdikdən sonra ("Təkvir", 15-18) buyurur: "Bu Quran (Allah dərgahında) çox möhtərəm olan bir elçinin (Cəbrailin) gətirdiyi kəlamdır. Elə bir elçi ki, çox qüvvətlidir; Ərşin sahibi Allah yanında çox hörmətli, izzətlidir".

"Elə bir elçi ki, (mələklər arasında) itaət ediləndir, (həm də Allah yanında vəhyə) etibarlı müvəkkildir" ("Təkvir", 19-21).

M.Füzulidə Peyğəmbərin (s) şənində yazdığı "sana" rədifli "nət"in beşinci beytində vəhy mələyi Cəbraillə (ə) Peyğəmbərin (s) bağlılığını belə vəsf edir:

[1] "Böyük Cinlər və məzhəblər ensiklopediyası". İstanbul, 1964. səh. 296

[2] Metin Akar. "Türk edebiyyatında menzum meracnameler". Ankara, 1987. səh. 255

*Vəsf Cibrili-Əmin etmiş qəbuli-xidmətin,*
*Sirri-həq kəşfinə anınla yetib fərman sana.*[1]

(Sənin qulluğunda olmağı inanılmış Cəbrail (ə) vəsf etmişdir, Tanrı sirrinin açılması üçün sənə onunla buyruq gəlmişdir).[2]

İlk baxışda adama elə gələ bilər ki, Şah Xətai bu beyt də yersiz fərq qoyur, ancaq bu qətiyyən belə deyildir. Hamıya bəllidir ki, İlahiyyətşunaslıq elmi Peyğəmbərləri (ə) Nəbi, Mürsəl, Ülul-Əzim və Xatəmul-Ənbiya olmaqla dörd qismə ayırır: Məlum ənənəyə əsasən 124.000 Peyğəmbərin (ə) hamısı "Nəbi" olduğu halda, yalnız 313-ü Mürsəldir, 5-i Ülul-Əzim, biri isə Xatəmul-Ənbiyadır. "Muhəmməd (s) aranızdakı kişilərdən heç birinin atası olmayıb və deyildir. Lakin o, Allahın elçisi və Peyğəmbərlərin sonuncusudur. Allah hər şeyi bilir". ("Əhzab", 40).

Bu ayə cahiliyyət dövrünə aid olan yanlış bir ənənəyə son qoymaq üçün Peyğəmbərin (s) Zeynəb binti Cəhş ilə evlənməsindən bəhs edən sonuncu ayədir. Öncə belə buyrulur: İstər Zeyd olsun, istərsə də başqası, "Muhamməd (s) aranızdakı kişilərdən heç birinin atası olmayıb və deyildir". Bir zamanlar əgər Zeydə "Muhamməd (s) oğlu" deyilirdisə, bu, təbii və qohumluq əlaqəsi deyil, İslamın və Quranın hökmü ilə ortadan qaldırılmış bir adət və ənənədən irəli gəlir. Əlbəttə, Peyğəmbərin (s) Qasim, Tahir və İbrahim adlı oğlanları olmuşdur. Ancaq tarixi mənbələrin yazdığına görə, onların hamısı yetkinlik yaşına çatmamış dünyalarını dəyişmişdilər.

Sonra Allah Peyğəmbərlə (s) insanların əlaqələrinin Peyğəmbərlik və xatəmiyyət prinsipinə əsaslandığını buyurur. Ayənin əvvəlində qohumluq əlaqəsi tamamilə inkar edilir, ardınca isə

[1] Məhəmməd Füzuli. "Əsərləri". V cilddə, 5-ci cild. Bakı, "Elm", 1985. səh. 134

[2] Vərağa Almasov. "Peyğəmbər (s) aşiqi Füzuli". Bakı, "Çaşıoğlu", 2007. səh. 76-77

əlaqənin Peyğəmbərlik və xatəmiyyət prinsipinə əsaslanan mənəvi əlaqə olduğu isbat edilir. Ayənin çatdırmaq istədiyi başqa bir həqiqət Peyğəmbərin (s) insanlara olan sevgisinin bir ata sevgisindən daha üstün olmasıdır. Onun ümmətə olan sevgisi bir Peyğəmbərin öz ümmətinə olan sevgisidir. Xüsusilə də o, özündən sonra heç bir Peyğəmbər gəlməyəcəyini bilirdi. Buna görə də onlar üçün Qiyamətə qədər lazım olacaq proqramı yüksək sevgi və şəfqətlə təqdim etməli idi. "Xatəm" sonluğa deyilir. Bu ayə Peyğəmbərlik missiyasının İslam Peyğəmbəri ilə başa çatdığını və ondan sonra heç bir Peyğəmbər gəlməyəcəyini göstərir. Hədislərinin birində Peyğəmbər (s) belə buyurmuşdur: "Mənim digər Peyğəmbərlərlə olan müqayisəmi bir misalla belə izah edə bilərəm: Bir kişi gözəl bir ev tikir. Camaat evin ətrafına toplaşıb "bundan gözəl bina yoxdur. Yalnız bir kərpici çatmır", – deyirlər. Bax həmin boş yeri dolduran sonuncu kərpic mənəm.[1]

Birdən kimsə bu bölgüyə etiraz etsə və desə ki, Qurani-Kərimdə dəfələrlə açıqaşkar bildirilir ki, Allahın saleh bəndələri "Biz Peyğəmbərlər arasında fərq qoymuruq" deyirlər. Cavab olaraq bildirməliyik ki, bu fərq bəndə baxış bucağından yox, İlahi nöqteyi nəzərdəndir. Yəni Peyğəmbərlər arasında bəndələr yox, Allah-təala özü fərq qoyur.

"O elçilərin bəzisini bəzilərindən üstün etdik. Allah onların bəzisi ilə danışmış, bəzisinin isə dərəcələrini yüksəltmişdir. Məryəm oğlu İsaya aydın nişanələr verdik və onu Ruhulqudusla qüvvətləndirdik. (Lakin bu Peyğəmbərlərin üstünlüyü ümmətlər arasında ixtilafa mane olmadı" ("Bəqərə", 253). Peyğəmbərlərin bəzisinin bəzilərindən üstün olmasına gəldikdə isə məlumdur ki, bütün Peyğəmbərlər (ə.m) Allah tərəfindən göndərilmək və İlahi ismarıc gətirmək baxımından haqdırlar. Onlara iman zəruridir. Necə ki, Allah-təala "Bəqərə" surəsinin 275-ci ayəsində mömin-

---

[1] Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 423

lərin dilindən buyurur: "Biz onun elçiləri arasında fərq qoymuruq (hamısına inanırıq)". Lakin bəzi cəhətlərdən, bəzi Peyğəmbərlər (ə) daha üstündürlər. Bu fərq iki növdür:

1. Bəzi Peyğəmbərlərə xas olan özəlliklər baxımından. Misal üçün, Allah Həzrəti-Musa (ə) ilə xüsusi şəkildə danışmışdır, yaxud Həzrəti-Süleymana (ə) padşahlıq vermişdir və s. Digər Peyğəmbərlərlə (ə) bağlı isə belə olmamışdır.

2. Mənəvi dərəcələr və Allaha yaxın olmaq baxımından. Şübhəsiz, bu baxımdan İslam Peyğəmbəri (s) Allahın ən üstün Peyğəmbəri olmuşdur. Hərçənd o Həzrət (s) birinci növ üstünlük baxımından da bir çox cəhətlərdən digər Peyğəmbərlərdən (ə) üstün olmuşdur. Misal üçün, ona nazil olan kitab (Quran) Allah tərəfindən göndərilən ən mükəmməl kitabdır. Heç bir Peyğəmbərə belə bir kitab verilməmişdir. Yaxud onun canişinlərini (on iki İmamı) deyək. Heç bir Peyğəmbərə belə canişinlər verilməmişdir.[1]

Digər cəhətdən "işim sənadır ifadəsi" Peyğəmbərə (s) çoxlu salavat göndərmək kimi də başa düşülür. "Dua etmək, salam vermək, namaz qılmaq" kimi müxtəlif istilahi mənaları olan bu sözün əsas lüğəvi anlamı diqqəti bir şəxsin, bir məfhumun ətrafında "cəmləşdirmək"dir. Bütün bunlar anlayışın möhkəm istinadgahına çevrilən mübarək "Əhzab" surəsinin 56-cı ayəsində əksini tapmışdır:

"Allah və Onun mələkləri Peyğəmbərə salavat göndərirlər. Ey iman gətirənlər! Siz də ona salavat göndərib, salam deyin və tam şəkildə itaət göstərin".

Keçən ayələrdə Peyğəmbərə (s) hörmət edilməsi, heysiyyətinin qorunması, ona əziyyət verilməməsi haqqında danışıldıqdan sonra bu ayədə öncə Allah və mələklərin Peyğəmbərə (s) olan xüsusi sevgisi qeyd edilir. Ardınca möminlərə buyurulur ki,

---

[1] Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 42

Peyğəmbərin (s) dərəcəsi o qədər yüksəkdir ki, varlıq aləminin yaradıcısı olan Allah və Allahın əmri ilə kainatı idarə edən bütün mələklər ona salam göndərirlər. İndi ki belədir, siz də bu işə qoşulun. O, yaradılış aləminin qiymətli gövhəridir. Əgər Allahın lütfü ilə onunla görüşmək sizə nəsib olsa, qiymətini bilin, onun Allah və mələklərinin yanındakı qiymət və dəyərini unutmayın. Sünni və şiə raviləri tərəfindən nəql edilən çoxlu sayda hədisdə Peyğəmbərə (s) salavat göndərilərkən "Ali Muhamməd" ifadəsinin də salavata əlavə edilməsinin zəruriliyi açıq şəkildə qeyd edilmişdir. Hədislərinin birində Peyğəmbər (s) belə buyurmuşdur: "Mənə yarımçıq salavat göndərməyin". Soruşdular: "Yarımçıq salavat nədir?" Buyurdu: "Təkcə "Əllahummə salli alə Muhamməd" deyib davam etdirməmək". Əslində, belə deməlisiniz: "Əllahummə salli alə Muhammədin və ali Muhamməd".[1]

Aşağıdakı beyt Xətainin bu anlayışa dərindən diqqət yetirdiyini göstərir:

*Hər qövüm adını eşidib səlavat vermədi,*
*Onların yeri həmişə damudadır, ya Rəsul!*

*(Q.188, səh.189)*

(Sənin Muhamməd, Əhməd, Məhmud, Müstəfa sözlərindən ibarət dörd adından birini eşidib, salavat deməyən bir dəstənin yeri mütləq Cəhənnəm olacaqdır).

Mətlənin ikinci misrasında isə Peyğəmbərin (s) şəfaət səlahiyyəti bəhs mövzusuna çevrilir. Lakin şair bunun kor-koranə surətdə yox, geniş və dolğun bir bədii plan da etmişdir. Misradakı asilik bimarı "ad" və ya "Nəbi" ifadələri bu planın bədii

---

[1] Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 426

struktur və kompazisiyasını şərtləndirməyə xidmət edir. “Asilik bimarı Qurani-Kərimdə dəfələrlə vurğulanan qəlb xəstəliyini xatırlatdığı üçün olduqca özünə məxsus deyimdir. Qəlb xəstəliyi isə müqəddəs kitabımızda ən müxtəlif aspektlərdə dəyərləndirilir.

“Quranı göndərməkdən hədəf budur) ki, onunla ağıl və bəsirət sahiblərini qorxutsun və deyilən söz (əzəldən buyurduğumuz əzab hökmü) kafirlər barəsində gerçək olsun”. (“Yasin”, 70).

“Haqqı eşitməz, danışmaz və görməzlər buna görə də öz pis adətlərindən, yaramaz əməllərindən geri dönməz və haqqı dərk etməzlər”. (“Bəqərə”, 117).

Allahu-təala yenə də “Bəqərə” surəsində, Münafiqlərin (iki üzlü şəxslərin) qəlbini xəstə adlandırmış və Allahın onların xəstəliklərinə əlavə etməsini bəyan etmişdir. “Onların ürəyində nifaq (münafiqlik) və həsəd mərəzi (xəstəliyi) var. Allah onların mərəzini daha da artırır” (“Bəqərə”, 10).

Başqa bir ayədə ürəyində Allah qorxusu olmayanları daş ürək adlandıraraq, onların qəlblərinin qənbər daşından (çay daşından) da bərk və qatı olmasını bildirir: “Bundan sonra qəlbləriniz yenə sərtləşərək daş kimi bəlkə daha da qatı oldu” (“Bəqərə” 74).

Digər bir ayədə isə kafirlərdən bir dəstəsini “ürəyi pak olmayanlar” adlandıraraq buyurur: “Onlar elə kəslərdi ki Allah onların ürəklərini təmizləmək istəməmişdir” (“Maidə”, 41).

Bunların hamısının müqabilində isə “Ənam” surəsinin 36-cı ayəsində buyurur: “(Sənin dəvətini) ancaq cani-dildən eşidənlər qəbul edər. Ölüləri də Allah dirildər. Sonra onlar Allahın hüzuruna qaytarılar”. Bu və bu kimi ayələrdən məlum olur ki, Quran “insani və ruhani həyat”ı əsas hesab edir. Çünki insanın bütün dəyər və qiyməti bu həyatda gizlənmişdir.

“Əl-Hədid” surəsindən 16-cı ayəni yada salaq: “İman gətirənlərin qəlblərinin Allahın zikri və haqqdan nazil olan (Quran) üçün yumşalması vaxtı gəlib çatmadımı? Onlar özlərindən əvvəl kitab verilən kimsələr (yəhudilər və xaçpərəstlər) kimi olmasınlar. Onlarla (öz Peyğəmbərləri arasında) uzun bir müddət

keçmiş və (öyüd-nəsihətləri unutduqları üçün) qəlbləri sərtləşmişdir. Onların çoxu (Allaha asi olan) fasiq lərdir".

Bu ayəyə diqqətlə nəzər salsaq, belə nəticəyə gələ bilərik ki, hər bir insan öz qəlbinin həyat tapması, ruh aləminə açılması üçün gecə-gündüz səy edib çalışmalıdır. İslamı qəbul edən şəxs sadəcə şəhadət kəlməsini deməklə kifayətlənməməli, həmçinin Allahın əmrlərini, yasaqlarınıda vaxtında yerinə yetirməlidir. Namaz, oruc, xums, zəkat və sairə kimi vacibləri layiqincə yerinə yetirməklə qəlbini, ruhunu təmizləməlidir. Qurani-Kərim, müqəddəs hədislər, dünya və axirət barəsində xəbərlər insanın qəlbində xüsusi yer tutmalıdır.

Bu məsələlərlə bağlı bədii düşüncələrə Aşıq Ələsgərin bir ustadnaməsində də rast gəlirik:

*Dünyada əl çəkmə sövm-səlatdan,*
*Təmiz ver, qalmasın xüms-zəkatdan,*
*Ələsgər, xof etmə, puli-Siratdan,*
*İrəhbərdi cənab Əli qabaqda.*[1]

İman insanın qəlbində olmalıdır. Həzrəti-Əli (ə) buyurur: "İman var canlarda, qəlblərdə yer tutmuşdur, iman da var canla bədən arasına girmişdir, qəlblərə bir anlıq qonar".

Cəlaləddin Rumi isə "Məsnəvi"sində bu fikri belə nəzmə çəkmişdir:

*To be qo in ke del avərdən be to*
*Quyətət pur əst əz in delha qutu.*
*An dele avər ke qutbi – aləm əst*
*Cani – cani – cani – cani adəm əst.*

(Sən deyərsən ki, (Allaha), mən sənə könül gətirmişəm;
Deyər ki, bu cür könüllərdən qutu doludur;

[1] Aşıq Ələsgər. "Seçilmiş əsərləri". Şeirlər. Bakı, "Yazıçı", 1988. səh. 15

O könülü gətir ki, aləmin mehvəridir;
Adəmin canının, canının, canının, canıdır!)

Bu deyilənlərdən o nəticəyə gəlirik ki, çox çalışaraq qəlblərimizi təmizləməli, həqiqi imana qəlbən nail olaraq, onu qoruyub saxlamalıyıq. Əgər həqiqi iman qəlbdə az da olsa, insanın hayına cavab verər, imdadına çatar. Qiyamət günündə onu əliboş qaytarmaz. Əks – təqdirdə, qəlb xəstələnər, mərəzlərə düçar olar.

“Bilin ki, qəlblər (möminlərin ürəkləri) yalnız Allahı zikr etməklə aram tapar.

Qəlb saleh olarsa, bədən də saleh olar.” (“Rəd”, 28).

Peyğəmbər (s) buyurub: “Allah-təala bədənlərinizin qüvvətinə, gözəlliyinə baxmaz. Əməllərinizə də baxmaz. Qəlblərinizə və niyyətlərinizə baxar. Bəsirət gözü (qəlb gözü) kor olanda, gözlə görməyin faydası yoxdur”.[1]

“Asilik bimarı” ifadəsi baxımından beyt Füzulinin:

*Sünnətin məğfirət əsbabinə minhaci-hisul,*
*Taətin məsiyyət əmrazinə tədbiri-ilac.*

(Sənin yolun bağışlanma səbəblərinin əldə edilməsi yoludur. Sənə itaət etmək günah xəstələri üçün sağalma tədbiridir).

İkinci misrada İslam rəhbərinə itaətin Peyğəmbər (s) sünnəti ilə bir tutulması Füzulinin bu cəhəti önə çəkməyindən soraq verir. Bu da Peyğəmbərə (s) itaətin Allaha ibadət qədər gərəkliliyi, sayıldığı İslami müddalarla uyğundur.

“Ey insanlar Allaha və Peyğəmbərinə itaət edin” (“Ənfal”, 20); “Yaxud peyğəmbərə itaət edən Allaha itaət etmiş olur” (“Nisa”, 80). Və ya “De ki, Allahı sevirsinizsə mənə tabe olun ki, Allahda sizi sevsin və günahlarınızdan keçsin” (“Ali-İmran”, 31). Rəsusullaha (s) itaətin günah xəstələri üçün dərman sayıl-

[1] Hacı İlham. “Qəlb və ilahiyyat”. “Elm və Həyat”, Bakı, 2003

ması, bura da gözü bağlı itaətdən yox, öyülənin sünnətini örnək götürməkdən, onun qoyduğu qaydaları gündəlik yerinə yetirməkdən danışıldığını göstərir.

Başqa sözlə, şair Peyğəmbərə (s) itaətin mənəvi saflaşmağa qulluq etdiyini, ruhi boşluğu doldurmaq üçün gərərəkli olduğunu demək istəyir. Peyğəmbər (s) yolu ilə itaət anlayışının belə qarşılıqlığı beytə bir fikiri-bədii bitkinlik verir. Bu bitkinlik misraların söz düzümündə, onlar arasındakı müvazilikdə də özünü göstərir.

Belə ki, hər iki misrada öncə Rəsulullahla (s) bağlı olub, beytin özünü təşkil edən və vasitə yerində dayanan anlayışlar ("sünnət" və "taət"), sonra ümmətlə bağlı olub, məqsəd kimi qavranılan motivdir. (Məxfirət əsbabinə minhacü-hüsul" və "məsiyyət əmrazinə tədbir-ilac")[1]

Göründüyü kimi "Asilik bimarı" ilə "Məsiyyət əmrazi" ifadələri üst-üstə düşür.

Xətainin beytdə irəli sürdüyü maraqlı fikirlərdən biri də Peyğəmbərin (s) adının şəfa olması fikridir. Adətən Qurani-Kərimin şəfa olmasından danışılır. ("İsra", 82; "Ənkəbut", 57).

Xətainin ustalığı da elə bundadır ki, o, Peyğəmbəri (s) Qurani-Kərimlə bir tutmuş, onu Qurani-Kərim səviyyəsinə qaldırmışdır. Bu zaman şair, heç şübhəsiz, Rəsulullahın (s) ürəklərə məlhəm olan adına güvənmiş, bu addakı sirri-sehri önə çəkmişdir. "Rəsulullah(s), Muhamməd (s) və Əhməd (s)" adları Quranda öz əksini tapmışdır. Belə ki, onun Muhamməd (s) adı müqəddəs kitabda dörd dəfə ("Ali-İmran", 144; "Əhzab", 40; "Fəth", 29; "Muhamməd", 2) və Əhməd (s) adı isə bir dəfə ("Səff" – 6-cı ayədə verilmişdir) Xətai Peyğəmbərin (s) dəfələrlə ad və ləqəblərini çəkir, öz ruhunu bir şam kimi onların başına dolandırır.

Məsələn:

---

[1] Vərağa Almasov. "Peyğəmbər (s) aşiqi Füzuli". Bakı, "Çaşıoğlu", 2007. səh. 102-103

*“Hu” deyərəm gerçəklərin dəminə,*
*Gerçəklərin dəmi nurdan sayılar.*
*On iki İmam qatarına uyanlar,*
*Muhəmməd, Əliyə yardan sayılar. (19, 344)*

*Bizə şəmi-təcəlli Mustəfadir,*
*Onunçün sərvəri Ali-Əbadir. (62, 74)*

“Nət”in **ikinci** beyti də Həzrəti-Muhammədin (s) İlahi mənşəyinin tərənnümünə həsr edilmişdir. Sadəcə olaraq mətlədəki “Şol mübarək zat” ifadəsi burada “ayağın torpağı” və o “torpaq” ifadələri ilə əvəz edilmişdir.

***Ayağın torpağının qədrin nə bilsin hər kişi,***
***Kun-fəkan ol torpağa kəmtər bəhadır, ya Nəbi!***
*(363, 233)*

(Hər yoldan ötən sənin üzərində gəzdiyin yerin, torpağın qədrini bilə bilməz, o torpağın ən az qiyməti “kun fəyəkun” ayəsidir).

Beyt Füzulinin:

*Kəlam səmadan enib, sən səmaya yüksəldin,*
*Əyari-qiymətini qoy düşünsün hər gümrah.*

beyti ilə yaxından səsləşir. Xətai Füzulinin dili ilə desək hər gümrahın (azğının) Peyğəmbərin (s) əyari-qiymətini düşünməsi üçün Qurani-Kərimdə yeddi yerdə gəlmiş “Kun fəyakun” ayəsini İslami meyar olaraq götürür. Şair çox orijinal metod seçərək tapdalanmış yolla getməmişdir. Belə ki, adətən o poeziyada ilahi qüdrətin pozulmaz nişanəsi, aydın əlaməti yerində çıxış edən “Kun fəyəkun” ayəsini burada Peyğəmbərliklə bağlamışdır.

Şairin yaradıcılığını lazımınca başa düşə bilməkdən ötrü bu qəbilli ayələrin bir neçəsini nəzərdən keçirək. “Allah-təala buyurur ki, Göyləri və yeri var edən odur. Bir şeyin yaranmasına

fərman verdik də, ona yalnız: (var ol! Deyər, o da dərhal) olar. (“Bəqərə”, 117), “Ali İmran” surəsinin 59-cu ayəsində buyurur ki, “Allah yanında İsada Adəm kimidir. Allah onu (Adəmi) torpaqdan yaratdı. Sonra ona: “mövcud ol!” – dedi, oda dərhal oldu. (Buna görə də, İsanın dünyaya atasız gəlməsi əsla onun tanrı olmasına dəlalət etmir”). (“Ali İmran”, 47-59; “Nəhl”, 40; “Yasin”, 82; “Məryəm”, 35).

Göründüyü kimi bu ifadə yeddi dəfə işlənilib. Bu ilahi bəyanatlarda xilqət, göylərin və yerin yaranışı, qadının (Məryəmin) dünyaya atasız uşaq gətirməsi və Adəmin (ə) peyğəmbər xəlq olunması kimi köklü məsələlərdən bəhs edilir. Seyyid İmaməddin Nəsiminin ustadı Fəzlullah Nəimi Astrabadi fars dilində yazdığı “Tərcibənd”lərinin birində:

*Bu təmtəraq ilə “Kun fə ya kun”,*
*Əfsanədir irfan əhli üçün.*

deyərkən, məhz ilahi yaradılışın əlçatmazlığını, ünyetməzliyini nəzərdə tutmuş, tükənməz tanrı qüdrətini ürəkdən tərənnüm etmişdir. Lakin klassik irsimizdə ayənin Həzrəti-Muhəmmədlə (s) əlaqələndirilməsinə də rast gəlirik.

*An “kaf”u “nun” ke, əsli-vücud əst, xəlq ra,*
*“Kaf”i – kəmalü, “Nun”e – məvali – Muhəmməd əst.*[1]

Varlığın özülünü təşkil edən “Kun fəyə kun” ayəsinin “Kaf” hərfi kamalını, “Nun” hərifi isə əlaçıqlığını, səxavətini göstərir. Xətai yaradıcılığında da bir neçə dəfə bu ifadəyə rast gəlmək olur. Məsələn: “Dəhnamə” əsərində:

*Qüdrət qələmi ilə yazdı “Kaf”i,*
*Ol “Kaf”ə ulaşdı “Nun”i safi.*

---

[1] Məhəmməd Füzuli. “Farsca divan”. Ankara, 1960

*Pəs gəldi vücudə "Kun fəkan" həm,*
*Xətm oldu zəman ilə məkan həm.*[1]

Şair "Nət"in **üçüncü və dördüncü** beytlərini Merac hadisəsi üzərində qurmuşdur.

***Ol məqamın kim, mələk yetməz süqufi-nəlinə,***
***Ayağın altında ol bir xaki-padır, ya Nəbi!***

(Mələklərin çata bilmədiyi o uca dərəcəndə yüksək şan şöhrətin – nəleyninin üstü sənin hər gün, tapdaladığın, üzərində sərbəst gəzib, hərəkət etdiyin adi qara torpaq dan başqa bir şey deyildir.)

Bu beytlərdə Peyğəmbərin (s) meracından bəhs edildiyinə görə, yaxşı olardı ki, burada Peyğəmbərin (s) Meracı haqqında ətraflı məlumat verək:

"Merac" sözü ərəbcə "yuxarı çıxmaq" anlamına gələn "araca" felinin mifal vəznindən bir törəməsidir. Bilindiyi üzrə bu vəznlə alət adı, hərdən də məcazi olaraq yer adı düzəldilir. Odur ki, "Merac"ın iki lüğəvi anlamı vardır: "yuxarı çıxma aləti, yuxarı çıxa biləcək yer".[2]

Sözün istilahi anlamları isə rəsulullaha aid "göyə çıxma" və Onun "bir möcüzəsinin adı"dır.[3]

Merac hadisəsi besətin 10-cu ili şiə alimlərinə görə Rəbiüləvvəl ayının 12-i, sünni alimlərinə görə Rəcəb ayının 27-i, miladi tarixlə 620-ci ildə baş vermişdir. Həzrəti-Peyğəmbərin (s)

---

[1] Şah İsmail Səfəvi (Xətai) külliyyatı. Qəzəllər, qəsidələr, nəsihətnamə, dəhnamə, qoşmalar. (Tərtibatçısı: Mirzə Rəsul İsmailzadə). Bakı, Əlhuda, 2004. səh. 392

[2] Metin Akar. "Türk edebiyyatında menzum meracnameler". Ankara, 1987. s.487

[3] Vərağa Almasov. "Füzuli "Leyli və Məcnun"un islami mahiyyəti". Bakı, "Elm", 2006. səh. 72

Məscidül-həramdan Məscidül-Əksaya aparılmasına isra (yəni – gecə gəzintisi) deyilir. Həzrəti Peyğəmbərin (s) Məscidül-əksadan Cəbraillə (ə) Büraq adlı miniklə ərşə qalxmasına “Merac” (yüksəlmə) deyilir.

Meracda olarkən Həzrəti-Peyğəmbər (s) ərşin birinci qatında Həzrəti-Adəmlə (ə). ikinci qatında Həzrəti-Yəhya (ə) və Həzrəti-İsa (ə), üçüncü qatında Həzrəti-İdris (ə) və Həzrəti-Yusif(ə) ilə, dördüncü qatında Həzrəti Harun (ə), beşinci qatında Həzrəti-Musa (ə), altıncı qatında Həzrəti-İbrahmlə (ə) görüşdükdən sonra öz məqamı olan göyün yeddinci qatı – “Sidrətül-müntəha”ya qalxmışdır.

Meracda olarkən Həzrəti-Peyğəmbər (s) Allahın üzünü görmədən Onunla pərdə arxasından danışmış və Allah tərəfindən üç şey peyğəmbərə hədiyyə edilmişdir:

1. Namaz;
2. Ümmətdən Allaha şərik qoşmayanların cənnətə girə biləcəyi müjdəsi;
3. “Bəqərə” surəsinin son ayələri.

Bəziləri Həzrəti-Peyğəmbərin (s) Meracda ruhən və ya cismən olması barədə ixtilafa düşmüşlər. Lakin, biz Qurana müraciət etdikdə görürürk ki, Həzrəti-Peyğəmbər (s) Meracda cismən olmuşdur. Çünki, “İsra” surəsinin birinci ayəsində “biəbdihi” – yəni özünü deyə müraciət olunur. Əgər Həzrəti-Peyğəmbər (s) Meracda ruhən olsaydı o zaman “berruhihi” – (yəni onun ruhunu) deyə müraciət olunardı.[1]

“Mətləül-etiqad”dakı Meracla bağlı bilgilər də bu deyilənlərlə uyğundur. M.Füzuli Həzrəti-Məhəmmədin (s) başqa peyğəmbərlərdən üstünlüyünü göstərən dəlillərdən biri saydığı belə açıqlayır: “…bizim peyğəmbər (s) bu barədə yeganədir. Deyirlər ki, Peyğəmbər (s) Merac gecəsində ərşə doğru qalxdığı zaman göylərin hər birisində peyğəmbəri aparan mələklər ondan geri qalmışdır. Onun getdiyi yerlərə mələklərin daxil olma ixtiyarı

[1] Şahlar Şərifov. “İslam tarixi”. Bakı, “Nurlar”, 2013. səh. 28-29

yox idi. Sonra Meracın keyfiyyəti haqqında soruşduqda Peyğəmbər (s) demişdi ki, bu, ancaq bəşəriyyətin seçmə fərdinə müyəssər ola bilər və Tanrı öz əmrini sizin bilmədiyinizə zahir etmi°dir”.[1,2]

Göründüyü kimi Peyğəmbərin (s) Meracı İslam dininin zəruri etiqadlarındandır və bütün İslam firqələri tərəfindən yekdilliklə qəbul olunur.

1. Merac mövzusu Qurani-Kərimin “İsra” və “Ən-Nəcm” surələrində və mütəvatir rəvayətlərdə bəyan olunmuşdur.

2. Mövzunu xırdalıqları ilə yox, prinsipcə qəbul etmək zəruridir.

3. Merac İslam Peyğəmbərinin (s) möcüzələrindən olduğu kimi, bütün möcüzələ rə tətbiq olunan qayda meraca da şamil olunur.

4. Bütün çətinliklər İlahi qüdrətə əsaslanmaqla həll oluna bilər. Əgər bəşər övladı olan insan bu gün səmaya təyyarə qaldırırsa, başqa planetlərə süni peyklər və hava gəmiləri göndərə bilirsə, onda Merac məsələsini şərtsiz və problemsiz qəbul etməli dir.

5. Quranda Bilqeyisin taxtının bir göz qırpımında bir ölkədən digər ölkəyə gətirilməsi qeyd olunur. Belə bir məlumat da Merac məsələsinin məsafə baxımından mümkünsüzlük ehtimalını aradan qaldırır.

Merac barədə nazil olan ayələrə diqqətlə yanaşılsa heç kəsdə şəkk şübhə yaranmaz. Allah-təala “İsra” surəsinin 1-ci ayəsində buyurur ki:

“Pak və münəzzəhdir o Allah ki, gecə vaxtı bəndəsini (Peyğəmbəri) ona öz ayə və qüdrət nişanələrini göstərmək üçün

---

[1] Məhəmməd Füzuli. “Əsərləri”. V cilddə, 5-ci cild. Bakı, “Elm”, 1985. səh. 215

[2] Vərağa Almasov. “Füzuli “Leyli və Məcnun”un islami mahiyyəti”. Bakı, “Elm”, 2006. səh. 72

“Məscidül-Həram” dan “Məscidül-Əqsa”ya” seyr etdirdi. O, eşidən və görəndir”.

Ayənin Ərəbcə əvvəli “Sübhan” kəlməsi ilə başlayır və bu məsələnin əzəmətli və çox mühüm olduğunu bildirir.

“Əsra” sözü göstərir ki, bu seyr etmə, gecə vaxtı baş vermişdir. Ərəblər də gecə seyr etməkdə bu sözü işlədərlər.

“Əbd” sözü Peyğəmbərin (s) öz cismi və bədəni ilə yuxarı aləmlərə yüksəlməsini göstərir. Bu seyr cismin və ruhun birgə seyri, hərəkəti idi.

“Linuriyyəhu min ayatina” – cümləsi meracın hədəfini, məqsədini bəyan edir. Yəni meracda məqsəd Allah-təalanın qüdrət nişanələrini Peyğəmbərə (s) göstərmək və Həzrəti-Əlinin (ə) rəhbərlik və vilayətini təsdiq etmək imiş. Bu ayədə olan incə nöqtələr mövzunu tam şəkildə aydınlaşdırmış və heç bir qaranlıq nöqtə qalmamışdır. “Ən-nəcm” surəsində Peyğəmbər (s) ikinci dəfə vəhy mələyini əsl surətində gördü. Allah-təala buyurur: “Peyğəmbərin (s) gözü səhvə uğramadı, o, Allahın böyük nişanələrini gördü”.

Bu iki ayə göstərir ki, həmin görünmə yuxuda deyil, ayıq halda olmuşdur. Biz müsəlmanların da İslami əqidəmiz “İsra” və “Ən-nəcm” surələrinin “Merac” barədə olan ayələrinə əsasən Peyğəmbər (s) bir gecədə öz cismi ilə (maddi cismi) “Məscidül-Həram”dan “Məscidül-Əqsa”ya aparılmış və oradan da yuxarı aləmlərə seyr etmiş, vəhy mələyini onun həqiqi surətində eynilə müşahidə edərək, Allah-təalanın ayə və nişanələrinin əzəmətini yaxından görmüşdür.

Bu ayədə (“İsra”, 1) peyğəmbərin (s) “Merac” adı ilə tanınmış ilahi və heyrətamiz səfərinə işarə edilmişdir. Bundan başqa “Nəcm” surəsinin də ilk ayələrində ilahi səfərə işarə edilmişdir. Əlbəttə, hədislərdə Məscidul-həramdan Məscidul-Əqsaya hərəkət sözü gedən səfərin başlanğıcı kimi göstərilmiş, bundan sonra yer, sonra göy və daha irimiqyaslı bir səfərin baş verdiyi qeyd edilmişdir. Bu ilahi səfərin necəliyi, səfər zamanı peyğəmbərin (s) başına gələnlər, onun nələri görməsi ilə bağlı hədislərdə ətraflı məlumat verilmişdir. Hədislərdə “Merac” gecəsi peyğəm-

bərin (s) mələklərlə, peyğəmbərlərin ruhları ilə görüşməsi, Cənnətlə Cəhənnəmi yaxından görməsi, heç bir vasitə olmadan Allahla danışması qeyd edilmişdir.[1,2]

Lakin dərindən diqqət yetirdikdə Xətainin meracı burada vasitə kimi verdiyi, əsil məqsədinin isə Həzrəti-Muhəmmədin (s) ilahi mənşəli müqəddəs zatını tərənnüm etmək olduğu anlaşılır. Meracın "Nət"də ki, geniş ifadəsi isə şeirin **dördüncü** beytində əksini tapmışdır.

***Qaldı sidrül-müntəha, keçdin fələkdən ta zəmin,***
***Kim yetər bu qədri-həqqə, müntəhadır, ya Nəbi!***

(Sənin merac gecəndə "Sidrətul-Müntəha" arxada qaldı, yer kürəsindən ucalaraq göyün bütün qatlarını keçdin, gəzib gördün. Bu bəşər övladının, insan oğlunun ucala biləcəyi ən yüksək zirvədir, axı bundan daha yüksəyə ucalmaq heç bir kəsin şəninə şayəstə deyildir).

Bu beytin özündə birləşdirdiyi dini İslami bilgiləri mənqəbəvi-əsatiri xammalı, etik-estetik dəyərləri, fəlsəfi siqləti, ruhi, pisixoloji ovqatı, xəlqi-mədəni və milli-mənəvi yükü yetərincə qavramaqdan ötəri Qurani-Kərimin mübarək "Nəcm" surəsinin ilk ayələrinə verilmiş açıqlamalara diqqət yetirmək qaçılmazdır:

"O, ən uca üfüqdə idi; Sonra yaxınlaşıb daha yaxın oldu; O, iki yay uzunluğunda, hətta ondan da daha yaxın məsafədə idi; Burada Allah öz bəndəsinə vəsf olunmalı olanı vəhy etdi; (Peyğəmbərin pak) qəlbi gördüyünü yalan saymadı; Siz onunla gördüyü şey barəsində mübahisəmi edirsiniz?; Onu bir daha gördü; Sidrətul-müntəhada (müntəhadaki sidr ağacının yanında); Məva bağıda oradadır; Həmin vaxt Sidrətul-müntəhanı bir şey

---

[1] "Əl-Mizan", c.13, səh. 7

[2] Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 282

(göz qamaşdıran nur) bürümüşdür; (Peyğəmbərin) gözü yayınmadı və həddi aşmadı (gözləri onu aldatmadı, gördüyü həqiqət idi); O, Rəbbinin ən böyük dəlil və nişanələrindən bəzisini gördü" ("Nəcm", 7-18).

Bu və əvvəlki ayələr Peyğəmbərə (s) vəhy edildiyini təsdiq edir, onun formasını izah edir. Əhli-beyt (ə.m) İmamlarından nəql edilmiş çoxlu sayda hədisdə bu ayələrin əsas məqsədinin bütün vəhylər deyil, merac gecəsi Allah Peyğəmbərə (s) göndərdiyi yaxın vəhy haqqında məlumat vermək olduğu bildirilmişdir. Ayələrin zahiri məzmunu da bu faktı təsdiq edir. Təfsirçilər bu ayələrdəki cümlə və sözlər haqqında bir-birindən kəskin şəkildə fərqlənən müxtəlif fikirlər irəli sürmüşlər. Allah-təala 7-ci ayədə "O, ən uca üfüqdə idi" deyə buyurur: Uca üfüq deyiləndə, Göylə Yerin birləşdiyi məkan nəzərdə tutulur. Əslində ayənin çatdırmaq istədiyi məzmun belədir: Peyğəmbər (s) merac gecəsi göyün ən yüksək yerində olmuş, sonra daha çox yaxınlaşmış... Allah-təala vəhy edilməli olanı öz bəndəsinə bu məqamda vəhy etmişdir. Peyğəmbərin (s) pak qəlbi göründüyü hadisədə yanılmamışdı, Peyğəmbərin (s) gör dükləri həqiqət idi. Əlbəttə, burada Peyğəmbərin (s) qəlb gözü ilə nə gördüyü açıq şəkildə deyilməmişdir. Ancaq 18-ayədə onun bu ruhani səfərdə Allahın bir sıra böyük nişanələrini gördüyü qeyd edilmişdir. Burada Allah-təala ilə görüş nəzərdə tutula bilər. Təbii ki, görmə fiziki gözlə deyil, qəlb gözünə aiddir, "görüş" deyilərkən isə fiziki deyil, ruhani görüş nəzərdə tutulur. Allahı fiziki deyil, yalnız ruhani gözlə görmək olar. İmam-Rzadan (ə) "Peyğəmbər (s) Allahı gördümü?" deyə soruşulduqda buyurmuşdur: "Bəli, onu qəlbi ilə gördü. Məgər Allahın" (Peyğəmbərin pak) qəlbi gördüyünü yalan saymadı" deyə buyurduğunu eşitməmisən? Peyğəmbər (s) Allahı gözü ilə deyil, qəlbi ilə gördü." 13-cü ayədə Peyğəmbərin (s) Allahla olan başqa bir görüşünə – merac vaxtı Peyğəmbərin (s) Sidrətul-müntəhanın yanında olan başqa bir görüşünə işarə edilmişdir. "Sidr" (ağac), "Müntəha" isə son deməkdir. "Sidrətül-müntəha" heyrətin son həddini ifadə edir (Fəxrəddin Razi). Burada göylərin ən son nöqtəsi nəzərdə tu-

tulmuşdur. Çünki "Məva bağı"nın (Möminlərin məskunlaşdığı cənnət bağının) onun yanında, cənnətin göydə olduğunu buyurur: Quranda bu ayədən başqa heç bir yerdə söhbət açılmamışdır. Sanki Allah burada rəmzlərlə danışır. Hədislərdə sidrin yeddinci göydəki bir ağacın adı olduğu qeyd edilmişdir. İnsanların əməlləri həmin ağaca doğru yüksəlir.[1] Peyğəmbər (s) belə buyurmuşdur: "Onun yarpaqlarının hər birinin üzərində Allaha tərif deyən bir mələk gördüm". Başqa bir hədisində isə belə buyurur: "Mən Sidrətul-müntəhaya çatdım, onun hər bir yarpağının kölgəsində bir ümmətin əyləşdiyini gördüm". Burada da yerdəki ağaclara bənzər bir ağacın nəzərdə tutulmadığı məlum olur. Onunla Allah dərgahına böyük bir kölgə salana və hər yarpağı üzərində bir mələyin tərif deməsinə, keçmiş ümmətlərin əməlisalehlərinin onun kölgəsində əyləşməsinə işarə edilmişdir. 16-cı ayədə belə buyrulur: "Sidrətul-müntəhanı bir şey bürümüşdür". Allah bu ayənin izahını verməmişdir. Ancaq hədislərdə bildirilir ki, Allahla Peyğəmbər (s) arasındakı pərdə götürüldüyü və O, Allahı qəlb gözü ilə gördüyü an Sidr ağacını bir nur bürümüşdür.[2] Hər halda biz meracın əsl həqiqətindən xəbərsizik. Bu hadisə haqqında olan izahlar bir növ bənzətmədir. Söz bu həqiqəti ifadə etməyə aciz olduğu üçün bu cür böyük həqiqətlərə belə işarə edilmişdir.[3]

Peyğəmbərin (s) Meracı bənzəri olmayan bir hadisədir. Bu bənzərsiz hadisə klassik Azərbaycan ədəbiyyatı şairləri üçün misilsiz bir ilham mənbəyinə çevrilmişdir. Şeyx Nizami Gəncəvi yazdığı "Xəmsə"sində də Peyğəmbərin (s) Merac səfərinə müraciət etmiş və bu səfərin həm ruhani, həm cismani olması faktını elmi dəlillərlə sübuta yetirmişdir. Bu deyilən fikirlərə

---

[1] "Əl-Mizan". c.19, səh. 26, 29, 32

[2] "Nümunə", c.22, səh. 497

[3] Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 526

sübut olaraq mərhum akademik Əhmədağa Əhmədov onun şərhi ilə bağlı özünün elmi mülahizələrini qələmə almışdır:

Mərhum alimimiz Azərbaycan Dövlət Neft Akademiyasının dosenti Əhmədağa Əhmədov "Nizami-elmşünas" kitabının 11-ci fəslində "Nizaminin meracnamələri adlı başlıqda 208-ci səhifəsində yazır:[1]

"Nizami Quranı İslam dinin müqəddəs, mötəbər, ictimai-siyasi, iqtisadi, elmi kitabı kimi tanıyır və öz əsərlərində dönə-dönə onun ayələrinə müraciət edirdi. O, bu ayələri elmi həqiqət kimi qəbul edir. Merac məsələsində Nizami Quran ayələrinə əsaslanır və digər şairlərdən fərqli olaraq onu elmi şəkildə şərh etmək istəyir. Bundan əlavə Merac əhvalatı ətrafında gedən əsassız, gülünc söhbətlərə, saxta hədislərə son qoyur.

Merac barəsində təfsirçilər tədqiqəatçılar və islamşünaslar arasında böyük ixtilaf var. İslam alimlərinin bir qismi Peyğəmbərin (s) Meraca getməsini yuxuda, digərləri – Qəşş halında, bəzisi – ruh aləmində, bəzisi də adi halda olduğunu qəbul edir. Bəzi tədqiqatçıların fikrincə Peyğəmbər (s) iki dəfə Meraca gedib. Bəziləri isə Meracın 34 dəfə təkrar olunduğunu yazırlar; bunlardan biri cismani şəkildə, 33 isə guya ruh və ya yuxu halında olub. Bəzi müəlliflər isə müxtəlif rəvayətlər və təfsirlərdən nəticə çıxararaq yazırlar ki, Peyğəmbər (s) 120 dəfə Meraca gedib. "Besətdən 12 il keçənədək 120 dəfə Merac elədi. 119 dəfəsini dünyanın hər tərəfinə qitələrə və dəryalara elədi. Bu aləmin əcayib və qərayibinin seyrini edəndən sonra bir özgə dəfə daxi, 17 rəməzani-şərif əflaki seyr etmək üçün məscüdül həramdan və ya zövcəsi Ümmi-Ha ninin evindən cənab Cəbrailin rəfaqəti ilə əflakə uruc elədi".

Merac haqqında bu qəbil rəvayətlər çoxdur. Təfsirçilər, bu rəvayətləri dörd qismə ayırırlar. Birinci qismin doğruluğu qətidir; İkinci qismi zahirən qeyri-adi görünsə də əmələ gəlməsi

[1] Əhmədağa Əhmədov. "Nizami-elmşünas". Bakı, "Azərbaycan", 1992. səh. 208

mümkündür; üçüncü qism mövcud qaydalara əks olsa da onları təvil etmək – yəni hansı mənada deyildiyini tapıb qəbul etmək olar. Dördüncü qisim isə bütün qaydalara zidd olub, təvil etməyə qabil deyil. Təfsirçilər dördüncü qisim rəvayətləri rədd edirlər.

Həmişə özünə qarşı tələbkar və bütün əsərlərində qoyduğu məsələlərə ehtiyatla yanaşan Nizami Merac məsələsində daha çox diqqətli olmuş, bu barədə söylənən rəvayət və xəbərləri dərindən öyrənmiş, onları "saf-çürük" etmiş, Quran ayələrinə və elmi-mülahizələrə uyğun olanları saxlayıb, qalanlarını qəbul etməmişdir.

Nizami "Xəmsə"yə daxil etdiyi əsərlərin hamısında merac məsələsinə baxmışdır. Bundan əlavə şair öz "Divan"ında da Merac əhvalatına ayrıca bir qəsidə həsr etmişdir. Bu qəsidə və əpoemalarda olan Meraca aid parçalarda şair eyni bir məzmzunu təsvir edib. Lakin, bunların hər biri öz gözəlliyi, təravəti, ətri ilə digərindən fərqlənən və hələ şeh damlaları üstündə olan, əl dəyməmiş tər bahar çiçəklərindən tutulmuş bəzəkli, yaraşıqlı gül dəstələridir.

Biz Merac mövzusunda Nizaminin qarşıya qoyduğu məqsədi aydın surətdə oxucuya çatdırmaq istəyirik. Meracnamələrdə Nizami əsasən iki məqsəd nəzərdə tutur. Birinci məqsəd Merac xüsusunda hər cür uydurma və xurafatı ləğv etmək, mübahisəli məsələləri müəyyənləşdirib ixtilafa xitam verməkdir. Bu məqsədlə o, Merac əhvalatını əvvəldən axıra qədər çox yığcam şəkildə təsvir edir.

Merac "nərdivan" deməkdir. Peyğəmbərin (s) göylərə səfərini guya asimana nərdivan qoyub çıxmasına oxşadırlar. Buradan da bu söz məşhur olub. Peyğəmbərin (s) nur nərdivanı ilə göyə qalxdığını söyləyən rəvayətlər də var.

Nizami "Şərəfnamə"də beylə deyir:

شب از چتر معراج او سایه ای
وز آن نردبان آسمان پایه ای

*Gecə onun meracı çətrinidən bir kölgədir.*
*O nərdivandan asiman özünə bir dayaq tapıb.*

Nizami meracın hansı tarixdə olduğunu qeyd etmir. Təfsirçilərin çoxu bu fikirdədir ki, merac hicrətdən bir il qabaq Məkkədə vaqe olub. Meracın hansı ayda olduğu da ixtilaflıdır. Bəzi təfsirçilər rəcəb ayının 27-də, bəziləri isə Ramazan ayının qədr gecəsində vaqe olduğunu qaildirlər. Qədr gecəsi Ramazan ayının 19, 21, 23 və ya 17, 19, 23-cü gecələrindən biridir. Qədr gecəsində Allahdan hər kəs nə istəsə ona nail olar. Allah onun hacətini rəva edər. Buna görə Qədr gecəsi bu üç (dörd) gecədə gizli saxlanılıb. Məşhur alim Şeyx Məhəmməd Bəhauddin Amili özünün "Nanü həlva" (Halvalı çörək) adlı şeir kitabında deyir:

چون شب قدر از همه مستور شد
لا جرم از پای تا سر نور شد

*Qədr gecəsi hamıdan gizli olduğu üçün*
*Başdan ayağa qədər nur (içində) oldu.*

Rəvayətə görə Qədr gecəsi Peyğəmbər (s) Meraca gedərkən asimandan yerə nur yağırmış; Şeyx bu beytdə həmin məsələyə işarə edir.

Bu barədə Füzuli ərəbcə yazdığı qəsidədə belə deyir:

و اذا نور المعراج برق براقه
فمن سيره قد صار ادهم ابرشا

*Meracın nuru onun burağını parladandır.*
*Onun seyrindən o qara at dönüb ala oldu.*

Füzuli də Meracın Qədr gecəsində olduğunu deyir.

*Cəbril yetib, yetirdi fərman;*
*Key sərvi-riyazi-elmi irfan.*

*Ey qədrü bülənd, padşəh dur,*
*Lütv et, şəbi-Qədr qədrün artur.*

Nizami də bu əqidədədir ki, Merac Qədr gecəsində vaqe olub; Bu barədə "Sirrlər xəzinəsi"ndə belə deyir:

تا شب او را چه قدر قدر هست
زهرهٔ شب سنج ترازو بدست

(O gecənin nə qədər qədri olduğunu bilmək üçün,
gecəni ölçən Zöhrə tərəzini əlində tutmuşdur.)

Burada "Qədr" sözü tövriyə kimi işlənib həm də qədr gecəsinə işarədir. Nizami bunu digər əsərlərində də qeyd edir:

امشب شب قدر تست بشتاب:
قدر شب قدر خویش دریاب
آرایش سرمدیست امشب
معراج محمدیست امشب

*Bu gecə sənin qədr gecəndir, tələs,*
*Öz Qədr gecənin qədrini tap.*
*Bu gücə sərmədi bəzəyidir,*
*Bu gecə Məhəmmədin meracıdır.*

*(Leyli və Məcnun)*

"Yeddi gözəl"də isə bu barədə belə deyir:

شب شب قدر وقت وقت دعاست
یافت خواهی در آنچه خواهی یافت

*Gecə – Qədr gecəsi, vaxt dua vaxtıdır.*
*Hər nə istəsən onu tapacaqsan.*

Bu məzmunu hər əsərində təkrar edərək Nizami Meracın Qədr gecəsində olduğunu təkidlə qeyd etmək istəyir.

Nizaminin bütün əsərlərində Peyğəmbər (ə) Ümmi Haninin evindən Meraca getmişdir. O, bu barədə "Xosrov və Şirin" əsərində belə deyir:

شبی رخ تافته زین دیر فانی
بخلوت در سرای ام هانی

*Bir gecə bu fani daxmadan üz döndərib,*
*Xəlvətə, Ümmi Haninin evinə gəldi.*

Eyni məzmunu "Leyli və Məcnun"da belə ifadə edir:

سر بر زدی از سرای فانی
بر اوج سرای ام هانی

*Fani evdən başını çevirib,*
*Ümmi Haninin evinə gəldi.*

Meraca həsr etdiyi qəsidədə həmin məzmun bu ifadə ilə verilir:

او بصدر ام هانی زامهات آورده روی
ام هانی ز امهات صدر او برتر شده

*O analardan (dünyadan) Ümmi Haninin evinə üz çevirib,*
*Ümmi Hani ona əsl analardan artıq olub.*

Ümmi Hani – Peyğəmbərin (s) əmisi Əbu Talibin qızı, İmam Əlinin (ə) bacısıdar. Ümmi Hani onun künyəsidir (Haninin anası deməkdir). Onun əsl adı Faxtə (Faxtə – ərəb mənşəli söz olub mənası qumri, çöl göyərçini deməkdir) idi. O, bir dul qadın idi. Yetim uşaqları var idi. Əbu Talib Peyğəmbəri (s) uşaq vaxtında öz himayəsinə aldığı kimi indi o da öz əmisi qızı Ümmi Hanin

öz himayəsinə götürmüş və özünə nigah etmişdi. Merac gecəsi Peyğəmbər (s) onun evində imiş. gecədən xeyli keçmiş Cəbrail mələk göylərdən ona nazil olub özü ilə gətirdiyi "Buraq" adlı ata minməyi ona təklif edir. Təfsirlərin çoxunda yazırlar ki, "Buraq" qeyri-adi bir heyvan idi. Onun başı insana, quyruğu və ayaqları dəvəyə, sinəsi və beli ata, dırnaqları isə öküz dırnağına bənzəyirdi. Onun tavus qanadı kimi iki əlvan qanadı vardı, yoxuşda onun iki qabaq qılçaları qısalar, enişdə isə uzanardı.

Lakin Nizami "Buraq" haqqında bu xüsusiyyətlərin heç birini söyləmir. O, "Buraq"ı hamar, xoş yerişli və hələ başına noxta, ağzına yüyən vurulmamış, belinə insan oturmamış, ildırım sürətli, itaətkar bir at kimi təsvir edir:

رسیده جبرئیل از بیت معمور
براقی برق سیر آورده از نور
نگارین پیکری چون صورت باغ
سرش بکر از لجام و رانش از داغ
نه ابر از ابر نیسان درفشان تر
نه باد از باد بستان خوش عنان تر
چو دریائی ز گوهر گشته زینش
نگشته وهم کس زورق نشینش
قوی پشت و گران نعل و سبک خیز
بدیدن دوربین و در شدن تیز

*Cəbrail Beytül–məmurdan yetişib,*
*Nurdan yaranmış, ildırım sürətli bir Buraq gətirdi.*
*Bağ surəti kimi gözəl bir peykər,*
*Başı cilov, budu dağ görməmiş.*
*Bulud nədir, neysan buludundan da dürr saçan,*
*Yel nədir, bostan yelindən də xoş yeriş.*
*Onun yəhəri gövhər dəryası kimi idi,*
*Heç kəsin xəyalı da onun gəmisinə minməmişdi.*
*Beli qüvvəli, nalı ağır, yerişi yüngül,*
*Görməkdə uzaq görən, dayanmaqda itiydi.*

*(Xosrov və Şirin)*

Peyğəmbər (s) iti sürətli Buraqa minib Cəbrailin müşayəti ilə Beytül-müqəddəsdəki Məscidü-Əksaya gedir:

چو مرغی از مدینه بر پریده
باقصی الغایت اقصی رسیده

*Bir quş kimi Mədinədən uçub,*
*Son məqsəd olan Məscidü-Əksaya yetişmiş.*
*(Xosrov və Şirin)*

Peyğəmbər (s) Meracının hicrətdən sonra Mədinədə vaqe olduğunu də qəbul edinlər də vardır. İlk baxışda Nizaminin bu beyti həmin fikrə müvafiq görünə bilər. Ancaq belə deyil. Burada Nizaminin işlətdiyi "mədinə" xüsusi isim deyil, mədinə ərəbcə "şəhər" deməkdir. Yəqin ki, Nizami Məkkə şəhərini nəzərdə tutur. Bunu şairin "Şərəfnamə"dəki bu şeiri sübut edir:

سرنامه در بیت اقصی گشاد
ز ناف زمین سر باقصی نهاد

*Namənin başını Beyti-Əksada açdı,*
*Yerin göbəyindən Əksaya(tərəf) baş qoydu.*

Burada "Yerin göbəyi" deməklə Nizami Məkkəni nəzərdə tutur. Məlumdur ki, müsəlmanlar dünyanın hər yerində olsalar namaz qılanda üzlərini Məkkə şəhərində olan məscidə çevirirlər. Belə olanda onlar Məkkə ətrafında çevrələr əmələ gətirirlər ki, o çevrələrin mərkəzi (göbəyi) Kəbə olur. Həm də Məkkənin adlarından biri Ümmül-Qüra (Kəndlər, şəhərlər anası) olduğu üçün onu "Yerin göbəyi" adlandırırlar. Bir də bunun səbəbi odur ki, Quranda deyildiyi kimi Allah əvvəlcə yerin bütün kütləsini Məkkədə cəmləşdiribmiş. Sonra bu kütləni çəkib yaymış və Yer kürəsinin indiki şəklini əmələ gətirmişdir. Bu hadisəyə "dəhvül-

ərz" deyirlər. Bu səbəblərə görə Məkkə Yer üzünün "göbəyi" mərkəzi hesab olunur.

Nizami həmişə öz mülahizələrini Quran ayələrinə uyğunlaşdırır. O, Merac məsələsində də buna riayət etmişdir. Quranda "Bəni-İsrail" surəsinin birinci ayəsi Meraca həsr edilir. Bu ayədə Peyğəmbərin (s) gecə ikən Məkkədən Məscidü-Əksaya aparılması aşkar surətdə deyilir. Bu bir daha sübut edir ki, Nizami mədinə sözünü şəhər mənasında işlədərək Məkkə şəhərini nəzərdə tutur. Bu beyti başqa bir cəhətdən də şərh etmək olar. Məlumdur ki, Nizaminin beytləri əksər hallarda çoxmənalı olur. Bu beyt də o qəbildəndir. Nizami Peyğəmbərin (s) səfərini izləyərək Məscidü-Əksada peyğəmbərlərin (ə.m) ona iqtida edib, namaz qıldıqlarını belə təsvir edir:

نموده انبیا را قبلهٔ خویش
بتفضیل امامت رفته در پیش

*Özünü peyğəmbərlərə qiblə edib,*
*İmamlıq fəziləti ilə qabağa getmişdir.*[1]

Bundan sonra Peyğəmbərin (s) göylərə səfəri başlanır. "Buraq" Peyğəmbəri (s) yer kürəsindən uzaqlaşdırır. O, səyyarələri, Ayı, Günəşi və ulduzları geridə qoyub kainatın dərinliklərinə tərəf gedir. Cəbrail (ə) yorulub qalır. Onu Mikail mələyə tapşırır. Sonra o da yorulur; Peyğəmbəri (s) İsrafil mələyə təhvil verir. İsrail onu "Buraq"dan düşürüb "Rəfrəf" adlı başqa bir ata mindirir. Bu at onu Tuba ağacından keçirib Sirdəyə çatdırır. Bura Kainatın "sonu"dur; ona görə də be yerə Sidrətül müntəha deyirlər.

Bundan sonra Peyğəmbəri (s) müşayət edən mələk qalır, buradan o tərəfə getməyə ona izn yoxdur. Peyğəmbər (s) "Rəfrəf"dən düşüb özü tək-tənha Ərşə tərəf yollanır:

---

[1] Nizami Gəncəvi. "Xosrov və Şirin". Bakı, "Elm", 1982

گشت از آن تخت تیز رخت گرای
رفرف و سدره را بماند بجای
همرهانرا به نیمه ره بگذاشت
راه دریای بیخوری برداشت
چون در آمد بساق عرش فراز
نردبان ساخت از کمند نیاز
سر برون زد زعرش نورانی
در خطرگاه سرّ سبحانی
چون حجاب هزار نور درید
دیده در نور بی حجاب رسید

*O, təxtdən yenə də yuxarı qalxdı,*
*Rəfrəf və Sidrə öz yerində qaldı.*
*Yoldaşlarını yarı yolda qoydu.*
*Bixudluq dəryası yolunu tutdu.*
*Elə ki, Ərşin ayağına qədər qalxdı,*
*Niyaz kəmərini özünə nərdivan elədi.*
*Allahın sirli xətərgahında nurani*
*Ərşdən başını kənara çıxartdı.*
*Elə ki, min nur pərdəsini yırtdı,*
*Gözləri pərdəsiz nura yetişdi. (Yeddi Gözəl)*

Peyğəmbər (s) nur pərdələrini keçərək Allah dərgahına yetişir və salam verir: Elə ki, O, sözünü tamam deyib qurtardı, onun salamı qəbul olundu. Təzim səhrasının qapısından vüsal əli pərdəni atdı. Bu zaman Peyğəmbər (s) Allahla mükalimə edir. Allahdan xitab gəlir ki, hər mətləbin və hacətin varsa məndən istə:

خطاب آمد که ای مقصود درگاه
هر آن حاجت که مقصود است درخواه

*Xitab gəldi ki, ey bu qapını qəsd edib gələn,*
*Məqsədində nə hacət varsa istə. (Xosrov və Şirin)*

Peyğəmbər (s) bu məqamdan istifad edərək öz ümmətinin günahkarlarının günahının bağışlanmasını istəyir. Allah onun xahişini qəbul edir:

گنهکاران امّترا دعا کرد
خدایش جمله حاجتها روا کرد

*Öz ümmətinin günahkarlarını dua eylədi.*
*Allah onun bütün hacətlərini rəva eylədi.*

*(Xosrov və Şirin)*

Peyğəmbərin (s) Allahla mükaliməsini Nizami belə təsvir edir:

دیده بر یک جهت نکرد مقام
کز چپ و راست میشنید کلام

*Göz bir tərəfdə məqam tutmurdu,*
*Soldan və sağdan kəlam eşidildi.*

*(Yeddi gözəl)*

کلام سرمدی بی نقل بشنید
خداوند جهانرا بی جهت دید

*Allahın kəlamını nəqlsiz (vasitəsiz) eşitdi.*
*Dünyanın Allahını cəhətsiz gördü.*

*(Xosrov və Şirin)*

“Allahı görmək” məsələsini Nizami müxtəlif ifadələrlə verir. Həm o cəlal sahibini görürdü, həm həqq kəlamının sirrini eşidirdi. Fəhmin çoxluğundan idrakın dərinliyindən, həm görməyi, həm də eşitməyi pak idi.

Nizami burada qeyd edir ki, Peyğəmbər (s) fəhm və idrakın dərinliyindən Allahı “pak” şəkildə görürdü. Yəni bu görmə adi

gözlə görmə deyil, mənəvi görməkdir.[1] Bu Merac əhvalatında ən incə məsələdir.

Meracla bağlı bədii parçalara həm Xətainin öz yaradıcılığında, həm də klassik şairlərimizdən olan Nizami Gəncəvi, S.İ.Nəsimi, M.Füzuli, M.Ə.Sabir və s. şairlərimizin yaradıcılığında da rast gəlirik:

*Xosrovi-hüsnün əzizim, sən imişsən taci,*
*Xubilər, cümlə sənin dərgəhinin möhtaci.*
*Qabi-qövseyn qaşın, leylətül isra zülfün,*
*Tapmısan mərtəbeyi-hüsndə sən Meraci.*[2]

"Qaldı sidrəl-müntəha, keçdin fələkdən ta zəmin, Kim yetər, bu qədri-həqqə, müntəhadır, ya Nəbi!" – bu beytdə Ş.İ.Xətai demək istəyir ki, hər bir gözəlliyin yetkinlik nöqtəsi Həzrəti-Muhəmmədə (s) məxsus olduğu kimi, peyğəmbərlər arasında Merac dağının ən uca zirvəsini fəth edən də odur.

Xətai demək istəyir ki, keçmiş və gələcək nəsillər içərisində heç kəs bu qədər Allaha daha yaxın olmamış və olmayacaqdır.

Ş.İ.Xətaidən və N.Gəncəvidən əlavə Yunis İmrə, S.İ.Nəsimi, Həbibi, M.Füzuli, Ş.Təbrizi, Mövlanə C.Rumi, S.Ə.Şirvani, M.Ə.Sabir, S.Ə.Nəbati, H.M.T.Qumri,

H.Cavid və bir çox başqa klassiklərimiz və bir çox aşıqlarımız Dirili Aşıq Qurbani, Aşıq Abbas Tufarqanlı, Xəstə Qasım Tikmədaşlı, Dədə Ələsgər, Növrəs İman, Bəhmən Göyçəli, Dədə Şəmşir və s. Peyğəmbərin (s) "Merac"ına dair çox gözəl bədii əsərlər yazıb yaratmışlar.

Müasir dövrdə də Merac mövzusu unudulmamışdır. Axund Hacı Soltan Hüseynqulu oğlu, A.Buzovnalı, V.Nakam, D.Almaslı, H.Ə.Mahir, Ə.Nəzərli, N.Salami, N.Zöhrabi, H.Yusif

---

[1] Əhmədağa Əhmədov. "Nizami-elmşünas". Bakı, "Azərbaycan", 1992. səh. 217-219

[2] M.Ə.Sabir. "Hophopnamə". Bakı, "Şərq-Qərb", 2004

Qulammirzə oğlu və s. kimi qələm sahibləri az-çox bu mövzuya üz tutmuş, bədii töhvələrini verməyə çalışmışlar.

***“Nət”in 5-ci beyti:***
***Ey günəş yüzlü, səni hər kimsə ki, həq bilmədi,***
***Danla məhşərdə anın yüzü qaradır, ya Nəbi!***

(Ey günəş yüzlü Peyğəmbər (s) sənin sonuncu Peyğəmbər (s) olduğunu qəbul etməyən hər bir kəs sabahki məhşər gününə üzü qara gələcəkdir).

Axirəz-zaman Peyğəmbərin (s) mübarək camalını günəşə bənzətməyi klassiklərimiz çox sevmişlər. Bu motivi ən çox tərənnüm edən şairlərimizdən biri də Seyyid Əzim Şirvanidir.

*Arizi-pakindi, ey nuri-Xuda, ümmül-kitab,*
*Mahi-rüxsarın bu yüzdən bir vərəqdir aftab.*

(Ey İlahi nur, sənin pak üzün mübarək cəmalın Allah dərgahında saxlanılan Lövhi-məhfuzun bir hissəsidir. Ey mənim ay üzlüm, günəşin özü sənin mübarək camal kitabından bir vərəqdir).

*Ta niqab oldu sənin rüxsarinə zülfi-siyah,*
*Afitab oldu nihan, “hətta təvarət bil-hicab”.*

(Qara saçların sənin üzün üçün niqaba çevrildikdən sonra günəş gizləndi, örtük arxasına keçdi).

*Zati-pakindi sənin vasiteyi-ərzü səma,*
*Arizin pərtövüdür göydə siraci-vəhhac.*

(Ya Rəsulullah (s), göy və yer sənin pak zatına görə əmələ gəlmişdir. Göydə parlaq çıraq (günəş) sənin üzündən bütün kainata yayılan işığı əks etdirir).

*Ey tari-səri-zülfün "Vəlleyli izə yəğşa"*
*"Vəş-şəms" yüzün vəsfin zərratə qılıb inşa.*

(Ey saçlarının hər teli "gündüz-gecə ilə örtüldü" ayəsi olan Peyğəmbər (s), Qurani-Kərimin "Vəş-şəms" surəsi sənin mübarək cəmalın xüsusiyyətlərini kainatın bü tün zərrələrinə səpələmişdir).

Xətai lirikasıda bu baxımdan istisna təşkil etmir:

*Vəchində peydadur sənin ənvari-zati-kibriya,*
*Ol yüzə qarşudə dura şərməndədir "Şəmsüz-züha".*
*(Q.14, səh49)*

(Ya Rəsulallah (s)! Bütün kamil şəxsiyyətlərin nurani keyfiyyətləri sənin mübarək camalında təzahür etməkdədir. Sənin mübarək camalınla üz-üzə gəldiyi zaman baş da günəş olmaqla, bütün işıq saçan planetlər xəcalətdən başlarını aşağı salarlar).

*Görklü yüzün aşiqi Həzrət-Xudadır, ya Rəsul,*
*Şol mübarək xülqünə canlar fədadır ya Rəsul!*
*(Q.188, səh.144)*

(Ey Allahın elçisi (s)! Allah-təalanın özü sənin mübarək camalının vurğunudur.

Sənin o pak xislətinə ən kamil şəxsiyyətlər canlarını qurban verərlər).

Hər iki beytdə şair Həzrəti-Muhammədi (s) zahiri gözəlliyi ilə yüksək mənəviyyatını vəhdətdə götürür və bunu sevə-sevə tərənnüm edir.

("Ənvari-zati-kibriya", "şərməndə", "Həzrəti-Xuda", "canlar fədadır" – bundan soraq verir).

Beytin başlıca ideyası Peyğəmbəri (s) tanıyıb-tanımamaq, onun gətirdiyi dini qəbul edib-etməmək müddəasından ibarətdir. Bəllidir ki, Peyğəmbərləri (ə) və Həzrəti-Muhəmmədin (s) sonuncu peyğəmbər olmasını danmaq müsəlman şəriətinə görə dindən çıxmaq deməkdir. Çünki, Nübuvvət "Üsuliddin"in 5 maddəsindən biridir. Bütövlükdə ikinci misra bax bu şəriət müddəasının bədii ifadəsidir.

***6-cı beyt:***

***Çün sənin xoşluğuna yaratdı sane aləmi,***
***Ayağın torpağına canım fədadır, ya Nəbi!***

(Ulu yaradan kainatı sənin əziz xatirənə və kamil gözəlliyinə görə yaratdığı üçün mənim canım sənin ayağının altındaki torpağına qurbandır ya Peyğəmbər).

Bu beyt məhşur bir qudsi hədisin üzərində qurulmuşdur. Hədis belədir: "Lolakə lolakə ləmə xələqtul əflak".

"Lolakə-lolakə" ifadəsi Muhəmməd peyğəmbərin (s) hədislərindən birinə işarədir. Həmin hədisə görə Allah-təala Muhamməd (s) haqda buyurmuşdur: "Sən olmasaydın mən fələkləri xəlq etməzdim".[1]

Şah İsmail Xətai şəxsiyyətinə dərin sayğı bəsləyən Məhəmməd Füzulidə bu parlaq Peyğəmbər (s) incisini möhkəm İslami əsas kimi dəfələrlə bəhs mövzusuna çevirmişdir. Filologiya üzrə fəlsəfə doktoru Vərəğa Almasov 1994-cü ildə AMEA-nın Nizami adına Ədəbiyyat İnistutunun Elmi Şurasında "Füzuli yaradıcılığında dinin mənqəbəvi anlayışların yeri və bədii ifadə yolları (Türkcə divan və "Leyli-Məcnun" məsnəvisi üzrə)" – mövzusunda müdafiə etdiyi disertasiyada bu yöndə geniş araşdırma aparmışdır. O, həmin disertasiya əsasında nəşr etdirdiyi

[1] M.Ə.Dilsuz. "Seçilmiş əsərləri". (Tərtib edəni: Qafarzadə Məlik İbrahim oğlu). Bakı, 2006. səh. 212

ilk monoqrafiyasında bu barədəki tədqiqatını belə ümumiləşdirmişdir:

*Ey padşəhi-səriri-"Lövlak",*
*Məqsudi-vücudi-xakü əflak!*
*Olmuş əflak xaki-rahin,*
*Çəkmiş əflakə xak cahin.*

(Ey "sən olmasaydın" taxtının hökmdarı, göylərin və yerin var olmasının məqsədi! Göylər sənin yolunun torpağına çevrilmiş, torpaq sənin hörmətini göylərə qaldırmışdır).[1]

Birinci beyt məşhur "Lövlakə" qudsi hədisinin (ənənəyə görə toxunulmaz sayılan qudsi hədislər Allahın (ə.c.) Həzrəti-Muhəmmədə (s) buyurduğu və onun ləfzən (söz-söz) də olmasa, mənən (mənaca) səhabələrinə çatdırdığı İlahi mənşəli İslami bəyanatdır. Odur ki, İlahiyyatçıların çoxu qudsi hədisləri Qurani-Kərimdən sonra ikinci mötəbər İslami məxəz bilirlər) bədii ifadəsidir. "Lovlakə" fenomeni Ərəb dilində "Lovlakə" – "Sən olmasaydın" ibarəsinin orta yüzilliklər Azərbaycan ədəbimədəni mühitinə uyğunlaşdırılmış və Tanrının Rəsulallaha (s) dediyi "sən olmasaydın, Sən olmasaydın Mən fələkləri, yəni kainatı yaratmazdım" şəklindəki İlahi sözün, deməli, məşhur qudsi hədislərdən də birinin daşıyıcısıdır. Həzrəti-Muhəmmədə (s) verilən bu İlahi səciyyə. Onun İslam dinindəki və Peyğəmbər (s) aşiqlərinin ürəklərindəki yerini göstərən tutarlı dəlillərdən sayılır.

Görünür bu möhkəm söykənəcək şairə sevgisindən həmişə könül genişliyi ilə söz açdığı, öyülənin ucalığını, Tanrı qatındakı ayrıcalığını yığcamlıqla göstərmək üçün gərək olmuşdur. Ancaq hədisin İslami tutumu Füzulinin onu təkcə buna görə "Leyli-Məcnun"a gətirmədiyini düşünməyə çağırır. Hədisdən Tanrının

[1] Vərağa Almasov. "Füzuli "Leyli və Məcnun"un islami mahiyyəti". Bakı, "Elm", 2006. səh. 61

da Həzrəti-Muhəmmədi (s) sevdiyi anlaşılır. Bunu istər bu bəhrin, istərsə də bütövlükdə əsərin fikri axarına qovuşdurduqda (aşağıda görəcəyik ki, Rəsulullahın Tanrı qatındakı uca yeri poemanın baş qəhrəmanları olan "Leyli" ilə "Məcnunun" da ən uca and yerləridir), şairin burada "Necə təqrir edəyin vəsfini bir şahin kim, Ona vəssaf ola "Yasin"ü müərrif "Taha" beytindəkinə oxşar bir fikir – "Tanrının sevdiyi, ondan ötrü kainatı yaratdığı bir kimsəni necə sevməmək olar?" demək istədiyi ortaya çıxır. Yeri gəlmişkən, bu qudsi hədisin Füzuli irsində leytmotiv olmasını sübuta yetirən bir neçə nümunəni verək:

*Həqq afərinişə səbəb etdi vücudini,*
*Əvcəbtə biz-zuhiri zühurəl-mükkəvənat.*

(Tanrı sənin varlığını yaranışa səbəb etdi, yaranmağınla varlığın ortaya çıxmasına yol açdın).

Yaxud:

*Ey vücudin əsəri xilqəti-əşya səbəbi!*
*Nəbi ol vəqt ki, bil fel gərəkməzdi Nəbi!*

(Ey varlığının təsiri yaranışa səbəb olan, Sən Peyğəmbərlik etməyin mümkün olmadığı bir vaxtda Peyğəmbər oldun) Və ya:

*Bürhanükə fil-kəmali yəkfi "Lövlak"*
*Lau ləkə lə ma darə mədarül-əflak.*

Tərcüməsi: Kamalda (əqli yetkinlikdə və mənəvi yüksəklikdə) (Sən olmasaydın). (qudsi hədisi) Sənə (sənin Peyğəmbərliyinə) dəlil olaraq yetər; Sən olmasaydın, fələklər fırlanmazdı, yəni həyat davam etməzdi.

Və yaxud:

*Nəbiyyi-haşimi ki, bəzmi-vücud*
*Cami-eşqindən aldı nəşeyi-bud!*

(Ey Haşimi Peyğəmbər, varlıq məclisi (kainat) özünün var olma sevincini (mövcudluq keyfiyyətini) Sənin eşq qədəhindən (Allahın sənə bəslədiyi əzəli-əbədi sevgidən) almışdır).[1]

Beytdə aydınlaşdırılmasına ehtiyac duyulan ikinci deyim Həzrəti-Muhamməd (s) aid edilən "sənin xoşluğun" ifadəsidir. Bu ifadə məhşur bir hədisə söykənir. Həmin hədis belədir: "Allah gözəldir və gözəlliyi sevir".

Hədis məcmuələrində verilən xəbərlərə əsasən Həzrəti-Muhamməd (s) Allah-təala ilə razu-niyaz etdikdə "Allahım, bədənimi gözəl xəlq etdiyin kimi, əxlaqımı da gözəlləşdir" demişdir. Füzuli də:

*İyzəd səriri-hüsnə səni qıldı padişəh,*
*Əla kəmalə zatikə fi əhsənis-sifat.*[2]

(Allah gözəllik taxtına səni çıxartdı;
Zatının kamalını gözəl sifətlərlə yüksəltdi).

Bu başlıca səbəb öyülənin gözə gəlimli görkəmi ilə mənəvi üstünlüklərini özündə birləşdirdiyinə görə, kamil olan Peyğəmbər (s) gözəlliyidir. Beytdə gözəlliyi bildirən sözlərin anlamları da (hüsni-gözəllik yaxşılıq, əhsən cox gözəl, çox göyçək, çox yaxşı) bunu göstərir. Beytin məzmunundan bu kamil Peyğəmbər (s) gözəlliyinin öz başlanğıcını İlahi qaynaqdan aldığı da açıqca görünür. Odur ki, bu gözəlliyi çox mənəvi-əxlaqi yetkinlik kimi başa düşməliyik.[3]

---

[1] Vərağa Almasov. "Füzuli "Leyli və Məcnun"un islami mahiyyəti". Bakı, "Elm", 2006. səh. 61-62
[2] Məhəmməd Füzuli. "Əsərləri". V cilddə, 1-ci cild. Bakı, "Elm", 1985. səh. 387
[3] Vərağa Almasov. "Peyğəmbər (s) aşiqi Füzuli". Bakı, "Çaşıoğlu", 2007. səh. 95

"Nət"in burayadək olan hissəsində lirik "mən"in fədakarlıq əhval-ruhiyyəsi aydın duyulur.

"Ayaq" və "torpaq" sözlərinin uyğunlaşdırılması şairin bu yaradıcılıq istəyindən irəli gəlir. Söhbət Şah İsmail kimi bir Fateh hökmdardan getdikdə isə bu əhval-ruhiyyənin fəlsəfi estetik dəyəri birə on qat artır.

***"Nət"in 7-ci beyti:***
***Hər münafiq kim, səni könlündə inkar eylədi,***
***Ta əbəd yanmağ cəhənnəmdə rəvadır, ya Nəbi!***

(Qəlbən səni danan hər bir münafiq, o, əbədiyyətə kimi cəhənnəmdə yanmağa layiqdir).

İslam etiqadına əsasən, cəhənnəm böyük günah işlədən şəxslərin əzəli-əbədi olaraq cəza çəkəcəkləri yerdir. Qurani-Kərimin bir mənalı ayələri insanları cinayət xarakterli və günah səciyyəli əməllərini ictimai məzmun daşıyıb, cəmiyyət hadisələri ilə bir başa bağlı olduğunu göstərir. Məsələn:

"Əgər bizim öz bəndəmizə nazil etdiyimizə şəkkiniz varsa, doğruçusunuzsa siz də (fəsahət kəlmələrinin gözəlliyi, bəlağət mənalarının dərinliyi baxımından və ya onun kimi heç kimdən dərs almayan bir şəxs tərəfindən) bir surə gətirin və (bu işdə) Allahdan başqa bütün köməkçilərinizi və şahidlərinizi də çağırın (ki, onlar sizin surənizin bizim surəmiz kimi olmasına şəhadət versinlər). Və əgər (belə bir işi) etməsəniz – heç vaxt edə bilməyəcəksiniz də – onda, kafirlər üçün hazırlanmış və yanacağı insanlar və daşdan olan oddan çəkinin". ("Bəqərə", 23-24).

"Sol tərəf əhli (nə gəldikdə isə); nədir sol tərəf əhli? (Əməl dəftərləri sol əlinə verilmiş bədbəxtlər!) Bu, cəza günü onlara göstərilən ilk xidmətdir". ("Vaqiə", 41-56).

"(Çünki) günahkarlar üzərindən tanınırlar. Buna görədə onların kəkillərindən və ayaqlarından tutacaqlar (və cəhənnəmə atacaqlar); Bu, günahkarların təkzib və inkar etdikləri həmin cəhənnəmdir"; Onlar həmin od və qaynar suyun içərisində (susuzluq-

dan və ardı-arası kəsilməyən dəhşətdən) fırlanacaqlar (“Ər-Rəhman”, 41, 43, 44). (“Ali-İmran”, 12, 106; “Nisa”, 56; “Əraf”, 36, 38, 41; “Ənfal”, 36, 37; “Tövbə”, 34, 35; “İbrahim”, 16, 17; “Hicr”, 43, 44; “Taha”, 127; “Ənbiya”, 98, 100; “Həc”, 19, 22; “Furqan”, 11, 14; “Səcdə”, 20; “Fatir”, 36, 37; “Saffat”, 60, 70; “Zümər”, 24, 25, 47, 48; “Ğafir”, 70, 76; “Duxan”, 43, 50; “Tur”, 11, 16; “Təhrim”, 6, 7; “Mülk”, 8, 11; “İnsan”, 4; “Nəbə”, 21, 30; “Müddəssir”, 26, 37; “Ğaşiyə”, 1-7; “Huməzə”, 1-9).

Nəinki bu şeir, bütövlükdə orta “əsrlər” ədəbiyyatı üçün novator motiv münafiqlik məfhumu və münafiq obrazıdır. Beyt o qədər aydındır ki, münafiq personajının çirkin surəti və qorxunc obrazı asanlıqla göz önündə canlana bilir.

“Nəfəqə” kökündən gələn sözlə ifadələr Ərəb dilində geniş məna-məzmun şəbəkəsi əmələ gətirmişdir.

Qurani-Kərim də bu murdar və idbar hərəkətin iç üzünü açıb göstərməyə xidmət edir.

“Münafiq” ərəb dilində “nifaq edən” deməkdir. Bu və ona bənzər sözlər “n-f-q” kökündən qaynaqlanır. Ərəblər bir girişi və bir çıxışı olan lağıma və ya tunelə “nəfəq” deyərlər.

Dilçi alimlərin fikrincə, münafiqə bu adın verilməsinin səbəbi budur ki, o, dinin və şəriətin bir qapısından daxil olub, o biri qapısından çıxıb. Bəzi lügət kitablarında qeyd edilib ki, səhrada yaşayan çöl dovşanının yuvası “nəfiqa” adlanır.

Çöl dovşanı, adətən özünə bir neçə yuva qurur, təhlükə hiss edəndə bir yuvadan çıxıb, o birisinə girir. Münafiq də beləcə, cəbhədən cəbhəyə keçir, cilddən-cildə girir, özünü ələ verməmək üçün hər yola əl atır.

(“Bəqərə”, 8, 13, 20, 77; “Ali-İmran”, 167, 168, 177; “Nisa”, 72, 74, 81-83, 88, 89, 138, 146; “Maidə”, 41, 52, 58; “Əraf”, 175; “Ənfal”, 49; “Tövbə”, 43, 58, 61-69, 73-77, 80-87, 94-98, 101, 107, 110, 124-127; “Nur”, 47-50, 53, 63; “Əhzab”, 1, 12-20, 24, 48, 60, 61; “Məhəmməd”, 16, 20-24, 29; “Fəth”, 6; “Hədid”, 13-15; “Mücadilə”, 14-18; “Həşr”, 11-17; “Münafiqun”, 1-8; “Müddəsir”, 31).

“Ənam” surəsinin 35-ci ayəsini “lağım” sözünə aid olaraq nümunə üçün qeyd edək. Belə ki, Allahu-təala buyurur: “Onların (haqq dindən) üz döndərməsi sənə ağır gəlirsə, yerdə (yerin dibinə gedən) bir lağım və ya göyə çıxacaq bir nərdivan tapıb onlara bir möcüzə gətirə bilərsənsə, durma gətir! Allah istəsəydi, onları yığıb doğru yola salardı. Elə isə, bilməyənlərdən olma!

Termin olaraq münafiq o kəsdir ki, üzdə özünü müsəlman və mömin kimi göstərir, amma qəlbində küfr, şirk, günah yuva qurub.

Hətta münafiq zahirdə namaz qılıb, oruc tuta da bilər, zəkat verib, həccə gedə də bilər, amma nifaq halında qalar. Bir sözlə hər kimin öz etdiyi əməllərə, danışdıgı sözlərə imanı, etiqadı olmasa münafiqdir.

***“Nət”in 8-ci beyti:***
***Həm sənin tərifin etdi, həm Əlinin ol İlah,***
***Nişə kim, sən Müstəfa, ol Mürtəzadır, ya Nəbi!***

(O böyük olan Allah özünün şanlı kitabında səni də, Həzrəti-Əlinidə (ə) öymüşdür. Çünki sən Müstəfasan, o isə Mürtəzadır).

Burada nəbəvi “nət”lər üçün səciyyəvi olmayan Həzrəti-Əli (ə) motivi ilə qarşılaşırıq. Şah İsmail Xətainin Səfəvi keçmişini nəzərə aldıqda bu qətiyyən qəribə görünmür. Ötəri deyildir ki, beyt də Peyğəmbərədə (s), İmamada (ə) eyni qədər bir ədəd epited aid olunur.

Müstəfa – “Səfavə” kökündən olub saflıq, paklıq, təmizlik mənalarını verir. Qurani-Kərimdə tez-tez işlənən “istefa” sözü bu qəbildəndir. Ayələrin birində isə Peyğəmbərlərə (ə) verilən ümumi salam fonunda Həzrəti-Muhammədin (s) “Mustafa” ləqəbi bir azda aydınlıq qazanır. Möhkəm dini ənənəyə görə sonuncu Peyğəmbərin (s) dörd adı Muhamməd, Əhməd, Mahmud və Mustafa adları çəkildiyi təqdirdə salavat deyilməsi vacibdir. Şah İsmail Xətai “Nəsihətnamədə” hamını buna əməl etməyə çağırır.

*Cəmali-Mustəfaya ver salavat,*
*Olasan cümlədən sağü səlamat.*
*İbadətlər başidür, dinlə, qardaş!*
*Səlavat eşqilə gər ola yoldaş.*
*Kimin eşqinə yaratdı cahanı,*
*Budur eyni-ibadət, tani anı.*
*Təvəkkül qıl, təfəkkür eylə, idrak,*
*Nədür ol aləmi-mənidə "Lovlak".*
*Muhamməd ümməti qalmaz damuda,*
*Səlavat ver, canın yanmıya oda.*[1]

"Murtəza" sözü Ərəb mənşəli söz olub, lüğəti mənası isə "bəyənilən"dir. Daha geniş şərh versək, Ərəbcə "riza" – "razılıq" sözündən olub mənası "razı olunan", "seçilən", "bəyənilən" deməkdir. İstilahda isə Həzrəti-Əlidən (ə) Allah-təalanın razı olmasının və bütün məxluqat – yaranmışların (insanlar) içindən onu seçib bəyənməsinin əsl səbəbidir. Yəni Həzrəti-Əlinin (ə) "Murtəza" ləqəbinin kökü olan "riza" sözü (Ərəblər "rida" tələffüz edirlər) əbcəd hesabı ilə "1001" rəqəmini təşkil edir ki, bu da Allah-təalanın 1001 adı olduğuna işarədir və Əlidə (ə) bu ləqəb vasitəsi ilə Allaha yaxınlıq etməklə onunla birləşmiş olur. Əbcəd hesabında "rey" ("r") hərfi 200, "zad" ("z") həriflərindən biri ki, ərəblər onu "dad" kimi tələffüz edirlər 800, "əlif" ("a") hərfi isə 1 rəqəmini ifadə edir.[2] (200+800+1=1001)

Xətai yaradıcılığında olduğu kimi S.İ.Nəsiminin yaradıcılığında da Peyğəmbər (s) Həzrəti-Əlinin (ə) yüksək məqam sahibi olduğunu dəfələrlə ümmətinə söyləmiş və onu elm şəhərinin qapısı adlandırmışdır:

---

[1] Şah İsmail Səfəvi (Xətai) külliyyatı. Qəzəllər, qəsidələr, nəsihətnamə, dəhnamə, qoşmalar. (Tərtibatçısı: Mirzə Rəsul İsmailzadə). Bakı, Əlhuda, 2004. səh. 374

[2] Ramiz Faseh. "S.İ.Nəsiminin seçilmiş bəzi şeirlərinin şərhi". Bakı, "Şərq-Qərb", 2007. səh. 35-36

*Əhmədа, şol kim dedin mən şəhri-elməm, qapusu*
*Ol Əliyyəl-Mürtəzadır, ol Əliyyəl-Mürtəza.*

***“Nət”in 9-cu beyti:***
***Möcüzatın qatına Musa misalı-murçə,***
***Gərçi Fironun əsası əjdahadır, ya Nəbi!***

(Firon sehirbazlarının əllərindəki, dəyənəklərin göz bağlayıcı şəkildə, yəni süni surətdə, aldadıcı formada əjdahaya çevrilmiş kimi görünməsinə baxmayaraq, sənin möcüzələrinin qarşısında Musa Peyğəmbərin (ə) doqquz möcüzəsinin hamısı qarışqa kimidir. Yəni çox kiçikdir).

Şair burada təlmih ifadə vasitəsindən istifadə etmişdir. Beləki, “ləməhə” kökündən gələn bu üsul leksem olaraq “göz ucu baxış deməkdir” ədəbi istilah kimi isə təlmih termini ilə şairlər uzun bir əhvalatın, böyük bir hadisənin cüzi bir hissəsini çox yığcam biçimdə qələmə alırlar ki, bununla da öz yaradıcılıqlarında lakonikliyi təmin etmiş olurlar.

“Biz Musaya doqquz aşkar möcüzə verdik. İsrail oğullarından soruş; Musa onların yanına gəldikdə Firon ona: “Ey Musa! Mən sənin sehrə uğradığını güman edirəm” demişdi; (Musa) dedi:

“Sən bilirsən ki, bu möcüzələrin yalnız göylərin və yerin Rəbbi ürəklərə işıq bəxş etmək üçün göndərmişdir. Ey Firon, mən güman edirəm ki, sən tezliklə məhv olacaqsan”. (“İsra”, 101-102).

“Açıq-aydın möcüzələrimiz onlara gəldikdə: “Bu, açıq-aşkar bir sehrdir!” – dedilər; Ürəklərində buna qəti əmin halda, haqsızcasına və özlərini üstün tutaraq onu inkar etdilər. Bax gör, fəsad törədənlərin aqibəti necə oldu”! (“Nəml”, 13-14).

Beyti lazımınca və layiqincə qavramaqdan ötəri “möcüzə”, “Musa”, “Firon” və onun sehirbazları, həmin sehirbazların əsa-

ları və o əsaların süni surətdə əjdahaya çevrilməsi məsələləri üzərində ayrıca durmaq yaxşı olardı.

Belə geniş fonda Musa Peyğəmbərin (ə) Qurani-Kərimdə də təsdiqini tapmış doqquz möcüzəsinin isbatı təhlili “Biz Musaya doqquz aşkar möcüzə verdik. İsrail oğullarından soruş; Musa onla rın yanına gəldikdə Firon ona: “Ey Musa! Mən sənin dəli (ya sehrbaz) olduğunu güman edirəm” – demişdi”. (“İsra”, 101).

Firon və qoşunları batmazdan əvvəl Musanın (ə) göstərdiyi möcüzələr:

Quran da Həzrəti-Musanın (ə) doqquz möcüzəsindən söz açılmışdır. Bu ayə də Firon və qoşunlarının məhv olunmasından əvvəl gerçəkləşmiş möcüzələrə işarə edilmişdir:

1. Həzrəti-Musanın (ə) əsasının böyük ilana çevrilməsi;

2. Bəm-bəyaz əl: Həzrəti-Musa (ə) əlini yaxasına salıb çıx-artdıqdan sonra əli gü nəş kimi parlayırdı.

(Yuxarıdakı bu iki möcüzəyə “Qəsəs”surəsinin 3-cü ayəsində işarə edilmişdir.)

3. Dağıdıcı tufanlar;

4. Firon və tərəfdarlarının tarlalarına və bağlarına daraşmış çəyirtkələr;

5. Onların dənli bitkilərini məhv edən bitki xəstəliyi;

6. Qurbağaların Nildən çıxması və həyatı onlar üçün dözülməz və yaşanmaz edəcək qədər çoxalması;

7. Qan: Firon tərəfdarlarının içməli suları qana döndü.

(Yuxarıda qeyd edilən bu beş möcüzəyə “Əraf” surəsinin 133-cü ayəsində işarə edilmişdir.)

8. Qıtlıq və quraqlıq;

9. Meyvə qıtlığı.

(Yuxarıda qeyd edilən bu iki möcüzəyə isə “Əraf” surəsinin 130-cu ayəsində işarə edilmişdir).[1]

(Açıq-aydın möcüzələrimiz onlara gəldikdə: “Bu, açıq-aşkar bir sehrdir!” – dedilər. (“Nəml”, 13).

---

[1] “Ətyəbül-bəyan”. c.8. səh. 314; “Nümunə”. c.12. səh. 309

Həzrəti-Muhamməmədin (s) möcüzələri qarşısında qarışqa qədər kiçildiyini Peyğəmbərlik tarixinin dəyərsiz və önəmsiz göstərilməsinə yox Rəsulullahın (s) ucaldılmasına və yüksəldilməsinə yönəldilmiş əbədi bir metoddur və qətiyyən İslamın mövqeyi ilə ziddiyyət təşkil etmir.

...Həzrəti-Muhəmmədin (s) başqa Peyğəmbərlərdən (ə) üstünlüyü bəhsi Şah Xətai lirikasında geniş yer tutur; Məsələn;

*Arizun bağində çün mürği hərim olmuş "Xəlil",*
*Ol səbəbdən həqq ona odu gülüstan eyləmiş.*

*(Q.168; səh.134)*

(İbrahim Peyğəmbər (ə) sənin mübarək camal bağında uçan çox mötərəm bir quş olduğu üçün, Allah-təala Nəmrudun qaladığı ölüm tonqalını onun üçün gülüstana çevirmişdir).

*Yunisi dərya içində yudduran bir balığa,*
*Atəşi İbrahimə gülzar edən Pərvərdigar!*

*(Qəsidə 1, səh.191)*

(Yunis Peyğəmbəri (ə) dənizin dərinliklərin də bir balığın qarnında sağ-salamat saxlayan da Allahdır, ölüm tonqalını İbrahim (ə) üçün gözəl bir çəmənliyə çevirən də!).

*Ey əzizim, xilqətindən, gecə-gündüz ağlaram,*
*Sən təki Yusifdən ötrü piri-Kənan olmuşam.*

*(Q.198; səh.149)*

(Ey mənim çox sevdiyim sənin ayrılığın məni gecə-gündüz ağlatdığı üçün, sənin kimi bir Yusifə (ə) görə mən Kənanlı qocaya (Yəqub Peyğəmbərə (ə) çevrilmişəm).

*Dinu gün hicrin ilə könlüm pərişandır, mənim,*
*Taleyim Yəqubə bənzər, Yusifi çah olmuşam.*

*(Q.199, səh.150)*

(Ayrılığın gecə-gündüz mənim halımı pozub qarışdırdığı üçün, talehcə Yəqub (ə) və quyuya düşmüş Yusif (ə) kimiyəm).

*Gərçi Yəqubi zəif etdi, fəraqi Yusifün,*
*Zəf içində ol dəxi mən natavandan yaxşıdır.*
*(Q.114; s.105)*

(Yusifin (ə) ayrılığı Yəqubu (ə) zəiflətməsinə baxmayaraq, o qədər zəiflik içərisində o, belə məndən yaxşı vəziyyətdədi).

*Misr içində Yusifi bir qul ikən sultan edən,*
*Dərd ilə Yəqubunu bimar edən Pərvərdigar!*
*(Qəs.1, səh.191).*

(Qul kimi satıldığı halda, Yusif Peyğəmbəri (ə) gətirib Misir məmləkətinin maliyyə naziri səviyyəsinə yüksəldən Allah, Yəqub Peyğəmbərə (ə) o qədər dərd-sər vermişdir ki, o, oğlunun müsibətindən xəstə yatağına düşmüşdü).

*Yəqubi gör zarü giryan Yusifi-Kənan üçün,*
*Piri-künci-xəlvətəm uş Misr sultan məndədir. (Q.55, səh.52)*

(Kənanlı Yusifdən (ə) ötəri, Yəqubun (ə) ağlar və gözü yaşlı halını gözlərin önündə canlandı. Lakin İlahi vəhdət xəlvətinin küncündə əyləşən başı bəlalar çəkmiş müdrik qoca mən özüməm. Odur ki, Misirin əsil hökmüdarı, həqiqi idarə edicisi mən, mən özüməm).[1]

*Ta dodağın çeşməsindən qılmışam bir qətrə nuş,*
*Xızr tək sirabi-nuşi-abi-heyvan olmuşam. (Q.198; səh.149)*

---

[1] Şah İsmayıl Xətai. "Keçmə namərd körpüsündən" (Şeirlər və poemalar). Bakı, "Yazıçı", 1988

(Ey Peyğəmbər (s) sənin mübarək dodaq bulağından bir damla içdiyim üçün Xızr Peyğəmbər (ə) kimi diriliş suyundan doyunca nəsibimi almışam).

*Zülməti zülfündə içmiş ləblərin abını Xızr,*
*Həyyi-baqi bulmuş, adın abi-heyvan eyləmiş.*
*(Q.168; səh.134)*

(Xızır Peyğəmbər (ə) sənin mübarək saçlarının qaranlığı içindən yol taparaq mübarək dodaqlarının bulağından su içə bildiyinə görə, yəni bir səhabə kimi səninlə həmsöhbət olub, sənin qulluğunda dayanmaq şərəfinə çatdığı üçün, əbədi ömür qazanmış, sadəcə olaraq adını diriliş suyu qoymuşdur).

Şeyx Səduqun İmam Sadiqdən (ə) rəvayət etdiyi hədisə əsasən İmam (ə) buyurur: – “Xızır (ə) mürsəl Peyğəmbərlərdən idi. Allah-təala onu öz qövmünə Peyğəmbər göndərdi. O da camaatı Allahın təkliyinə, Peyğəmbərlərin (ə) və onlara nazil olmuş kitabların haqlı olduğuna dəvət etdi”.

Həzrəti-Xızırın (ə) möcüzələrindən biri bu idi ki, qurumuş ağaca söykənsəydi, ya ot bitməyən yerdə otursaydı durandan sonra ora yaşıllaşardı. Elə buna görə də ona Xızır (ə) ləqəbini vermişdilər. Onun əsil adı Taliyadır. O, Məlakan ibni Abir ibni Ərfəxşəd ibni Sam ibni Nuhun (ə) oğludur.

Bəzi rəvayətlərə əsasən, o, İskəndərin qoşununun başçısı idi. Əbədi həyat suyunu içdi. Ona görə də uzun ömür sahibi olaraq indiyə qədər yaşayır.[1]

Bir hədisdə İmam Rza (ə) buyurur: – “Xızır (ə) həyat suyu içdi və sur (Qiyamətdə səslənən şeypur) səslənənə qədər sağ qalacaq”.

Şiə mühəddisləri nəql edirlər ki, Muhəmməd (s) dünyadan gedəndən sonra Xızır (ə) baş sağlığı vermək üçün naməlum bir

---

[1] “İkmalud-din”. səh. 219

şəxs kimi, Həzrətin (s) evinə gəldi. Hələ Muhəmməd (s) sağ ikən Xızır (ə) dəfələrlə Həzrəti-Peyğəmbərin (s) və Həzrəti-Əlinin (ə) yanına gəlib onlardan bəzi suallar soruşmuşdu. Həmçinin Həzrəti-Əlidə (ə) şəhid olanda Xızır (ə) Kufəyə gəlib bir neçə söz dedi. O, başqa İmamların (ə) yanına da gedirdi. Xızır (ə) on ikinci İmamın (əc.f) qeybə çəkildiyi dövrdə də o Həzrətin (əc.f) yanına gedir və İmamla söhbət edərək onu tək qalmağa qoymurdu. Hər il həcc mərasimində iştirak edir.[1] Nəql olunduğu kimi müxtəlif yerlərdə adi adamlar da Xızırı (ə) görüb və onun söhbətlərini, hədislərini danışıblar. Əgər hər kəs bu hədisləri yığsa bir kitab yaza bilər.

Muhəddis Qumi adi adamların Xızırı (ə) görüb ondan nəql etdikləri hədislərin mündərəcatını "Səfinətül-bihar" kitabında gətirmişdir.

*Dev oğurlamışdı bir zərrə dəhanın nəqşini,*
*Varmış ondan xatəmi möhri-Süleyman eyləmiş.*
*(Q, 168, səh.134)*

(Ya Rəsulallah (s) dev sənin mübarək ağzından kiçicik bir zərrənin şəklini oğurlaya bildiyi üçün, gedib ondan Süleyman Peyğəmbərin (ə) verdiyi hökmlərini imzaladığı möhür düzəltmişdir).

Allah-təala Süleymana (ə) da atası Davud (ə) kimi, çoxlu nemətlər verdi. O cümlədən, Peyğəmbərlik, səltənət, "məntiqüt-təyr" (quşların dili) elmi, qəzavət elmi, hikmət və alimlik, cinləri, divləri, şeytanları ram etmək...

Qeyd etdiyimiz kimi Allah-təala Peyğəmbərliyi və padşahlığı birlikdə Süleymana (ə) nəsib etdi. O, böyük, münbit və yer altı mədənlərə malik olan ölkəyə, yəni Üqbə körfəzindən Fərat çayına qədər olan torpaqlara hökmüranlıq edirdi. Həzrəti-Süleyman (ə) cinləri, şeytanları və külək qüvvələrini öz ixtiyarı altın-

---

[1] "Kamilut-təvarix". səh. 160

da saxladığı üçün Beytül-Müqəddəs, məşhur heykəl kimi əzəmətli binalar və əsərlər özündən iz qoydu. İndiyə qədər həmin tarixi abidələrin çoxunu Fələstin və Şamad torpaqlarında müşahidə etmək olar.

Belə uca tikintilərin divarlarındakı nəhəng daşları görən şəxs üçün onun gözə görünməyən qüvvələrin gücü ilə tikilməsində heç bir şək-şübhə qalmayıb.[1]

*Səbri-Əyyub eylədin, şaha, inayət vəqtidir,*
*Dəmbədəm mən intizari-lütfi-Allah olmuşam.*
*(Q.199, səh.150)*

(Ey Şah! Mən artıq Əyyub (ə) qədər səbr etmişəm, indi növbə sənin mənə lütf göstərməyinə qalıb, mən həmişə ilahi mərhəmətin həsrətində olmuşam).

*Əyyuba çəkdirdi çox dərdü bəlavü möhnəti,*
*Gəl məni istəş vərəyim, dərdə dərman məndədir.*
*(Q.55, səh.52)*

(Allah-təala Əyyub Peyğəmbəri (ə) çox ağır sınaqlarla imtahana çəkərək, son dərəcə böyük müsibətlərə düçar etdi. Lakin ey dərdinə əlac axtaran kimsə, sən mətləb almaq üçün Əyyubun (ə) qapısına yox, mənim yanıma gəl. Çünki, mən Allahın izni ilə bütün dərdlərə dərman edə bilirəm).

Mərhum Səduqun “Xisal” kitabında İmam Baqirdən (ə) nəql etdiyi bir hədisə əsasən həqiqət aşkar olur, qeyd olunan iradlardan isə heç bir xəbər yoxdur. Bundan əlavə, başqa hədis və rəvayətləri də açıqlayır. Hədisin tərcüməsi belədir: “Əyyub (ə), heç bir günahı olmadan bəlaya düçar oldu. Çünki Allahın Peyğəmbərləri (ə) hər bir günah qarşısında məsumdur, kəbirə (bö-

[1] Seyyid Haşim Rəsuli Məhəllati. “Peyğəmbərlərin həyatı”. Bakı, 2010. səh. 365-366

yük) və səğirə (kiçik) günahlara düşmürlər. Əyyub (ə) bütün bəlalara düşməsinə baxmayaraq, heç vaxt bədəni iylənməmiş, siması iyrənc olmamış, bədənindən qan və çirk axmamış, camaat ondan iyrənməmiş və bədəninə də qurd düşməmişdir. Allah-təala bütün Peyğəmbər (ə) və övliyalarını bəla və giriftarlığa düçar edərkən belə rəftar etmişdir.

Camaatın ondan uzaqlaşmasının səbəbi isə onun zahirdə fəqir və zəifliyinə görə olmuşdur. Çünki, camaat onun Allah yanında olan məqamından və bunların ardınca ona yetişəcək rahatlıqdan xəbərsiz idi".[1]

Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Peyğəmbərlər (ə.m) insanlar içində hamıdan çox bəla çəkənlərdi. Onlardan sonra, insanların içində onlara daha çox oxşayanlar (yəni Allah dərgahına daha yaxın olanlar) hamıdan çox bəlaya düçar olanlardır".

Allah-təalanın Əyyubu (ə) böyük bəlalara düçar etməsi o bəlalar ki, onların səbəbinə camaat arasında xar oldu, ona veriləcək nemətlərə görə idi ki, onu ilahiləşdirməsinlər. Bu yolla bilməliydilər ki, Allahın yaxşı savab və hədiyyəsi iki növdür. Biri haqq və muzd, digəri isə xüsusi lütf və mərhəmət olaraq verilir. Həm də biri ibrət dərsi idi ki, heç kəsi kasıb və zəif olduğuna görə xar etməsinlər, hər xəstəyə xəstəliyinə görə həqarətlə baxmasınlar. Habelə, bilməlidirlər ki, Allah hər kəsi istəsə, xəstələndirər və hər kəsə istəsə şəfa verər. Hər yerdə, hər cür, hər səbəbi hər kəs üçün nəsihət və ibrət dərsi etmək istəsə, Allah-təalanın etdiyi hər bir şeydə adil, işlərində də həkimdir. Bəndələrinin məsləhəti olmayan işi görmür. Bəndələrin bütün qüdrət və bacarığı ondandır.[2]

Göründüyü kimi bu beytlərdə, İbrahim (ə), Yəqub (ə), Yusif (ə), Əyyub (ə), Yunis (ə) Xızr (ə) və Süleyman (ə) kimi

---

[1] "Xisal". 2-ci cild. səh. 34

[2] Seyyid Haşim Rəsuli Məhəllati. "Peyğəmbərlərin həyatı". Bakı, 2010. səh. 233-234

Peyğəmbərlər Həzrəti-Muhamməddin (s) üstünlüyü yönündə bəhs mövzusuna çevrilmişdir. Aşağıdakı beytlə elə Xətainin özü də bütün bunları olduqca lokanik surətdə ümumiləşdirir:

*Ənbiyalər bəxşinə yazduran əla mərtəbə,*
*Mustəfanı cümlədən Muxtar edən Pərvərdigar!*
*(Q.1, səh.191)*

Şair **"Nət"**i bu beytlə yekunlaşdırır:

***Bu Xətai xəstəyə qılgil şəfaət ruzi-həşr,***
***Çünki əslindən səninlən aşinadır, ya Nəbi!***
***(Q.363; səh.233)***

(Ey Peyğəmbər (s) qiyamət günündə bu xəstə Xətaiyə şəfaət et. Çünki, onun əsilnəsəbi son nəticədə gedib sənə çatır, odur ki, sən də onu özünə dost-doğma bil.)

"Şəfaət bir şəxsə arxa durmaq, sahib çıxmaq yardıma möhtac olan, qorunmağa layiq bir kimsə üçün əfv diləmək və onun yaxşılığına çalışmaqdır". Peyğəmbərin (s) Allahın izni ilə həm öz ümməti, həmdə bəşəriyyət üçün uzun-uzadı məhşər sorğu-sualından qurtarmaq məqsədi ilə edəcəyi şəfaətə Şəfaəti-Kubra yəni (böyük şəfaət deyilir). Abdullah ibn Ömər Rəsulullahdan (s) rəvayət edir ki, qiyamət günü insanlar dəstə-dəstə öz Peyğəmbərlərinin (ə) arxasınca o baş-bu başa aparılacaq və Ulul-Əzim Peyğəmbərlərə "Ya Rəsul şəfaət et!" deyə yalvaracaqlar. Bu şəfaət tələbi İslam Peyğəmbərində (s) başa çatır. Allahın Rəsulullahı (s) Məqami-Məhmuda (s) (həmd edilməli dərəcəyə) təyin edəcəyi gün baş verəcək və məhşərdəkilərin hamısı o gün bu şəfaətinə görə ona minnətdar olacaqlar.

"Məqami-Məhmud" Həzrəti-Muhəmməd Peyğəmbərin (s) və övliyaların toplanacağı sahədə İslam rəhbərinin dayanacağı yerdir.

Allah Həzrəti-Muhammməd (s) ümmətinin yarısının cənnətə girməsi ilə onlara şəfaət etmək arasında seçmək hüququ vermiş, daha ümumi və daha kafi bir xilas yolu olduğundan oda "Şəfaəti-kubra"dan sonra öz ümmətindən zərrə qədər imanı olanların əfvi, cəhənnəmə layiq görülmüş bəzi şəxslərin oda atılmamaları, bəzilərini əzablarının yüngülləşdirilməsi və ya dərhal çıxarılması, bəzi şəxslərin hesaba çəkilmədən cənnətə daxil edilməsi üçün Ulu Yaradandan son iltimasını dilə gətirəcəkdir. Ən nəhayət, Rəsulallah (s) öz səhabələrinin bir çoxunun dərəcələrinin yüksəldilməsi və Əhli-beyti (ə.m) sevənlərin bağışlanması üçün dua edəcəkdir. Şəfaətə inanmayanlarla, müşriklərin şəfaətdən kənarda qalacağını Peyğəmbər (s) xəbər vermişdir: "Qiyamət günü mənim şəfaətim büs-bütün həqiqətdir və şəfaət bir səlahiyyətdir.

Kim buna inanmazsa, şəfaət əhlindən olmayacaqdır. Hər Peyğəmbərin (ə) qəbul olunması vəd edilmiş bir duası vardır və hər Peyğəmbər (ə) duasını etməkdə tələsmişdir. Ancaq mən ümmətimə şəfaət üçün duamı qiyamət gününə saxladım, ümmətimdən Allaha şərik qərar vermədən vəfat etmiş hər bir şəxs, İnşəallah bu şəfaətə layiq olacaqdır".

Mövlanə Məhəmməd Füzuli Rəsulullahla (s) bağlı şəfaət barədə belə bir beyt yazmışdır:

*Ol qədər zövqü-şəfaət cövhəri-zatındadır,*
*Kim, gəlir ərzi-xəta mənidə bir ehsan sənə.*[1]

(Sənin zatının mayasında şəfaət zövqü elə çoxdur ki, suçun dilə gətirilməsi, günahın bildirilməsi sənə yaxşılıq etmək mənasına gəlir).[2]

---

[1] Məhəmməd Füzuli. "Əsərləri". 4-cü cild. Bakı, 1961. səh. 41
[2] Vərağa Almasov. "Peyğəmbər (s) aşiqi Füzuli". Bakı, "Çaşıoğlu", 2007. səh. 81-82

İkinci misradan Şah İsmail Xətainin şəxsiyyətinin seyyidlik qatı aydınca boy göstərir "əslindən" sözü bunu daha qabarıq biruzə verir. Əvvəlki bölümdə haqqında daha ətraflı məlumat verdiyimiz seyyidlik amili burada şairin şəxsiyyətindən yaradıcılığına hopmuş, Şah İsmaillə Şah Xətaini birləşdirmişdir.

Ən nəhayət, dostluq məfhumunun da üzərindən sükütla keçmək olmaz. Burada bu məfhum Allah dostları anlayışının Peyğəmbər (s) dostluğa tətbiq edilməsindən ibarətdir. Allah dostları anlayışı isə Qurani-Kərimdə müəyyən qədər də olsa yer tutur.[1] Allah dostlarının qorxusu və qəm-qüssəsi olmaz: "Bilin ki, Allahın dostlarının heç bir qorxusu yoxdur və onlar kədərlənməzlər". ("Yunus", 62).

"Övliya" mənası iki şey arasında vasitəsizlik, yaxınlıq və fasiləsizlik olan "vəli" sözünün cəmidir. Buna görədə övliyalar (Allah dostları) Allahla aralarında heç bir pərdə, maneə və fasilə olmayan şəxslərdir. Onların qəlblərində olan örtük aradan qalxmış, Allahı tanıma nuru, iman və pak əməl sayəsində Allahı qəlb gözü ilə heç bir şübhə, tərəddüd olmadan görürlər. Varlığı sonsuz, qüdrəti nəhayətsiz, mütləq kamillik olan Allahı bu cür tanıma sayəsində Allahdan qeyrisi nəzərlərində kiçik, dəyərsiz, qeyri-sabit görünür. Okeanla tanış olanın gözüzündə damcının heç bir dəyəri olmaz. Günəşi görən şəxs şamın işığına etina etməz. Buna görə də onların qorxusu və qəm-qüssəsi olmaz.

Çünki insanda qorxu əlində olan nemətləri itirdiyi və ya gələcəkdə onu təhdid edən təhlükələr olduğu zaman yaranır. Qəm-qüssə də insanda əlində olan nemətləri itirdiyi üçün yaranır. Allahın həqiqi dostları maddi dünyanın bütün bağlılıqlarından və əsarətindən azaddırlar, başqalarını davamlı olaraq iztirab

---

[1] Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017

və narahatlıq içində sax layan qorxular və qəm-qüssələr onlardan uzaqdır.[1]

Həzrəti-Əlidən (ə) bu ayə və Allah dostlarının xüsusiyyətləri haqqında soruşulduqda İmam (ə) belə buyurmuşdur: “Allah dostları Allah üçün olunan ibadəti səmimi şəkildə yerinə yetirən, başqaları təkcə dünyanın zahirinə baxdıqları halda, onlar dünyanın batininə baxan, (bu dərin baxış sayəsində) dünyanın gec yetişən təsirlərindən xəbərdar olan, başqaları dünyanın keçici bəzək-düzəyinə aldandığı halda, dünyanın onları tezliklə tərk edəcəyini bildikləri üçün onu tərk edən, dünyanın onları tezliklə öldürəcəyini bildikləri üçün ona qarşı olan sevgilərini ürəklərindən qovub çıxaran şəxslərdir”.[2]

İmam Sadiq (ə) buyurmuşdur: “Qeybdə olduğu vaxt İmamlarının (ə) (özlərini islah etməklə) zuhurunu gözləyən, zühur etdiyi vaxt əmrinə müti olan Qaim İmamın (əc.f) ardıcıllarının xoş halına! Onlar Allah dostlarıdırlar. Onların qorxusu və qəm-qüssəsi olmaz”.[3]

“İman gətirmiş və (Allahın əmrinə qarşı çıxmaqdan) çəkinmiş şəxslər; Dünyada da, axirətdə də şaddırlar. Allahın verdiyi vədlər heç vaxt dəyişməz. Bu, böyük qurtuluşdur!” (“Yunus”, 63-64)

Bu ayələr də Allahın öz dostlarına dünya və axirətdə nəyi layiq görməsi təfsirçilər arasında fikir ayrılığına səbəb olmuşdur. Bəziləri hesab edir ki, bu, dünyasının dəyişib, o dünyaya gedərkən mələklərin möminlərə “Sizə vəd verilmiş cənnət sizə mübarək olsun” (“Fussulət”, 30) deyə verdiyi müjdədi. Bəziləri hesab edir ki, bu, Allahın möminlərin düşmən üzərində qələbə çalması və yer üzündə hökmranlıq etməsi ilə bağlı verdiyi qələbə vədləridir. Bəzi hədislərdə bu, möminlərin dünyada gördükləri yaxşı yuxuların yozumları, qəbirlərindən qalxdıqdan sonra mələklərin

---

[1] “Nümunə”. c.8. səh. 333
[2] “Əl-Mizan”. c.10. səh. 92
[3] “Nurus-səqəleyn”. c.3. səh. 222

onlara verdiyi cənnət vədi olduğu qeyd edilmişdir. Ayədən müjdənin çox geniş məna ifadə etdiyi, hər növ müjdə, şadlıq, qələbə və uğuru ehtiva etdiyi məlum olur. Qeyd etdiyimiz bütün məzmunlar müjdənin ayrı-ayrı nümunələridir.

İmam Sadiqin (ə) dostlarından biri İmamın (ə) belə buyurduğunu qeyd edir: "Bu məktəbin davamçıları ömürlərinin son anlarında elə şeylər görürlər ki, gözləri parlayır". Ravi belə qeyd edir: "Mən israrla: "Nə görürlər?" – Deyə soruşdum və on dəfə eyni sualı təkrar etdim. Lakin hər dəfəsində İmam (ə) təkcə bu cümlə ilə kifayətləndi: "Görərlər".

Məclisin sonunda İmam (ə) üzünü mənə tərəf tutub səsləndi: "Deyəsən israr edib nəyi gördüklərini öyrənmək istəyirsən". Dedim: "Bəli, əlbəttə". Sonra ağladım. İmam (ə) halımı görüb lütfkarlıqla buyurdu: "O iki nəfəri görərlər". Soruşdum ki, hansı iki nəfəri? Buyurdu: "Peyğəmbər (s) və Əlini (ə). Heç bir imanlı insan bu iki böyük şəxsiyyətin ona müjdə verdiyini görmədən dünyaya göz yummaz. Bunu Allah Quranda bəyan edib". Soruşdum ki, "harada, hansı surədə?" Bu vaxt İmam (ə) bu ayəni tilavət etdi: "Həqiqətən, insanlardan İbrahimə ən layiq olanı, ona tabe olan, bu Peyğəmbərə və ona iman gətirənlərdir. (Onlar hər kəsdən layiqlidirlər.) Allah möminlərin vəlisi və hamisidir!" ("Ali-İmran", 68).[1]

Bu ayədə ideoloji məktəb əlaqəsindən üstün əlaqə olmadığı, Allah dostları ilə yalnız tabeçilik və itaət vasitəsilə əlaqə qurmağın mümkünlüyündən danışılır. Buna görə də İslam Peyğəmbəri (s) və məsum İmamlarla (ə) əlaqə və yaxınlıq iddiasını yalnız onlara tabe olmaqla iddia etmək olar. Hədis və rəvayətlərdə də bu mövzu əsas diqqət mərkəzində olmuşdur. İmam Əliyə (ə) istinadən edilən bir hədisdə belə qeyd edilmişdir: "İnsanların Peyğəmbərlərə (s) ən layiq olanı onların göstərişlərinə hər kəsdən çox əməl edənlərdir". Sonra İmam (ə) bu ayəni oxuyub buyurmuşdur: "Nəsəb və qohumluq baxımından nə qədər uzaq

---

[1] Nümunə, c.8, səh. 337; Əl-Mizan, c.10, səh. 94

olsa da, Muhəmmədin (s) dostu Allahın əmrinə itaət göstərən, qohumluq əlaqələrinə yaxın olsa da, Muhəmmədin (s) düşməni Allaha itaətsizlik göstərəndir”.[1]

Bu motivlə biz Xətainin başqa “Nət”lərində də qarşılaşırıq:

*İsmini zikr eyləyən məhşər günündə qəm yeməz,*
*Vay qiyamət ona kim, səndən cüdadır, ya Rəsul!*
*(Q.188, səh.144)*

(Sənin adını dilinin əzbərinə çevirən bir şəxs qiyamət qopacağı zaman əsla kədərlənməyəcəkdir. O kəsin başını qiyamət qopacaq ki, o, etiqad, ibadət və əxlaqca sənin yolunla getməsin).

Beləliklə, aydın olur ki, Şah İsmail Xətai bu qəzəl “Nət”ində Həzrəti-Muhəmmədlə (s) bağlı ən zəruri cəhətləri məharətlə tərənnüm etmişdir.

---

[1] Ayətullah-üzma Nasir Məkarim Şirazi. “Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı”. (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, “Nurlar”, 2017

## 3.5. HƏZRƏTİ-ƏLİ (Ə) AŞİQİ XƏTAİ

Rəsulullahdan (s) sonra bəşəriyyətin ikinci ən kamil şəxsiyyəti olan Əliyyən Vəliyullah həmişə zamanın fövqündə durmuş, hər cür fəlsəfədən, məzhəbdən və təriqətdən yuxarıda dayanmış, keçdiyi ömür yolu, həyat və fəaliyyəti, mübarizə tarixçəsi, ictimai ədaləti sonadək gözləməsi bütün filosof və ədibləri dərindən-dərinə düşündürmüşdür. Klassiklərimizin irsinə göz ucu baxış belə, Şah İsmail Xətainin Həzrəti-Əlinin (ə) haqqında ən çox yazan şairimiz olduğunu göstərir.

Belə ki, şairin 12 qəsidəsindən 1-i Allahu-təalanın, 3-ü Əhli-beytin (ə.m), 6-sı isə Həzrəti-Əlinin (ə), 408 qəzəlindən 35-ə yaxını, qoşma, gəraylı və duyğularının, önəmli bir bölümü, eləcə də poemalarının bəzi hissələri məhz bu əl çatmaz, ünyetməz şəxsiyyətə həsr edilmişdir. Digər tərəfdən ədəbi ictimaiyyətdə belə bir təsəvvür də vardır ki, “Nəsihətnamə” bütünlüklə Həzrəti-Əlinin (ə) “Nəhcül-bəlağə”dəki xütbə, məktub və hikmətli kəlamlarından ilhamlanmış etik-didaktik görüşlərin, mülahizə, müddəa və qənaətlərin ədəbi ifadəsindən ibarətdir. Qətiyyən təsadüfi deyildir ki, Xətai divanı “Münacat” və “Nət”lə deyil, məhz Həzrəti-Əlinin (ə) mədhindən ibarət olan qəzəllə başlanır:

*Eylədim bünyad əvvəl bəndə əz nami-Xuda,*
*Ol yaratmış sərvəri-mərdan Əliyyül-Mürtəza.*

*Aciz olma, ey könül, münkir gərəkməz əhli-dil,*
*Həq təala buyruğudur mur əlində əjdaha.*

*Öylə sultandır ki, yoxdur mislü həm həmtay ona,*
*Buyruğundan kim, onun çıxmaz şəhü mirü gəda.*

*Kim ki, həqqə münkir oldu, qoy cəzasıdır onun,*
*Zərrəcə rəhm etməgil sən ta kim, ol halın duya.*

*İt rəqiblər tənə edərsə, Xətai, həqqə sal,*
*Olma qəmgin kim, sana qıldığını həqdən tapa.*

Həmin mədh belədir:

***Eylədim bünyad əvvəl bəndə əz nami-Xuda,***
***Ol yaratmış sərvəri-mərdan Əliyyül-Mürtəza.***

*(Q.18 səh. 48)*

(Mən bir bəndə kimi öncə Allahın adını çəkdim, ona görə ki, mərd kişilərin rəhbəri olan Mürtəza Əlini (ə) Allah təala məhz öz nurundan xəlq etmişdir.)[1]

Bəllidir ki, klassiklərimizin "Bismillah"sız başlanan heç bir əsəri yoxdur. Orta yüz illikdə müsəlman mədəniyyətində isə divan ayrıca bir əsər hesab olunurdu. Hər hansı bir işi Allahın adı ilə başlamaq Qurani-Kərimdə əksini tapmış İlahi göstərişdir. Məsələn, Ulu Yaradan öz şanlı kitabının "Hud"un mübarək ismiylə adlandırdığı 11-ci surəsinin 41-ci ayəsində Nuh Nəbiyə (ə) tapşırır ki, gəmi gedəndə də, dayananda da ona Allahın adını çəkərək minsin. Yaxud mübarək "Həcc" surəsinin 27-ci ayəsində istəkli Həbibinə insanların qurbanlıq olaraq kəsdikləri dörd ayaqlı heyvanların üzərində Allahın adını anmalarını qaçılmaz olduğunu bildirir və ya mübarək "Nəml" (Qarışqa) adlı 27-ci surənin 29-30-cu ayələrində Süleyman Peyğəmbərin (ə) Səba məlakəsi Bilqeyisə göndərdiyi məktubun "Bismillahir-Rəhmanir-Rəhim" cümləsi ilə başladığı hamıya bəllidir. Təfsirçilər demək olar ki, yekdilliklə bunu "Bismillah"sız başlanan "Tövbə" surəsinin "Bismillah"ı hesab edirlər. Digər tərəfdən Həzrəti-Muhamməd (s) belə buyurur: "Bismillah"sız başlanan hər bir iş quyruğu kəsik olar, yəni yarımçıq qalar". Füzuli müxtəsər Türkü divanının ilk qəzəlinin məqtəsində bu inci Peyğəmbər (s) sözünü aşağıdakı şəkildə qələmə almışdı:

[1] Şah İsmayıl Xətai. "Əsərləri". İki cilddə, 1-ci cild. (Tərtib, müqəddimə, lüğət və izahlar: Əzizağa Məmmədov). Bakı, "Azərnəşr", 1975

*Ey Füzuli, intahasız zovqü buldun eşqdən,*
*Böylədir hər iş ki, Həq adıyla qılsan ibtida!*

(Ey Füzuli, axı bu necə işdir ki, sən məhəbbətdən də sonsuz dərəcədə zövq ala bildin? Sanki şair özü-özünə cavab verir: "Ay Füzuli, məgər Sən bilmirsənmi ki, Ulu yaradanın adı ilə başlanan hər bir işdə bitib-tükənməyən xeyir var").

Şeyx Nizami Gəncəvi də "Bismillah"ı olduqca geniş şəkildə bəhs mövzusuna çevirmişdir. Məsələn O, "Sirlər Xəzinəsi" məsnəvisini belə başlayır:

*Bismillahi-Ərrahməni-Ərrahim,*
*Həst-kilide-dəri-gənci həkim!*

("Bismillahir-Rəhmanir-Rəhim" Allahın hikmət xəzinəsinin qapısının kilididir).

"Xosrov və Şirin" mənzum romanı isə belə başlayır:

*Benami-an ke, həsti nam əz u yaft,*
*Fələk conbeş, zəmin aram əz u yaft.*

(O qüvvənin adı ilə başlayıram ki, varlıq adını ondan almışdır. Planetlərə dövr etməyi və yer kürəsinin sükunət içərisində olmağı da məhz O, vermişdir. Şairin "Leyli və Məcnun" poemasıda "Bismillah"ın çox qatlı və çox şaxəli mənalandırılması üzərində qurulmuşdur).

*Ey name-tu behtərin sər ağaz,*
*Bi name-to name key, kunəm baz!*

(Ey adı başlanğıcların, hər bir işi başlamaq üçün ən üstünü olan Allah, Sənin adın olmasa, mən öz məktubumu, yəni əsərlərimi necə başlaya bilərəm).

*4. Ey cahan dide xiş əz to,*
*Hiç budi nə bud piş əz to*[1]*.*

*Ey dünyanın özünü səninlə gördüyü,*
*Səndən əvvəl heç bir varlıq yox idi.*

5. Xudaya, cahan-padşahi torast,
Ze ma xedmət ayət, xodaye-torast[2].

*İlahi, dünya şahlığı sənə mənsubdur,*
*Biz xidmət etməliyik, sahiblik sənə mənsubdur!*

Böyük filosof-şair Seyyid İmadəddin Nəsimi də öz məbudu ilə "Bismilləh" ayəsi ilə sözlərini başlayıb və "Bismilləhir-Rahmənir-Rahim" ayəsində olan hərflərin sirlərini açıqlamışdır.

"Ba"vu "sin" "mim" üçün bəşarətdir,
"Əlif"u "lam"u ha işarətdir.

Bu beytdə işlədilən hərflər "Bismilləh" sözünü təşkil edən hərflərdir. "Bismilləh" sözündə bir neçə ilahi hikmət vardır;

1-ci ilahi hikmət budur ki, "Bismilləhir-Rahmənir-Rahim"dən fərqli olaraq, "Bismilləh" sözü əvvəlcə tək bir söz olduğu halda sərbəst şəkildə nazil olmuşdur ki, bu da "Bismilləhir-Rahmənir-Rahim"dir.

2-ci hikmət budur ki, "Bismilləh" sözü altı hərfdən ibarətdir və bütün xilqətin əvvəldən axıra qədər olan yaradılış mərhələ və mərtəbəsi altıda tamamlanır ki, 7-ci mərhələ və mərtəbə isə İlahiyyətə, yəni bir şeyin əslindən gəlib, yenidən öz əslinə qovuş-

---

[1] Nizami Gəncəvi. "Yeddi gözəl". Bakı, "Gənclik", 1981
[2] Nizami Gəncəvi. "İsgəndərnamə". Bakı, "Gənclik", 1981

duğu məqamdır. Necə ki, Quranda "Bütün şeylər nəhayət öz əslinə qayıdacaqlar" buyurulmuşdur.

3-cü hikmət budur ki, "Bismilləh" sözü "bə" ("b") hərfi ilə başlanır ki, bu da əbcəd hesabında iki rəqəmini ifadə edir və heç də təsadüfi deyildir ki, bütün Yaxın və Orta Şərq klassikləri öz əsərlərini "Bismilləh" sözü ilə və yaxud, "Bismilləhir-Rahmənir-Rahim" cümləsi ilə başlamış olduqları halda, ***Cəlaləddin Rumi*** özünün "Məsnəviyi-mənəvi"sini "beşno – yəni eşit" kəlməsi ilə başlamışdır. "Məsnəviyi-mənəvi"ni şərh edən Rüsuxi İsmail Əfəndi Ənqurəvi "bə" hərfinin hikmətindən danışaraq qeyd edir ki, Rumi "Məsnəviyi-mənəvi"sini "beşno" kəlməsi ilə başlamışdır. Ona görə ki, "Bismilləh" ayəsi də "bə" hərfi ilə başlanır. "Beşno" sözündəki "bə" hərfi əlifbada "əlif" hərfindən sonra gələn ikinci hərfdir və əbcəd hesabında da, deyildiyi kimi, 2 rəqəmini ifadə edir. Bu onu göstərir ki, Allahdan başqa bütün varlıqlar cüt yaranmışdır, məhz "bə" hərfinin bu hikmətinə görədir ki, başqa şairlər kimi Rumi öz əsərini "məsnəvi", yəni iki-iki qafiyələnmə formasında yazmış olduğuna baxmayaraq, ona müstəqil bir ad verməyib, məhz yalnız "Məsnəviyi-mənəvi" adını verməklə kifayətlənmişdir. Necə ki, Quranın 36-cı "Yasin" surəsində buyurulur: "Pakdır hər eyb və nöqsanlardan o Allah ki, hər şeyi cüt yaratmışdır".

4-cü hikmət odur ki, "bə" hərfinin altında bir nöqtə vardır ki, "bə" hərfində olan bütün ilahi hikmətlərin sirri həmin nöqtədə yerləşmişdir. Həzrət Əli (ə) buyurmuşdur: "Allah-Təalanın bütün sirləri "lövhi-məhfuz" da, "lövhi-məhfuz"un sirri Allah-Təala tərəfindən yer üzünün peyğəmbərlərinə endirilmiş olan beş kitabda ("Sühuf", "Tövrat", "Zəbur", "İncil" və "Quran"), beş kitabın sirri Quranda, Quranın sirri "Fətihə" surəsində, "Fətihə" surəsinin sirri "Bismilləh"də, "Bismilləh"in sirri onda olan "bə" hərfində, "bə" hərfinin sirri onun altında olan nöqtədədir ki, həmin nöqtə də Mənəm – yəni həmin nöqtənin sirri dəMəndədir.

5-ci hikmət budur ki, nə üçün "Bismilləh" sözündə "bə" hərfi ilə "sin" hərfi arasında "əlif" hərfi yoxdur, yəni yazılmır, lakin

deyildikdə isə həmin iki hərfin arasında "əlif" hərfi olduğu təsəvvür edilir. Bu fikri biz iki dəlil üzrə sübut edə bilərik; 1-ci dəlil budur ki, "əlif" hərfi yuxarıda qeyd etdiyimiz kimi, yalnız Allahın özünün zatı varlığına aid olan rəmzi hərfdir və Allahın səkkiz "sifati-sübutiyyə"si olduğu kimi, "əlif" hərfinin də xüsusi olaraq səkkiz feli sifəti vardır ki, onların hər biri "əlif" hərfi ilə başlanır. Bu sifətlər də məna etibarı ilə Allah-Təalada vardır. 2-ci dəlil isə budur ki, Nəsimi yazır: "Ba"vu "sin" "mim" üçün bəşarətdir", yəni "bə" və "sin" hərfləri "mim" üçün bir müjdədir. Çünki "Bismilləh" sözünün əsas özəyi "bism"dədir və "bə" və "sin" hərfləri "mim" ilə birləşdikləri zaman "bism" sözünü əmələ gətirir və bunun da mənası "ad ilə", əgər "Bismilləh" sözünü bütövlükdə götürsək, o zaman "Allahın adı ilə" və yaxud "Allahın adının köməkliyi ilə" mənasını vermiş olur. Elə olduqda bəs səbəb nədir ki, tələffüz zamanı bu söz "bism" kimi oxunur və sanki adama elə gəlir ki, bu sözdəki "bə" və "sin" hərfləri arasında "əlif" hərfi yazılmışdır, lakin həqiqətdə isə bu hərflərin ikisinin arasında "əlif" hərfi yoxdur. Bunun mənası odur ki, Allah-Təala özü cismani bir varlıq olmayıb, zahirən surətdə gözə görünmədiyi, lakin həqiqətdə isə var olub, öz sifətləri ilə hər şeydə özünün varlığını əks etdirməklə tanınıb bəlli olduğu üçün "bism" sözündə də "bə" və "sin" hərfləri arasında "əlif" hərfi əgər surətən yazılmırsa da, lakin mənada (deyilişdə) "əlif" hərfi tələffüz olunur və həmin söz "bism" şəklində oxunur.

13 yaşında 235 illik Azərbaycan Səfəvilər dövlətinin əsasını qoyan, doğma torpaqların – Məmləkəti Azərbaycanın birliyi, bütövlüyü uğrunda mübarizə aparıb, böyük qələbələr qazanan, adı Şərqdən Qərbəcən bütün dünyaya yayılan qılınc və qələm dahisi Şah İsmail Xətai "Dəhnamə" əsərində "bə" hərfinin və "Bismilləhir-Rahmənir-Rahim" ayəsinin fəzilətindən söz açaraq yazır:

*"Ba" ismi-İlahü fərdi-Yəzdan,*
*Rəhmanü-rəhimü heyyi-Sübhan.*
*Hər karını, ey dil iqtida qıl,*
*Çün əhdə bəli dedin, vəfa qıl.*
*Ta hər bir işin yetə kamalə,*
*Şükr eylə Cəlili-Zülcalalə.*
*Vird eylə sənayi-Mustafanı,*
*Zikr eylə Kəmali-Mürtəzanı.*
*Ta ola işin dürüstü-kamil,*
*Əz fəzli-əimmeyi-əfazil.*
*Bəs söylə nə boldu həsbi-halın?*
*Dil şadlığın, ğəmü-məlalın?*
*Eşq əhlinə ta ki, pənd bolsun,*
*Bəzm əhli ara pəsənd bolsun.*[1]

M.Füzuli İslam dininin şiə məzhəbinə mənsub olan bir şəxsiyyət kimi tanınmışdır. Şiə məzhəbi 32 tayfadan ibarətdir. Füzuli Oğuz soylarının bir qolu olan Bayat tayfasından çıxmışdır. Bayat tayfası böyük Səlcuqlar dövründən başlayaraq, İraqda yaşamışlar. Oğuz soylarının ilk ozanı Dədə Qorqud da Bayat soyuna mənsubdur.

Zəmanəsinin görkəmli şairi M.Füzuli Azərbaycan Səfəvilər dövlətinin zamanında yaşamış və Səfəvilər dövlətinin başçısı Ş.İ.Xətaiyə "Bəngü-Badə" poemasını ithaf etmiş və Şah İsmaili ədalətli bir şah kimi Azərbaycan xalqına tanıtdırmışdır.

Füzuli 1514-1524-cü illərdə yazdığı bu poemasında Şah İsmail Xətaini səmimi, ürəkdən gələn misralarla alqışlamış və "Bəngü-badə" poemasını bu misralarla başlamışdır:

[1] Şah İsmayıl Xətai. "Keçmə namərd körpüsündən" (Şeirlər və poemalar). Bakı, "Yazıçı", 1988. səh. 221

*Başəd in mədhi-Şah İsmayıl,*
*Saqiya, sübh dəmidir, eylə şitab,*
*Dövrə gəlsin çün mehr cami-şərab.*
*İztirab içrə əm, xumarım var,*
*Badəyə xeyli intizarım var.*
*Qalib olmuş mənə məhəbbəti-bəng,*
*Vəhm edib eylərəm hər işdə dirəng.*
*Cami-mey sun ki, dilirana,*
*Mədh edim padşahi-dövranə.*
*Bu surahidən olmayan xoşhal,*
*Dürdi-nisbət müdam ola pamal.*

***

*Məclisəfruzi – Bəzmigahi-Xəlil,*
*Cəmi-əyyam Şah İsmayıl.*
*Ondan asudədir ğəniyyu-gəda,*
*Xələdallahu mülkəhü-əbəda.*[1]

*Mənası:*

*Allah dostunun məclisinin zövq artıranı,*
*Bütün dövrlərin hökmdarı olan Şah İsmayıl.*
*Allah onun mülkünü əbədi eləsin ki,*
*O, varlı ilə yoxsula bir gözlə baxır.*

***

*Surətinin səfhəsinə gör nə yazmış ol qədim,*
*Oxudum ol xətti "Bismilləhi-Rəhmanir-Rəhim".*[2]
*(S.İ.Nəsimi)*

---

[1] Məhəmməd Füzuli. "Bəngü badə". Bakı, "Yazıçı", 1987. səh. 10
[2] Ramiz Faseh. "S.İ.Nəsiminin seçilmiş bəzi şeirlərinin şərhi". Bakı, "Şərq-Qərb", 2007. səh. 345

“Qədim” Allah təalanın “Əsmaül-Hüsna” – yəni gözəl adlarından biridir. Mənası “ən qabaq, ən əzəli” olan deməkdir. Çünki ondan qabaq heç bir varlıq olmadığı, hər şeyin ibtidası ondan başlandığı üçün ona “Qədim” deyilmişdir. Səhfə Ərəbcə səhifə deməkdir. Burada isə insanın üzü nəzərdə tutulmuşdur. Çünki bizim yuxarıda qeyd etdiyimiz kimi Allah insanın üzündə Quran dan yeddi xət yazmışdır ki, bu da “Fatihə” surəsidir. Məhz buna görə də şair deyir ki, ey insan, o qədim olan Allah gör sənin üzünün səhifəsində nə yazmışdır ki, mən o xətti Bismilləhir-Rəhmənir-Rəhim oxudum. Mənası başlayıram ruzi qapılarını açan və rəhm edən Allahın adı ilə və yaxın adının köməkliyi ilə deməkdir.

Məhəmməd Füzuli də öz ustadının yolu ilə gedərək “Leyli-Məcnun”un bir hissəsini belə başlayır:

*Ey munisi-əhli-zövq yadın,*
*Əbvabi-əməl kilidi adın!*

(Ey zövq sahiblərinin sirdaşı olan Allah, sənin o mübarək ismin bütün əməl qapılarının kilididir).

“Ol yaratmış sərvəri-mərdan Əliyyul Mürtəza” misrasında Şah İsmail Xətai “Bismillah”la Həzrəti-Əli (ə) şəxsiyyəti arasında gizli bir rabitə qurmuşdur. Misradan anlaşıldığına görə, Rəsulullah (s) kimi Həzrəti-Əlinin (ə) də mənşəyi Uca Tanrı qatından başlanğıc götürdüyünə görə İlahi səciyyə daşıyır. Peyğəmbəri (s) öyərkən onun bu səciyyəsini qabartmayan Xətai məlum səbəblərə görə Həzrəti-Əli (ə) ilə bağlı bu cəhəti gen-bol qələmə almışdır. Məsələn:

*Bu əlimdir, dəməniniz, ya Əliyyül-Mürtəza,*
*Buyi-vəslindən sənin hər dərdə dərmanım, mədəd!*
*(Q.40, səh.71)*

Və yaxud,

*Əzəldən ta əbəd Heydər gəlibdir,*
*Adəm övladına sərvər gəlibdir.*

*Əli şiri-Xudadır, şahı-mərdan,*
*Muhəmməd həqqə peyğəmbər gəlibdir.*

*(Q.58, səh.91)*

Və ya

*Gəl, ey arif, sana hər dəm təvafi-həcci-əkbərdir,*
*Ki, qiblə nuri-Peyğəmbər, İmami nəqdi-Heydərdir.*

*Əli oldur ki, cənnətdə olubdur saqeyi-kövsər,*
*Budur saqi, budur cənnət, şərabı abi-kövsərdir.*

*(Q.133, səh.169)*

*Məhəmməd nuridən, Əli sirindən,*
*Həqiqət bəhri içrə gövhərəm mən.*

*(Q.261, səh.299)*

Və yaxud:

*Əli sirrin nə bilsin hər münafiq,*
*Münafiq qibləsi şeytan deyilmi?*

*Xətai, sirridir "Taha"vü "Yasin",*
*Durubdur ortada, mizan deyilmi?*

*(Q.344, səh.381)*

Misrada əksini tapmış 2-ci xüsusiyyət Həzrəti-Əlinin (ə) "sərvəri mərdan" olmasıdır. Qurani-Kərim də "Usvətul-həsənə" (ən gözəl nümünə) şəkilində verilən bu xüsusiyyət Peyğəmbərlə (s)

yanaşı Həzrəti-Əlini (ə) də başlıca İslam rəhbəri kimi qavratmağa və bunu bədii surətdə ifadə etməyə yol açır:

"Ləqəd kanə ləkum fi Rəsulillahi usvətun həsənətun limən kənə yərcullahə vəl youməl əxira və zəkərallahə kəsira" – "Allahın elçisinin həyatı sizə Allahın rəhmətinə və axirət gününə ümüdü olanlara və Allahı çox zikir edənlərə gözəl nümunədir". ("Əhzab", 21).

Peyğəmbərlərin (ə) insanların arasından seçilməsinin səbəbi onların insanlara əməli nümunə ola bilməsi ilə bağlıdır. Çünki Peyğəmbərlərin (ə) təbliğat və dəvətlərinin ən mühüm hissəsini onların əməldə çağrışları təşkil edir. Buna görə də İslam alimləri məsumluğu peyğəmbərliyin şərti hesab edirlər. Bu iddianın dəlillərindən biri də məhz onların mütləq nümunə olmasıdır. Doğrudan da əgər Peyğəmbərlər (ə) həyatımızın iman və təvəkkül, ixlas və şücaət, nizam-intizam və təmizlik, dindarlıq və təqva nümunəsi olsalar həyat proqramlarımız tamamilə dəyişər, həyatımız başdan-başa nura boyanar.[1] Quranda bu nümunənin yalnız Allaha və dirilişə ümidi olanlara və Allahı çox-çox xatırlayanlara aid olduğu qeyd edilmişdir. Əsil həqiqətdə yaradılışın əvvəli və məada inam, bu hərəkətin motivasiyası, Allahı xatırlamaq isə onun davamlılıq səbəbidir. Şübhəsiz ki, qəlbi bu cür imanla dolu olmayanlar Peyğəmbərin (s) addımının izləri ilə addımlaya bilməzlər. Çünki davamlı olaraq Allahı xatırlamadıqca və şeytanı özündən uzaqlaşdırmadıqca, insanlar Peyğəmbərin (s) nümunəvi həyatını davam etdirə bilməzlər.[2]

"Qad kənət ləkum üsvətun həsənətun fi İbrahimə vəlləzinə məhu" – "İbrahim (ə) və onunla birlikdə olanların həyatında sizin üçün gözəl bir örnək vardır". ("Mumtəhinə", 4).

İbrahim (ə) hamımız üçün bir örnəkdir. Allah Quranın bir çox

---

[1] Nümunə. cild 17. səh. 243-264

[2] Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017

yerində öz təlimatlarını yaratdığı insanlar üçün təkmilləşdirmək-dən ötrü insanlıq tarixində mövcud olmuş böyük örnəklərdən statlar gətirir. "Mumtəhinə" surəsində də Allahın düşmənləri ilə dostluq edilməsi kəskin şəkildə qadağan edildikdən sonra bütün xalqlar, xüsusi ilə Ərəblər üçün örnək hesab edilən İbrahim (ə) və onun proqramından söz açılmışdır. O, bütün həyatı başdan-başa Allaha bəndəlik, Allah yolunda cihad və ona qarşı sevgi dərsi olmuş böyük bir Peyğəmbərdir. "Onunla birlikdə olanlar" deyilərkən onun ətrafında olan az saylı səhabələri nəzərdə tutulur.

Tarix mənbələrində yazıldığına görə İbrahimin (ə) Babildəki möcüzələrini gördükdən sonra bir qrup insan ona iman gətirmiş, Şama hicrət edərkən onu müşaiyyət etmişdir. Bu isə onun vəfalı dostlarının olduğundan xəbər verir.[1]

Böyük örnəklər həyatları boyu insanların tərbiyyə olunmasında mühüm rol oynamışdır. Buna görə də Peyğəmbərlər (ə) və məsum İmamlar (ə) həqiqət yolunun ən mühüm qollarını insanlara öz əməlləri ilə göstərmişdilər. Sünnə məsumların sözü, əməli və tədqiqindən ibarətdir. Yəni məsum öndərlərin sözləri, əməlləri və sükutları istiqamətləndiricidir. Buna görə də həyatın bütün sahələrində örnək ola bilmələri üçün Peyğəmbərlər (ə) və İmamların (ə) hamısının məsum olması şərtdir. İmam Sadiqin (ə) hədisində də qeyd edildiyi kimi, insanların dillə deyil, əməl vasitəsi ilə dəvət edilməsi şuarıda bu cəhəti təsdiq edir. Bütün həqiqi müsəlmanlar öz növbələrində başqalarına örnək olmalı, öz əməlləri ilə İslamı bütün dünyaya tanıtdırmalıdırlar. Əgər belə olsaydı İslam bütün dünyaya hakim olardı.[2]

---

[1] "Nümunə", cild. 24, səh. 17

[2] Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 549

***2-ci beyt:***

***Aciz olma, ey könül, münkir gərəkməz əhli-dil,***
***Həq təala buyruğudur mur əlində əjdaha.***

*(Q.18, səh.48)*

(Ey könül, iman sahibləri heç vaxt kafir olmazlar. Odur ki, sən qətiyyən acizliyə yol vermə. Əgər Allah-təala iradə etsə qarışqa əjdahanı əlinə götürə bilər).

Bu beytdə şair öz könlünə üz tutur orta əsrlər müsəlman mədəniyyətində ruh, vicdan, nəfs kimi könül də mücərrəd məfhum sayılırdı. Klassiklərimiz bu məfhumu daha çox "arifinin işıqlı ürəyi" kimi tərənnüm etmişdir. Beyti lazımınca qavramaqdan ötəri "əhli-dil" ifadəsinə toxunmaq gərəkdir. Qəribədir ki, Xətai bu ifadəni hamı kimi zövq əhli mənasında yox, imanlı şəxs, iman sahibi mənasında işlətmişdir. Əksi təqdirdə beyt könülə müraciət üzərində qurula bilməzdi.

Çünki bu iki ifadədən biri artıq olardı. Birinci misradan belə anlaşılır ki, lirik "mən" dara düşmüş mömin kimsəyə təsəlli və təskinlik verir. "Aciz olma" ifadəsi buna dəlalət edir. Bu ifadə "munkir olmaz əhli-dil" tərkibiylə birlikdə hər bir çətinliyə dözən, bütün əzab– əziyyətlərə qatlaşan əsil səadət dövrünün ilk müsəlmanlarını məsələn; Bilal Həbəşi, Səlman Farsi, Əbuzər Ğəffari, Miqdad, Əmmari Yasir və s. xatırladır. Bu şəxslərin Rəsulullahla (s) yanaşı Əliyyən-Vəliyullahın da səhabəsi olduğunu və Xətainin şeiri Həzrəti-Əlinin (ə) şənində yazdığını nəzərə aldıqda burada uzaqdan-uzağada olsa Seyyid Əzim Şirvaninin aşağıdakı beyti də boy göstərir:

*Tut könül, Ali-Əli damənini, eyləmə qəm,*
*Get bu yoldan ki, bu yol Buzərü Səlman yoludur.*[1]

(Ey könül Həzrət Əlinin (ə) nəslinin ətəyindən yapışıb qəm yemə. Bu yoldan getməkdən əsla qorxub çəkinmə. Çünki bu yolla Əbuzər Səlman kimi böyük şəxslər getmişdir).

Bu beytdə işin çətinliyi Xətainin bu təlmihlə nəyə işarə etməsinin aydın bilinməməsidir. Belə ki, "mur əlində əjdaha"nın "həqq təala buyruğu" olması burada istər-istəməz konkret bir xəlqi-mədəni, milli və dini-mənəvi əsatirdən, rəvayətdən, mənqəbədən və xəbərdən danışıldığını göstərir. Lakin üzdə olan ayə və hədisdə daha dəqiq desək ayə və hədislərin üst qatında bu motiv açıq şəkildə əksini tapmadığından biz Xətainin burada nəyi nəzərdə tutduğunu aydınlaşdırmaqda çətinlik çəkirik. Odur ki, mərhum filoloq Ramiz Fasehin Seyyid İmaməddin Nəsimiyə verdiyi şərhlə kifayətlənirik.

*Qaşınla kiprigin, mişkin saçınla,*
*Vicudidir Süleyman, eynidir mur.*

Bu beytdə əslində "vicudindir" və "eynindir" sözləri vəznin tələbinə görə "vicudidir" və "eyni"dir şəklində yazılmışdır. Beytdə adı çəkilən Süleyman (ə) Bəni-İsrailin mürsəl Peyğəmbərlərindən (ə) biridir və yeganə Peyğəmbərdir ki, dünya üzündən ən çox dövlətə malik olmuşdur.

Buna görədə xalq arasında "dünya Süleyman (ə) mülküdür", "Süleymana (ə) qalmayan dünya sənədə qalmaz" və sair bu kimi atalar misalı yaranmışdır. Həmçinin o yeganə Peyğəmbərdir ki, Allah-təala ona Peyğəmbərliklə bərabər həmdə dünya padşahlığı

---

[1] S.Ə.Şirvani. "Seçilmiş əsərləri". 3 cilddə, I cild. Bakı, AMEA nəşriyyatı, 1967. səh. 221

da bəxş etmişdir. Suleyman (ə) hekayəti Quranın iyirmi yeddinci "Ən-Nəml" (qarışqa) və otuz səkkizinci "Sad" surələrində nəql olunur. Qarışqa Allah-təala tərəfindən bir nəsihət edici və hikmət rəmzi kimi verilmişdir. Çünki Süleyman (ə) Quranda bir Peyğəmbər və padişah kimi təsvir olunsa da qarışqa bəzi nəsihət və hikmət məsələlərində ona üstün gəlir. Elə məhz buna görə də bu surə, yəni iyirmi yeddinci surə Quranda "Ən-nəml" qarışqa adlandırılmışdır. Həmçinin hikmətlərdən bir neçəsini misal göstərək. Süleyman (ə) yerdən bir qarışqanı ovcuna qoyub deyir: "Sənin taxtın yüksəkdir, yoxsa mənim? Qarışqa isə ona cavab verərək deyir ki, hal-hazırda mənim taxtım yüksəkdir; Çünki sənin kimi padişahın taxtı fani dünyanın torpağı üstündə, mənim kimi kiçik bir qarışqanın taxtı isə sənin kimi bir Peyğəmbərin (ə) ovcunun içindədir". Necə ki, Məhəmməd Füzuli Həzrəti-Əli (ə) tərifinə, mədhinə həsr etmiş olduğu bir qəsidəsində deyir:

*Ol şəhənşəh kim, əgər bir murə qılsa iltifat,*
*Mur hökm eylər, Süleyman üstünə sultan olur.*

Və yaxud qarışqa Süleymana (ə) deyir: "Sən böyüksən, yoxsa atan Davud (ə)? Süleyman (ə) cavab verir ki, atam məndən böyükdür". Belə olduqda qarışqa ona deyir:"Bəs nə üçün sənin adın həriflərinin sayı etibarilə atanın adından böyükdür?" Və yaxud qarışqa Süleymana (ə) deyir: "Sənə Süleyman adı səhv olaraq qoyulubdur; Çünki bu sözün mənası "səlamət qalan" deməkdir. Halbuki dünya fani, (puç olacaq,) səndə öləcəksən, ona görə də dünyaya, sənin özünə və mülkü malına etibar yoxdur". Necə ki, Məhəmməd Füzuli bir qəzəlində deyir:

*Təşneyi-cami-vüsalın abi-heyvan istəməz,*
*Maili-muri-xətin mülkü Süleyman istəməz.*

Və yaxud Seyyid Əzim bir qəzəlində deyir:

*Mülki-dünya aqibət bərbad olur, ey huşyar,*
*Murcə əqli olan mülkü Süleyman istəməz.*

Və yaxud Sədi təxəllüslü qarabağlı bir şair (Sədiye-Sani) bir qəzəlinin məqtəsində deyir:

*Sədi, hənuz mur kimi danə cəm edən,*
*Bilmirmi, gündə neçə Süleyman gəlib-gedər?!*

Və yaxud bir gün Süleyman (ə) bütün heyvanlara tapşırır ki, o taxta oturarkən, hərə onun hüzuruna (qulluğuna) özünə layiq olan bir hədiyyə gətirsin. Bu heyvanlar içərisində yalnız qarışqa özündən böyük olan bir çəyirtgə budunu ağzına alaraq gətirmişdir. Süleymana (ə) həmin hədiyyə xoş gəlmiş və qarışqanı tərif etmişdir. Necə ki, Seyyid Əzim bir qəzəlində deyir:

*Aldım ələ payi-mələxasa dilü cani,*
*Sandım ki, çıxıb təxtə Süleyman, genə gəldim.*[1]

Ən nəhayət deyilməmiş qalmasın ki, Xətainin "mur əlində əjdaha" olmasını "həqq təala" buyruğu adlandırması onun hədis, xəbər və mənqəbələrə Quran ayəsi qədər önəm verdiyini düşünməyə yol açır. Bu isə bəzilərinin iddia etdiyi kimi əsla bidət olmayıb, İslama bəslənilən ideoloji, məfkurəvi münasibətin dürüstlüyündən irəli gələn yaxşı bir haldır.

***3-cü beyt:***
***Öylə sultandır ki, yoxdur mislü həm həmta ona,***
***Buyruğundan kim, onun çıxmaz şəhü mirü gəda.***
*(Q.18, səh.48)*

[1] Ramiz Faseh. "S.İ.Nəsiminin seçilmiş bəzi şeirlərinin şərhi". Bakı, "Şərq-Qərb", 2007. səh. 113-114

(Həzrəti-Əli (ə) elə bir hökmdardı ki, onun tayı-bərabəri dünyaya gəlməmişdir belə, ağa və kölə olmasından asılı olmayaraq heç bir bəşər övladı onun hökmündən kənara çıxa bilməz).

Beytin özünə məxsus ideyası bundan ibarətdir ki, Həzrəti-Əlinin (ə) hökmü bütövlükdə dinin, İslamın hökmüdür. Bu isə lirik "mən"in onun Peyğəmbərlə (s) bir tutması deməkdir. Bu motiv Xətai ədəbi irsində geniş yer tutur. Məsələn:

*Şah iki cahanın əfzəlidir,*
*Allahın əli anın əlidir.*
*Ol söz ki, zəmanə heykəlidir,*
*Allahü Muhammədü Əlidir.*

*Olmaq diləsən işin mülayim,*
*Olgil Əlinin işinə qayim,*
*Kim, əhli-həqin dilində dayim,*
*Allahü Muhammədü Əlidir.*

*Ol sirri-vilayətü kəramət,*
*Sahibhünəri-düri-vilayət.*
*Həqqi sevənə qılan himayət,*
*Allahü Muhammədü Əlidir.*

*(Mürəbbə. səh.226)*

Və yaxud:

*Şəriət yolunu Muhamməd açdı,*
*Təriqət gülünü şah Əli seçdi.*
*Şu dünyadan neçə yüz min ər keçdi,*
*Onlar ittifaqda, Mehdi yoldadır.*

*(Q.16, səh.342).*

Və yaxud:

*Məhəbbətdir "La ilahə illəllah",*
*Məhəbbətdir "Muhamməd Rəsulallah",*
*Məhəbbətdir "Əliyyən Vəliyullah",*
*Üçü də mənada birdir məhəbbət.*

*(Q. 21, səh.346)*

Və yaxud:

*Məhəbbət edənlər qismətin alır,*
*Arayır dərd əhlin, dərmanın bulur.*
*Sərçeşmə Muhamməd, Əlidən gəlür,*
*Tükənməz dalğası, göldür məhəbbət.*

*(Q.21, səh.346)*

Beytdəki, "buyruq" sözü ilə Xətainin Həzrəti-Əlinin (ə) "Nəhcül-bəlağədəki ümumbəşər müdrük kəlamlarını da nəzərdə tuta biləcəyini düşünmək olar. Odur ki, o Həzrətin (ə) hidayət dolu sözlərinin bir neçəsini burada verməyi özümüz üçün böyük şərəf bilirik:

İmam Əli (ə) (özündən sonra) baş verən hadisələrə işarə etdiyi (İmami-Zaman (əc.f) qeybə çəkilməsindən xəbər verdiyi) xütbələrindəndir. (Dünyapərəstlər) tutdular azğınlıq yollarını sağdan, soldan, göz yumdular hidayət və qurtuluşun dümdüz yollarına. Dinləyənlər bu sözdən heyrətə gələrək bu hadisələrin nə vaxt baş verəcəyini Həzrətdən (ə) soruşanda buyurdu: Tələsməyin. Baş verəcək pozğunluqları, olması gözlənilənləri və sabahın gətirəcəklərini (bundan sonra aşkar olacaqları) gec sanmayın ki, bir şey uğrunda tələsən onu tapdıqda ona çatmağı qalır![2] Sabahın nişanələri (o zamanların çatacağı və həmin pozğunluqların baş verə cəyi zəmanənin insanlarının əməlindən aydın görünür) bu gün necə də yaxındır! Ey zəmanə camaatı, hər vəd olunmu-

şun gəlişinin vaxtı, xəbəriniz olmadığı fitnələrlə görüşə yaxınlaşmaq anıdır.[3] Agah olun, bizdən fitnələri görən kimsə (Sahib Əz-Zaman (əc.f)) həmin fəsadların zülmətində aydın çıraqla (İmamət və vilayət nuru ilə) hərəkət edəcək, yaxşılar kimi rəftar edəcək ki, o çətinliklərin bir düyününü açsın (azğınlığa düçar olanı xilas etsin) və bir əsiri (cəhalət və nadanlığın buxovlarından) azad etsin. (Kafirlərin) birliyini dağıdıb dağınığı (haqqı) bir yerə yığacaq. Camaatdan gizlində onlar, axtaran arxasınca nə qədər nəzər salsa da bir izini, nişanəsini görməz.

Bir dəstə bu fitnələrdə dəmirçi qılıncı cilaladığı kimi cilalanacaq (doğru yola gəlib xilas olacaq və o Həzrətin (əc.f) ardınca getməyə hazır olacaq. Belə ki,) onların gözləri Quranın nuru ilə işıqlanacaq, təfsiri qulaqlarında səslənəcək (Quran ayələrini oxuyub dərindən düşünəcək, təfsirini öz əhlindən öyrənəcək). Səhər erkən içdikdən sonra axşam da hikmət camını onlara içirdəcəklər.

Bu xütbənin (cahiliyyət dövrünün insanları və Həzrəti-Peyğəbmərin (s) səhabələri haqda olan) bir hissəsidir.

(Müqəddəs İslam dini yaranmamışdan əvvəl bütün dünyanı azğınlıq bürümüşdü və insanlar müxtəlif pozğun işlərlə məşğul olurdular.) Onların (günah və itaətsizlik) zəmanəsi (öz) günah və cəzalarını başa çatdırmaları üçün uzun çəkdi. Zəmanələrinin sonu yaxınlaşana qədər ruzgarlarının ağır hadisələrinə layiq olmaları üçün. (Rəis və başçılarından) bir dəstə pozğunluqlara bel bağlayıb ondan rahatlıq tapdı. Müharibə atəşini alovlandırmaq üçün əllərini qılıncla göyə qaldırdılar.[7] (Həzrəti-Peyğəmbər (s) öz səhabə və ardıcıllarını Müqəddəs İslam dinini təbliğ edib yaymaq üçün elə tərbiyələndirdi ki,) İlahi qəzavü-qədər bəla və çətinlik dövrünün başa çatmasını tələb edənədək (müsəlmanlar güclənib dinləri dünyada məşhurlaşana qədər çətinliklərdə və düşmənlə döyüşdə) dözümlərini Allaha minnət qoymadılar, haqqın yolunda candan keçməyi böyük saymadılar. (Döyüşlərdə) qılınc çalmaları bəsirətlərinə (nadanlığa və şəhvətə görə deyil, Allaha və Peyğəmbərə inamlarına) görə idi. Yol göstərən və nə-

sihət verənlərinin (Həzrət Peyğəmbərin) əmrilə Allahlarına yaxınlaşdılar. Allah-təala bu Peyğəmbərin (səlləllahu əleyhi və alih) ruhunu aldıqdan sonra bir dəstə geriyə qayıtdı (Həzrət Peyğəmbərin əmr və qadağalarına arxa çevirib yenidən azğınlıq yoluna qədəm qoydular) və (azğınlıq) yolları onları məhv etdi. (Dünyada pozğunluğa, axirətdə isə əbədi əzaba düçar oldular.) Öz nadürüst düşüncə və rəylərinə etimad etdilər (hökmləri özlərindən səhv bəyan etməklə insanları ona tabe olmağa məcbur etdilər. Həzrət Peyğəmbərin) qohum-əqrabasından qeyrisinə tabe oldular. (Onları) sevməyə əmr edilmiş vasitədən (yəni, hidayət və qurtuluş vasitəsi olan Həzrət Peyğəmbərin Əhli-Beytindən) uzaq durdular. Binanı (din və imanı) möhkəm bünövrəsindən köçürərək layiq olmayan yerdə tikdilər. Onlar hər günahın mənbəyi, hər çətinliyə və nadanlığa daxil olanın qapılarıdır. (Batili və nadürüstlüyü istəyən hər kimsə onların ardınca gedər. Çünki onlar zəlillik və azğınlıq qapıları, fitnə-fəsadın, din və dünya işlərində pozğunluğun mənşəyidirlər.) Heyrət və səfalət içrə (dənizin dalğaları kimi) get-gəl edirdilər (çünki haqdan əl çəkmişdilər və dinin rəhbərinə tabe deyildilər) və bihuşluqda (cəhalət və nadanlıqda) Fironun ardıcılları kimi (öz əməllərinin əzab və cəzasından) qafil idilər. Bəziləri (xəlifələr kimi) axirətə göz yumub dünyaya yönəldilər, bəziləri də (Bəni Üməyyə kimi) dindən əl çəkib (doğru yol və qurtuluşdan) uzaqlaşdılar.

1. Əsas yola qədəm qoymadıqlarından fitnə-fəsad törəyəcək. Yaxşılara zülm-sitəm edib nahaq qanlar tökəcəklər.

2. Gələcəyin fitnənərini görsəydiniz, o dövrün məzlumları kimi (ey kaş, bu dünyada olmayaydıq)deyib arzulardınız.

3. Hələ İslamın ilk illərində başqaları mənim haqqımı qəsb edib, hər layiqsiz insan xəlifəlik iddiasına düşürsə, dünyanın hər yerində fitnə-fəsad başlayıbsa, vaxt keçdikcə mənim sizə xəbər verdiyimi anlayacaqsınız.

4. Nə qədər çalışıb zəhmət çəksələr də görüşməyə layiq olanlardan və ilahi hikmət sahiblərindən başqa heç kim Onu görməyəcək.

5. Onlar üçün gizlində və aşkarda səadət, xoşbəxtlik, elm və əməl hazırlığı görüləcək.

6. Qurani-Kərimin Ali-İmran surəsinin 178-ci ayəsində buyurulduğu kimi: Küfr edənlər onlara verdiyimiz neməti heç də özləri üçün xeyirli sanmasınlar! Bizim onlara verdiyimiz möhlət ancaq bacardıqları qədər günah və itaətsizlik etmələri üçündür. Onlar rüsvay edici bir əzab görəcəklər.

7. Hamilə qalmaq üçün quyruğunu yuxarı qaldıran dişi dəvə kimi heç bir çirkin işdən çəkinmədilər. Dünyanın belə hərc-mərcliklə qalacağını güman etdikləri vaxt, qəfildən Həzrəti-Məhəmmədə peyğəmbərlik verildi O, dünyada fəsadın kökünü kəsmək üçün heç bir fədakarlığını əsirgəmədi.

8. Allahın dinin əzəmət və böyüklüyünü nəzərdə saxlayaraq onun irəliləməsi üçün özlərini kiçik sanıb heç bir fədakarlıqdan çəkinmədilər.

9. O Həzrətin əmr və qadağalarına tabe olub Allahın razılığını qazandılar və bu minvalla ruzigarlarını keçirdilər.

10. Şəhvət və dünyapərəstliyə görə İmam əleyhis-salamı xanənişin edərək xəlifəliyə layiq olmayan başqaları hakimiyyətə gətirdilər.

11. Qurani-Kərimin Şura surəsinin 23-cü ayəsində buyurulur: De ki: mən risaləti təbliğ etməyimin müqabilində heç kimdən qohumluq məhəbbətindən başqa bir haqq istəmirəm. İbn Abbasın söylədiyinə görə bu ayə nazil olduqdan sonra səhabələri Həzrəti Peyğəmbərə dedilər: Ya Rəsulullah! Sənin sevməli olduğumuz qohumların kimlərdir? Buyurdu: Əli, Fatimə və övladları Həsənlə Hüseyn. İbn Əbil-Hədid "Nəhcül-Bəlağə"yə verdiyi şərhdə bu barədə yazır: Sizin aranızda iki qiymətli şey qoyuram: biri Allahı kitabı, digəri isə qohumlarım, Əhli-beytimdir. Bunlar göydən yerə çəkilmiş iki kəndirdir, cümləsinə işarədir. Yəni Behiştdəki hovuzun başında mənimlə görüşənə qədər bir-birindən ayrılmayacaq, bu iki şey dünya əhlinin yol göstərənidir. Peyğəmbər (s) burada Allahın kitabını və Əhli-Beytini iki kəndir adlandırıb. Əmirəl möminin də əhli-beyt sözünü leksik mənası

(kəndir) olan səbəb kimi izah etmişdir.

12. Həzrəti Peyğəmbərin (s) Allah tərəfindən Xəlifəliyə təyin etdiyi İmamları arxaya keçirərək nalayiq adamları hakimiyyətə gətirdilər.

13. Fironun tabeliyində olanlar Bəni İsrailə zülm, sitəm edib onları Allaha doğru çağıran Həzrət Musaya düşmən kəsildikləri kimi. ("Nəhcül-Bəlağə", xütbə-150).

İmam Əli əleyhis-səlamın (camaata öyüd-nəsihət verib pak İmamları öydüyü) xütbələrindəndir. Ağıllı insanın işinin sonunu (ölümü və qiyamət gününün haqq-hesabını) görən, öz eniş-yoxuşunu (xeyir və şərini) tanıyan qəlbinin gözü, (camaatı İslam dininə) dəvətə səsləyən (xeyri və şəri, səadət və bədbəxtlik yolunu onlara bəyan edən) carçı (Həzrəti Peyğəmbər) və (o Həzrətin şəriətinin əsaslarını düşmənlərin fəsad və pozğunluğundan) qoruyan keşikçidir. Belə isə, dəvət edəni qəbul edin və keşikçiyə tabe olun (ki, dünyada başıuca, axirətdə xoşbəxt olasınız. Bilin ki,) İkiüzlü insanlar fitnə dənizlərinin dibinə gömülmüş[1] və sünnələrə (Həzrət Peyğəmbərin hökmlərinə) göz yumaraq bidətlərdən yapışmışlar (onlar nəfslərinə uyaraq hər hökmü icra edəcəklər). Möminlər (batil haqqa qalib gəldiyi üçün) kənara çəkilərək sakit dayanmış və azğın yalançılar dil açmışlar. Biz Əhli-Beyt (Həzrəti Peyğəmbərə yaxınlığa görə onun bədənində) köynək kimiyik, (o Həzrətin) səhabələriyik (Allah tərəfindən ona nazil olanlara iman gətirib təsdiqlədik), o, xəzinədir və (biz elmə, maarifə açılan) qapılarıq.[2] Evlərə onların qapılarından qeyri yerdən daxil olmaq olmaz. Evlərə qapıdan başqa yerdən girənlərə oğru

---

[1] Azğınlıq yolunu tutaraq başqalarını da azdırmış və nahaq qanın axıdılmasına zəmin yaratmışdır.

[2] Bununla belə bizdən əllərini üzmüşlər. Biz Qurani-kərimin təvil və təfsiri ilə tanışıq və İlahi hökmləri bilməklə camaata doğru yolu göstəririk. Buna görə də Həzrəti-Peyğəmbər, bütün müsəlmanların da öz hədis və rəvayətlərində göstərdiyi kimi buyurmuşdur. Mən elm, bilik şəhəri, Əli isə onun qapısıdır. Kim bu şəhərə daxil olmaq istəyirsə, qapıdan içəri keçməlidir.

deyərlər.[1]

Bu xütbənin (Əhli-Beyt əleyhimus-salamın fəzilətləri haqda olan) bir hissəsidir

Quranın elm və doğru yolun tərifi, mədhi barədə olan ayələri Onların barəsində nazil olmuşdur və Onlar bağışlayan Allahın xəzinələridir.[2] (Buna görə də) söz demək üçün ağızlarını açsalar, doğrunu deyərlər, sakit otursalar, heç kəs onlardan qabağa getməz.[3] Hər qövmün öndə gedənləri və rəhbərləri öz ardıcıllarına doğru deməlidir.[4] Öz ağlını yönəltməli (dediklərimizin doğruluğunu dərk etmək üçün sözlərimizi diqqətlə, düşüncə ilə dinləməlidir) və axirət övladlarından olmalıdır. Çünki oradan gəlib və ora da dönər. (Allahı nəzərində saxlayıb, ondan, çıxmalı olduğu dünyaya ürək bağlamaz. Axirəti isə özünə əbədi məkan sanar.) Ürəyinin gözünü açıb bəsirətlə bir iş görürsə, onu görməmişdən qabaq ziyanına, yoxsa xeyrinə olduğunu bilməlidir. Xeyrinədirsə – həmin işi görməli, ziyanınadırsa – ondan uzaqlaşmalıdır. Nadancasına iş görənlər başqa yolda hərəkət edənlər kimidir. İşıqlı yoldan uzaqlaşmaq onun yaxşılıqlarından uzaqlaşmaqdan başqa ona bir şey artırmaz. (Əyri yolda olanlar nə qədər çox yol getsələr, mənzil başından bir o qədər uzaqlaşarlar.) Biliklə bir işi

---

[1] Bizim yolumuzdan qeyri yolla Allah və Peyğəmbərlə tanış olmaq istəyən hər kəs dindən fayda götürməyərək axirətdə əzaba düçar olacaq.

[2] Allah-təala bütün bahalı gövhərləri – yəni, elm, helm, səxavət, şücaət, fəsahət, bəlağət, ismət, təmizlik və bu kimi bəyənilmiş sifətləri onlarda cəmləşdirib.

[3] Çünki sükutları hikmət və məsləhətə görədir. Acizliyə və gücsüzlüyə görə deyil ki, başqası onlardan qabağa keçib söz danışsın.

[4] Bu cümlənin şərhi 106-cı xütbədə verilmişdir. İmam əleyhis-salamın bu misalı çəkməkdə məqsədi budur ki, burada olanlar olmayanlara öyüd-nəsihət vermək və yol göstərməklə doğrunu deməli, onları azğınlıq və nadanlıqdan xilas etməlidir.

İmam əleyhis-salamın bu cümlədə və peyğəmbər əleyhis-salamın buyuruğundan sonra əməli və bitkiyə bənzətməkdə məqsədi budur ki, əməl ağacı onun sahibinin əqidə və daxilindən su içir. Əqidə düz, batin yaxşı olsa, layiqli əməldən və bəyənilmiş işdən fayda götürər.

görən işıqlı yolda addımlayan kimidir. Deməli, gözü olan insan (qəlbinin gözünü açaraq düşünüb iş görənlər) yolda hərəkət etdiklərini, yoxsa yolsuzluğa getdiklərini görməlidir. (İşin əvvəlində götür-qoy etməlidir. Allahın bəyəndiyi işlərdəndirsə, görməli, əks təqdirdə isə ondan uzaqlaşmalıdır.) Bil ki, hər zahir və aşkarın müqabilində batin və gizlin var. Zahiri yaxşı olanın batini də yaxşıdır. Zahiri çirkin və pis olanın batini də çirkin, natəmiz olar. (Bəzən də zahiri batininə uyğun olmur. Çünki) doğru danışan Peyğəmbər (səlləllahu əleyhi və alih) buyurmuşdur:

"Allah-təala bəndəni sevər (Öz rəhmətini onun halına şamil edər), onun əməlindən (haram və günahından) acığı gələr və (bəzən də) əməlini (yaxşı işlərini) bəyənər, onun sahibini sevməz". Bil ki, hər əməl, rəftar üçün bir bitki var və hər bitkinin də suya ehtiyacı var. Sular müxtəlifdir. Saf sudan içənin ağacı yaxşı, meyvəsi şirindir. Natəmiz və pis su içənin ağacı pis, meyvəsi acıdır.[1]

İmam Əli (ə) (böyük Peyğəmbəri mədh etdiyi və camaata öyüd-nəsihət verdiyi) xütbələrindəndir. Allah-təala Həzrət Mustafanı (dünya əhlinin qəlblərini) işıqlandıran (peyğəmbərliyin) nur, aşkar dəlil və sübutu ilə (möcüzələrlə), aydın yolla (İslam dini) və yol göstərən kitabla (Qurani-Kərim) seçdi. Onun əhli-beyti ən yaxşı əhli-beyt, şəcərəsi (o Həzrətin ata-babası) ən gözəl şəcərədir. Bu şəcərənin budaqları birbaşa və düz, (o böyük şəxsin əhli-beyti haqq işdə ifrat və azlıqdan-yəni, həddi aşmaq və təqsirdən uca və təmizdir) meyvələri yerə dağılmışdır. (Elmlərinə və maarifinə hamının əli çatandır). Dünyaya gəlməyi Məkkədə, hicrəti Mədinəyə olmuşdur. Orada onun adı ucalmış, dəvətinin səs-sədası yayılmışdır. (Oranın "ənsarlar" adlanan sakinləri kafirlərlə döyüşlərdə və düşmənləri məğlub etməkdə Həzrətə kömək etmişdir). Allah-təala onu kifayət edən dəlil (o

[1] Əqidə səhf, daxil isə natəmiz olarsa, yaxşı iş Allah onu bəyənsə də, işi görənə xeyir verməz. Yəni, onun nəticəsində əbədi səadətə nail olmaz. ("Nəhcül-Bəlağə". xütbə-153).

Həzrətin digər möcüzələrindən əlavə Qurani-Kərim də peyğəmbərliyini sübut etmək üçün kifayətdir) və şəfa verən nəsihətlə, (qəlblərin xəstəliklərinə şəfa bəxş edən o Həzrətin sünnəsi və ehkamları ilə) və (İslama doğru) tədarük görən dəvətlə göndərdi.

(Cahiliyyət dövründə aradan getmiş din və dünya işlərini bərpa etdi.) O Həzrətin vasitəsilə məlum olmayan şəriət hökmlərini aşkarladı, (cahiliyyət dövrünün) nadürüst bidətlərini məhv etdi və (Quran və sünnədə) bəyan etdiyi ehkamları üzə çıxardı. İslamdan qeyri bir din istəyən kimsənin bədbəxtliyi qəti, (səadət və xoşbəxtlik) ipi qırıq, (atəşə) üzü üstə düşməsi ağırdır. Onun (qiyamətdə) qayıdışı dərin kədər və ağrılı əzabladır. (Buna görə də) mən gözünü hər şeyə yumub Ona tərəf açan kimsənin təvəkkül etdiyi kimi Allaha təvəkkül edir, (yolçunu) cənnətə (İslama əməl etmək xoşbəxtliyinə) çatdıran, razılığını və şadlığını nəsib edən bir yolu Ondan diləyirəm. Ey Allahın bəndələri! Sizlərə Allahdan qorxmağı və Ona itaət etməyi tövsiyə edirəm. Çünki Onun əmrlərinə tabe olmaq sabah (qiyamətdə) nicata və həmişəlik (əzabdan) qurtuluşa səbəb olar. (Camaatı qiyamət gününün cəzasından) qorxutdu, sonra (peyğəmbərin vasitəsilə Öz hökmlərini) təbliğ və (onları səadət və xoşbəxtlik yoluna) təşviq edib (onu) təkmilləşdirdi. (Əbədi səadətə çatmağa aid olanı bəyan etdi.) Sizin üçün dünyanı, onun ayrılıb məhv olması və başqa şeyə çevrilməsini vəsf etdi. Sizi bu dünyada heyran edənlərdən uzaqlaşın, çünki ondan az bir şey sizinlə gələcək (dünyanın zəngin mallarından yalnız kəfəndən artıq bir şey qazancınız olmayacaq, o da torpağın altında çürüyəcək). Dünya (şəhvət və nəfsi istəklərə tabeçiliyə görə) Allahın qəzəbinə ən yaxın saray, (haqqa, həqiqətə tabe olanların azlığına görə) Allahın razılığından (əbədi cənnətdən) ən uzaq saraydır. Belə isə, ey Allahın bəndələri, onun ayrılığına, halının dəyişəcəyinə inandığınıza görə (dünyadan tezliklə ayrılacağınızı, çəkdiyiniz əzab-əziyyətin başqasına nəsib olacağını bilirsiniz) çətinliklərə və (sizi axirətdən saxlayan) işlərə göz yumun. Dünyadan (ona aldanıb, vurğun olmaqdan) çəkinib qorxun, öyüd verən, çalışan və zəhmət çəkən xeyir-

xahın (İmam əleyhis-salamın) çəkindiyi kimi. (Camaatın çətinliklərdən xilas olmasına çalışıb, onların doğru yola yönəlməsi və nicatı üçün zəhmət çəkir.) Sizdən öncəki ruzigarların əhlinin korlanmasından gördüklərinizdən ibrət götürün ki, onların da ipləri bir-birindən ayrılmış, göz və qulaqları sıradan çıxmış, şərafət və böyüklükləri əllərindən getmiş, şadlıq və sevinc onlardan uzaq düşmüşdür. Övladları ilə olmaqları onlardan uzaqlığa, arvadları ilə yoldaşlıqları ayrılığa döndü. Bir-biri ilə öyünüb naz etmir, övlad əkmir, bir-birini görməyə getmirlər. Qonşu və yoldaş da deyillər. Ey Allahın bəndələri! (Bu sözlərdən) qorxun! Öz nəfsinə hakim olub nəfsi istəklərinin qarşısını alaraq ağlın və zəkanın köməyi ilə düşünənin (xeyrini və ziyanını başa düşənin qorxduğu) çəkindiyi kimi. Çünki (dinin) əmri aşkar, (qurtuluş) nişanəsi asılı, (əzabdan nicat) yolu hamar, (Allah və peyğəmbərin razılığını qazanmağın) vasitəsi görünən və doğrudur.[1]

İmam Əli əleyhus-salamın, xanımlar xanımı Fatimə əleyhas-salamı torpağa tapşırarkən buyurduğu nəql edilmiş kəlamlarındandır. O, sanki Allahın Peyğəmbəri (səlləllahu əleyhi və alih) ilə, o Həzrətin məzarı müqabilində dayanıb sir danışırdı: Salam olsun sənə, ey Allahın Peyğəmbəri, məndən və sənin kənarına enmiş (Bəqi qəbristanlığında, ya evində, ya da Həzrət Peyğəmbərin hərəmində dəfn edilmiş) və sənə tez qovuşmuş qızından! (Alimlərin məşhur nəzərinə əsasən, Həzrət Fatimə atasından sonra dünyada yetmiş beş gün yaşayıb.) Ey Allahın Peyğəmbəri! Mənim sənin seçilmişinə (onun ayrılığına) səbrim azaldı və ona (onun getməsinə) görə taqət və gücüm əldən çıxdı. Amma mənim üçün, səndən ayrılmağı və sənin müsibət və qəminin çətinliyini gördükdən sonra səbrliliyin yeri var.[2] Halbuki sənin başını

---

[1] "Nəhcül-Bəlağə" (toplayanı: Seyyid Rəzi; tərcümə və şərh, 2 cilddə). Bakı, 2017. xütbə - 160

[2] Fatimə əleyhəs salamdan ayrılmaq müsibətinin ağır və böyük olmasına baxmayaraq, bu səndən ayrılmaq müsibətindən çətin deyil. Həmin müsibətə səbr etdiyim üçün bu müsibətə də səbr edəcəyəm.

qəbirinin ləhədinə (çuxuruna) mən qoydum və ruhun bədənindən mənim boynumla sinəm arasında çıxdı. (Bu qədər məhəbbət və bağlılıqla nələr çəkdiyim məlumdur. Amma yenə səbr və dözümlülüyə yer var. Çünki) "Biz Allahınıq və Ona tərəf qayıdacağıq".[1] Həqiqətən əmanət (Fatimə əleyhas-salam) geri qaytarıldı və girov təhvil alındı. Amma (bu müsibətdə) bundan sonra həmişə qəm-qüssədə olacaq və Allah mənim üçün sənin məskunlaşdığın diyarı seçənə (məni sənə birləşdirənə) kimi gecəm oyaqlıqla keçəcək. Çox tezliklə qızın sənə, ümmətinin o məzluma zülm etməkdə birləşmələrindən (onun haqqını tanımamalarından, qabırğasını sındırmalarından, bətnindəki uşağı salmalarından və Fədəyini qəsb etmələrindən) xəbər verəcək. Buna görə də ondan baş verənlərin hamısını soruş və bizimlə necə rəftar etmələrini xəbər al. Onlar bizə bu qədər zülm etdilər, halbuki sənin getməyindən bir (o qədər də çox) müddət keçməmişdi və sənin xatirələrin unudulmamış, itməmişdi. Sizin hər ikinizə salam olsun, qəzəblənmiş, incimiş və qəlbi sıxılmış şəxsin deyil, (məhəbbət və sevgi ilə) vidalaşanın salamı! Buna görə də getsəm, bu, məhəbbətin olmamasından deyil. Həmçinin əgər qalsam, bu, Allahın səbrlilərə vəd etdiklərinə qarşı pis gümanda olmaqdan deyil. (Sizin yanınızdan gedirəm. Amma hər yerdə sizi xatırlayacağam.) ("Nəhcül-Bəlağə", xütbə-193).

İmam Əlinin (ə) Siffeyn müharibəsi günlərinin birində oğlu Həsənin (ə) döyüş meydanına tələsdiyini görərkən buyurduğu kəlamlarındandır.

Mənim yerimə bu gəncə sahib durub onu saxlayın (onun döyüşməsinin qarşısını alın).

Nəbadə məni kədərləndirsin. Çünki mən bu iki gəncin yəni, Həsənlə (ə) Hüseynin (ə) ölümünə xəsislik edirəm (razı deyiləm) ki, onların ölümü ilə Allahın Peyğəmbərinin (səlləllahu əleyhi

---

[1] Bizim canlarımız Onun ixtiyarındadır və bu dünya qalmaq yeri deyil. Buna görə də hamımız sənin yanına gələcəyik və əməl yükünü orada açacağıq.

və alih) nəsli kəsilməsin. (Seyyid Rəzi-rəhmətullah-deyir).

O Həzrət (ə) Mənim yerimə bu gəncə sahib durun. Kəlamı ən gözəl və fəsih kəlamlardandır. ("Nəhcül-Bəlağə", xütbə-198).

İmam Əlinin (ə) Məhəmməd Əhli-Beyti (ə.m) (onların fəzilətlərini) bəyan etdiyi xütbələrindəndir.

Məhəmməd Əhli-Beyti (pak imamlar-salavatullah əleyhim əcməin) elm və biliyi dirildənlər və nadanlıq və cəhaləti öldürənlərdir. (onlardan elm əldə edilir və vasitələri ilə nadanlıq dəf edilir.) Onların səbirlilikləri alimlilərindən xəbər verir (çünki səbr etmək lazım olan yerləri bilib ancaq həmin yerlərdə səbrlilik edərlər) və həmçinin zahirləri batinlərindən (gözəl söz və əməlləri paklıq və saflıqlarının kamilliyindən) və sükutları sözlərinin düzlük və doğruluğundan! (çünki insan sükut edərək yersiz danışmaması onun sözlərinin elm və hikmət əsasında olmasına bir dəlildir.) Haqq ilə müxalifət etməzlər (ondan üz döndərməzlər) və onun barəsində ixtilaf və ziddiyyətləri yoxdur (sözləri bir şəkildədir). Onlar İslamın sütunları və sığınacaqlarıdır (öz elmləri ilə onu qoruyur və hökmlərini xalqa öyrədərək onlara azğınlıq və nadanlıqdan nicat verirlər). Haqq onların vasitəsi ilə öz əslinə və yerinə qayıdır, batil və nahaq onun yerindən uzaqlaşır, məhv olur və haqq zahir olanda (batilin) dili kəsilir. (onların elm və biliyi nəticəsində haqq və həqiqət aşkar, batil və nahaqq isə məhv olur.) Dini (və onun hökmlərini) bildilər, qavradılar, amma sırf eşitməyə və nəql etməyə əsaslanan qavrama ilə deyil, elmə və riayət (əməl) etməyə əsaslanan qavrama ilə (çünki əgər belə olmasaydı, başqalarından bir üstünlükləri olmazdı.) Elmi rəvayət edənlər çox, ona əməl edənlər isə azdır.[1,1] ("Nəhcül-Bə-

[1] Bütün dövrlərdə bir çox insanlar müxtəlif elmləri əldə edir, məclis və yığıncaqlarda kamal nümayiş etdirərək özlərini başqalarından üstün və onlara başçı hesab edirlər. amma onların əməlləri sözləri ilə bir deyil. eyb və nöqsan sifətlərdən pak və uzaq olan Allah hamını qəflət yuxusundan oyatsın və elminə əmət etməkdə müvəffəq etsin.

lağə", xütbə-239).

Göründüyü kimi Həzrəti-Əlinin (ə) bu kəlamlarında cəmiyyətin bütün təbəqələrinin ictimai-siyasi, iqtisadi-mədəni və sosial-məişət və insanın mənəvi-azadlığını təmin edəcək parlaq pirinsiplər, müddəalar və qənaətlər əksini tapmışdır.

***4-cü beyt:***

***Kim ki, həqqə münkir oldu, qoy cəzasıdır onun,***
***Zərrəcə rəhm etməgil sən ta kim, ol halın duya.***

*(Q.18, səh.48)*

(Cəhənnəmdə yanmaq Allah-təalanı inkar edənlərin layiqli cəzasıdır. Onlar öz cəzalarını lazımınca çəksinlər deyə sən öz şəfaət səlahiyyətindən istifadə edərək, o günahkarlara zərrə qədər olsa belə mərhəmət göstərmə).

Bəllidir ki, şiə məzhəbində Həzrəti-Muhammədlə (s) yanaşı Əhli-beyt (ə.m) İmamlarınında şəfaət səlahiyyətinə malik olduqlarına inanılır. Beytdə məhz bu inamın bədii ifadəsinə qulluq edir. Bu inam orta əsrlər poyeziyamız üçün səciyyəvidir.

"Qorxun o gündən ki, heç kəs digərinin cəzasını üzərinə almır, heç kəsdən də şəfaət qəbul olunmur, heç kəsdən əvəz alınmır və onlara heç bir kömək göstərilmir" ("Bəqərə", 48).

Təfsirçilərə görə ayənin "heç kəsdən şəfaət qəbul olunmur" hissəsi göstərir ki, "Qiyamətdə heç kəsin şəfaəti Allahın izni olmadan qəbul olunmayacaq. Necə ki, Allah "Taha" surəsinin 109-cu ayəsində buyurmuşdur: "O gün Rəhman Allahın izn verdiyi və söz danışmağına razı olduğu kəsərdən başqa heç kimin şəfaəti fayda verməz!"

Bəziləri şəfaət haqqında yanlış təsəvvürlərə malikdirlər, şəfaəti dünya əlaqələrinə bənzədirlər. Halbuki, şəfaət İslam manti-

[1] "Nəhcül-Bəlağə". İmam Əli (əleyhissalamın) Xütbə, Məktub, və hikmətli kəlamları (tərcümə və şərh). III nəşr. Mədəniyyət Mərkəzi, 2009

qinə əsasən yüksək tərbiyə məktəbidir, öz səy və fəaliyyətləri ilə haqq yolda addımlayan, ancaq, bəzən qüsur və xətaya yol verən şəxslər üçün bir dərsdir. Yol verdiyi qüsur və xətalar insanın qəlbində ümidsizlik yarada bilər. Məhz, bu zaman şəfaət hərəkətverici bir qüvvə kimi insana yardım edir, ona məyus olmamağı, haqq yolunu davam etdirməyi, bu yolda səy və fəaliyyətdən əl çəkməməyi diqtə edir. Əgər insan qüsura yol veribsə, ümumi mərhəməti hər kəsə şamil olan mərhəmətli Allahın icazəsi ilə insanlara yardım edən şəfaətçilər vardır. Şəfaət tənbəlliyə dəvət, məsuliyyət yükünün altından qaçmaq və ya günah qarşısında yaşıl işıq yandırmaq deyildir, əksinə, insanı haqq yolda daha qətiyyətli olmağa, günahları azaltmağa səsləyən bir vasitədir.[1]

Bu və bu qəbildən olan ayələr kafirlərə və ağır günahlar səbəbilə şəfaətdən məhrum olan fərdlərə aiddir. Buna görə də bu ayənin digər şəfaət ayələri və Peyğəmbərin (s) məsum imamların (ə) günahkarlara vasitəçilik etməsi haqqında nəql olunan çox saylı rəvayətlərlə ziddiyyət təşkil etmir. Əlbəttə, bir məsələni xatırlatmaq zəruridir ki, şəfaət nə günaha həvəsləndirməkdir, nə geridə qalma əlamətidir, nə də bu günkü dünya cəmiyyətlərindəki tərəfgirlik və dostbazlığa bənzərdir. Əksinə, çox önəmli tərbiyə üsuludur və müxtəlif baxımlardan müsbət və qurucu təsirlərə malikdir. Misal üçün, günahkarda ümid yaradır, onu məyusluq ruhu ilə mübarizə haqqında düşündürür. Onların günahların bağışlanmayacağı ilə bağlı ümidsizliyə qapılıb aludəlik girdabında batmasına mane olur. Həmçinin, şəfaətə ümid edən kəs şəfaət edənlə hər hansı bir şəkildə ünsiyyət qurmağa çalışır. Onun razılığını cəlb etmək yönündə işlər görür. Məhz, bu mənəvi əlaqə şəfaət edənin gözəl xüsusiyyətlərinin şəfaət olunana keçməsinə gətirib çıxarır. Öncə də qeyd etdiyimiz kimi şəfaətin başlıca şərti Allahın iznidir. Şübhəsiz, şəfaətə ümid edən kimsə bu iznin mü-

[1] “Nümunə”, cild 13. səh. 304; Ayətullah-üzma Nasir Məkarim Şirazi. “Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı”. (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, “Nurlar”, 2017. səh. 319

qəddimələrini bu və ya digər şəkildə hazırlamalıdır. Yəni elə bir iş görməlidir ki, Allahın xoşuna gəlsin. Bundan başqa bəzi ayələrdə deyilir ki, şəfaət zalımlara aid deyil. Beləcə, şəfaətə ümid bağlayanlar zülmkarların cərgəsindən (burada "zülm" geniş mənadadır) çıxmalıdırlar. Bu cəhətlərin məcmusu səbəb olur ki, şəfaətə ümid bağlayanlar keçmiş əməllərini bir daha nəzərdən keçirsinlər. Gələcək üçün daha yaxşı qərarlar versinlər. Bunun özü də şəfaətin müsbət tərəfi və tərbiyədə təsirli amildir.[1]

***5-ci beyt:***

***İt rəqiblər tənə edərsə, Xətai, həqqə sal,***
***Olma qəmgin kim, sana qıldığını həqdən tapa.***

*(Q.18, səh.48)*

(Ey Xətai, əgər it xislətli rəqiblər yəni Həzrəti-Əli (ə) və Əhli-beyt (ə.m) düşmənləri sənə bitib tükənməyən bu Əli (ə) məhəbbətinə görə tənə vururlarsa, sən yalnız və yalnız ulu yaradanın qüdrətinə pənah apar və heç vəchlə kədərlənmə. Çünki, Allah-təala bu bəd əməllərinin cəzasını onların qabağına çıxaracaqdır).

El içərisində deyərlər "it hürər karvan keçər". Şair də bu beyti atalar sözü üzərində qurmuşdur. Yeri gəlmişkən deyilməmiş qalmasın ki, Xətainin əsərlərində o çağların onlarla folklor nümunəsi əksini tapmışdır. Bunların içərisində atalar sözləri də var; Məsələn:

1. Sizə üç əmanət qoyub ərən babalar: Dilimiz, Qeyrətimiz, Vətənimiz-can sizin, can onlar əmanətin;
2. Mən karvan basan quldur deyiləm. İgid igidi döyüş meydanında basar, təkbətək;

---

[1] Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 7

3. Əxlaq pozulubsa, o səltənəti heçnə qurtara bilməz;
4. Biz rüşvəti dara çəkməməliyik;
5. Hər qəmişdən şəkkər olmaz, hər tikandan tazə gül;
6. Keçmə namərd körpüsündən, qoy aparsın su səni;
7. Məhəbbətdən keçən haqdan da keçər;
8. Ərənlər asimanın dirəyidir;
9. Ululuq istər isən qulluq eylə;
10. Ayaq bir-bir basarlar nərdivanə;
11. Güzgüsü pak olmayanın çarə yoxdur pasına;
12. Doğruluq dost qapısıdır, doğru gəlgil bu yola;
13. Murşidsiz, rəhbərsiz yollar açılmaz;
14. Kamil ilə yoldaş olan yorulmaz;
15. Ər olub etiqad edə pirinə;
16. Murşid ətəgin möhkəm tut;
17. Gər nə gəlsə həqqdən gələr;
18. Afərin ol başə kim, min başə bir baş oynadır;
19. Əsir olub xəz geyinməkdənsə, azad olub bez geymək yaxşıdır;
20. Həzrəti-Əlini (ə) sevmək səadətdir;
21. Kulli aləm iki şeyin üstündə bərqərardır: Mərifət və ibadət;
22. İti qılınc siyirilməyincə haqq aşkar olmaz;
23. Sufilər ticarət etməzlər;

Xətainin ədəbi irsinin tədqiqatçılarının hamısı – akademik Həmid Araslının, professor Məhərrəm Qasımlının, Filologiya elimlər doktoru Əzizağa Məmmədovun, professorlar Fuad Qasımzadə, Xəlil Yusifov, Əliyar Səfərli və Azadə Rüstəmovanın, akademik Rafail Hüseynovun və xalq yazıçısı Anarın, habelə Qafqaz Müsəlmanları Ruhani İdarəsinin üzvü, qazi, Buzovna qəsəbəsi “Cümə” məscidinin axundu Hacı Soltan Hüseynqulu oğlunun da vurğuladığı kimi Ş.İ.Xətainin əsərləri klassik-kitab və folklor danışıq üslublarının üzvü vəhdətindən ibarətdir.

Örnək olaraq yazıçılar birliyinin sədri Anarın “Şairin zəfəri”

məqaləsindən bir bölümü veririk: "Xətai – şeirimiz tarixində iki nəhəngin – Nəsiminin və Füzulinin arasında parlaq əbədi simadır, həm də bu keçiddə yalnız xranaloji ardıcıllığa, vaxt, zaman qatarına görə yer tutmur. Xətai – poetkasına, təfəkkür tərzinə, dünya duyumuna görə də Nəsimi ilə Füzuli arasındakı bir körpüdür. Onun yaradıcılığına Nəsiminin insan və şair hünəri təsir edib, amma Füzuli kədərində də Xətai "qəm-qüssə"sindən bir xal, bir soraq var.

*Seyyid Nəsimini zahidlər üzdü,*
*İncimədi həqdən gələn cəfaya.*

– deyə sələfinin dözümünü, hünərini təqdir edən Xətaidə Nəsiminin panteist, vəhdəti-vücud motivləri qabarıq görünür.

*Niyə gəldik, nə gətirdik cahanə,*
*Nə iltərsən axirət cavidanə?*
*Nə idin aləmi-vəhdətdə, söylə,*
*Bu kəsrət evinə düşdün ki böylə?*

və ya

*Yer yox ikən, göy yox ikən, ta əzəldən var idim,*
*Gövhərin yekdanəsindən iləri pərgar idi.*

Sufizm poetikası Xətainin bir sıra şeirlərini şərqin başqa şairləriylədə yaxınlaşdırır:

*Sən məndəsən, mən səndəyəm,*
*Nə sən olur, nə mən olur.*

Bu beytdə Cəlaləddin Ruminin təfəkkür tərzi duyulursa,

*Şəriət, təriqət, mərifət haqdır,*
*Həqiqət odu var, ondan içəri.*

sətirləri deyim şəkili ilə Yunis İmrənin məşhur misralarını yada salır:

*Məni məndə demə, məndə deyiləm,*
*Bir mən vardır məndə məndən içəri.*

Sələflərindən çox şey öyrənmiş Xətai özündən sonra gələnlərə, Füzuli kimi dahi şairə belə təsir göstərmişdir. Bu, bəzən intonasiyada, bəzən də sözlərin düzümündə görünür:

*Sevdigim, ömrüm, əfəndim, hey gülüm, balım mənim!*
*(Xətai)*

*Gözüm, canım, əfəndim, sevdiyim; dövlətli sultanım!*
*(Füzuli)*

Bəzən bu yaxınlıq aydın-aşkar şəkildə meydana çıxır.

*Hanı ey zalım, səninlə əhdimiz, peymanımız?*
*(Xətai)*

*Hanı, ey zalım, bizimlə əhdi-peyman etdiyin?*
*(Füzuli)*

Şeirimizin Nəsimidən Füzuliyə gələn yolunda Xətai keçidinin bir əhəmiyyəti də ədəbi dilimizin sadələşdirilməsidir. Xalq şeir formalarına Nəsimidən və Füzulidən artıq dərəcədə aludə olan Xətai qoşmalar, bayatılar, gəraylılar, varsağılar yaratmaqdan başqa, qəzəllərinidə son dərəcə sadə, anlayışlı dildə yazmış, əruzu mümkün qədər Azərbaycanlaşdırmağa çalışmışdır.

Xətainin el ədəbiyyatına yaxınlığı başqa şəkildə də ortaya çıxır, xalq onun adına dastan qoşur (dastan qəhrəmanı Şah İsmail real İslami Səfəviyyə, onun bioqrafiyasına uyğunluğu olmasa-

da), Aşıq Qurbani Xətaiyə qoşma həsr edib. Şah İsmailin şəxsiyyəti, taleyi, ömür yolu, Xətai yaradıcılığında el ədəbiyyatımıza, musiqimizə danılmaz təsir göstərmişdir. M.M.Nəvvabın verdiyi məlumata görə XIX əsrdə belə "Şah İsmayıl" adlı muğam Azərbaycanda məşhur idi".[1]

Şairin Həzrəti-Əli (ə) və Əhli-beyt (ə.m) düşmənlərini itə bənzətməsi bəzi tarixçi və ilahiyyatşunasların iddia etdikləri kimi, onun öz hakimiyyətini, öz taxt-tacını qorumaq cəhdi olmayıb, murdar və idbar, dağıdıcı və pozucu dairələrə bəslədiyi nifrətin böyüklüyündən irəli gəlir. Qətiyyən təsadüfi hal deyildir ki, o, şeirlərində dəfələrlə, xəvaricləri, Yezidi, Kərbəla qatillərinin dərin nifrət hissi ilə adlarını çəkir, onların iyrənc təbiətini üzə çıxarır və onları bütün bəşəriyyətin düşməni olaraq səciyələndirir. Məsələn:

*Yerdə, göydə istəmir şol kor münafiqlər səni,*
*Zahirən peyda imişsən, ya Əli, səndən mədəd.*

*(Q.40, səh.44)*

Yaxud,

*Cuş etdi Zülfüqarım, qında durmaz,*
*Kim inkar əhlidir, imana gəlsin.*

*(Q.262, S.144)*

Yaxud,

*Sürər Düldül, çalar şah Zülfüqarı,*
*Əlidən qaldı bu zərbü nişanə.*

*(Q.303. S.163)*

---

[1] Anar. "Şairin zəfəri" // "Şah İsmayıl Xətai". (Məqalələr toplusu). Bakı, "Elm", 1988. səh. 50-52

*Mən onu bilmişəm, qovli-Xudadur,*
*Onunçun oxuram lənət Yəzidə.*
*Yəzidə lə'nət etmək həm səzadur,*
*Onunçun oxuram lənət Yəzidə.*

*(Mürəbbe. 6, səh.310)*

Beləliklə, aydın olur ki, Həzrəti-Əliyə (ə) bəslədiyi tükənməz məhəbbət "şair şahı və şah şairi" (Anar) divanını Allaha münacatla deyil, Peyğəmbərin (s) "nət"i ilə yox, məhz Həzrəti-Əlinin (ə) mədh və mənqəbəti ilə başlamağa vadar etmişdir.

## 3.6. HƏZRƏTİ-ƏLİNİN (Ə) ŞƏNİNDƏ YAZILAN QƏSİDƏLƏR

Xətai yaradıcılığında elə bir şeir şəkli yoxdur ki, şair Həzrəti-Əlinin (ə) tərifində öz qələmini onda sınamamış olsun. Odur ki, biz şairin bu din böyüyünə bəslədiyi məhəbbətin sonsuzluğunu və Həzrəti-Əli (ə) fəzilətlərini Xətai yaradıcılığındakı geniş tərənnüm olunduğunu nəzərə alıb, daha iri şeir şəkli olan bir "Qəsidə"ni də təhlil etməyi məqsədə uyğun hesab edirik. Xətainin indiyədək on iki qəsidəsi işıq üzü görmüşdür ki, bunlardan biri Allahu-təalanın, üçü Əhli-beytin (ə.m), altısı isə Həzrəti-Əlinin (ə) haqqındadır.

Həzrəti-Əlinin (ə) şənində yazılan Qəsidələrin 1-ci beytləri:

*Dəryayi-Nəcəf gövhərinə kan Əlidür,*
*Billah, ləbi-ləli-Bədəxşan Əlidür. (Q.3, səh.269)*

*Yəqin bil, əbcədü bürhan Əlidür,*
*Bəyani-tovhidü Quran Əlidür. (Q.4, səh.271)*

*"Əlif" oni bilmişəm mən, "La fəta illa Əli",*
*"Yey" yalanı silmişəm mən, "La fəta illa Əli".*
*(Q.7, səh.275)*

*Ey rumuzi xəttü xalın şərhi-Quran, ya Əli,*
*Vey ruxi fərxundə falun, mahi-taban, ya Əli!*
*(Q.9, səh.277)*

*Ey Həq kəlam içində dedi Murtəza səni,*
*Həq bildi sidqü can ilə, əhli-səfa səni. (Q.10, səh.279)*

Bu qəsidələrin fikri axarını və bədii tutumunu özündə birləşdirdiyindən biz **"Ey iki aləm pənahi, şahi-sərvər, ya Əli"** sözləri ilə başlanan qəsidəni ayrıca araşdırırıq:

*Ey iki aləm pənahi, şahi-sərvər, ya Əli,*
*Sahibi-fəzlü kəramət, şiri-Heydər, ya Əli.*

*(Q.8, səh.276)*

(Ey bütün Vəli, Vəsi və İmamların şahı, dünya və axirətdə pənah gətiriləcək Həzrəti-Əli (ə)! Sən əlçatmaz, ünyetməz, fəzilət və kəramət sahibisən, ya Əli (ə), sən döyüşlərin qorxmaz şirisən!).

"İki aləm pənahı" dedikdə şair məmduhunun (mədh etdiyi, öydüyü, tərifədiyi şəxsin) şəfaət səlahiyyətini nəzərdə tutur. Yuxarıda da qeyd etdiyimiz kimi şiəlikdə Həzrəti-Muhammədlə (s) yanaşı Əhli-beyt (ə.m) İmamlarının da müəyyən qədər şəfaət səlahiyyətlərinə malik olduqlarına inam bəslənilir. Həzrəti-Əli (ə) aşiqi kimi Xətai də bu inamı dönə-dönə tərənnüm etmişdir:

*Hüsn ilə ziba imişsən, ya Əli, səndən mədəd,*
*Görk içində bay imişsən, ya Əli, səndən mədəd.*

*Eşqlə məşuqü aşiq səndə olmuşdur zühur,*
*Sirri-"ma ovha" imişsən, ya Əli, səndən mədəd.*

*Eşq oxurlar adına rahi-həqiqətdə sənin,*
*Eşq ilə şeyda imişsən, ya Əli, səndən mədəd.*

*Övliyalar, Ənbiyalar çoxdurur, illa ki, sən,*
*Cümlədən əla imişsən, ya Əli, səndən mədəd.*

*Mömin irşad edirsən lütfü ehsanü kərəm,*
*Kafirə qovğa imişsən, ya Əli, səndən mədəd.*

*Yerdə, göydə istəmir şol kor münafiqlər səni,*
*Zahirən peyda imişsən, ya Əli, səndən mədəd.*

*On səkiz min aləmin sirdaş sənin sirrindədir,*
*Mürşidi bina imişsən, ya Əli, səndən mədəd.*

*Qisməti-ruzi-əzəldə həm muini-Mustafa,*
*Nərgizi-şəhla imişsən, ya Əli, səndən mədəd*

*Anca kim, seyr eylədim, gəzdim vicüdim şəhrini,*
*Misli-bihəmta imişsən, ya Əli, səndən mədəd.*

*Bu Xətai xəstədil birliginə iqrar edir,*
*Vahidi-yekta imişsən, ya Əli, səndən mədəd.*[1]

Yeri gəlmişkən mədhiyyənin yazılışı ilə bağlı bir məsələnin üstündən sükutla keçməyək. Qəzəlin qafiyə sisteminin "a" hərfi üzərində qurulması özlüyündə bəllidir, lakin şeirin ikinci misrasının müxtəlif variantlarında "ba" və "bay" şəklində məsələyə ciddi yanaşmağı tələb edir. Belə ki, əgər qafiyələnməni "bay" şəklində götürsək, onda gərək sözü əski Azərbaycan dilində "el ağsaqqalı" anlamına gələn "bəy" kəlməsi kimi qəbul edək. Laədri bir beytin el içində çox yayılması bu ehtimalı bir qədər də gücləndirir:

*Çəkmə, çəkə bilməzsən, bərkdir fələkin yayı,*
*Gah yoxsulu bay eylər, gah yoxsul edər bayı.*

Xətainin xəlqi, mədəni və mənəvi ənənəyə bağlı böyük bir sənətkar, folklor danışıq üslubunda yazıb-yaratması və türk dünyagörüşünü əsaslı surətdə mənimsəməsi məsələni bu yöndə həll etməyə yol açır. Lakin şairin "Mürtəza Əli zatlıyam" deyərkən, öz kökünü Həzrəti-Əliyə (ə) aparıb çıxarmasını, sırf şiə olmasını, böyük bir dövlət qurub ona başçılıq etməsini nəzərə alsaq,

---

[1] Şah İsmayıl Xətai. "Keçmə namərd körpüsündən" (Şeirlər və poemalar). Bakı, "Yazıçı", 1988. səh. 44

misranın qafiyəsinin “bay” kimi yox, “ba” kimi götürmək daha düzgün olar. Çünki, “Bismilləhir-rahmənir-rəhim”dəki hərflərin sirrini aça bilmək üçün “bilmillah”dakı “ba” hərfinin hikmətini anlamaq lazımdır. Həzrəti-Əli (ə) “ba” hərfindəki ucalığa işarə edərək buyurmuşdur: “Mən “bismillah”dakı “ba” hərfinin altındakı nöqtəyəm”.

Hafiz Suleyman ibni-İbrahim Qunduzinin (Hənifi) “Yənabiul-Məvəddə” adlı kitabında və Cəlaləddin Suyutinin “Əd-durrul-Mənsur” adlı əsərində “Fətihə” surəsinin birinci ayəsi olan “Bismilləhir-Rahmənir-Rahim” ayəsinin haqqında deyilir:

“Bilin ki, bütün səmavi kitabların sirləri Qurani-Kərimdədir və Qurani-Kərimdə də olan bütün sirlər “Fətihə” surəsindədir. “Fətihə” surəsində olan bütün sirlər isə “Bismilləh”dədir. “Bismilləh”dəki bütün sirlər isə ondakı “bə” hərfində və “bə”də olan bütün sirlər isə onun altındakı nöqtədədir.”

Həzrət Əlinin (ə) belə buyurduğu nəql edilir: “Mən “bə” hərfinin altındakı nöqtəyəm.” Yenə, Qunduzi Həzrət Əlidən (ə) belə nəql edir: “Mən natiqi (danışan) – Quranam.”

Əgər bizlər bu hədisə bir az diqqət etsək, istisnasız olaraq bu nəticəni əldə edəcəyik:

“Bə” hərfinin altında nöqtə olmadığı zaman bu hərf boş bir qaralamadan başqa bir şey olmayacaq. Beləliklə də nöqtəsiz olan bu hərf heç bir mənaya dəlalət etməyəcək.

“Bütün sirlər “bə” hərfinin altındakı nöqtədədir” sözü isə “elmlərin açarları “bə”nin altındakı nöqtədədir” deməkdir. Bu nöqtə olmadığı zaman bütün elmlər bağlıdır. Beləliklə də bütün səmavi kitabların və Qurani-Kərimin sirri bu nöqtədə olduğuna görə bütün elmlər insanlara bu nöqtə ilə bərabər açılmaqdadır.

*Nə qədər elm ki, var nazil olubdur bəşərə,*
*Cəm edib bircə nöqtə daxilində “ba”da verir.*[1]

[1] Şair Vüqar Nakam.

Həzrət Əli (ə) də buyurmuşdur: “Mən natiqi-Quranam”.

Ona görə ki, o nöqtə olmadan heç bir elm və insanlar kamala çatmaz. Deməli, Qurani-Kərimdə kamillik dərəcəsinə yetişməz. Bu elə bir nöqtədir ki, bütün səmavi dinlərin və İslam dininin təməl nöqtəsidir.[1]

Şah İsmail lirikasının Həzrəti-Əli (ə) payı üçün ən səciyyəvi leksim (kəlmə, söz) şah sözüdür. Nəsimi kimi o da şah deyərkən əksər hallarda Həzrəti-Əliyə (ə) işarə edir. Məsələn:

*Xətainin deyil həqqi “şaha qulam” deyə bilmək,*
*Əgər xidmət qəbul olsa, onun mövlası Qənbərdir.*

*Mən şaha bu canımı sidq ilə qurban qılmışam,*
*Gər qəbul qılsa vilayət, eydi-Qurban məndədir!*
*(Q.55, səh.52)*

Və yaxud da:

*Ərzə yazdım mən sana, ey şahı-xubanım, mədəd,*
*Ərzi-halım sən bilürsən, dinü imanım, mədəd.*

*Bu Xətainin günahın sən götürmə yüzinə,*
*Şahi-Mərdan, şiri-Yəzdan, sirri-Sübhanım, mədəd!*
*(Q.27, səh.54-57)*

*Ey könül, sidq ilə hər kim şah ilən yoldaş ola,*
*Yüz gərək döndərməyə, hər necə kim, yol daş ola.*
*(Q.20, səh.34)*

Mətnin sadələşdirilməsindən “sərvər” leksiminə çox məna yükləndiyi aydın görünür. Lüğəvi mənası “rəhbər” olan bu söz Həzrə-

[1] H.Hüseyni. ““Bismilləh” ayəsinin incə görüntüləri və “bə” hərfinin altında olan nöqtənin sirri”. Bakı, “MBM”, 2014. səh. 87-88

ti-Əli (ə) ilə əlaqələndirildikdə "Vəlilik, Vəsilik, İmamlıq, Xəlifəlik" məzmunu alır. Odur ki, biz həmin sözdən yuxarılardakı mənaları çıxarmaqda tamamilə haqlıyıq.

Beytdə üzərində durulmasına ehtiyac duyulan üçüncü ifadə "sahibi-fəzlü kəramət" tərkibidir. Ənənəvi təsəvvürlərə əsasən Peyğəmbərdə (s) möcüzə, İmamda və Övliyada kəramət, kafirdə isə istidrac olar. Doğrudur, ifrat şiə cərəyanları Rəsulullah (s) kimi Həzrəti-Əlinin (ə) də möcüzə göstərdiyini iddia edir. Lakin məzhəbindən asılı olmayaraq bütün mötədil alimlər möcüzə göstərməyin nübuvvət tarixi ilə bitdiyi fikrindədir.

Başlıca lüğəvi anlamları "üstünlük, böyüklük, əqli-mənəvi yetkinlik, kamillik" olan fəzilət sözü bir İslami termin və şiə istilahı kimi mövzu, məzmun və məfkurəcə daha dolğun və tutumlu olub, kəramətlər də daxil olmaqla bütün Peyğəmbərlik və İmamlıq məziyyətlərini əhatə edir. Bəzi bir tərəfli cəhətlərinə baxmayaraq aşağıdakı qeydlər bu barədə müəyyən təsəvvür verə bilər:

Hər kim Allaha xalis bəndəçilik edərsə, Allahın "məsəli" olar və onun gördüyü işlərdən o da görə bilər. (Bir hədisdə deyilir ki, "Bəndəçilik bir cövhərdir ki, onun məğzi Rəbb olmaqdan – varlıqlarda təsərrüf etməkdən ibarətdir"). Peyğəmbərin (s) möcüzəsi də məhz bu əsasda baş verir. Onlar Allahın xalis bəndələri olub, hər bir sahədə Allahın istək və iradəsini, öz istək və iradəsindən qabağa saldığından, Allahın onlara verdiyi mənəvi-ruhi qüvvə və İlahi elm sayəsində öz Peyğəmbərlik iddiasını isbat etmək üçün xarüqəladə işlər görürdülər. Əsanın əjdahaya çevrilməsi, ölülərin dirildilməsi, əlacsız xəstələrə şəfa verilməsi, anadan gəlmə korların gözünün açılması, dağın içindən dəvənin çıxarılması, ayın bir barmaq işarəsi ilə iki yerə bölünüb sonradan birləşdirilməsi, heyvanların danışığını başa düşmək, cinləri təsxir etmək (ixtiyarına keçirmək), mələklərlə əlaqə yaratmaq və bir sözlə, bütün kainatda təsərruf etmək Allahla sıx mənəvi əlaqənin nəticəsində baş verir.

Allaha xalis bəndəçilik sayəsində insanın "insanlıq" şərti olan ruhunun əhatə dairəsi genişlənir, öz bədənindən əlavə, xarici əşyalara da təsir edə bilir (buna vucudi genişlik – "sieyi vucudiy-

yə" deyilir). Adi insanların ruhu əhatəsi yalnız öz cismi dairəsində qərar tutduğundan, özündən xaricdə yalnız əşyaların vasitəsi ilə təsərruf edə bilir, amma birbaşa təsərruf edə bilmir.[1]

**Möcüzə** – elə bir işdir ki, həmin təbii və ali səbəb və vasitələr olmadan – səbəb və musəbbəblərə (nəticələrə) əhatəli olan iradə (istək), səbəbin musəbbəbdə (nəticədə) təsiri və musəbbəbin səbəbdən təsirlənməməsi ilə vücuda gəlir. Möcüzənin mənşəyi İlahi şəxsiyyətli insanların, Allahın sonsuz qüdrəti və yenilməz iradəsi ilə əlaqəsidir. Varlıqlar arasında təsir qoyan əlaqə heç də bizim bildiyimiz təbii əlaqələrdə sona yetmir. Bu təbii əlaqələrin fövqündə daha güclü bir səbəb – Allahın elmi və iradəsi dayanır. Yalnız həqiqi, sadiq bəndəçilik sayəsində müəyyən şəxslər bu güclü səbəblərdən agah ola bilər.

"Kafi" kitabında İmam Sadiqdən (ə) belə nəql edilir: "İsaya (ə) İlahi elmdən iki hərf verilmişdir, Həzrəti-İsa (ə) bu 2 hərflə möcüzəli işlər görürdü. Musaya (ə) 4, İbrahimə (ə) 8, Nuha (ə) 15, Adəmə (ə) 25 hərf verilmişdir. Allah onların (yəni həmin hərflərin) hamısını Həzrəti-Muhamməddin (s) vücudunda bir yerə toplamışdır. Allahın "ismi-əzəmi" 73 hərfdir. Allah-təala onun 72-ni Peyğəmbərə (s) vermiş, birini isə ondan gizli saxlamışdı".

Həzrəti-Əli (ə) buyurur: "Rəsuli-Əkrəm (s) öz elmindən mənə min bab (bölmə) öyrətdi ki, hər bir qapıdan da üzümə min qapı açılır".

Peyğəmbər (s) buyurmuşdur ki, "Mən elmin şəhəri, Əli isə onun qapısıdır..."

Məşhur sünnü alimi İbni Əbil-Hədid, Əhməd ibni Hənbəli "Musnəd" və Beyhəqqinin "Səhih" kitablarından Peyğəmbərin (s) belə buyurduğunu nəql edir: "Hər kəs əzmində Nuha (ə), elmində Adəmə (ə), helmində İbrahimə (ə), huşyarlığında Musaya (ə), zöhdündə İsaya (ə) baxmaq istəyirsə, onda Əli ibni Əbu-Ta-

[1] Məsum Əlizadə. "Müqəddimə" // Haşim ibni Süleyman Bəhreyni. "Möcüzələr şəhəri". (Əmirəl-möminin Əliyyibni Əbi Talibdən 546 fəzilət və kəramət). səh. 3-4

libə (ə) baxsın!” Bu hədis Həzrəti-Əlinin (ə) sabiq “ulul-əzm” Peyğəmbərlər kimi olmasını göstərir. Deməli, o da onların göstərdiyi möcüzələri, üstəlik onlardan da üstününü göstərə bilər.

Bundan əlavə Həzrəti-Əli (ə) həmin şəxsdir ki, İmam Sadiqin (ə) buyurduğuna əsasən, kafirlər Peyğəmbəri (s) inkar etdikdə Allah-təala onun barəsində buyurur: “Mənim Peyğəmbər olmağıma Allahın və kitab elmi ixtiyarında olan şəxsin (Əlinin (ə)) şahidliyi kifayətdir”.[1]

İmam Sadiq (ə) yenə buyurur: “Əmirəl-möminin Əli (ə) besətdən qabaq İslam Peyğəmbərinin (s) risalət nurunu görür və vəhy mələyinin səsini eşidirdi”.

Peyğəmbər (s) vəhyin gəldiyi heyrətli və unudulmaz anlarda Əliyə (ə) buyurdu: “Əgər mən Peyğəmbərlərin xatəmi (axırıncısı) olmasaydım, sən məndən sonra nübuvvət (Peyğəmbərlik) məqamına layiq olacaqdın. Amma sən mənim vəsim və varisim, müttəqilərin rəhbəri və övliyaların sərvərisən”.

Həzrəti-Əli (ə) uşaqlıq çağlarında qeybi səsləri eşitməsi haqda buyurur: “Peyğəmbərə (s) vəhy nazil olan zaman bir nalə səsi eşitdim. Ərz elədim ki, “Bu nalə nədir?” Buyurdu ki, “Bu, şeytanın naləsidir. Səbəbi də budur ki, mənim besətimdən sonra yer üzündə pərəstiş olunmaqdan naümid oldu”. Sonra Peyğəmbər (s) üzünü mənə tutub dedi: “Mən eşitdiyimi sən də eşidirsən, mən gördüyümü sən də görürsən, bir fərq ilə ki, sən Peyğəmbər yox, mənim vəzirim və köməkçimsən”.

Peyğəmbərimiz (s) kainatda “illəti-qai” olduğundan, bütün Peyğəmbərlərdən (ə) sonra zühur etməlidir və onda olan elm, kamal, qüdrət və s. əvvəlki Peyğəmbərlərin (ə) və onların Vəsilərinin (ə) hamısından artıq və kamil surətdə olmalıdır. Əvvəlki İlahi Peyğəmbərlərin (ə) möcüzəsi daha kamil surətdə bizim Peyğəmbərimizdə (s), onların Vəsilərinin (ə) möcüzəsi də daha

[1] Məsum Əlizadə. “Müqəddimə” // Haşim ibni Süleyman Bəhreyni. “Möcüzələr şəhəri”. (Əmirəl-möminin Əliyyibni Əbi Talibdən 546 fəzilət və kəramət). səh. 4

kamil surətdə bizim Peyğəmbərimizin (s) Vəsisində (ə) zahir olmalıdır. Misal üçün:

İbrahimə (ə) od təsir etmirsə, zəhərin də təbii təsiri aradan gedə bilər və Peyğəmbər (s) və onun Vəsisinə (ə) təsir etməyə bilər.

Zəkəriyya (ə) mehrabda Məryəm (s.ə) üçün behişt nemətini görürdüsə, Peyğəmbərimiz də (s) öz qızı üçün ondan yaxşısını görə bilər.

Musanın (ə) əsası əjdahaya çevrilirsə, əsanı Nil dəryasına vuraraq onu 12 yerə bölürdüsə və ya əsanı daşa vurub ondan çeşmə çıxarırdısa, deməli bizim Peyğəmbərimiz (s) və onun Vəsisinin (ə) əlindəki əsa ondan artıq dərəcədə əjdahaya çevrilə bilər, daşdan su çıxara, dəryanı yara bilər.

İsa (ə) öz həvariləri üçün asimandan yemək süfrəsi nazil edirsə, bizim Peyğəmbər (s) və onun Vəsisi üçün də behişt nemətləri nazil ola bilər.

İsa (ə) və onun vəsisi Şəmun ölüləri dirildirsə, bizim Peyğəmbərimiz (s) və onun Vəsisi (ə) onlardan artıq dərəcədə ölüləri dirildə, bundan əlavə, bərzəxdəki ruhları istədiyi şəxsə göstərə bilər.

İsa (ə) cürbəcür xəstələrə şəfa verirdisə, bizim Peyğəmbərimiz (s) və onun Vəsisi (ə) ondan da artıq ağır xəstələrə şəfa verər.

Saleh (ə) dağın içindən dəvə çıxarırdısa, bizim Peyğəmbərimiz (s) və onun Vəsisi də bu işi edə bilər. Çünki bizim Peyğəmbərimiz (s) bütün Peyğəmbərlərin (ə), onun Vəsisi də bütün Vəsilərin ən fəzilətlisidir.

Həzrəti-Süleyman (ə) cinlərə hakimiyyət edib quşların dilini bilirdisə və ya uçan xalça üzərində səyahət edirdisə, bizim Peyğəmbərimiz (s) və onun Vəsisi (ə) də mütləq bu işləri görə bilər: "Süleyman (ə) Davudun (ə) varisi oldu və dedi: "Ey insanlar! Bizə quşların dili (elmi) verilmişdir və bizə hər bir şeydən verilmişdir. Bu da aşkar bir fəzldir (mərhəmətdir)"

Süleymana (ə) quşların dili təlim verilirsə, onda bütün heyvanların dili bizim Peyğəmbərimiz (s) və onun Vəsisinə (ə) tə-

lim verilməlidir.

Əvvəlki, ümmətlərdə müəyyən alçaq fitrətli inadkar adamların müxtəlif heyvanlara (meymun, donuz və s.) çevrilməsi baş veribsə, bu iş (məsx etmə, mahiyyətin dəyişdirilməsi) bizim Peyğəmbərimiz və onun Vəsisi (ə) tərəfindən də mütləq edilə bilər.

"Hökmən, şənbə günündə sizin içərinizdən üsyankarlıq və günah edənlərin halını bildiniz. Biz onlara: "Zəlil və qovulmuş meymunlar şəklinə düşün!" – dedik" "Allah (Əhli-kitabdan bəzilərinə) lənət etdi, onlara qəzəbləndi və onlardan bəzilərini meymun və donuz surətinə salıb məsx etdi".

Quranda buyurulur ki, İsa (s) və Yəhya (s) kimi İlahi Peyğəmbərlər (s) beşikdə ikən dil açıb danışırdı: İsa (s) beşikdə ikən anası ilə danışıb deyir: "Salam olsun mənə, dünyaya gəldiyim, öldüyüm və bir daha dirildiyim gündə".

Deməli, Əlinin (ə) də beşikdə danışaraq Allahın yeganəliyinə, Həzrəti-Muhammədin (s) nübuvvətinə şəhadət verməsi qəribə deyildir.[1]

Allah-təala buyurur: "Yeddi qat asiman, yer və onlarda olanların hamısı Allaha təsbih deyir (Onu hər növ eyib və nöqsandan pak-pakizə bilir), elə bir şey yoxdur ki, ona təsbih deməsin, lakin siz onların təsbihlərini başa düşmürsünüz". Başqa bir ayədə isə Allahu təala belə buyurur: "Həqiqətən biz əmanəti səmalara, yerə və dağlara təqdim etdik, onlar onu qəbul etməkdən imtina edərək qorxdular, amma insan onu qəbul etdi".[2]

"Furat Kufi" təfsirində bu ayənin təfsirində Həzrəti-Fatimeyi-Zəhradan (s.ə) rəvayət edilir ki, Peyğəmbər (s) belə buyurmuşdur: Meracda gedib "Sidrətul-müntəhaya" çatdığım zaman belə

[1] Məsum Əlizadə. "Müqəddimə" // Haşim ibni Süleyman Bəhreyni. "Möcüzələr şəhəri". (Əmirəl-möminin Əliyyibni Əbi Talibdən 546 fəzilət və kəramət). səh. 5-6

[2] Məsum Əlizadə. "Müqəddimə" // Haşim ibni Süleyman Bəhreyni. "Möcüzələr şəhəri". (Əmirəl-möminin Əliyyibni Əbi Talibdən 546 fəzilət və kəramət). səh. 6

bir səs eşitdim: "Ey mənim mələklərim! Ey asimanımın, yerimin sakinləri! Ey Ərşimi daşıyanlar! Şahid olun: Həqiqətən mən yeganə Allaham, Məndən başqa heç bir məbud yoxdur, şəriksizəm". Dedilər: "Şəhadət verdik və iqrar etdik!" Allah buyurdu: "Ey Mənim mələklərim! Ey asimanımın, yerimin sakinləri! Ey Ərşimi daşıyanlar! Şahid olun: Həqiqətən Muhamməd (s) mənim bəndəm və Rəsulumdur". Dedilər: "Şəhadət verdik və iqrar etdik!" Allah buyurdu: "Ey mənim Mələklərim! Ey asimanımın, yerimin sakinləri! Ey Ərşimi daşıyanlar! Şahid olun: Həqiqətən Əli (ə) Mənim vəlim (dostum), Rəsulumun vəlisi (dostu) və Rəsulumdan sonra möminlərin Rəhbəridir". Dedilər: "Şəhadət verdik və iqrar etdik!"

İmam Sadiq (ə) öz atasından, ibni Abbasın belə dediyini nəql edir: "Allah-təala Adəmi xəlq etməzdən qabaq səmalara və yerə vəhy etdi: "Həqiqətən Mən sizdə Muhammədin (s) zürriyyəsini (övladlarını) xəlifə qərar verəcəyəm, onunla nə edəcəksiniz?! Sizi çağırdıqları zaman (müsbət) cavab verin, sizə sığındıqları zaman onlara pənah verin". Sonra dağlara vəhy edib buyurdu: "(Onlar) Səni çağırdıqları zaman (müsbət) cavab ver, onların düşmənlərinə qarşı (əmrlərinə) itaət et!" Bu zaman səmalar, yer və dağlar Allahın onlara itaətlə əlaqədar verdiyi fərmandan qorxdular və imtina etdilər, amma insan onu qəbul etdi. Bundan sonra da səmalar, yer və dağlar Bu əmanəti qəbul etdilər." İmam Sadiq (ə) sonra buyurur: "Allaha and olsun ki, onlar itaətlə bağlı öz əhdlərinə vəfa etmədilər!"[1]

Bu hədisə əsasən, bütün varlıqların – istər canlı, istərsə də cansız – Əlinin (ə) və Əhli-beytin (ə.m) vilayətinə iqrar etməsi qəribə deyildir.

Həzrəti-Süleymanın (ə) vəsisi Asəf ibni Bərxiya kitab elmindən az bir miqdar bildiyi halda bir göz qırpımından əvvəl Bil-

---

[1] Məsum Əlizadə. "Müqəddimə" // Haşim ibni Süleyman Bəhreyni. "Möcüzələr şəhəri". (Əmirəl-möminin Əliyyibni Əbi Talibdən 546 fəzilət və kəramət). səh. 6-7

qeysin taxtını Səba diyarından Beytul-müqəddəsə gətirdi. Deməli, Həzrəti-Əlinin (ə) əlini Kufədən uzadaraq Şamda Muaviyənin saqqalından tük qoparması, yaxud ayaqlarını Kufədən uzadaraq Şamda Muaviyənin qarnına vurması tamamilə mümkündür.[1]

Sonra İmam (ə) mübarək əli ilə onun başına vurdu və Allahın izni ilə qara bir itə çevrildi. Onun paltarları bədənindən çıxaraq havaya atıldı; Bədəni it formasına düşmüşdü. İtə çevrildikdən sonra ağlar gözlərlə İmama baxırdı... İmam Əlinin (ə) ona ürəyi yandı, astadan nəsə zümzümə etməyə başladı ki, heç kəs onun mənasını bilmirdi. Bu zaman hamının gözü önündə o şəxs əvvəlki vəziyyətinə qayıtdı və xəcalətli halda məsciddən çıxdı. Biz də təəccüblə o Həzrətin (ə) üzünə baxırdıq. İmam (ə) buyurur: Bu işdən təəccüb edirsiniz?!

Dedik: – Necə təəccüb etməyək, halbuki belə bir qəribə hadisəni gördük!

Həzrət (ə) buyurdu: – Nə üçün Allahın qüdrəti ilə görülən bu işlərdən təəccüb edirsiniz?! Həzrəti-Süleymanın (ə) vəsisi Asəf ibni Bərxiya kitab elmindən az bir miqdar bildiyi halda bir göz qırpımından əvvəl Bilqeysin taxtını Səba diyarından Beytul-müqəddəsə gətirdi. Halbuki, mən ondan əzəmətliyəm və kitab elminin hamısı mənim ixtiyarımdadır... Əgər istəsəniz, Tövrat əhli ilə Tövrat əsasında, İncil əhli ilə İncil əsasında, Quran əhli ilə Quran əsasında hökm edərəm. O hadisə Quranda vardır. "Süleyman (ə): "Bilqeys müsəlman (haqqı qəbul etmiş) halda bizim qabağımıza gəlməmişdən qabaq onun taxtını kim mənim yanıma gətirə bilər?" – deyə buyurduqda, cinlərdən olan ifrit dedi: "Mən, yerinizdən hərəkət etməzdən qabaq onu gətirərəm". Həzrət (ə) bunu qəbul etmədi, sonra kitabdan cüzi elmi olan bir şəxs dedi: "Mən gözünüzü bir dəfə qırpmazdan əvvəl onu sizin yanı-

[1] Məsum Əlizadə. "Müqəddimə" // Haşim ibni Süleyman Bəhreyni. "Möcüzələr şəhəri". (Əmirəl-möminin Əliyyibni Əbi Talibdən 546 fəzilət və kəramət). səh. 7

nızda hazır edə bilərəm!”[1] Bundan sonra Allahın izni ilə həmin işi gördü. Bu da Allahın fəzli idi. Məgər Allah sizin Peyğəmbəri (s) Həzrəti-Süleymandan (ə) üstün qərar verməyibdirmi?! Yoxsa Həzrəti-Süleyman (ə) sizin Peyğəmbərinizdən (s) fəzilətlidir?!

Dedik: – Ya Əmirəl-möminin (ə), əlbətdə, bizim Peyğəmbərimizin (s) məqamı daha yüksəkdir.

Həzrət (ə) buyurdu: – Sizin Peyğəmbərinizin (s) vəsisi üstündür, yoxsa Həzrəti-Süleymanın (ə) vəsisi?!

Dedik: – Əlbəttə ki, bizim Peyğəmbərin (s) vəsisi!

Bururdu: – Həzrəti-Süleymanın (ə) Vəsisi “ismi-əzəm”dən bir hərf bilirdi, onunla Allahdan istədi və bu işi bir göz qırpımından öncə yerinə yetirdi. Halbuki Allah “ismi-əzəm”in 72 hərfini bizə vermişdir, qalan bir hərfini isə (Özünə məxsus edərək heç kimə verməmiş və) öz yanında saxlamışdır. Deməli, biz onlardan üstünük.[2]

“Şiri-Heydər” ifadəsi ilə isə şair Həzrəti-Əlinin (ə) misilsiz qəhrəmanlığını, tayı-bərabəri olmayan igidlik və cəsurluğunu, cihad meydanlarının qorxmaz aslanı kimi ad çıxarmasını göz önündə aydın canlandıra bilər. İslam tarixi Həzrəti-Əlinin (ə) öz qanı bahasına yazdığı belə şanlı səhifələrlə doludur.

Əlbəttə, biz qətiyyən o fikirdə deyilik ki, bu fikirlərin hamısı tamamilə obyektivdir. Lakin, birmənalı surətdə başa düşmək gərəkdir ki, bütün bunlar ənənəvi orta əsrlər dindarının dini-fəlsəfi dünyagörüşününü ayrılmaz tərkib hissəsidir və Ş.İ.Xətai də bütün varlığı ilə buna inanmışdır. Bizim bu qeydlərə belə geniş yer verməməyimizin səbəbi də elə budur.

---

[1] Məsum Əlizadə. “Müqəddimə” // Haşim ibni Süleyman Bəhreyni. “Möcüzələr şəhəri”. (Əmirəl-möminin Əliyyibni Əbi Talibdən 546 fəzilət və kəramət). səh. 7

[2] Məsum Əlizadə. “Müqəddimə” // Haşim ibni Süleyman Bəhreyni. “Möcüzələr şəhəri”. (Əmirəl-möminin Əliyyibni Əbi Talibdən 546 fəzilət və kəramət). səh. 7-8

***2-ci beyt:***

*Gəldi dəstün şəninə ismi-Yədullah bigüman,*
*Oldi zati-bimisalun Həqqə məzhər, ya Əli!*

*(Q.8, səh.276)*

("Yədullah" – Allahəli adı heç şübhəsiz göylər aləmindən yalnız sənin şəninə deyilmişdir. Odur ki, tayı-bərabəri olmayan şəxsiyyətin ilahi qüdrət və hikmətin bariz təzahürünə, ortaya çıxma yerinə çevrildi, yəni Ey Əli (ə), Allah özünün qüdrət və hikmətini Peyğəmbərdən (s) sonra sona kimi yalnız sənin həyat və fəaliyyətində biruzə verdi).

Beyt çox orijinal çıxmışdır. Çünki Xətai bütün varlığı ilə vurulduğu şəxsiyyəti hissələrə parçalamamış, onun vuran əlini qəhrəmanın bütöv şəxsiyyətinin ayrılmaz tərkib hissələrindən biri kimi götürmüşdür. Odur ki, Həzrəti-Əli (ə) beytin ümumi məzmunu içində ayrıca bir obraz, sürət, personaj təsiri bağışlayır. Bu isə lirik növ üçün olduqca özünə məxsus bədii keyfiyyətdir. İndi də dillərdə əzbər olan milyonlarla insanın dilində, ağzında dolaşan saysız-hesabsız mənqəbələr bu bədii keyfiyyəti dini-islami baxımdan möhkəm surətdə əsaslandırır. Məsələn, belə danışılrlar ki, Kəbə evinin təvafı zamanı Həzrəti-Əli (ə) bir nəfərin naməhrəm bir qadına oğrun-oğrun baxdığına görə elə oradaca ona karlı bir şillə çəkir.

Təvaf bitəndən sonra həmin şəxs ikinci xəlifənin (Ömər ibni Xəttabın) yanına gəlib bu əhvalatı danışır və Həzrəti-Əlidən (ə) şikayət edir. İkinci xəlifə həmin şəxsə belə cavab verir: "Səni Allahın gözü görmüş, Allahın əli də vurmuşdur".[1]

Birinci misrada "Yədullah" ləqəbinin Həzrəti-Əliyə (ə) Allah dərgahından verildiyinə işarə də vardır. İşarənin hər hansı bir İslami məxəzdən başlanğıc götürüb-götürməməsi bir o qədər də önəmli deyil. Önəmli olan şairin bütün varlığı ilə buna inanması

[1] Hacı Soltan Hüseynqulu oğlu Əlizadə. "Duayi-Heydəri və ya Həzrəti-Əli (ə) zirvəsinə bir baxış". Bakı, "Tural-Ə" NPM, 2002

və inandığını da qələmə almasıdır.

Lakin Həzrəti-Əlinin (ə) dəstinin şəninə ismi-Yədullahın gəlməsi motivini hər hansı bir sahə ilə məsələn, şəriət hökmlərinin yerinə yetirilməsini nəzarətlə məhdudlaşdırmaq olmaz. Bu Şah İsmailin Vəsi, Vəli, İmam eşqini daraltmaq olardı. Bu motiv heç şübhəsiz Həzrəti-Əlinin (ə) İslamın cihad konsepsiyasını əyani surətdə həyata keçirilməsi ilə bağlıdır.

Bu din böyüyünün həyatı belə tarixi faktlarla zəngindir. Örnək olaraq "Xeybər qalasının" fəthi zamanı göstərdiyi şücaəti göstərmək olar. Biz bundan qəsidənin onuncu beytinin təhlili zamanı ətraflı danışacağıq.

***3-cü beyt:***

*Ruzi-hica, saidun bər fərqi əda bəsdürür,*
*Qəbzinə hacət deyül şəmşirü xəncər ya Əli!*

*(Q.8, s.276)*

(Döyüş günü sənin yalxı əlini düşmən başına aparmağın kifayətdir. Düşmən qoşununun sıra nəfərlərinin başlarını kəsmək, kəllələrini qoparmaq üçün sənin qılınca və xəncərə ehtiyacın yoxdur.)

Açıq-aydın hiss olunur ki, Xətai özünün şair təxəyyülünü tədricən Həzrəti-Əlinin (ə) şücaəti ətrafında cəmləşdirir, beytin leksikonu (söz ehtiyatı) bunun üzərində qurulmuşdur:

"Ruzi-hica" – döyüş günü, "saud" – qol, "bər fərqi əda" – düşmən başı üzərində, "şəmşiri-xəncər" – qılınc və xəncər. Göründüyü kimi on dörd sözdən ibarət olan bir mətndəki sözlərin yeddisi bilavasitə müharibə ilə bağlıdır. Bu isə lirik şeir növü üçün o qədər də səciyyəvi olmayan tərənnümün təsvirlə əvəz edilməsidir. Deməli, həm də Xətai yaradıcılığı üçün (Özünə məxsus) navatorluq (yenilik) və orijinallıqdır.

***4-cü beyt:***

*Ey şücaət mədəni, sən xəşmilə hökm eyləsən,*
*"Kun fəkan" bir almadur dəstündə yeksər ya Əli!*

*(Q.8, s.276)*

(Ey igidlik qaynağı olan Əli (ə), sən qəzəblə hökmü verdiyin təqdirdə "Ol"! dedi "Oldu" buyruğu sənin üçün bir alma əlinə götürə biləcək qədər asandır. Yəni sən istədiyin vaxt, istədiyin işi görə bilərsən).

Bəziləri burada Şah İsmail Xətaini Həzrəti-Əlinin (ə) igidliyini tərənnüm edərkən həddindən artıq şişirtməyə yol verməkdə təqsirləndirə bilərlər. Lakin birincisi mübaliğə poeziya üçün tamamilə təbii haldır, ikincisi bu mübaliğənin kəlam elmində müəyyən qədər istinadgahı vardır.

Aşağıdakı beytlər bunun kəlam elmində ki, istinadgahlarından biri hesab edilə bilər:

*Ey camalında sənin nuri-İlahidir tamam,*
*Ol sifatın zikridir fikrim həmişə sübhü şam.*

*Ol şəhənşahi-cəhansan kim, qul olub qapuna,*
*Qənbərinin xidmətiyçün Qeysərü Cəmdir ğulam.*

*"Həl Əta"də həq sana çün saqiyi-mütləq dedi,*
*Abi-kovsərdən sənin dəstindədir yaqut cam.*

*Ol Əlisən kim, xamu Peyğəmbərə sənsən şəfi,*
*Cümlə bu ümmüd ilən qapına gəlir xasü am.*

*Çün sənin övsafinə yetməz Xətainin sözü,*
*Üş bu əbyat üstə xətm oldu kəlamım, vəssalam.*[1]

Peyğəmbər (s) buyurmuşdu: "Hamınız bilirsiniz ki, mən Allahın ən fəzilətli Peyğəmbəriyəm. Mən və Əli bir nurdan xəlq

[1] Şah İsmayıl Xətai. "Keçmə namərd körpüsündən" (Şeirlər və poemalar). Bakı, "Yazıçı", 1988

edilmişik. Həqiqətən bizim təsbih deməyimiz Əbdul-Muttəlibin zamanına qədər hər bir əsrdə və zamanda – atalarımızın sülbündə, analarımızın rəhmində eşidilmişdir. O zaman (Əbdül-Müttəlibin zamanında) bizim nurumuz iki hissəyə bölündü: "Mənim nurum atam Əbdullahın, Həzrəti-Əlinin (ə) nuru isə onun atası (və mənim əmim) Əbu Talibin sülbündə qərarlaşdı. Hər vaxt onlar öz qəbiləsinin (Qureyşin) önündə otursaydılar, üzləri bizim nurumuzla parlayardı. Hətta biz dünyaya gələnə qədər nurumuzun xatirinə şirlər və digər heyvanlar onlara salam verirdi".

Bu hədisə əsasən, Peyğəmbər (s) və Əhli-beytinin (ə.m) dünyaya gəlişindən əvvəlki vücudları onların "nurani vücudu" kimi təbir edilir ki, bu nurlar Allahın yaratdığı ilk varlıq olmuş, bütün Peyğəmbərlərin (ə) dövründə onlar üçün əyan olmuşdur. Buna əsasən, Həzrəti-Əlinin (ə) əvvəlki Peyğəmbərlərin (s) dövründə müəyyən iş görməsi də məhz o Həzrətin (ə) nurani vücuduna aiddir və qeyri-mümkün bir şey deyildir.[1]

***

"Həzrəti-Əlinin (ə) əli ilə möcüzənin zahir olması, o cümlədən, Xeybərin qala qapısını yerindən qoparması, əjdahanın onunla danışması, çox böyük daş parçasını təklikdə götürüb uzaq məsafəyə atması, cinlərlə müharibə aparması, Günəşin (Həzrət (ə) üçün) geri qayıtması və sair kimi işlərlə yanaşı İmamət iddiası etməsi onun bu iddiada sadiq və doğruçu olduğunu göstərir".[2]

Sünnü alimi ibni Əbil-Hədidi Mötəzili bir şeirdə bu hadisəni belə bəyan edir:

"Ey qırx dörd nəfərin hərəkət etdirməkdən aciz qaldığı qapını

---

[1] Məsum Əlizadə. "Müqəddimə" // Haşim ibni Süleyman Bəhreyni. "Möcüzələr şəhəri". (Əmirəl-möminin Əliyyibni Əbi Talibdən 546 fəzilət və kəramət). səh. 8

[2] Məsum Əlizadə. "Müqəddimə" // Haşim ibni Süleyman Bəhreyni. "Möcüzələr şəhəri". (Əmirəl-möminin Əliyyibni Əbi Talibdən 546 fəzilət və kəramət). səh. 8

yerindən çıxaran!"

İordaniya tərəfdən Hicaza gələn hacılar Xeybər məntəqəsindən keçəndə bir küncə tullanmış o böyük qala qapısını görür və Həzrəti-Əlinin (ə) o qapını çıxartmaqla və yəhudiləri məğlub etməklə misilsiz şücaətini xatırlayırdılar. Amma texnika inkişaf etdikdən sonra vəhhabilər o qala qapısını kranla qaldırıb naməlum bir yerə aparmışlar;

***5-ci beyt:***

*Fəzlü ehsanü mürüvvət, həm səxavət kanısan,*
*Lütfünə xak ilə cövhərdür bərabər, ya Əli!*

*(Q.8, səh.276)*

(Ya Əli, sən fəzilət, ehsan və mürüvvət mədənisən, Sənin lütfün qarşısında torpaqla cövhər birdir).

Şeir üçün yeni olan məmduhun ehsan və mürüvvət keyfiyyətləridir. Hər iki keyfiyyətin Həzrəti-Əlinin (ə) həyatında böyük yer tutduğu hamıya bəllidir: Örnək olaraq bu keyfiyyətlərin hərəsinə dair bir neçə nümunə verək. Ehsan "Həsənə" sözündən götürülüb yaxşılıq etmək deməkdir.

Ehsanın iki mənası var...

1. Maddi ehsan – Maddi ehsan-pul kimi kömək etmək və.s.

2. Mənəvi ehsan – söz vasitəsi ilə ehsan etmək, yol göstərmək və s.

Qeyd etdiyimiz kimi Ehsan, Həsən sözündən olub yaxşılıqlar anlamındadır, Mürüvvət isə heç bir dilə tərcümə olunmayan bir ismi faildi ki, yəni, kamal sahibi, nəfsin ədəbi mənasına gəlməkdir və günah qarşısında vəqf etmək, dayanmaq, nəfsi saxlayan kəsin sifətlərindəndir, yəni, kişi özünü pislikdən saxlasa ona "Zu-Mürüvvət" deyərlər.

Səxavət-comərd, comərdliyə adət etmiş və s.

Beytin ikinci misrasında Xətai demək istəyir ki, Həzrəti-Əli (ə) bütün insanlara bir gözlə baxırdı. Milli, irqi və ictimai mənsubiyyətindən, cəmiyyət arasındakı tutduğu mövqeyindən asılı olmayaraq bütün insanlara eyni gözlə baxırdı. Allah-təala "Hü-

carat" surəsinin 13-cü ayəsində buyurur: "Allah yanında ən hörmətliniz ən təqvalı olanınızdır. (Allahdan ən çox qorxanınızdır). Allah biləndir, xəbərdardır".

Bu ayə bütün zahiri və maddi imtiyazların üzərindən xətt çəkir, əsil dəyərin təqva və Allah qorxusu olduğunu bildirir. Allaha yaxınlaşmaq üçün təqvadan üstün imtiyaz yoxdur. Hədislərin birində Allah Rəsulu (s) belə buyurmuşdur: "Allah sizin ailə vəziyətinizə, əsil-nəsəbinizə, bədənlərinizə, mallarınıza deyil, qəlblərinizə baxır.

Allah qəlbi sağlam olana lütf və məhəbbət göstərir. Siz hamınız Adəm övladlarısınız. Sizin Allah yanında ən sevimliniz Allahdan ən çox qorxanınızdır".

Qəribədir ki, bu qədər göstəriş və təlimatlara baxmayaraq, hələ də müsəlmanlar arasında milliyyəti və dili ilə öyünən hətta bunların dini vəhdətdən üstün tutan adamlar var. Allahın Rəsulu (s) hədislərinin birində belə buyurmuşdur: "Siz hamınız Adəm övladlarısınız, Adəm torpaqdan yaradılıb. İnsanlar ataları ilə öyünməkdən çəkinsinlər, əks təqdirdə, çirkaba bulaşmış həşaratdan da aşağı olacaqlar".[1]

Sədi Şirazinin aşağıda şeiri bu Quran izahı ilə uyğundur.

*Bəni-Adəm əzai-yek digərənd*
*Ke, dər afərinəş ze yek qohərənd.*
*Çe uzvi bedərd avərəd ruzeqar,*
*Digər uzvha ra nəmanəd qərar.*
*Tu gəz mehnəte-digəran be ğəmi,*
*Nəşayəd ke namət nəhənd adəmi.*[2]

Tərcüməsi:

---

[1] Numunə, c.22, səh. 197; Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 517

[2] Sədi Şirazi. "Əsərləri". Bakı, 2003. səh. 21

*Bir bədən üzvüdür bu bəni-Adəm,*
*Eyni bir cövhərdən yaranmış aləm.*
*Bir üzvü dərdlərə salsa ruzigar,*
*Tutmaz başqa üzvü yerində qərar.*
*Özgənin dərdinə əgər qalmasan,*
*Yaraşmaz adına deyilsin insan.*[1]

Bununla da O, Allahın və Rəsulullahın (s): "Ərəbin Ərəb olmayandan heç bir üstünlüyü yoxdur, üstünlük yalnız təqvayladı" – buyruqlarını gerçəkləşdirmişdir. O, cənabın ömür yolu belə və konkret hadisələrlə doludur. Rəvayət edildiyinə görə əsil-nəsəbli bir ərəb xanımı qeyri ərəb olan kənizi ilə beytul maldan payını almağa gəlir. Hər ikisinə eyni miqdarda üç dinar verildiyini gördükdə ərəb qadın səs-küy salaraq etiraz edir. Bu zaman Həzrəti-Əli (ə) yerdən iki ovuc torpaq götürərək o qadının gözləri önündə tutur və "mən bu iki ovuc torpaq arasında bir fərq görmürəm" – deyir. Rəvayətlərin başqa bir versiyasında da danışırlar. Həmin versiyaya əsasən Həzrəti-Əlinin (ə) bacısı Ümmül-Hani başqa millətdən olan kənizi ilə birlikdə eyni hadisə ilə qarşılaşdıqda Həzrəti-Əli (ə) məsələyə belə aydınlıq gətirir: "Mən Quranı bir neçə dəfə başdan-ayağa oxumuşam, amma orada ərəbin üstünlüyü barədə bir hərif də görməmişəm".

***6-cı beyt:***

*Ol Əlisən kim, sənin şəninə gəldi "Həl-Əta",*
*Vəsfin oldu məniyi-Quran sərasər, ya Əli!*

*(Q.8; 276)*

(Sən o, Əlisən (ə) ki, sənin həyat və fəalyyətin, ali-vəziyyətlərin "İnsan" surəsinin nazil olma şənini şərtləndirmişdir. Ümumiyyətlə Quranın məna və məzmunu bütünlüklə sənin keyfiy-

[1] Sədi Şirazi. "Gülüstan". Bakı, "Azərnəşr", 1987. səh. 48

yətlərindən ibarətdir ya Əli!).

Göründüyü kimi beytdə Qurani-Kərim Həzrəti-Əli (ə) qoşalığı üzərində qurulmuşdur. Bu qoşalıq şiə qaynaqlarında qabarıq olaraq əks etdirilmişdir: Məsələn; "Quran Əliylə, Əli Quranladı" (Həzrəti-Muhamməd (s).

Peyğəmbəri-Əkrəm (s) buyurur: "Həzə Əliyyun məəl Qurəni vəl Qurənu məə Əliyyun-Bu Əli Quran ilədir və Quran onunladır".

Digər bir hədisdə Həzrəti-Peyğəmbər (s) buyurur: "Əliyyun məəl həqqi və həqqu məə Əliyyun-Əli haqq ilə və haqq da Əliylədir".[1]

Bu qoşalıq orta yüz illikdə müsəlman poeziyası üçün çox səciyyəvidir. Filologiya üzrə fəlsəfə doktoru Vərağa Almasov 2010-cu ilə çap etdirdiyi Həzrəti-Əli (ə) monaqrafiyasında "Ya Əli" rədifli müvafiq beytinin təhlili zamanı bu qoşalığı hər tərəfli surətdə işıqlandırmışdır:

Qəzəl-nətin üçüncu beyti bütünlüklə Həzrəti-Əli (ə)-Quran bağlılığı üzərində qurulmuşdur:

*Hər hekməti ke həst kəlame-məcidra*
*Dərcəsd dər kəlame-to ya Mortəza Əli!*

(Qurani-Kərimdə ki, hər bir hikmətli fikir sənin sözlərində öz parlaq əksini tapmış və özünün həqiqi dəyərini almışdır).

"Şanlı tanrı sözündəki, hər bir hikmətli fikir" dedikdə Füzuli ilk növbədə Qurani-Kərimdə "əzmu-l-umur" (niyyət edib yerinə yetirilməyə ən layiqli işlər) adlanan İlahi göstərişləri nəzərdə tutur. "İsra" surəsinin 23-36-cı, "Loğman"surəsinin 13 və 16-19-cu, "Ənam" surəsinin 151-153-cü ayələri bu qəbildəndir: 1. Həzrəti-Əli (ə) Quran şərhçisi kimi; 2. Onun Qurani-Kərimə dair

[1] İbni Hacər "Əssavaiqul-muhriqə", 2-ci fəsil, səh. 75; Müstədrəki Hakim 3-cü cild, səh. 124; Rasim İbadoğlu. "Quran əlifbası və islamın təlimi". (Quran oxumaq, öyrənmək üçün dərs vəsaiti). Bakı, 2001. səh. 90

mülaizələri; 3. Qurani müddəaların bu ulu din böyüyünün həyat və fəaliyyətinə təsiri; 4. Həzrəti-Əli (ə) haqqında nazil olmuş ayələr.

Əlbətdə, bu cəhətlərin hər biri özlüyündə araşdırma istəyən geniş bir bəhsdir. Nəzərə alınmalıdır ki, bu ulu din böyüyü üzdə qeyri təvazökarlıq təsiri bağışlamasına baxmayaraq, əslində son dərəcə real olaraq bildirir ki, "Allahın məndən böyük hikmət və qüdrət nişanəsi yoxdur"[1], Yaxud nəzərə alınmalıdır ki, "mələklər İmamların öyrətdiyi təsbeh üsulu ilə Allahın paklığını dilə gətirirlər".[2]

Axı məsum İmamların (ə) demək olar ki, hamısı "Bizim qəlblərimiz İlahi iradənin zərfidir" buyurmuşlar.

Həzrəti-Əli (ə) isə dəfələrlə elan etmişdir ki, "Allaha and olsun, istəsəm, sizin hər birinizin keçmiş sərgüzəştlərinizdən və gələcək taleyinizdən sizə xırdalıqlarınadək xəbər verərəm. Ancaq sizin bu qeybi-xəbərləri eşidərək, küfrə düşməyinizdən və "Əli (ə) Peyğəmbərdən (s) üstündür"deməyinizdən çəkinirəm".

Belə örnəklərin sayını bir az da artıra bilərik. Ancaq bu gətirilən dəlillər, danılmaz biçimdə göstərir ki, Həzrəti-Əlinin (ə) Qurana bağlılığı qətiyyən zahiri əlamətlərə yox, əksinə, batini şühud məqamı kimi sırf mənəvi abu-havaya aid olan müstəsna bir məsələdir.

Bununla belə, Həzrəti-Əli (ə) Quran bağlılığında heç də həmişə qeyri-adi cəhətlər axtarılmamalıdır. Məsələn, Qurani-Kərimdə "Ey iman gətirənlər, Allaha məsuh tövbəsi ilə tövbə edin!" (Təhrim, 8) ayəsini oxuyub, lazımınca başa düşməyən şəxslər Həzrəti-Əlidən (ə) məsələyə aydınlıq gətirilməsini istədikləri zaman bu ulu din böyüyünün verdiyi cavab çox sadə olmuşdur: "Nəsuh tövbəsi qəlbən peşman olmaq, dillə üzrxahlıq gətirmək və bir daha o günaha meyl etməməyə qərar verməkdir!".

---

[1] Şeyx Kuleyni. "Üsuli-kafi". I cild. Bakı, 2005. səh. 207

[2] Səfinətul-Bəhar, 1-ci cild, səh. 594

2. Həzrəti-Əlinin (ə) Qurani-Kərimə dair mülahizələri. Həzrəti-Əlinin (ə) Qurani-Kərimlə bağlı fikirləri də bu və ya başqa müstəvidə dini ictimaiyyəti dərindən düşündürən cəhətlərə malikdir. Bu mülahizələrin birində oxuyuruq: “Bir şəxs Quranı götürüb (oxumaq üçün) yerə əyləşsə, ayağa qalxdığı zaman onda (onun mənəviyyat və əxlaqında) mütləq dəyişiklik baş verər. Baş verən bu dəyişiklik onun doğru yola daha surətlə yaxınlaşmasından və mənəvi korluğunun azalmasından ibarətdir. Bilin ki, Quran oxuduqdan (onun başlıca müddəalarını mənimsədikdən) sonra heç kimdə Allahdan savayı bir kəsə ehtiyac hissi qalmaz, əksinə, bu şərəfə nail olmamışdan qabaq kimsə özünü həqiqi mənada sərvət sahibi hiss edə bilməz!” (Əl-həyat, 2 cild, səh.101)

Həzrəti-Əli (ə) “Divani-Əmir”də də poetik şəkildə Qurani-Kərimlə bağlı duyğu və düşüncələrini dəfələrlə dilə gətirmişdir. Oğlu İmam Hüseynə (ə) nəsihətindəki aşağıdakı bölüm bu baxımdan olduqca səciyyəvidir:

*Oğlum, Quranda çoxlu nəsihətlər var,*
*Ancaq onun nəsihətlərindən dərs alan kimdir?*
*Allahın kitabını qüdrətin çatdığı qədər oxu!*
*Ona (Qurana) əməl edənlər və özlərini Quran əhli hesab edənlər arasında oxu!*
*Quranı idrakla, düşünərək, itaətkarlıqla və Allaha yaxınlaşmaq niyyəti ilə oxu!*
*Allaha yaxın olmaq istəyən ona yaxın olar.*
*Səni təkamülə və inkişafa sövq edən Allahına sədaqətlə ibadət et!*
*Və Qurandan gələn misallara yaxşı diqqət yetir!*
*Cəhənnəm əzabından danışan və qorxu törədən ayəyə çatanda dayan və ağla,*
*(Söylə): “Ey ədalət naminə əzab çəkəni sevən Allah,*
*Məni əzab verəcəyin adamların sırasında qoyma!*
*Mən öz qüsur və günahlarımdan tövbə edib qaçıram*
*Və bu zaman səndən başqa bir pənah yerim varmı?”.*

*Quran da cənnətə çatmağın yolu və onun xarüqəladə nemətlərindən bəhs edən bir ayəyə çatdığın zaman Allahından sədaqət və ah-nalə ilə ona yaxın olanlar kimi əbədi cənnət istə!*
*İstəməyində cəhd et ki, bəlkə cənnət ərazisinə daxil olasan.*
*Və viran olmayan evlərə yol taparsan!*
*Və sonsuz bir ləzzətə çatasan!*
*Elə bir şərafət mülkünə sahib olasan,*
*Əlindən heç vaxt alınmasın!*[1]

Göründüyü kimi, hər iki parçada bir çox dərin ictimai-mədəni və əxlaqi-fəlsəfi məsələlər əksini tapmaqda, həyata, insani münasibətlərinə dair, dərəcədə Allah, kainat, təfəkkür və şəxsiyyət haqqında bir-birindən dolğun və tutumlu olan dəqiq, aydın və bir mənalı baxış sistemi boy göstərməkdədir. Bu isə özlüyündə aydın və geniş bir araşdırma tələb edə biləcək qədər köklü bir problemdir.

3. Qurani müddəaların Həzrət-Əlinin (ə) həyat və fəaliyyətinə təsiri. Həzrəti-Əli (ə) ömür boyu canlı Quran kimi yaşayıb fəaliyyət göstərməsinə heç kəs şübhə etmir. Görünür, Həzrəti-Muhamməd (s) "Əli (ə) haqqladır və haqq Əli (ə) ilədir" buyurduğu zaman məhz bu danılmaz gerçəkliyi nəzərdə tutmuşdur.

Qaynaqlarda bu gerçəkliyin üzərindən sükutla keçməmiş, Həzrəti-Əli (ə) fəaliyyət və mübarizəsindəki Quran yönümünü qeydə almalı olmuşdur. Məsələn, "Özünə beyət edildikdən sonar Əli (ə) məsciddə müsəlmanlara xütbə oxudu və onlara belə söylədi: "Allah insanlara doğru yolu göstərən, hər cür xeyri və şəri açıqlayan bir Kitab nazil etmişdir. Siz bunu götürün və onda göstərilmiş şər işlərdən uzaqlaşın!".

O eləcə də qan tökməməyi, ölümü tez-tez xatırlamağı, qiyamət haqqında dfikirləşməyi və yaxşı işlər görməyi buyurmuşdur".[2]

---

[1] "Divan-Həzrəti-Əli ibni Əbu Talib", Bakı, 2011. səh. 14-15
[2] Təbəri. Tarix, 2 cild, səh. 700; Doktor Nuri Ünlü. "İslam tarixi". III cilddə, I

Başqa bir missal. Həzrəti-Əli (ə) Misrə vali göndərdiyi Muhamməd ibni Əbubəkrə məktubunda belə yazırdı: "Sən ibadətini işlərinə yox, işlərini ibadətinə tabe et! Bunu etmək üçün namazı əvvəl vaxtda, özü də camaatla birlikdə qıl!".

Ümumiyyətlə, Həzrəti-Əli (ə) ibadətə, xüsusən də onun namaz növünə olduqca böyük önəm vermiş, Qurana söykənərək onu çevik həyat tərzinin rəhni bilmişdir. Bu ulu din böyüyü buyurur: "Namaz şeytanın vəsvəsə və dəğdəğələrindən qorunmaq üçün sarsılmaz bir qaladır!".

Və ya "sizlərdən biriniz namaz qılmaqdan ötrü ayağa qalxdıqda namazı elə qılsın ki, sanki onunla vidalaşır".

Yaxud İmam Həsən (ə) uşaqlıq dövrünü xatırlayaraq Həzrəti-Əlinin (ə) ona "Ey mənim balaca oğlum, namazı həmişə əvvəl vaxtda qıl!" buyurduğunu bildirir.

Bütün bunlar ulu Yaradanın "yalnız namaz insanı açıq və gizlin günahlardan qoruyub saxlayar" (Ənkəbut,44) şəklindəki buyruğunun əməli təzahürü, canlı təsdiqi və aydın dərki kimi səslənir. Deməli, doğrudan da Həzrəti-Əli (ə) ömrünün hər anını Qurani-Kərimin bir hərfi ilə yoğurub araya-ərsəyə gətirmiş, Quran məfkurəsinə sözü və işi, canı və qanı ilə əməl libası geyindirmişdir.

4. Həzrəti-Əli (ə) haqqında nazil olmuş ayələr: Quran elmlərinin demək olar ki, hamısının predmetini təşkil edən və "şəninüzul" (nazil olma səbəbi)adlanan məsələ həmişə diqqət mərkəzində olmuş, ayrı-ayrı hipotezlərin sübuta yetirilməsi yönündə tez-tez bəhs mövzusuna çevrilmişdir. Həzrəti-Əlinin (ə) həyat və fəaliyyətini öyrənən mütəxəssislər də müqəddəs Kitabımıza bu baxımdan yanaşmış, onun başqa-başqa ayələrini bu və ya digər dərəcədə bu ulu din böyüyünün əqidə və mübarizə yolu ilə əlaqələndirməyə çalışmışlar. Əlbəttə, bu cəhdlərin heç də hamısı özünü bir mənalı surətdə doğrultmur. Digər tərəfdən, əbədi təhlil üçün heç hadisə və əhvalatların tarixi planda dərinliyinə gedib

---

cild. İstanbul, 1997. səh. 144

təfərrüata və təfsilata varmağa da lüzum yoxdur. Ona görə ki, şairləri ilk növbədə maraqlandıran hadisə və əhvalatların ruhi-mənəvi tərəfi, əxlaqi qatı və fəlsəfi siqləti, bütün bunların kamil insan yetişdirməkdən ötrü hansı ölçüdə təsirli olub-olmamasıdır.

Aşağıdakı əhvalat da məhz bu baxımdan diqqəti çəkir.

“Bir şəxs Peyğəmbərin (s) hüzuruna gəlib, ac olduğunu bildirir. Həzrəti-Peyğəmbər də (s) onu öz zövcələrinin yanına göndərir və onlar üçün xəbər yollayır ki, əgər sizdə yeməyə bir şey varsa, onu yedirdin. Həzrəti-Peyğəmbərin (s) zövcələri öz evlərində sudan başqa bir şey olmadığını bildirirlər. Bu zaman o, üzünü səhabələrə tutub soruşur:

– Kim bu gecə bu kişiyə yemək verə bilər?

Həzrəti-Əli (ə) cavab verir: – Ya Rəsulullah (s), mən bu gecə onu qonaq aparacağam.

Evə gəldikdə Həzrəti-Əli (ə) xanım Fatimeyi-Zəhradan (s.ə) soruşur:

– Evdə yeməyə bir şey varmı ki, qonağa təklif edək?

Xanım (s.ə) belə cavab verir: Ya Əbəl-Həsən, uşaqların xörəyindən bir az qalıb. Ancaq qonağımızı uşaqlarımızdan üstün tutarıq.

– Həzrəti-Əli (ə) buyurdu: – Uşaqları yatırt və çıraqları söndür.

– Onlar yeməyi qonağın qabağına qoyub, qaranlıqda mübarək ağızlarını yemək yeyirmiş kimi tərpətməyə başlayırlar. Qonaq yeməkləri bitirdikdən sonra çıraqları yandırdıqda ilahi fəzilət nəticəsində kasanın ağzınadək dolu olduğunu görürlər.

Sübhçağı Həzrəti-Əli (ə) namaz qılmaq üçün məscidə gedir. Namazdan sonra Peyğəmbər (s) ona baxaraq uca səslə ağlayır və belə buyurur: – Ya Əbəl-Həsən, dünən gecəki hərəkətinizdən sonra Allahu-təala bu ayəni nazil etdi: “Özlərinin ehtiyac içərisində olmalarına baxmayaraq, onları özlərindən (qonaqları öz ailə

üzvlərindən, övladlarından) üstün tutarlar" ("Həşr", 8-9)[1]

– Bu qəbilli ilahi bəyanatları qətiyyən ötəri müddəa hesab etmək olmaz. Cünki Müqəddəs kitabımızda Həzrəti-Əli (ə) ilə bundan da çox bağlı olan ayələr kifayət qədərdir.

– Həzrəti-Əli (ə) Quran bağlılığı baxımından toxunulması lazım gələn cəhətlərdən biri də Həzrəti-Muhammədin (s) bu ulu din böyüyünü Qurani-Kərimin canlı daşıyıcısı və yorulmaz carçısı kimi ümmətə təqdim etməsidir. Təkcə İmam Nisai bu barədə onbeşədək hədis toplamışdır. Məsələn: "Əli bin Əlqəmə Əlidən (Allah ondan razı olsun!) – belə nəql edir:

– "Ey iman gətirənlər! Peyğəmbərlə (s) (hər hansı bir iş barəsində) məxfi danışacağınız zaman bu danışıqdan əvvəl (ona hörmət əlaməti olaraq) sədəqə verin" (ayəsi) nazil olduqda Allahın Peyğəmbəri (s) (Əliyə) dedi: "Onlara (müsəlmanlara) əmr et ki, (bu andan etibarən mənimlə məxfi söhbət etmək istədikləri zaman əvvəlcə) sədəqə versinlər". (Əli) dedi: "Nə qədər, ey Allahın Peyğəmbəri?". (Peyğəmbər) dedi: "Bir dinar". (Əli) dedi: "(onların) buna gücü çatmayacaq". (Peyğəmbər) dedi: "Onda yarım dinar". (Əli (ə)) dedi: "(Onların buna da) gücü çatmayacaq". (Peyğəmbər) "Elə isə nə qədər (olsun)?" deyə soruşdu. (Əli (ə)) dedi: "Bir arpa". Allahın Peyğəmbəri (s) "Sən çox azaltdın", – dedi. Bu vaxt Allah: "Məgər siz (Peyğəmbərlə) məxfi danışmazdan öncə sədəqə verməkdən qorxdunuz?" (ayəsini) nazil etdi. (Bu hadisədən sonra) Əli – Allah ondan razı olsun! – belə deyərdi: "Bu ümmətin yükü mənim sayəmdə yüngülləşdirildi".[2]

Yaxud, Əbu Səid Xudri belə nəql edir: "Əyləşib Allahın Peyğəmbərini (s) gözləyirdik. O, yanımıza gəldi, nəleyninin bağı qırılmışdı. Onu Əliyə (Allah ondan razı olsun!) verib buyurdu:

[1] Şəvahidü-t-tənzil, 2 cild, səh. 246; Qəzavəthaye-Həzrəti-Əmir, səh. 383; Mahmud Şəriətzadə Xorasani, səh. 112

[2] İmam Nisai. "Əmirəlmöminin Əli bin Əbu Talibin (ə) fəzilətlərinə dair hədislər". Bakı, 2008. səh. 111-112

"Sizin içərinizdə elə adam vardır ki, Quran nazil olduqda mən onun müdafiəsi uğrunda vuruşduğum kimi, o da Quranın (hər cür təhrifdən qorunub səhih) izah edilməsi uğrunda vuruşacaqdır". Əbu Bəkr dedi: "(Həmin adam) mənəm? (Peyğəmbər "Xeyr", – deyə cavab Verdi. (sonra) Ömər dedi: (Onda həmin adam) mənəm?" (Peyğəmbər ona da "Xeyr" – deyə cavab verdi, – o, çarığı təmir edən kəsdir".

Və ya: Əbu Səid belə nəql edir ki, Allahın Peyğəmbəri (s) bu ümmətin içərisindən (haqqa qarşı) çıxacaq bir qism insan barəsində danışaraq onların namaz, zəkat və orucuları (necə namaz qılmaları, zəkat verib oruc tutmaları) barədə danışdı (və dedi): "Onlar islamdan ox yaydan çıxdığı kimi sıyrılıb çıxacaqlar. Quran boğazlarından ötüb (qəlblərinə)nüfuz etməyəcək. Onları qətlə yetirən (dəstə), şübhəsiz ki, insanlardan haqqa daha yaxın olandır".

Və yaxud: Sələmə bin Kuheyl Zeyd bin Vahabdan belə nəql edir ki, o, Əli – (Allah ondan razı olsun!) – ilə birlikdə (Əlinin rəhbərliyi altında) olub, xəvaricə qarşı çıxan ordu sıralarında idi. Əli – (Allah ondan razı olsun!) – dedi: "Ey insanlar! Mən Allahın peyğəmbərinin (s) belə söylədiyini eşitmişəm: "Ümmətimdən bir qövm meydana çıxacaqdır ki, Quran oxuyacaq, ancaq sizin oxu tərziniz onların oxu tərzinə, həmçinin nə namazınız namazlarına, nə də orucunuz oruclarına bənzəyəcəkdir. Onlar Quran oxuyacaq və onun özlərinin lehinə olduğunu hesab edəcəklər.

Əslində isə Quran onların əleyhinə olacaqdır. (Çünki) Quran onların boğazlarından ötüb (qəlblərinə) nüfuz etməyəcəkdir. Onlar islamdan ox yaydan sıyrılıb çıxdığı kimi çıxacaqlar. Əgər onlarla vuruşacaq ordu peyğəmbərlərin (ə) dili ilə özləri barədə edilən hökm (axirətdə onları necə mükafat gözlədiyini) bilsəydilər, şübhəsiz ki, (bu savaşdan sonra Allaha) arxayın olub bir iş görməzdilər. Onların əlaməti (belədir): aralarında qolunun yalnız bazusunun ön nahiyəsi olan bir kişi vardır. Həmin nahiyənin aşağı hissəsi qadın döşünün giləsinə oxşayır və üzərində ağ tüklər vardır.

Sələmə deyir: "Zeyd məni (özü ilə) bir yerə apardı. Biz bir körpü üzərindən ötüb keçdik. O dedi: "Biz Abdullah bin Vahab Rasibin başçılığı altında olan xəvariclə qarşılaşdıqda (Vahab Rasibi) onlara (öz əsgərlərinə) dedi: "Nizələrinizi atıb qılıncınızı qınından sıyırın (və vuruşun)". Beləliklə, insanlar onları nizə atəşinə tutdular. Onlar bir-birini qətlə yetirməyə başladılar. Həmin gün insanlardan (Əlinin (ə) ordusundan) yalnız iki nəfər öldürüldü. (Döyüş səngidikdən sonra) Əli – (Allah onu şərəfləndirsin!) – dedi: "Onların arasındakı qolu qüsurlu kişini axtarın". Onu (axtardılar,ancaq) tapmadılar. Belə olduqda Əli-Allah ondan razı olsun! – özü onu axtarmağa başladı. O, bir-birinin üstünə sərilmiş bir neçə cəsədin yanına gəlib dedi: "Onları dartıb yerə çəkin".

…Nəhayət, onu cəsədlərin altından tapdılar. Əli – (Allah ondan razı olsun!) – dedi: "Allah doğru buyurmuş, Onun Peyğəmbəri də (doğru) çatdırmışdır", – deyib təkbir etdi. Sonra Übeydə Yəmani Əlinin yanına gəlib dedi: "Ey Əmir! (Səni) and verirəm özündən başqa heç bir tanrı olmayan Allaha! (De görüm), doğrudan sən bu xəbəri Allahın peyğəmbərindən (s) eşitmisən?" Əli-Allah ondan razı olsun! – dedi: "And içirəm özündən başqa heş bir tanrı olmayan Allaha ki, həqiqətən, mən (bütün) bunları Allahın peyğəmbərindən (s) eşitmişəm". (Übeydə Yəmani) onu (bu barədə) üç dəfə Allaha and içdirdi və o da bu barədə (üç dəfə) and içdi".[1]

Bu hədislər də danılmaz biçimdə göstərir ki, Həzrəti-Muhamməd (s) Qurani-Kərimlə bağlı bütün önəmli məsələləri yalnız Həzrəti-Əliyə (ə) etibar etmiş, bunların öhdəsindən yalnız onun sonadək gələcəyinə inanmışdır.

Füzuli kimi Xətai də "Məniyi-Quranın sərasər məmduhun vəsfi"ndən ibarət olduğunu ayrıca vurğulayır. Beytin əyaniliyini təmin edən "Həl-əta" sözüdür. Beytdə olan bu söz Qurani-Kəri-

---

[1] İmam Nisai. "Əmirəlmömininin Əli bin Əbu Talibin (ə) fəzilətlərinə dair hədislər". Bakı, 2008. səh. 136-137

min 76-cı "İnsan" surəsindən götürülmüşdür və həmin surə bu ifadə ilə başlanır: "Həl-əta ələl insəni hiynun minəd-dəhri ləm yəkun şəyən məzkurə" – "Doğurdanmı insanın heç kimə məlum olmadığı bir dövr hələ də ötüb keçməmişdir?".[1]

5. Sözsüz ki, möminlər xoş ətirli (şərab dolu) badələrdən nuş edəcəklər;

6. Allahın xas bəndələrinin içdiyi və istədiyi yerdən axıtdığı çeşmədən;

7. Onlar vəd etdikləri nəziri verər və əzabı hər yeri sarmış gündən qorxarlar;

8. Onlar özləri istədikləri (ehtiyac duyduqları) yeməyi kasıba, yetimə və əsirə verərlər;

9. (və deyərlər): "Biz sizi yalnız Allaha xatir yedirdirik və sizdən nə əvəz, nə də bir minnətdarlıq gözləyirik!;

10. Əslində, biz ağır və zəhmli gündə Rəbbimizdən qorxuruq!";

11. (Bu etiqad və əməllərinə görə) Allah onları həmin günün şərindən qoruyar və onlara gözəllik və sevinc nəsib edər;

12. Səbr etdiklərinə görə onlara Cənnəti və ipəkdən olan cənnət libasları bağışlayar;

13. Orada taxtlar üzərində dirsəklənəcək və orada nə günəş, nə də soyuq görəcəklər;

14. Cənnət ağaclarının kölgələri onlar üçün aşağı enəcək, meyvələrini də dərmək asan olacaq;

15. Onların ətrafına (təamlarla dolu) gümüşdən hazırlanmış qablar və büllur qədəhlər dolandırılacaq;

16. Gümüşdən olan elə büllur qədəhlər ki, onları münasib ölçüdə hazırlamışlar;

17. Orada onlara zəncəfil qatılmış pak şərabla dolu badələr içirdiləcək;

---

[1] Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 578

18. (Həmin badələr) Cənnətdə Səlsəbil adlı bulaqdan (doldurulacaq);

19. Onların ətrafında həmişə gənc (cavan) olan xidmətçi gənclər dolanacaq. Onları gördükdə səpələnmiş mirvari dənələri olduqlarını sanarsan;

20. Oraya baxsan, nemət və əzəmətli səltənət görərsən;

21. Onların əyinlərində taftadan və atlazdan yaşıl paltarlar olacaq. Qolları gümüş bilərziklərlə bəzədiləcək. Rəbbləri onlara pak şərab içirdəcəkdir;

Peyğəmbər (s) Əhli-beytinin (ə.m) üstünlüyünü təsdiq edən böyük fakt: İbn Abbas belə nəql edir: İmam Həsənlə, İmam Hüseyn (ə) xəstələnmişdi. Peyğəmbər (s) bir dəstə səhabəsi ilə onlara dəyməyə gəlmişdi. Peyğəmbər (s) Həzrəti-Əliyə (s) buyurdu: “Ey Əbülhəsən, yaxşı olardı ki, övladlarının şəfa tapması üçün nəzir edəsən”. Həzrəti-Əli (ə), Həzrəti-Fatimə (s.ə) və Fizzə (onların xidmətçisi) nəzir edirlər ki, əgər onlar şəfa tapsalar üç gün oruc tutacaqlar. Bəzi hədislərə görə İmam Həsənlə (ə), İmam Hüseyn də (ə) oruc tutmağı nəzir edir. Çox çəkmir ki, onların hər ikisi sağalır. Həmin vaxt onların maddi vəziyyətləri də yaxşı olmur.

Həzrəti-Əli (ə) 3 kq arpa borc alır, Həzrəti-Fatimə (s.ə) onun üçdə birindən çörək bişirir. İftar vaxtı qapıya bir dilənçi gəlib deyir: “Salam olsun sizə, ey Muhamədin (s) ailəsi! Müsəlman yoxsullarındanam, mənə yemək verin, Allah da sizə Cənnət yeməklərindən lütf etsin”. Onlar hamısı öz payını həmin yoxsula verib, yalnız su ilə keçinir. İkinci gündə oruc tuturlar, iftara yemək (arpa çörəyi) hazırladıqları vaxt qapıya bir yetim gəlir. Həmin gündə öz paylarından keçirlər, yenə də su ilə kifayətlənirlər. Növbəti gün yenə oruc tuturlar. Bu dəfə qürub vaxtı bir əsir gəlir. Bu dəfə də paylarını verirlər. Səhər açılanda Həzrəti-Əli (ə) İmam Həsənlə, İmam Hüseynin (ə) əlindən tutub peyğəmbərin (s) yanına gedir. Peyğəmbər (s) onların aclıqdan titrədiklərini görüb buyurur: “Sizin bu vəziyyətiniz mənə çox ağır gəldi”. Sonra ayağa qalxıb onlarla birlikdə yola düşür. Həzrəti-Fatimənin (s.ə) evinə daxil olanda onun aclıqdan qarnı belinə yapışmış

və gözləri batmış halda mehrabda dayanıb namaz qıldığını görürlər. Peyğəmbər (s) çox narahat olur. Bu vaxt Cəbrail (ə) enib buyurur: "Ey Muhamməd (s), bu surəni qəbul et ki, Allah belə bir ailəyə sahib olduğuna görə səni təbrik edir". Cəbrail bunu söyləyib "İnsan" surəsini nazil edir. Bəziləri həmin vaxt "İnsan" surəsinin 5-22-ci ayələrinin nazil olduğunu qeyd etmişlər. Sünni məzhəbinin ən böyük təfsirçilərindən olan Alusi də bu surənin Əhli-beyt (ə.m) haqqında nazil olduğunu qeyd etmiş və ayələrin altından belə yazmışdır: "Bu surədə Cənnət xidmətçilərindən danışıldığı halda, Zəhrayi-Bətula (s.ə) hörmət əlaməti olaraq qaragözlü hurilərdən danışılmır." [1]

Allahın xas bəndələrinin ixtiyarında olan pak şərabbulağı onlar istədiyi yerdən baş qaldırıb axır. İmam Baqir (ə) həmin bulaq haqqında belə buyurmuşdur: "O bulaq islam Peyğəmbərinin (s) evindədir, oradan digər peyğəmbərlərin və möminlərin evinə axır." Dünyada elm və mərhəmət bulağı Peyğəmbərin (s) evindən Allah bəndələrinin evinə doğru cərəyan etdiyi kimi, axirətdə də onun böyük bir təcəssümü olacaq, pak şərab çeşməsi vəhy evindən qaynayıb möminlərin evlərinə doğru axacaq.[1]

**9.Başqalarına yemək verməyin savabı:** Acları doyurmaq yaxşı insanların ən üstün cəhətlərindəndir. Quranda bu cəhətə çox böyük önəm verilmişdir. Əgər müasir dünyaya nəzər salsaq, yayılan xəbərlərə görə hər il dünyada milyonlarla adam aclıqdan ölür. Halbuki dünyanın başqa yerlərində zibilliklərə küllü miqdarda yemək tökülür. Bu da İslam qanunlarının çox yüksək dəyərlərinə sahib olduğunu, dünyanın isə ondan nə qədər uzaq düşdüyünü açıq şəkildə göstərir. Hədislərdə də bu məsələyə xüsusi onəm verilmişdir. Hədislərinin birində İmam Sadiq (ə) belə buyurmuşdur: "Bir möminə qarnı doyunca yemək verən şəxsi

---

[1] Nümunə, c.25, səh. 343; Əl-Mizan, c.20, səh. 143; Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 378

axirətdə hansı mükafat gözlədiyini aləmlərin Rəbbi olan Allahdan başqa heç kəs, hətta Allahın yaxın mələkləri və Peyğəmbərlər də bilməz.” Hədislərdə açıq şəkildə qeyd edilir ki, mömin və müsəlman olmasa belə, ac adamı doydurmaq ən yaxşı əməllərdəndir. İslam Peyğəmbəri (s) belə buyurmuşdur: “Allah dərgahında əməllərin ən yaxşısı yanan ciyərləri sərinlətmək, ac qarınları doydurmaqdır. Canım əlində olana and olsun, müsəlman qardaşı gecəni ac yatdığı halda, tox yatan bəndə mənə iman gətirməmişdir.”[1]

**13. Orada nə günəş, nə də soyuq görəcəklər:** Bu cümlə Cənnət havasının çox xoş olduğunu bədii mərhələlərinə işarə edir: “Cənnət sakinləri qəfildən Cənnəti işıqlandıran günəş işığına bənzər bir işıq görəcək və cənnət məmuruna deyəcəklər: “Bu nə işıqdır belə? Axı Allah buyurur ki, orada nə günəş, nə də soyuq görəcəklər”. O isə belə deyəcək: “Bu, günəş və ay işığı deyil, Əli (ə) və Fatimə (s.ə) gülüb, Cənnət onların dişlərinin nurundan işıqlanıb.”[2]

**21. Pak şərab:** Cənnətdə əməli salehlərə verilən nemətlərdən söz açılarkən dadlı və ləzzətli içkilərdən də danışılır. Ancaq onlarla bu ayədə qeyd edilən içki arasında çox böyük bir fərq olduğunu görürük. Onlarda içkini verən saqi əbədiyaşar gənclər, burada isə Allahdır. İnsanı tərbiyə edib yüksək kamillik mərhələlərinə nail edərək, son mərhələyə yüksəldən Allah lütfkarlığının ən yüksək həddini nümayiş etdirir. Öz qüdrət əli ilə əməlisaleh bəndəsini pak şərabla sirab edir. Ümumiyyətlə, “təhur” ərəbcə həm pak olana, həm də pak edənə deyilir. Deməli, bu içki insanın cismini və ruhunu istənilən bulaşıqdan təmizləyir, ona sözlə ifadə edilməsi qeyri-mümkün olan ruh, nur və sevinc bəxş edir.

---

[1] Ayətullah-üzma Nasir Məkarim Şirazi. “Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı”. (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, “Nurlar”, 2017. səh. 378

[2] Ayətullah-üzma Nasir Məkarim Şirazi. “Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı”. (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, “Nurlar”, 2017. səh. 378

İmam Sadiqin (ə) bu ayənin təfsirini ehtiva edən bir hədisində belə deyilir: “Onları Allahdan başqa hər şeydən təmizləyər”. Qəflət pərdələrini yox edər, örtükləri aradan qaldırar, insanı Allah yaxınlığında daimi hüzura layiq edər.[1]

Lakin təfsirçilərin çoxu surənin 5-21-ci ayələrinin Həzrəti-Əliyə (ə) daha çox bağlı olduğunu qeyd edirlər.

***7-ci beyt:***

*Səndən özgə gəlmədi ər və qılıncdan özgə tiğ,*
*Bu söz öfsafında Həqdəndür müqərrər, ya Əli!*

*(8;276)*

(“Dünyaya nə sənin özün kimi igid, nə də qılıncın kimi qılınc gəlmişdir!”. Səni səciyyələndirən bu söz Ulu Yaradanın uca dərgahından qaynaqlanır ya Əli!).

Şair burada açıq-aşkar “Ühüd” müharibəsinə işarə edir.

İslamşunas alimimiz Ramiz Faseh Paşayev “Seyyid İmaməddin Nəsiminin seçilmiş bəzi şeirlərinin şərhi” başlıqlı kitablarında şairin əsərlərinin Türkiyə nəşrindən götürdüyü iri bir “Mürəbbi”ni (dördlük şeir növü) açıqlamalı surətdə vermişdir. Əyanilik naminə həmin kitabdan bir neçə səhifəni burada qeyd edirik:

*Əqlü eşqü nəfsü can həzrətdə idi intizar,*
*Bir ovuc torpağə çün qıldı nəzər Pərvərdigar,*
*Adəmin cismi anın ismilə oldu üstüvar,*
*“La fəta illa Əli, la seyfə illa Zülfüqar”.*

Əql, eşq, nəfs və can (ruh) Allahın dərgahında intizarda idilər

[1] “Nümunə”, c.25, səh. 350, 357, 363, 371; Ayətullah-üzma Nasir Məkarim Şirazi. “Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı”. (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, “Nurlar”, 2017. səh. 379

(gözləyirdilər). Elə ki, pərvərdigar (tərbiyə verən Allah) bir ovuc torpağa nəzər saldı (bu, Həzrəti-Adəmin (ə) yaranmasına işarədir; çünki siryani dilində yerin üst qatına (təbəqəsinə) **ədim** deyirlər və Allah-təala da Adəmi yerin üst təbəqəsinin torpağından (ədimul-ərzdən) yaratdığı üçün ona Adəm deyildi), Adəmin cismi (bədən quruluşu) onun adı ilə qurulub düzəldi, "Əlidən başqa cavan igid, Zülfüqardan da başqa qılınc yoxdur."

*Adəmə verdi kəramət xüldü cənnati-nəim,*
*Cümlə anə səcdə qıldı, qeyri-şeytanir-rəcim,*
*Adəmin vəchində yeddi xətti yazmışdı Qədim,*
*"La fəta illa Əli, la seyfə illa Zülfüqar".*

(1-ci misra "Adəmə verdi kəramət Cənnəti-xüldi nəim" şəklində yazılmış olsaydı, daha dəqiq və düzgün olardı).

Xüld və Nəim səkkiz guşədən ibarət (səkkiz təbəqədən ibarət) olan Cənnətin dörd və beşinci guşələrinin (təbəqələrinin) adlarıdır və bu dörd və beşinci guşələr səkkiz guşəli Cənnətin ən orta guşələri olduqları üçün cənnətin ən əla təbəqələri hesab olunurlar və Klassik Şərq şeirində də bir bənzətmə (təşbih) olaraq, ən çox həmin bu iki Cənnət guşəsinin adları şəkilməkdədir, necə ki, Məhəmməd Füzuli bir qitəsində deyir:

*Binəsib olsun Nəimü Xülddən ol zişt kim,*
*Namülayim ləhcəsi mövzuni namövzun edər.*

(Bizə bu qədər lazım olduğu üçün biz qitənin yalnız bir beytini verməklə kifayətləndik). Yəni, Nəim və Xülddən binəsib olsun o pis adam ki, onun namülayim olan ləhcəsi (şeiri düzgün oxuyub, düzgün tələffüz etməməsi) vəznli şeiri sındırıb, vəznsiz edər. Cənnətin yuxarıda qeyd etdiyimiz səkkiz guşəsi bunlardır: Ədn, Vəsilə, Firdövs, Xüld, Nəim, Məva, Darüs-səlam və darülqəvar. Füzulinin qitəsindən misal gətirdiyimiz beytdə şair vəznin tələbinə görə "Nəim"i qabağa salaraq, "Nəimü-Xüld" demişdir.

İndi də Nəsiminin Mürəbbesinin şərhinə qayıdaq. Yəni Allah-təala Adəmi (ə) Cənnətin Xüld və Nəim guşələrini kəramət göstərərək bəxş etmiş oldu və daş-qalaq edilərək, Allah dərgahından qovulmuş şeytandan başqa hamı (burada hamı dedikdə, mələklər nəzərdə tutulur) ona səcdə etdilər. Qədimdən Adəmin (ə) üzündə yeddi xətt yazmışdı ki, biz bunun nə demək olduğunu yuxarılarda izah etmişik. “Əlidən (ə) başqa cavan igid, Zülfüqardan da başqa qılınc yoxdur”.

*Nəmrudun mancanağından narə atıldı Xəlil,*
*Nari gülzar eylədi anə çün ol rəbbi-cəlil,*
*Bu mübarək ismi gəldi narə urdu Cəbrəil,*
*“La fəta illa Əli, la seyfə illa Zülfüqar”.*

Nəsimi mürəbbenin bu bəndində Quranın 21-ci “əl-Ənbiya” surəsində olan bir ayəyə işarət etmişdir. Həmin ayədə deyilir: “Pəs Allah-təala tərəfindən oda deyildi: “Ey od, İbrahim üzərinə soyuq və səlamət ol” Burada işlədilən “səlamət ol” sözü ona görədir ki, “soyuq ol” dedikdə, ola bilər ki, o zərər yetirən soyuq olsun; necə ki, Quranın 76-cı əslində “həl-əta” deyilən surəsində işlədilən “zəmhərira” ifadəsi bu mənadadır; Cünki cəhənnəmdə istilik olduğu kimi, elə bir guşə (yer və təbəqə) də vardır ki, o yer həddindən artıq soyuq olur ki, onun adına “zəmhərira” deyilir, lakin ayədə deyilən “səlamət ol” sözündən məqsəd “Ey od, İbrahim üzünə səlamətlik gətirən soyuq ol ki, İbrahim o soyuqluqdan zərər çəkməsin” lakin bu ayənin nazil olma səbəbi budur ki, o zamankı Babil padşahı Nəmrud, İbrahimin (ə) onu imana dəvət etməyini qəbul etməyib, İbrahimi öldürmək istədi. Bir mancanaq düzəltdirib, İbrahimi (ə) mancanağın üstünə qoyub, oda atdığı zaman cənabi Cəbrail (ə) nazil olub dedi: “Ey İbrahim (ə), ehtiyacın nəyədir? De yerinə yetirim.” İbrahim (ə) dedi: “Ehtiyacım var, lakin sənə yox Allahadır.” O zaman Allah-təala yuxarıda qeyd etdiyimiz həmin bu ayəni göndərdi və cənabi Cəbrail (ə) qanadı ilə vurub odu söndürdü; necə ki, Seyyid Əzim Şirvani bir qəsidəsində deyir:

*Eşq idi kim, Xəlilini hifz etdi nardən,*
*Söndürdü bir xitab ilə narın hərarətin.*

"Nar" – ərəb dilində "od" deməkdir və o yer gülüstana çevrildi; necəki biz bu barədə bir qədər yuxarıda müqəddəs ağaclardan bəhs etdiyimiz zaman danışmışıq və bəzi tarixçilərin yazdıqlarına görə o zaman cənabi Cəbrayıl (ə) bir köynək gətirib, İbrahimin (ə) əyninə geydirmişdi, bu həmən o köynəkdir ki, oğlu İshaqın (ə) vasitəsi ilə onun oğlu Yəquba (ə) və nəhayət ondan da, oğlu Yusifə (ə) yetişmişdi ki, həmin köynək vasitəsi ilə Yəqubun (ə) gözləri açılmışdır. Və beləlikldə Nəsimi mürəbbenin bu bəndində deyir: "Nəmrudun mancanağından Xəlil oda atıldı, aləmləri tərbiyət edən uca Allah onun üçün odu gülzar etdi, cənabi Cəbrayil (ə) gəldi bu mübarək adı həmin oda vurdu. "Əlidən (ə) başqa cavan igid yoxdur, Zülfüqardan da başqa qılınc yoxdur".

*Əyyuba oldu həvalə yeddi il rəncü bəla,*
*"Rəbbəna" söylərdi daim həzrətində "Rəbbəna!"*
*Uş bu ismi yad qıldı, buldu ol qəmdən nica,*
*"La fəta illa Əli, la seyfə illa Zülfüqar".*

Şair burada üçüncü misrada əslində "nicat" olmalı sözü qafiyənin tələbinə görə "nica" şəklində yazmışdır. Nəsimi deyir ki, Əyyuba (ə) yeddi il əziyyət və bəla çəkmək həvalə oldu, o, Allahın dərgahında olub, daima "Rəbbəna – yəni, ey bizim Allahımız və yaxud da ey bizi tərbiyə edən Allah!" söylərdi. O, bu adı (Əlinin (ə) adını) xatırladığı üçün o qəmdən nicat tapdı, "Əlidən (ə) başqa cavan igid, Zülfüqardan da başqa qılınc yoxdur".

*Samiri Firon üçün sehr etdi ba izni-Xuda,*
*Həm nida Musaya gəldi, saldı əlindən əsa.*
*"La təxafü" həqqinə gəldi bu ism ilən dua,*
*"La fəta illa Əli, la seyfə illa Zülfüqar".*

Samiri, yuxarılarda qeyd etdiyimiz kimi, Musa (ə) "Turi-Sina"ya qırx günlük səfərə getdiyi zaman danışan buzov icad edərək, bəni-İsrailin yarısını, "qüsaləpərəst" olmağa – yəni "buzova sitayiş etməyə" dəvət edən Musa ibn Zəfərin ləqəbidir; necə ki bu əhvalat Quranın "əl-Bəqərə" surəsinin 54-cü ayəsində qeyd olunmuşdur. Yəni şair deyir ki, Samiri Allahın izni ilə Firon üçün sehr etmişdir, həmçinin Musaya (ə) nida gəldi, o da əsanı yerə saldı, bu ad ilə "qorxma" – deyə onun haqqında Xudadan (Allah tərəfindən) dua gəldi, "Əlidən (ə) başqa cavan igid, Zülfüqardan da başqa qılınc yoxdur".

"La təxaf – yəni qorxma" ifadəsini Nəsimi Quranın 28-ci "əl-Qəsəs" surəsinin 22-ci ayəsindən götürmüşdür; belə ki, mürebbenin bu bəndinin 2-ci və 3-cü misralarının məzmunu məhz bu ayələrdən götürülmüşdür. Ayədə əslində "la təxaf" şəklində olan ifadə vəznin tələbinə görə "La təxafü" şəklində yazılmışdır. Həmin ayədə deyilir: "Ey Musa, əlindəki əsanı at, elə ki, Musa əlindəki əsanı atdı, gördü ki əsa canlanaraq tərpənir, sanki bir ilandır, Musa bunu görcək, tez qorxudan qaçmağa başladı, bu zaman Allah-təala Musaya (ə) dedi: "ey Musa, əsanı qəbul edib, yenidən əlinə al və qorxma, sən əsanın əjdahaya çevrilməsindən xatircəm olmuşlardansan".

*Ta Süleymani-nəbi oldu cahanda padşah,*
*İnsilə cinnü üyuz fərman idi ba hökmi-şah,*
*Xatəminin nəqşinə yazdı bu ismi şol ilah,*
*"La fəta illa Əli, la seyfə illa Zülfüqar".*

Elə ki, Süleyman (ə) cahanda padşah oldu, insanlar, cinlər və quşlar şahın hökmü ilə onun fərmanında idilər, onun üzüyünün nəqşinə (qaşına) ol ilah (Allah) bu adı yazdı, "Əlidən (ə) başqa cavan igid, Zülfüqardan da başqa qılınc yoxdur".

*Həqqin əmrilə gətirdi Cəbrəil adəm dəmi,*
*Həm məşamindən üfürdü, hamil etdi Məryəmi.*

*İsi onun ismini yad etdi, oldu həmdəmi",*
*"La fəta illa Əli, la seyfə illa Zülfüqar".*

(Kitabda ikinci misrada səhv olaraq, "kamil etdi Məryəmi" yazılmışdır; üçüncü misrada isə İsanı İsi kimi yazmaq həm vəzn, həmdə tələffüz qaydalarına görə daha münasibdir).

Şair deyir ki, Allahın əmri ilə cənabi Cəbrail (ə) adəm (insan) nəfəsi gətirdi, Məryəmin (s.ə) burnundan üfürməklə, Məryəmi (s.ə) İsaya (ə) yüklü etdi, İsa (ə) onun adını yad etdi və onun həmdəmi oldu, "Əlidən (ə) başqa cavan igid, Zülfüqardan da başqa qılınc yoxdur".

*Əhmədü Məhmudü Qasim çıxdı bər ərşi-məcid,*
*Həm Əsədullahı gördü, dərgəhə olmuş mürid,*
*Bərməzid olsun ona bu ismü dövlət, bərməzid,*
*"La fəta illa Əli, la seyfə illa Zülfüqar".*

Əhməd, Məhmud və Qasim Məhəmmədin (s) adları və künyətidir; belə ki, Əhməd onun aləmi-lahut (ilahiyyət aləmi) və aləmi-mələkutda (mələklər aləmi) adıdır. Məhmud onun sifətlərinə görə verilmiş ləqəbdir, mənası "tərifə layiq və bəyənilmiş" deməkdir. Qasim isə onun künyətidir; əslində "Əbülqasim"dir, lakin vəznin təbinə görə bu beytdə təkcə Qaim yazılmışdır və biz bu adlar və künyətin nə demək olduğunu birinci şeirin onuncu beytinin şərhində izah etmişik. İkinci misrada "dərgah" ifadəsi vəznin tələbinə görə "dərgəh" şəklində yazılmışdır. Əsədullah Allahın şiri (ərəbcə) deməkdir, bu da Əli (ə) ləqəblərindən biridir, mürid batini elm olan ürfani elmi təlim edən mürşidin şagirdinə deyirlər, lakin bu beytdə isə mürid istəkli olmaq mənasındadır.

"Bərməzid" ərəbcə "artıq olsun, həddən ziyadə olsun", məcid əzəmətli deməkdir. Yəni, Nəsimi deyir ki, Əhməd, Məhmud və Əbülqasim olan Muhamməd (s) əzəmətli olan göyə çıxdı, orada həm Əsədullahı gördü ki, Allah dərgahının istəklisidir, ona bu ad və bu dövlət həddindən artıq olsun, həddindən artıq! "Əlidən

başqa cavan igid, Zülfüqardan da başqa qılınc yoxdur”.

*“Getdi bu hicran dəmi, gəldi çün əyyami-bahar,*
*Səd hezaran mürğzar açıldı, oldu mürğzar,*
*Bülbülü qumri, mütəbbəq söylədi vəsfin hezar,*
*“La fəta illa Əli, la seyfə illa Zülfüqar”.*

Yəni, bu ayrılıq dəmi (zamanı, çağı vaxtı) getdi, bahar Əyyami (zamanı) gəldi; əyyam əslində lüğəvi mənada ərəbcə gün adlanan “yövm”ün cəmi olan “günlər” deməkdir; bülbül, qumri və qaranquş onun tərifini minlərlə söylədi, “Əlidən (ə) başqa cavan igid, Zülfüqardan da başqa qılınc yoxdur”.[1]

*Dünyəyə gəldi Əli, çün adı oldu Şahsuvar,*
*Yerlər anın ismi ilə çünki tutdular qərar,*
*İslam anın ismilə islama gəldi iftixar,*
*“La fəta illa Əli, la seyfə illa Zülfüqar”.*

*Ta xəyalinlə könül mülkündə seyran eylərim,*
*Bən bəni ol şahımın mədhində heyran eylərim,*
*Bən Nəsimiyəm, Şəhin vəsfini dastan eylərim,*
*“La fəta illa Əli, la seyfə illa Zülfüqar”.*

Yenidən mövzunun üzərinə qayıdırıq. Ühüd müharibəsinin tarixi təsviri belədir: Hicrətin üçüncü ilinin hadisələri əhəmiyyətlilik baxımında ikinci ilin hadisələrindən heç də geri qalmır. Əgər Hicrətin ikinci ilində Bədr döyüşü baş vermişdisə, Hicrətin üçüncü ilində Ühüd döyüşü baş verdi ki, hər ikisi islamın böyük və əhəmiyyətli döyüşlərindən sayılır.

Əbu Süfyan öz qoşununun bayraqdarlarına xitabən “Qoşunun qələbəsi bayraqdarların səy göstərmələrinə bağlıdır. Biz Bədr

[1] Ramiz Faseh. “S.İ.Nəsiminin seçilmiş bəzi şeirlərinin şərhi”. Bakı, “Şərq-Qərb”, 2007. səh. 289-294

günündə elə bu səbəbdən məğlub olduq. Əgər bəni Əbdüd-dad qəbiləsi, bayrağı saxlamaqda səy göstərə bilməyəcəklərsə, elə indidən bayraqları başqa qəbiləyə versinlər” – deyəndə döyüş başlandı bu vaxt bayraqdarlardan biri olan Təlhəd ibni Əbi Təlhə irəlləyib mübarizə istədi və dedi: – Ey Muhammədin (s) tərəfdarları siz deyirsiniz ki, bizim ölülərimiz cəhənnəmdə, sizinkilər isə cənnətdədir, bu halda sizdən bir nəfər varmı ki, onu cənnətə göndərim və ya o, məni cəhənnəmə göndərsin?.

Onun nərəsi meydanda dolaşırdı ki, Əli (ə) irəlilədi, qısa müddətli vuruşdan sonra onu torpağa sərdi. Qureyş ondan başqa səkkiz nəfəri, ehtiyat üçün bayraqdar seçmişdi, hamısı da bəni Əbdud-dad qəbiləsindən idilər, hamısının əlində bayraq var idi. Ardıcıl olaraq mübariz istədilər, hamısı da Həzrəti-Əlinin (ə) qılıncı ilə öldürüldülər. Sonra vahiməli siması, enli kürək Həbəşli Suab adlı bir qul bayrağı götürdü. Onun məqsədi Həzrəti-Rəsulu (s) öldürmək idi. Qəzəbindən gözləri qızarmış və ağzı köpüklənmişdi. O da Əlinin (ə) qılıncı ilə məhv edildi.[1]

Qureyş qoşunları islam qoşununun şücaətini gördükdən sonra həlqə qurub xüsusi ahənglə şeir oxuyaraq öz qoşunlarına deyirdilər: “Əgər düşmənlə qarşı-qarşıya dursanız, sizinlə qol-boyun olacağıq və əgər düşmənə arxa çevirsəniz, sizdən ayrılacağıq”.

Bu qədər tədbirlərlə belə, Qureyş qoşunu onda biçarə oldu ki, on nəfər bayraqdarın hamısını itirdi, vəhşət və qorxu onlara hakim oldu, hamı qaçmağa üz qoydu və müsəlmanlar qalib gəldilər.

Nəsimi və Xətai kimi klassiklərimizin bu səpkili beytləri 19-cu əsr Azərbaycan poyeziyasında güclü təsir göstərmişdir. Daha çox Əli (ə) eşqində qələm çalan Əbül Qasim Nəbati Xançobani məhşur bir müsəddisində “Ühüd” döyüşündə Həzrəti-Əli (ə) şücaətini belə təsvir edir:

[1] Əllamə Məclisi. “Biharül-ənvar”. 110 clddə, 20-ci cild. səh. 51

*Çünki Peyğəmbər Ühüd rəzmində qaldı bipənah,*
*Gövhəri-dəndanı sındı, oldu halı çox təbah,*
*Ləşgəri buldu həzimət, getdi əldən dəstigah,*
*Zikr edib bu ismi-pakı, çəkdi canından bir ah:*
*"Şahi-Mərdan, şiri-Yəzdan, Heydəri-Düldülsəvar,*
*La fəta illa Əli, La seyfə illa Zülfüqar".*

(Ühüd döyüşündə Peyğəmbər (s) köməksiz qaldığından inci kimi dişləri sındırıldı və vəziyəti olduqca kəskinləşdi, onun həyatı üçün təhlükə yarandı. Ordusu başı pozuqluğa uğradı və qoşunu idarə etmək mümkün olmadı. O, Həzrəti-Əlinin (ə) pak-pakizə adını dərin sayğı və sevgi ilə dilə gətirərək ürəkdən bir ah çəkdi. Həmin ah bundan ibarət idi: "Ey mərd kişilərin hökmüdarı, sən ey Allahın şiri, sən ey asta yerişli Düldülə minmiş yenilməz igid, axı Tanrı özü buyurmuşdur ki; "Əlidən (ə) başqa igid, Zülfüqardan başqa qılınc yoxdur").

Göründüyü kimi istər Xətainin beyti, istərsə Nəbatinin bəndi yuxarıda haqqında məlumat verilmiş tarixi hadisəni bədii baxımdan ustalıqla tamamlamaqdadır.

Şair burada "Ühüd" müharibəsinə və həmin müharibədə Həzrəti-Əli (ə) haqqında buyurulmuş hədisə işarə edir. Bu hədisin istinadgahlarından biri belədir:

"Ühüd" müharibəsində Həzrəti-Əli (ə) butün qüdrəti ilə Peyğəmbərin (s) müqəddəs vücudundan mühafizə edirdi və düşmənləri öldürürdü. Orada olanlar göydən bir səs eşitdilər. Həmin səs (Cəbrailin (ə) səsi) bundan ibarət idi ki: "La fəta illa Əli, La seyfa illa Zülfüqar– İgid yalnız Əli, qılınc yalnız Zülfüqardı".

Bu qılıncın Zülfüqar adlandırılmasının hikməti barədə İmam Sadiqdən (ə) sual etdilər. İmam Sadiq (ə) onların cavabında buyurdu: "Həmin qılıncın orta hissəsində xüsusi fəqərələrə (insanın onurğa sütununun fəqərələrinə) oxşayan bir xətt olduğu üçün bu qılıncın adı Zülfüqar idi, yəni, fəqərələrə sahib olan. Zülfüqar

həlqəsi gümüşdən olan bir qılıncdır, Cəbrail (ə) onu göydən gətirmişdi”.[1]

Onu da qeyd edək ki, Ühüd müharibəsində Həzrəti-Əlinin (ə) fədakarlığı elə bir həddə çatdı ki, vəhy mələyi Cəbrail (ə) Peyğəmbərə (s) nazil olub buyurdu “Ey Muhammad! (s) Bu qardaşlıq və fədakarlıq mənasıdır”. Peyğəmbər (s) buyurdu: “İnnəhu minni vəl ənə minhu” -yəni Əli məndən və mən ondanam”. Cəbrail (ə) buyurdu: “Və ənə minkumə” – “mən də sizin ikinizdənəm” Ühüd müharibəsində Həzrəti-Əlinin (ə) fədakarlığı elə şövkətli idi ki, Peyğəmbər (s) ondan olması ilə iftixar edirdi və Cəbraildə (ə) arzu edirdi ki, Peyğəmbərdən (s) və Əlidən (ə) olsun, yəni Cəbrail (ə) Peyğəmbər (s) və Həzrəti-Əlinin (ə) malik olduğu fəzilətlərə malik olmaq istəyirdi.[2]

***8-ci beyt:***

*Kim qalur ruzi-qiyamət hövli-məhşərdə susuz,*
*Onda sənsən saqiyi-əbrari-kövsər, ya Əli! (8;276)*

(Qiyamət günündə məhşər sorğu-sualının ağırlığından əmələ gələcək qorxunun nəticəsin də susayan hər bir kəsə – kövsər hovuzunun ətrafındaki əməli saleh adamların hamısına məhz sən su verəcəkcən ya Əli!).

Xətai burada Həzrəti-Əlinin (ə) mədhini olduqca geniş miqyasda götürür. Belə ki, beytin ümumi məzmunundan oxucu qiyamət günü və məhşər səhrası haqqında aydın anlayış əldə edə bilir. Bu anlayışı islami baxımdan şərtləndirən başlıca amillər yerində isə qiyamətin dəhşət və vəhşətini əks etdirən bir xeyli adı durur. Məsələn; “Yovm əl-həsrət”, “Yovm əl-muhasəbə”, “Yovm əl-məsələ”, “Yovm əl-vaqiə”, “Yovm əl-qariə”, “Yovm

---

[1] Məhəmməd Həsən Muini. “On dörd məsum haqqında sual-cavab”. Bakı, 2009. səh. 87

[2] Məhəmməd Həsən Muini. “On dörd məsum haqqında sual-cavab”. Bakı, 2009. səh. 88

əl-racifə”,

“Yovm əl-firaq”, “Yovm əl-hisab”, “Yovm əl-tənad”, “Yovm əl-əzab”, “Yovm əl-firar”, “Yovm əl-həqq”, “Yovm əl-hökm”, “Yovm əl-fəsl”, “Yovm əl-cəm”, “Yovm əl-din”, “Yovm tubləs-sərair”, “Yovmə la yuğni mövla ən mövla şeyən”, “Yovmə yəfirrul-məru min əxih”, “Yovmə la yənfəu malun və la bənun”, “Yovm əl-təğabun”

1. Hesab günü (“Ğafir”, 27); 2. Din günü; 3. Həsrət günü; 4. Ziyan günü; 5. O gün ki, kişi öz qardaşınnan, həyat yoldaşından və balalarından qaçar; 6. O gün ki, nə mal fayda verər nə övlad; 7. Çırpıb əzən hadisə (“Qariə”, 1); 8. Böyük hadisə (“Vaqiə”, 1); 9. Ayıq vicdan; 10. Əsəd; 11. Saat günü.

Bundan başqa “susuz, saqi, kövsər” sözlərinin əmələ gətirdiyi mənzərə məmduhun qiyamət günündəki və məhşər səhrasındakı dəyəri, önəmi, yeri və çəkisiylə bağlı məxsusi təsəvvür formalaşdıra bilir. Odur ki, beytin ümumi məzmunu və fikiri axarını yetərincə qavramaqdan ötrü “saqiyi, əbrari, kövsər” ifadəsi üzərində ayrıca dayanmaq gərəkdir.

Təfsirlərdə “kövsər”ə 25-dən çox məna verilmişdir. “Kəsərə” kökündən gələn və çoxluq anlamını verən bu söz, cənnətdə bir hovuz, cənnətdə bir çay, Muhamməd (s) ümməti, müsəlman alimləri seyyid, peyğəmbər (s) övladları və s. şəklində izah edilmişdir. Bunların hamısı demək olar ki, Peyğəmbər (s) nəslini davam etdirən yeganə övlad kimi xanım Fatimeyi-Zəhra (s.ə) ilə bağlı olduğundan “kövsər” surəsinə əsasən bu sözdə daha çox Fatimeyi-Zəhranın (s.ə) nəzərdə tutulduğu düşünülür. Lakin burada söhbət qiyamət günündən və məhşər səhrasından getdiyi üçün “kövsər”in cənnət hovuzu, yaxud cənnət olmasını düşünmək daha çox yerinə düşərdi.

“Əbrar” – “birr” sözünün cəmidir. Doğru danışan, iman gətirən, yaxşı adam, kamil şəxs demək olan “birr” sözü Qurani-kərimdə hər tərəfli surətdə səciyyələndirilir.

“Onlar sizin nə etdiklərinizi bilirlər. Həqiqətən, yaxşılar bol nemətlər içində olacaqlar”. (“İnfitar”, 12-13).

(Əməllərin gözətçiləri: “Gözətçilər” deyilərkən burada insan-

ların yaxşı və pis əməllərini qoruyub saxlayan mələklər nəzərdə tutulur. Quranda başqa ayələrdə də əməllərə nəzarət edən bu mələklərdən danışılmışdır (“Qaf”, 17) Bir nəfər İmam Sadiqdən (ə) soruşur: “Allah sirləri və sirlərdən gizli olanları da bildiyi halda, insanların yaxşı və pis əməllərini yazıb saxlayan mələklərə nə ehtiyac var?” İmam (ə) buyurur:

“Allah-təala bu mələkləri özünə ibadət etməyə çağırdı və onları bəndələrinə şahid etdi ki, bəndələr onların nəzarət etdiyini nəzərə alıb Allaha itaətdə daha diqqətli, itaətsizlik göstərdikdə daha çox narahat olsunlar. Çox bəndə var ki, günah etmək istədikdə bu iki mələyi xatırlayıb qərarından daşınır, nadanlıq etməkdən əl çəkir, özünü günahlardan saxlayaraq deyir: “Rəbbim məni görür, əməllərimi yazıb saxlayan mələklər şahidlik edir.” Bundan başqa, Allah bu mələkləri ona görə ayırıb ki, Allahın əmrilə həddi aşmış şeytanları insanlardan uzaqlaşdırsınlar, onları Allahın (ölüm, əcəl) fərmanları yetişənə qədər görüb xəbərdar olmadıqları ziyanverici canlılardan və bəlalardan qorusunlar”. Onlar əməlləri yazmaqla yanaşı, insanları xoşagəlməz hadisələr, bəlalar və şeytanların vəsvəsələrindən də qoruyurlar. Allah-təala bu mələkləri bir-birini tamamlayan dörd xüsusiyyətlə səciyyələndirmişdir:

1. İnsanların əməllərinin gözətçiləridirlər.

2. Hörmət sahibləridirlər. Onlar insanların əməllərini yazmaq vəzifəsi daşısalar da, kobudluğa yol vermir. Nəzakətlə, alicənabliqla davranırlar, yaxşı əməlləri dərhal on bərabər yazır, pis əməllərin yazılmasını bir neçə saat təxirə salır, onun tövbə edib qayıtmasını gözləyirlər. Onların böyüklüyü həm də ondadır ki, yaxşı əməlləri göylərə qaldırıb mələklər arasında yayır, pis əməllərə gəldikdə isə, Allahın eybləri örtən xüsusiyyətindən ilhamlanaraq onları gizlədirlər.

3. İnsanların əməllərini yazır və qoruyub saxlayırlar. Bunun üçün hər tərəfli bilgiyə malik olmaq lazımdır.

4. “Onlar sizin nə etdiyinizi bilir”, – deyə buyurulur. Bu məz-

mun həm sözlər, həm üzvlərin gördüyü işlər, həm də niyyətlərə şamildir.[1]

"Sevdiyiniz şeylərdən (Allah yolunda) sərf etməyincə xeyirə çatmazsınız. Allah verdiyiniz sədəqədən xəbərdardır"! ("Ali-İmran", 92).

Ərəb dilində "Birr" xeyir və yaxşılığın çoxluğu deməkdir. Bu söz qəlbdə və əməldə olan bütün yaxşılıqlara şamil olur. "Bəqərə" surəsinin 177-ci ayəsində belə buyrulmuşdur:

"Yaxşı əməl (yalnız namaz vaxtı) üzünü Şərqə və ya Qərbə tərəf çevirməyiniz deyil (və yaxşı əməl yalnız qiblənin dəyişilməsi haqqında danışmağınız və bütün vaxtınızı ona sərf etməyiniz deyil). Yaxşı əməl (sahibi) əslində Allaha, axirət gününə, mələklərə, (səmavi) kitaba və Peyğəmbərlərə (ə) inanan, mal-dövlətini çox sevməsinə baxmayaraq, onu qohum-əqrəbaya, yetimlərə, yoxsullara, yolda qalan müsafirə, dilənçilərə və qulların azad olunmasına sərf edən, namaz qılan, zəkat verən, (eləcə də) əhd bağladıqda əhdinə vəfa edən, dar ayaqda, xəstəlikdə və cihad zamanı səbr edənlərdir (mətin olanlardır). Onlar doğru danışanlardır (sözləri etiqadlarına uyğundur). Təqvalı olanlarda məhz onlardır." Bu ayədə bütün yaxşılıqlar müxtəsər şəkildə sadalanmış və "birr" sözünün geniş mənası verilmişdir. Sözü gedən ayədən mömінin sevdiyi şeylərdən xərcləməsi xeyirxahlığa və yaxşılıqlara nail olmağın əsas vasitələrindən biri hesab edilmişdir. Bu məsələyə israr edilməsinin səbəbi də budur ki, insanın maldan ayrılması çox çətindir. Malından və sərvətindən ayrılmağa hazır olan şəxs xeyriyyəçilik zirvəsi istiqamətində böyük addıma imza atmışdır.[2]

---

[1] "Nümunə", c.26, səh. 224; "Pəyame-Quran", c.6, səh. 93; Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 587

[2] "Əl-Mizan", c.3, səh. 394; Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 62

"Saqi" sözü də Quran leksikonu üçün yad deyildir. Bu obrazla bağlı ən aydın anlayış aşağıdakı ayədə əksini tapmışdır:

"İnnəl əbrarə yəşrəbunə min kəsin kənə mizəcuhə kəfurə-Sözsüz ki, möminlər xoş ətirli (şərab dolu) badələrdən nuş edəcəklər" ("İnsan", 5)

Deməli, Xətai "saqeyi-əbrari-kövsər" dedikdə bir çox cəhətdən əsaslandırılmış şəkildə Həzrəti-Əlinin (ə) möhtəşəm bədii portiretini yaratmışdır. Çünki, beytdə Həzrəti-Əlinin (ə) lütfükarlığı, rəhmdilliyi də aydın görünür.

***9-cu beyt:***

*Sənsən ol Səftər ki, dəsti möcüzatini görüb,*
*Hökmünə ram oldu "Şam"ü, "Rum"ü, "Bərbər", ya Əli!*

*(8; 277)*

(Möcüzəli əlinin sərraf zərbələrini görüb Şam, Rum və Bərbər məmləkətlərinin əhalisini danışıqsız olaraq əmrinə baş endirən böyük rəhbər yalnız sənsən ya Əli!)

Beytin fikri axarını və bədii tutumunu aydınlaşdırmaqdan ötürü, ilk növbədə "dəsti möcüzat" ifadəsi açılmalıdır. Əksi təqdirdə səriştəsiz oxucu Xətainin burada ifrata vararaq, yalnız peyğəmbərlərə (ə) aid olan möcüzə göstərmək keyfiyyətini imama - da (ə) şamil etdiyini düşünə bilər. Halbuki, şair "dəsti möcüzat" dedikdə burada Həzrəti-Əlinin (ə) imamlıqdan irəli gələn kəsərli, kəskin, çevik, kəramətini yox, boşa getməyən sərraf qılınc zərbələrini nəzərdə tutur.

Bu beytdə "nət"lər üçün səciyyəvi olmayan yer adlarının çəkilməsi, Xətainin navatorluğu və orjinallığıdır.

"Şam", "Rum", "Bərbər" – dedikdə şair Həzrəti-Əlinin (ə) 4 il 9 ay çəkən xəlifəliyi zamanı islam qoşunlarının ali baş kamandanı kimi ilkin müsəlman dövlətinin təsirini genişləndirdiyi Asiya və Afrika qitəsindəki bəzi əraziləri nəzərdə tutur. Böyük ehtimalla fərz etmək olar ki, "Şam" – indiki Suriyaya, "Rum" indiki Türkiyəyə qədim Yunanıstan ərazisinə, "Bərbər"də Afrika tor-

paqlarına işarədir.

***10-cu beyt:***

*Ol Əlisən kim, şəhadət barmağın qüllab edib,*
*Qopdi yerdən qüdrətinlə babi-Xeybər, ya Əli!.*

*(8; 277)*

(Ya Əli (ə), sən o Əlisən ki, özünün şəhadət barmağını vasitə edərək tükənməz güc qüdrətinlə Xeybər qalasını yerindən qopardın).

Birinci dəfə deyildir ki, qəsidənin ya Əli (ə) olmasına baxmayaraq, şair bu din böyüyünün əziz və şərəfli adını dönə-dönə sayğı və sevgi ilə təkrarlayır, dərin hörmət hissi ilə dilə gətirir və bunu özü üçün böyük bir şərəf bilir.

Beytin başlanğıcını – "ol Əlisən kim" ifadəsini məhz bu cür başa düşmək gərəkdir. Əgər kimsə bunu poetik naşılıq hesab edirsə, deməli o, şair şahın saf Əli (ə) məhəbbətindən xəbərsizdir.

Özlüyündə gün tək aydındır ki, beytdə Xeybər qalasının fəthi tərənnüm olunur.

"Ühüd" müharibəsində olduğu kimi Xeybər qalasının fəthini də Nəbati qələmə almışdır:

*Çünki Xeybər qələsində qaldı aciz Mustafa,*
*Naümid oldu ki, hasil olmaz oldu müddəa,*
*Gəldi ta ki, Cəbrəil, gətirdi fərmani-Xuda,*
*Söylədi: "bu zikri təkrar et ki, gəlsin Mürtəza",*
*Şahi-Mərdan Şiri-Yəzdan, Heydəri-Düldülsəvar,*
*La fəta illa Əli, la seyfə illa Zülfüqar!*[1]

("Həzrəti-Muhammməd (s) Xeybər qalasını fəth etməkdə çətin-

[1] Seyid Əbülqasim Nəbati. "Seçilmiş əsərləri". Bakı, "Yazıçı", 1985. səh. 123

lik çəkdiyi və qalanın fəthindən ümidini kəsdiyi bir zamanda mələk Cəbrail (ə) gəlib Allahın əmrini gətirdi ki, ya Rəsulallah! (s) İgidlərin hökmdarı, Allahın şiri, asta yerişli Düldülün minicisi və özündən başqa igid, Zülfüqarından da başqa qılınc olmayan şəxs!" – zikrini durmadan dilinin əzbərinə çevir ki, "Mürtəza" Allahın razı qaldığı, ilahi razılığı qazanmış Həzrəti-Əli (ə) dadına çatsın).

*Heydərü Səftər qopardı çünki babi-Xeybəri,*
*Qıldı qalxan başinə onu ərənlər sərvəri.*
*İki böldü şir tək ol dəmdə Əmrü Əntəri,*
*Söylədi göydə mələklər, yerdə insanü pəri:*
*"Şahi-Mərdan, Şiri-Yəzdan Heydəri-Düldülsəvar,*
*La fəta illa Əli, la seyfa illa zülfüqar".*[1]

(O, qorxmaz igid bir əliylə Xeybərin qapısını qoparır, başı üzərində qalxana çevirdiyi üçün, O, həll edici anda bir şir kimi Əmrü Əntəri iki yerə parçaladı. Bunu görən mələklər göydə insanlar və pərilər isə yerdə Həzrəti-Əliyə (ə) bu şəkildə əhsən dedilər: "Ey mərd kişilərin hökmdarı, sən ey Allahın şiri, sən ey asta yerişli Düldülə minmiş yenilməz igid, axı tanrı özü buyurmuşdur ki; Əlidən (ə) başqa igid, Zülfüqardan başqa qılınc yoxdur).[2]

***11-ci beyt:***

*Ol kəramət kanısan kim, Haq-təaladən sənə,*
*Şərqü-Qərbü ərşü kürs oldu müsəxxər, ya Əli!*

*(Q.8, səh.277)*

(Ya Əli (ə) sən Ulu yaradan tərəfindən Şərq-Qərbin, ərş və

---

[1] Seyid Əbülqasim Nəbati. "Seçilmiş əsərləri". Bakı, "Yazıçı", 1985. səh.123
[2] Axund Hacı Soltan Hüseynqulu oğlu Əlizadə. "Azərbaycan dərvişləri və rövzəxanları". Bakı, "Boz Oğuz", "Nicat", 1995

kürsün ixriyarına verildiyi kəramət mənbəyisən)

Yuxarıda da deyildiyi kimi kəramət Peyğəmbərdən (s) çox İmama (ə) və övliyaya xas olan keyfiyyətdir. Xətai bu keyfiyyətin tanrı qatından gəldiyini, İlahi mənşədən qaynaqlandığını ayrıca vurğulayır və oxucunu öz səmimiliyinə inandıra bilir.

Digər tərəfdən unutmayaq ki, Ulu yaradan şanlı kitabında göylərdə və yerdə olanların hamısından bir qədərini insanların ixtiyarına verildiyini buyurur: "Gəmilərin onun əmri ilə dənizdə üzməsi və sizin də onun lütfündən faydalanmağınız üçün dənizi sizə ram edən Allahdır. Bəlkə şükür edəsiniz"; Göylərdə və yerdə olanların hamısını Özü sizə ram etmişdir. Bunda düşünən adamlar üçün nişanələr vardır. ("Casiya", 12-13).

Odur ki, Şərqü-Qərb ifadələri heç bir halda qəribə qarşılanmamalıdır.

Həzrəti-Əlinin (ə) yüzlərlə fəziləti içərisində belə nümunələr kifayət qədərdir: Bu səbəblə də Həzrəti-Əlinin (ə) kəramətlərindən bir neçəsini burada qeyd edirik.

İbni Abbas deyir: "Məkkəni fəth edib qayıdaraq, gecə vaxtı Həvazendə[1] idik. Peyğəmbər (s), Əli ibni-Əbi Talibə (ə) buyurdu: "Ey Əli (ə)! Qalx, Allah yanında olan dərəcəni dərk et! Günəş doğan zaman onunla söhbət et!" Mən Fəzlə dedim: Qalx ayağa görək Əli (ə) günəş ilə necə söhbət edir. Günəş doğdu Əli (ə) ayağa qalxıb, ona xitab edərək dedi: Salam olsun Sənə, Ey Allahın itaətində həmişə duran saleh bəndə! Günəş onun cavabında dedi: Salam olsun sənə, ey Peyğəmbərin (s) qardaşı, canişini və Allahın xalqına olan dəlili! Bu zaman Əli (ə) şükür səcdəsi etməyə başladı. Gördüm Allahın Rəsulu (s) ayağa qalxdı. Əlinin (ə) başından tutub, onu ayağa qaldırdı. Həzrət (s) öz əlini, Əlinin (ə) üzünə çəkib buyurdu: Qalx mənim Həbibim! Asiman əhli sənin ağlamağına görə ağlayırlar, Allah-təala, səninlə yük-

[1] Məkan adıdır.

sək fələyi saxlayanlarla fəxr edir”.[1,2]

İmam Əli (ə) öz əshabı ilə birlikdə Babilə tərəf yola düşdülər. Yolun ortasında namaz qılmaq üçün münasib bir yer tapa bilməyib, hərəkətlərinə davam etdilər. Nəhayət, namaz qılmaq üçün münasib yer tapdılar. Amma günəşin batmasına çox az qalmışdı. Hərçənd Həzrəti-Əli (ə) bir qrup əshabı ilə namazını qılmışdı. Lakin əshabın bir qrupu namazını qılmamışdı. Buna görə də öz namazları barədə danışmağa başladılar.

İmam Əli (ə) onların söz-söhbətini eşitdikdən sonra, Allah-təaladan günəşin qaytarılmasını istədi. Allah-təala onun duasını qəbul etdi. Günəşi əsr namazının vaxtına qaytardı. Həzrətin (ə) əshabı namazını qılıb qurtardıqdan sonra, günəş qüruba endi. Camaat bu aşkar möcüzəni müşahidə etdikdən sonra, Allaha şükr edib, ondan bağışlanmaq istədilər. Bu xəbər hər tərəfə yayıldı.[3]

İmam Əli (ə) və onun əshabından bir neçəsi Kufə məscidində oturmuşdular. Bir kişi Həzrəti-Əliyə (ə) xitab edərək dedi: “Atam-anam sənə fəda olsun. Bu dəstənin (Müaviyəyə, Əmr As və s. işarədir) əlində olan dünyaya təəccüb edirəm. Siz bu dünyadan faydalanmırsınız”.

Həzrət (ə) buyurdu: “Sən təsəvvür edirsən biz dünyanı istəyirik bizə verilmir?”

Bu zaman bir ovuc xırda daş götürüb, öz möcüzəsi ilə cəvahirə çevirib, soruşdu:

– Bunlar nədir?

Dedim: Ən yaxşı növ cavahirdir. Həzrət (ə) buyurdu: “Əgər dünyanı istəsək bizim üçün həmişə var, lakin istəmirik”.

---

[1] Əmaliye-Səduq, səh. 351. Biharul-ənvar, 41-ci cild, səh. 177

[2] İrşadə-Müfid. səh. 161; Biharul-ənvar, 41-ci cild, səh. 172; Hacı Soltan Hüseynqulu oğlu Əlizadə. “Duayi-Heydəri və ya Həzrəti-Əli (ə) zirvəsinə bir baxış”. Bakı, “Tural-Ə” NPM, 2002. səh. 100-101

[3] İrşadə-Müfid. səh. 161; Biharul-ənvar, 41-ci cild, səh. 172; Hacı Soltan Hüseynqulu oğlu Əlizadə. “Duayi-Heydəri və ya Həzrəti-Əli (ə) zirvəsinə bir baxış”. Bakı, “Tural-Ə” NPM, 2002. səh. 100-101

Sonra əlindəki cavahirləri yerə atdı. "Yenidən xırda daşlar öz əvvəlki halına qayıtdı".[1]

Həzrəti-Əlinin (ə) əshabından bir neçəsi ona dedilər: "Həzrəti-Musa (ə) və Həzrəti-İsanın (ə) canişinləri, camaat üçün dəlil, nişanə və möcüzələr göstərdilər. Siz də əgər bizə möcüzə göstərsəniz qəlblərimiz inam və yəqinlik tapar".

İmam (ə) buyurdu: "Sizin nişanə, dəlil və möcüzəni görməyə dözümünüz yoxdur".

Amma camaat israr etdi. Nəhayət Əli (ə) camaatı qəbristanlığa tərəf apardı. Onlar quru və şoran olan bir məntəqəyə çatdılar. Bu zaman yavaş səslə dua edib dedi: "Öz pərdələrini kənara çək".

Qəflətən səhranın bir tərəfində bağlar, çaylar, başqa bir tərəfində isə cəhənnəmin atəşi aşkar oldu. Bəziləri dedi: Bu sehrdir. Bəziləri isə Həzrətin (ə) möcüzəsini qəbul edib dedilər: Peyğəmbər (s) buyurardı: "Qəbir, behişt bağlarından biri, ya cəhənnəm çalalarından biridir".[2]

Salman deyir: "Bir neçə nəfər, Peyğəmbərin (s) hüzurunda oturmuşduq. Bu zamanda Həzrəti-Əli (ə) də gəldi. Peyğəmbər (s) bir ovuc çınqıl daşını götürüb ona verdi. Daşlar hələ Həzrəti-Əlinin (ə) əlində qərar tutmamışdı ki, dil açıb dedilər: "Allahdan başqa, Allah yoxdur, Həzrəti-Muhamməd (s) onun elçisidir. Razı oldum ki, Allah mənim Pərvərdigarım, Həzrəti-Muhamməd (s) Peyğəmbərim və Həzrəti-Əli (ə) isə mənim ağamdı" – "La ilahə illəllah, Muhammədun Rəsulullahi rəzityutü billahi Rəbbən və bi Muhammədin nəbiyyən və bi Əliyyəbnə Əbi Talibin vəliyyən"

Həzrəti-Peyğəmbər (s) buyurdu: "Sizlərdən hər kəs, Allahı və

---

[1] Bəsairüddərəcat, səh. 109. Biharul-ənvar, 41-ci cild, səh. 255; Hacı Soltan Hüseynqulu oğlu Əlizadə. "Duayi-Heydəri və ya Həzrəti-Əli (ə) zirvəsinə bir baxış". Bakı, "Tural-Ə" NPM, 2002. səh. 102-103

[2] Biharul-ənvar. 41-ci cild, səh. 24; Hacı Soltan Hüseynqulu oğlu Əlizadə. "Duayi-Heydəri və ya Həzrəti-Əli (ə) zirvəsinə bir baxış". Bakı, "Tural-Ə" NPM, 2002. səh. 104-105

Əliyyibni Əbitalibin (ə) vilayətini qəbul edib razı olsa, Allahın əzabından amanda qalar”.[1]

***12-ci beyt:***

*Üç yüz ildən sonra Səlman aldı səndən imtahan,*
*Verdün onun dəstinə gül tazəvü tər, ya Əli! (8; 227)*

(Səlmani Farsi 300 yaşında ikən sənə verdiyi imtahandan alnı açıq, üzü ağ çıxdı. Ya Əli (ə), bu münasibətlə sən onun əlinə tazə tər gül dəstəsi verdin).

Bu motvlə şairin başqa şeirlərində də rastlaşırıq:

*İfritin bəndini aldın, üç yüz ildən sonra sən,*
*Dəşti-Ərjəndə keçən kərrar sənsən ya Əli!*
*(Q.396. səh.252)*

Beytin təlmih üzərində qurulması şübhəsizdir. Lakin bu ifadə vasitəsiylə şairin hansı əhvalata işarə etdiyini tapmaq çox çətindir. Odur ki, biz burada şifahi nitq mənbələrinə müraciət etməyə məcburuq.

Əslən Cəsubi Azərbaycandan olan Ağayi Müctəba Xani belə bir əhvalat nəql edir ki, İranın Pars vilayətinin Şiraz şəhərində Dəşti-Ərjəndə (Ərjəqdə çölü) adlı bir çəmənlik var imiş və hazırda da vardır. Həmin çəmənlikdə çox nadir çiçəklər bitir. Ağız ədəbiyyatında dolaşan, Dəşti-Ərjəndə çölündə Səlmanla bağlı baş vermiş bir hadisəni əziz oxucuların diqqətinə çatdırmaq istərdik: Səlmanın əvvəl adı Ruzbeh ibn Buzəhşan olub. Həmin çöldə vaxtilə Səlmanın başına maraqlı bir hadisə gəlib. Belə ki, Səlman kiçik yaşlarından haqq axtarışında olub. Onun bu axtarışı ailədə narahtçılığa səbəb olurmuş. Atası ona çox öyüd-nəsihət

[1] “Biharul-ənvar”, 41-ci cild, səh. 351; Hacı Soltan Hüseynqulu oğlu Əlizadə. “Duayi-Heydəri və ya Həzrəti-Əli (ə) zirvəsinə bir baxış”. Bakı, “Tural-Ə” NPM, 2002. səh. 105-106

verir ki, mənsub olduğu dinə tabe osun. Səlmanın qəlbində olan haqq sevgisi onu tamam ədyanları (dinləri) gəzməsinə sövq edir. Deyilənə görə o, əvvəl günəşpərəst, aypərəst, ulduzpərəst olur. Bunların heç birindən nicat olmur. Atası ona yenə də tövsiyyə edir ki, bu axtarışlardan əl çəkib ata-babasının mənsub olduğu dinə tabe olsun. Lakin, Səlmanın daxilində olan haqq sevgisi onu axtarışından dayandırmır. Atasının sözlərinə məhəl qoymayan Səlman haqq dinin arxasınca piyada çox gəzib dolanır. İş o yerə çatır ki, atası ictimai qınaqdan ehtiyat edərək Səlmandan can qurtarmaq üçün yollar axtarır. Bu məqsədlə onu Dəşti-Ərjəndəyə odun gətirmək bəhanəsi ilə göndərir. Düşünür ki, Dərşti-Ərjəndənin vəhşi təbiətindən sağ çıxa bilməz və məsələ bununla bitər.

Səlman həmin çölə gəlir, odun yığdıqdan sonra yorğunluğunu almaq üçün yaxınlıqdakı gölün kənarına gəlir. Paltarını çıxarıb gölün kənarına qoyub suya girir. Bu zaman Səlman görür ki, bir aslan gəlib gölün kənarında dayandı. Bu aslanın heybətindən Səlman vahiməyə düşür və əl-aman çəkib həqq-təaladan kömək istəyir. Bu zaman bir ağ atlı kimsənə gəlir. Aslan o kimsənəni görən kimi onun heybətindən qorxub qaçır. Səlman xilas olur və o böyük şəxsiyyətin köməkliyi ilə öz canına nicat verir. Bu hadisədən sonra Səlman ağ atlı kimsənəyə təşəkkür əlaməti olaraq bir dəstə nərgiz gülü hədiyyə edir. Bu zaman atlı Salmana deyir: "Geriyə bax".

Salman geriyə dönərkən o kimsənənin qeyb olduğunu görür. Səlman odunları götürüb evə qayıdır. Atası onun sağ-salamat qayıtdığını görüb gözlərinə inanmır.

Məmləkətin şahının oğlu ilə çox yaxından dostluq edən Səlman onunla bərabər öz yaşyış yerini tərk edir və birlikdə səyahətə çıxırlar. Onlar bir məntəqəyə varid olurlar və görürlər ki, bir keşiş əlində kitab oxuyur. Yaxınlaşıb ondan əlindəki kitabın nə olduğunu soruşurlar. Həmin keşiş əlindəki kitabın İsaya (ə) nazil olmuş ilahi kitab olan İncil olduğunu deyir. Onlar həmin məsihidən bu kitabda olan xəbərlərdən soruşurlar. Məsihi deyir: İsa peyğəmbərə bu kitabda ondan sonra gələcək və Məkkədə zühur

edəcək son peyğəmbər barədə müjdə verilir. Onlar Məsihi ilə vidalaşıb yollarına davam edirlər və öz axtarışlarında olurlar. Bir gün Səlman eşidir ki, məsihinin ona dediyi İncildə adı gələn peyğəmbər zühur edibdir. Səlman Məkkəyə gəlir. Peyğəmbərin sorağına gedir və ona beyət edir. Peyğəmbərin yanında olan Əlini görür. Peyğəmbərə ərz edir ki, mən bu şəxsin simasında haqqin nurunu görürəm və icazə versən mən ömrümün axırına qədər onun xidmətində dururam. Peyğəmbər onun təklifini qəbul edir və adını dəyişib Səlman (Səlman islam sözündən olub təslim olan deməkdir) qoyur.

Beləcə günlər keçir. Demək olar ki, daim Peyğəmbər, Əli və Səlman birgə olurlar. Bir gün Peyğəmbər Səlmana buyurdu ki, sənin Nuxilistanda bir xurma bağın var. Bizi o bağdakı xurmalara qonaq edərsənmi? Səlman: Bəli, ya Rəsul Allah deyə cavab verir. Hər üçü Səlmanın xurma bağına gedirlər. Ev sahibi olaraq Səlman xurma ağacının başına çıxır və xurmalardan dərib Həzrəti-Əliyə verir ki, həm peyğəmbərə versin, həm də özü yesin. Həzrəti Əli (ə) bu işə əncam verərkən özü yediyi xurmaların tumunu barmaqları arasına qoyub çırtma ilə Səlmana atır. Bu işdən narahat olan Səlman deyir ki, ey uşaq, məni niyə bu qədər incidirsən? Həzrəti-Əli (ə) buyurdu ki, ey Səlman, mənə uşaq deyirsən? Səlman ərz etdi ki, yaş nisbətində əlbəttə, mənim yaşım 300-dən artıqdır. Həzrət Əli (ə) buyurdu ki, Ey Səlman Dəşti-Ərjəndə deyilən çəmənlik yadındadırmı? dedi Bəli. Buyurdu ki, sən orada bir aslanın qorxusundan gölün içində aciz qalmışdın, bir ağ atlı gəlib bu aslanın hüzurunda dayanarkən aslan o şəxsin heybətindən qorxuya düşüb kənarlaşdı. Sən o göldən kənara çıxıb libasını geyindin və səni aslandan xilas edən şəxsə təşəkkür əlaməti olaraq bir dəstə nərgiz gülü verdin. Səlman dedi, bəli, yadımdadır. Əli (ə) buyurdu, o gülü görsən tanıyarsanmı? Dedi bəli.

Əli (ə) qoynundan bir dəstə nərgiz gülü çıxarıb ona uzatdı. Səlman bu hadisədən sonra Dəşti-Əjəndədə ona Aslanın əlindən nicat verən şəxsin Həzrəti-Əli (ə) olduğunu bildi. Həzrəti-Əli (ə) dedi: Ey Səlman bu sirr səninlə mənim aramda məhrəmanə bir

sirr olaraq qalacaqdır.

Bu motivin S.Ə.Nəbati yaradıcılığında da əksini tapması əhvalatın XIX əsrdə də dildə ağızda dolaşdığından xəbər verir:

*Dəşti-Ərjəndə çü etdi şir Səlmanı əsir,*
*Acizi biçarə qaldı, tapmadı bir dəstgir.*
*Üz tutub dərgahi-həqqə ağladı ol mərdi pir,*
*Zahir oldu onda bir dəm Şahsüvari – şirgir:*
*Şahi-Mərdan, şiri-Yəzdan, Heydəri-Düldülsəvar.*
*La fəta illah Əli, la seyfə illa Zülfüqar.*

(Ərjəndə çölündə şir Səlman üçün təhlükəli vəziyyət yaratdığından o, çarəsiz qalaraq bir çıxış yolu tapa bilmirdi. Ona görə də o qoca kişi ulu Yaradanın uca qatına üz tutaraq hönkür-hönkür ağlamağa başladı. Bu zaman gözlənilmədən şir kimi bir atlı ortaya çıxdı. Ey mərd kişilərin hökmdarı, sən ey Allahın şiri, sən ey asta yerişli Düldülə minmiş yenilməz igid, axı Tanrı özü buyurmuşdur ki: Əlidən başqa igid, Zülfüqardan başqa qılınc yoxdur).

Xətainin aşağıdakı misraları XVI əsrdə də belə mənqəbələrin yayıldığını söyləməyə imkan verir.

*Şah Xətaim özün ırma,*
*Gerçəklər könlünü qırma,*
*Hər adama sirrin açma,*
*Əliyə Səlman olasan.*

Şah Xətai yaradıcılığında Dəşti-Ərjən motivi ilə bərabər “İfritin bəndini aldın üç yüz ildən sonra sən” misrası da təlmih üzərində qurulmuşdur. Uzun illər “Ağ div”i zindana salan ya Əli” misrasının mənası barədə təhqiqatlar apardıq və Allahın köməkliyi ilə ağız ədəbiyyatından da olsa bu cərəyanın da mahiyyəti və yaranma səbəblərini öyrəndik. Əslən Cənubi Azərbaycanın Miyandab şəhərinin Alıbəyli kəndindən olan (təxminən 60-65 ya-

şında) müəllimlik vəzifəsində işləyən Ağayi Xanizadə belə bir əhvalat danışdı: Həzrəti Adəmin yaradılışından 3000 il əvvəl divlər və cinlər Yer üzünün sakinləri imiş. Onlar bir-birinə çox əziyyət verirlər. Allahın əmri ilə haqqın ən böyük qüdrət nişanəsi olan Həzrəti-Əli (ə) bunların münaqişələrini aradan qaldırmaq üçün vəzifələndirilir. Həzrəti-Əli (ə) o zaman divlərlə mübarizə apararkən onların aralarında ən təhlükəlisi Ağ Div, ya da İfrit adlanan bu div imiş. Məxluqata ən çox əziyyət edən həmin İfritmiş. Həzrəti-Əli (ə) ona yaxınlaşır və qulağının dibinə güclü bir zərbə vurur. Qulağından açılan qanı görüb qaçmağa çalışan divə Həzrəti-Əli (ə) imkan vermir. Öləcəyini hiss edən Ağ Div Həzrəti-Əlidən (ə) onu bağışlamağı diləyir. Həzrəti-Əli (ə) onu öldürmür, cəzasını zindanda həbsdə saxlamaqla əvəz edir. Bunun üçün Həzrəti-Əli (ə) xurmanın şaxəsi ilə Ağ dvivin (İfrittn) hər iki əlinin çeçelə barmaqlarnı bir-birinə bağlayır və onu zindana salır. Mövla Əli (ə) buyurdu ki, bu zindanda o zamana qədər qalacaqsan ki, Axir-əz Zaman Peyğəmbər Xatəmul-Ənbiya Yer üzünə zühur edə. O zaman hüzura gələrsən və barmaqlarını açıb sənə nicat verərəm. Rəvayət olunur ki, Xatəmul-Ənbiya Həzrəti-Peyğəmbər Məhəmməd (s) zühur etdiyini eşidən Ağ Div bağışlanması üçün onun hüzuruna gedir. Peyğəmbər (s) məsciddə ümmətinə xütbə oxuyan zaman həmin Ağ Div məscidə daxil olur. Divin heybətindən qorxuya düşən məscid əhli oranı tərk edib qaçmağa üz tutur. Məsciddə Peyğəmbərlə (s) Həzrəti-Əli (ə) qalır. Div onların hüzuruna gəlir, Peyğəmbərdən (s) icazə alıb başına gələni ona nəql edir. Peyğəmbər buyurdu ki, "ya Əli, bu sənin işindir". Həzrəti-Əli (ə) Divin dediklərini təsdiq edir və cərəyanı peyğəmbərə də nəql edir və onun hüzurunda şəmşiri ilə xurmanın lifini kəsir və Ağ Divi azad edir. Div azad olunandan sonra o, öz istəyi ilə Həzrəti-Əliyə (ə) mürid olur.

Ağ Div (İfrit) motivi ilə tək Şah Xətai yaradıcılığında deyil, klassik ədəbiyyatımızda və aşıq ədəbiyyatımızda da tez-tez rastlaşırıq.

*İsadır həmdəmim, Musadır qustaq,*
*Nə müddət Ağ Divi sən etdin dustaq,*
*Mömin olan qullar çəkirlər müştaq,*
*Haçan olar axır-zaman atəşi.*

*(Dədə Sail)*

***

*Aslan olub Merac yolunda yatan,*
*Əbu Cəhlin başın havaya atan*
*Xurma lifəsiynən barmağın çatan,*
*Ağ divi zindana salan ya Əli!* [1]

*(Aşıq Ələsgər)*

***

*Sığın bir Allaha, on iki İmama,*
*Dadına Xeybəri atanı çağır.*
*Dünyaya gəlməmiş öz qüdrətiylə,*
*Ağ Divin bəndini çapanı çağır.*[2]

*(Xındı Məmməd)*

***13-cü beyt:***

*Sədri-divani-əzəlsən, pişivayi-övliya,*
*Qütbi-dinü qibləvü mehrabü mənbər, ya Əli!*

*(Q. 8, səh.277)*

(Ya Əli (ə), sən əzəli-əbədi "Ələst" aləmində qurulmuş ali məclisin yuxarı başında əyləşmiş kamil şəxsiyyətsən! Ya Əli (ə), sən indiyədək gəlib-getmiş bütün övliyaların rəhbərisən! Ya Əli (ə), sən bütövlük də dinin və onun ayrılmaz tərkib hissələri olan

---

[1] Aşıq Ələsgər. "Gözüm bir alagöz xanıma düşdü". Bakı, "Yazıçı", 1993. səh. 100

[2] Aşıq Xındı Məmməd. "Meydanda mərdi-mərdana". Bakı, "Borçalı", 2001. səh. 54

qiblə, mehrab və minbərin istiqamət verici qüvvəsisən!)

Bu beyt ideya baxımından qəsidənin ən dolğun və tutumlu beytidir. Çünki, burada Həzrəti-Əli (ə) şəxsiyyətinə, onun ömür yoluna, mübarizə tarixçəsinə, həyat və fəaliyyətinə, eləcədə dini ierarxiyadakı yeri, dəyəri, önəmi və çəkisinə dair çox dərin məzmunlu fikir var: Həzrəti-Əlinin (ə) əzəli-əbədi "ələst" aləmində qurulmuş ali məclisin yuxarı başında əyləşmiş kamil şəxs olmasından ibarətdir.

"Ələst" aləmi Qurani-Kərimin mübarək "Əraf" surəsinin 172-ci ayəsində təsvir olunmuşdur:

"Xatırla ki, bir zaman Rəbbin Adəm oğullarının bellərindən övladlarını çıxardıb özlərini-özlərinə şahid tutaraq: "Mən sizin Rəbbiniz deyiləmmi?" – (deyə soruşdu), onlar da: "Bəli, Rəbbimizsən!" – deyə cavab verdilər. (Bunu ona görə etdi ki, məbadə) qiyamət günü: "Biz bundan qafil idik".

Bu ayədə fitri tövhidə və Allaha inamın insanların ruhunun dərinliklərində olmasına işarə edilir. Bu ayənin izahı haqqında çoxlu sayda fikir və rəylər mövcuddur. Ayənin da məntiqli təfsirlərindən birində buradakı əhd-peymanla istedadlar aləminə, fitri sözləşməyə, yaradılışa və obyektivlik pirinsipinə işarə edildiyi qeyd edilmişdir. Belə ki, Adəm övladları nütfə şəklində atalarının belindən ayrılıb analarının bətninə düşdükləri zaman zərrə şəklində olurlar. Həmin vaxt Allah bu zərrələrə tövhid həqiqətini dərk edəcək istedad və potensial bəxş edir. Bu ilahi sirr onların zatına və fitrətinə zati və daxili bir hiss, şüur və idraklarına isə şüurlu bir həqiqət şəklində əmanət edilir. Buna görə də bütün insan fərdləri tövhid ruhuna malikdirlər. Həm Allahın onlardan soruşduğu sualın, həm insanların Allaha verdiyi cavabın dili obyektiv qanunlar sisteminə aiddir. Bu izaha görə, ayədə ki, sual-cavab forması və əhd-peyman fitri sözləşmə olmuşdur. Hər kəs bu fitrəti və onun təsirlərini ruhunda hiss edir. Hətta pisixoloji araşdırmalara görə, dini hiss insanın şüuraltı psixikasının əsas hisslərindən biridir. Bəşəriyyəti bütün tarix boyu Allahpərəstliyə sövq edən məhz həmin hisdir. Belə bir fitrət olduğu üçün insan-

ların “atalarımız bütpərəst olublar” bəhanəsi tamamilə əsassızdır. “Rum” surəsinin 30-cu ayəsində belə buyrulmuşdur: “Üzünü Allahın fitri olaraq insanların verdiyi dinə tərəf tut. İlahi yaradılışda dəyişiklik olmaz”.[1]

Doğrudur, bu beytlərdə Həzrəti-Əlinin (ə) məclisin yuxarı başında əyləşməsi barədə açıq məlumat yoxdur. Lakin məzhəb, təriqət və fəlsəfi cərəyan ideoloqlarının təfəkkür tərzində və təxəyyül dünyasında Rəsulullahla (s) Əliyyən Vəliyullahın (ə) qoşa əyləşmələrinə qətiyyən şəkk-şübhə edilmir. Bu isə şairlərin əlinə böyük fürsət vermiş, onların qarşısında zəngin yaradıcılıq üfüqləri açmışdır. Siyasət müstəvisində və döyüş meydanında son dərəcə ürəkli, çevik olan Şah şair heç vəchlə belə bir fürsəti fövtə verməzdi. Odur ki, qəsidənin bu beyti belə bir dəlil fikirlərlə zənginləşmişdi.

***14-cü beyt:***

*“Ləhmukə ləhmi” rumuzunin bəyanı səndədir,*
*Həmdəmü həmsirrü, həmrazi-Peyəmbər, ya Əli!*
*(Q.8, səh.277)*

(“Sənin ətin mənim ətimdəndir” rəmzlərinin açıqlaması sənin əlindədir. Həzrəti-Peyğəmbərin (s) dostu, sirdaşı və könül yoldaşı yalnız sən ola bilərdin ya Əli (ə)!)

Mötəbər şiə məxəzlərinə əsasən Rəsulullah (s) Əliyyən Vəliyullahın (ə) hər baxımdan özünə yaxın olmasını real surətdə ümmətə çatdırmaq üçün ya Əli (ə) “Sənin ətin mənim ətimdəndir” – deyə buyurmuşdur. “Allah hər kəsi bir başqa ağacdan yaratmışdır, mənlə Əlini (ə) isə eyni ağacdan xəlq etmişdir” – hədisinə bənzəyir.

---

[1] Nümunə, c.7, səh. 4; Ayətullah-üzma Nasir Məkarim Şirazi. “Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı”. (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, “Nurlar”, 2017. səh. 173

Bəs niyə Xətai hədisin mövzu, məzmun və məfkurə incəliklərinin şərhini Həzrəti-Əlinin (ə) özündən gözləyir?

Birincisi, evin sirrini ev əhli bilər; ikincisi, müqəddəslərin özləri haqqında yüksək rəy bildirmələri, tərifli sözlər demələri qətiyyən qeyri-təvazökarlıq sayılmır.[1]

Seyyid İmaməddin Nəsiminin də bəhs mövzusu olan hədisi önə çəkməsi bu inci Peyğəmbər (s) sözünün orta əsrlər müsəlman mədəniyyətinin geniş yayılmış faktı olduğunu sübuta yetirir:

*Kim Muhammədi Əlidən ayırır, lənət ona,*
*"Ləhmukə ləhmi" deyilmi, ya Əli, səndən mədəd!*

(Rəsulullahı (s) Əliyyən Vəliyullahdan (ə) ayırana Allah lənət eləsin! "Sənin ətin mənim ətimnəndir" hədisi Peyğəmbər (s), İmam vəhdətinə dəlil deyilmi? Ya Əli (ə) belələrinə layiqli cavab vermək üçün yalnız səndən kömək istəyirik.)

Ən nəhayət hədisin Qurani-Kərim pirinsipləri ilə uyğunluq dərəcəsinə toxunaq. Hədis Əhli-beyt (ə.m) haqqındakı Quran ayələrinin hamısının müxtəvası çərçivəsində əksini tapır. Misal üçün mübarək "Nisa" surəsinin 59-cu ayəsini götürək. Həmin ayə belədir: "Ey iman gətirənlər! Allaha, peyğəmbərə və əmr sahiblərinə (peyğəmbərin canişinlərinə) itaət edin! Əgər bir iş barəsində mübahisə etsəniz, Allaha və qiyamət gününə inanırsınızsa, onu Allaha və Peyğəmbərə həvalə edin! Bu, daha xeyirli və nəticə etibarilə daha yaxşıdır.

(Peyğəmbərin (s) xüsusi səhabələrindən olan Cabir ibn Abdullah Ənsariyə aid edilən bir rəvayətdə belə qeyd edilmişdir: "Bu ayə nazil olduqda peyğəmbərdən (s) soruşdum: "Ey Allahın Rəsulu (s), Allah və peyğəmbərini tanıdıq, bəs əmr sahibləri kimlərdir ki, Allah onlara itaəti Öz itaəti ilə yanaşı qeyd etmişdi-

[1] İbrahim Quliyev. "Dua kimi oxunan şeirlər". Bakı, "Qanun", 2013

r?" Peyğəmbər (s) buyurdu:

"Ey Cabir, onlar mənim canişinlərim və məndən sonra müsəlmanların rəhbərləridirlər. Onlardan birincisi Əli ibn Əbutalib (ə), sonra Həsən (ə), sonra Hüseyn (ə), sonra Əli ibn Hüseyn (ə), sonra Tövratda Baqir adı ilə qeyd edilmiş Muhamməd ibn Əli (ə). Cabir, sən onu tezliklə görəcəksən.

Onunla görüşəndə salamımı ona çatdırarsan. Ondan sonra Sadiq Cəfər ibn Muhamməd (ə), sonra Musa ibn Cəfər (ə), sonra Əli ibn Musa (ə), sonra Muhamməd ibn Əli (ə), Əli İbn Muhamməd (ə), sonra Həsən ibn Əlidir (ə). Sonra Həsən ibn Əlinin oğlu, Muhamməd (ə), mənim adaşım, həmkünyəm, Allahın yer üzündəki dəlili və Allahın bəndələri arasında qoruduğudur. O, elə bir şəxsdir ki, Allah onun vasitəsilə Öz adını bütün dünyaya yayacaq. O, elə bir şəxsdir ki, şiələri və dostlarının gözündən uzaq düşəcək. Bu qeyb şəraiti elə olacaq ki, Allah qəlbini iman ilə yoxlamayıncaya qədər heç kəs onun İmamətinin inamında sabitqədəm olmayacaq."

Dedim: "Ey Allahın Rəsulu (s) o, qeybdə olduğu vaxt şiələr ondan faydalanacaqlarmı?"

Buyurdu: "Bəli, and olsun məni Peyğəmbər göndərənə, buludlarla örtülməsinə baxmayaraq, insanlar günəş işığından faydalana bildiyi kimi, qeyb dövründə şiələr onun nurundan nur alacaq, rəhbərliyindən faydalanacaqlar.

Cabir, bu, Allahın gizlətdiyi sirlərdən və Allahın gizlətdiyi bilgidir. Buna görə də onu yalnız layiq olana söylə".[1])

("Künyə" – Ərəb dilində kişinin öz böyük oğlunun, qadının isə böyük övladının adının qarşısına "əb" (kişilərdə) və "ümm" (qadınlarda) sözləri əlavə edilərək adlandırılması bir ənənə olmuşdur. Ərəb qəbilələri arasında şəxslər üçün künyə formasında

---

[1] "Kəmalüddin və təmamün-nemə", c.1, səh. 253; Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 87

ad qoymaq ənənəsi o şəxs üçün hörmət və ehtiram əlaməti sayılır. Məsələn, Əbülqasim, Ümmi-Sələmə, Ümmi Gülsüm və s.).

Bütün bunlara görə şair İmam Əlini (ə) həmdəmi, həmsirri, həmrazı Həzrəti-Muhamməddin (s) ən layiqli ardıcılı olaraq ürəklə tərənnüm edə bilir.

***15-ci beyt:***

*Bu Xətai xəstəyə həmrah qılgil himmətün,*
*Kim, sənə sidqilən oldu bəndə, çakər, ya Əli!*

*(Q.8, səh.277)*

(Ya Əli (ə), öz lütfü nəzərini bu yorğun Xətainin üzərindən kəsmə, ona görə ki, o, bəndə sənə həmişə sədaqətlə nökərlik etmişdir!)

"Himmət" sözü "dolğun və tutumlu" məzmun şəbəkəsinə malikdir. Odur ki, birinci misranı bir neçə baxımdan qavramaq olar. Məsələn o baxımdan qavramaq olar ki, şairin burada məmduhundan lütfü nəzərini üzərindən kəsməməkdən daha çox, öz müqəddəs ruhunun bir şəxsiyyət olaraq, bir dövlət xadimi kimi, Şah Xətaini Həzrəti-Əli (ə) yolunda daha sabit qədəm olmasına yardım göstərməsini istəməsidir.

"Himmət" sözünü burada "şəfaət" mənasında da götürmək mümkündür. Yuxarıda dəfələrlə qeyd etdiyimiz kimi dini-müqəddəslər dini şəfaət səlahiyyətinə malikdir. Belə olan surətdə qəsidənin sonunun şəfaət duyğuları ilə bitməsidə çox yerinə düşüb.

Beytdə öz əksini tapmış məsələlərdən biri də, bu mədh edilən dini-müqəddəsin yolunda sabit qədəm olma istəyindən irəli gəlir. Xətainin bir çox şeirlərində bu istək özünü göstərir. Məsələn;

*Adım İsmayıl ibni-Heydəriyəm,*
*Əlinin çakərinin çakəriyəm.*

*(Q.217, səh.125)*

*Xətai şahi-aləm eşigində,*
*Qulami-kəmtər əz Qənbər digilmi?*

*(Q. S.180)*

(Xətai aləm-şahının yəni Həzrəti-Əlinin (ə) kənarında onun Qəmbərdən rütbəcə daha aşağı səviyyəli qulu, köləsi deyilmi?)

*Xətainin deyil həqqi, "Şaha qulam" deyə bilmək,*
*Əgər xidmət qəbul olsa, onun mövlası Qənbərdür.*

*(Q.133, səh.89).*

("Mən Həzrəti-Əlinin (ə) qulamıyam" sözlərini dilə gətirmək Xətainin haqqı deyil, əgər Allah Həzrəti-Peyğəmbər (s) və İmam Əlinin (ə) dərgahında Xətainin bu adla çox gördüyü işlər İslam yolunda yaratdığı "dövləti qızılbaşlıq" – "Qızıl baş dövləti" məqbul sayıldığı təqdirdə o yalnız və yalnız Həzrəti-Əlinin (ə) qulu, köləsi olan Qənbəri özünə ağa seçə bilər.

Beləliklə, aydın olur ki, Şah İsmail Xətai bir Həzrəti-Əli (ə) aşiqi kimi, ən çox Həzrəti-Əlinin (ə) eşqində qələm çalmış, şeirlərinin çoxunu onun vəsfi ilə başlayıb, onun vəsfiylə bitirmişdir. Həzrəti-Əlinin (ə) vəsfi isə sözə, şeirə, sənətə sığmayacaq qədər genişdir. Beyt-beyt araşdırdığımız qəzəl Xətainin Əhli-beyt (ə.m) məhəbbətinin ucu-bucağı olmayan dənizlərtək dalğalandığını saf və sərin bulaq suyu kimi ruhu oxşadığını göstərir. Şah şair böyük bir mərdliklə özü etiraf edir:

*Çün sənin öfsatına yetməz Xətainin sözü,*
*Uş bu əbyat üstə xətm oldu kəlamım vəssalam.*

*(Q.219, səh.126)*

(Hər nə qədər yüksək olursa olsun, Xətai qələmindən çıxan əsərlər sənin ali məziyyətlərini sonadək açıb göstərə bilmədiyindən O, sənə qoşduğu sözləri bu beytlə bitirmək məcğuriyyəti qarşısında qalmışdır)

Şiə məzhəb müsəlmanlara görə, 14 din böyüyu – Rəsulullah (s), qızı Həzrəti-Fatimeyi-Zəhra (s.ə) və 12 İmam (əsmai-əşəri) məsumdur, müqəddəsdir, toxunulmazdır. Xanım Fatimeyi-Zəhra (s.ə) və 12 İmam (ə) peyğəmbər (s) nəslindən olub, ən qabaqcıl nümayəndələridir. Şah İsmail Xətaidə 12 qəsidəsindən birini, 408 qəzəldən 12-sini bəşəriyyətin ən kamil şəxsiyyətləri olan bu din böyüklərimizin əlçatmaz, ünyetməz, məziyyətlərinin tərənnümünə ad eləmişdi.

Bu əsərlərə göz gəzdirdikdə Həzrəti-Əlinin (ə) parlaq simasının öndə durduğu dərhal duyulur. Belə ki, qəzəl şəkilli 12 şeirin 4-ünün ümumi məzmunu və fikiri axarı ideya, bədii istiqaməti Həzrəti-Əliyə (ə) bağlıdır. Məsələn:

*Dəryayi-Nəcəf gövhərinə kan Əlidür,*
*Billah, ləbi-ləli-Bədəxşan, Əlidür.*

*Əşyada iki nur ki, məşhur olubdur,*
*Xurşid Muhamməd, məhi-taban, Əlidür.*

*Meraca Muhamməd ki, uruc etdi zi sufla,*
*Bər dərgəhi Həq gördü ki, aslan Əlidir.*

*İslam anası Fatimeyi Xeyri-Nisadır,*
*Zira hamıya din ilə iman Əlidir.*

*Mən çakərəm o şahə, Həsən məzhəri-Yəzdan,*
*Həqdür ki, könül təxtinə sultan, Əlidir.*

*Ver başı Hüseyn eşqinə, ey sufi, şəhid ol,*
*Gəl şübhədən arın Şəhi-mərdan, Əlidir.*

*(Qəs.3, səh.269)*

Və yaxud

*Mehrini möhr etmişəm mən sinəm içrə Heydərin,*
*Canü dildən çakəriyəm sidq ilə ol sərvərin!*

*Nazil oldu "Həl Əta" şənində daxi "la fəta"!*
*Sahibidür Düldülün, həm xacəsidür Qənbərin.*

*Zülfüqar ilə müsəxxər qıldı həftum keşvəri,*
*Barmaq ilə fəth edibdir qapusini Xeybərin.*

*Mustafa "Şəmsüz-Züha", həm Mürtəzadır "Vəl-Qəmər"*
*Həm Əmirəl-möminin, həm saqisidür kovsərin.*

*Nuri-çeşmi Əhmədin, həm Mürtəzanın didəsi,*
*Qurrətul-əyni Əlinin, alidir peyğəmbərin*

*Babi Şəbbər ilə Şübbərdür Həsən, biri Hüseyn,*
*Ey məvali, bil, bulardürür İmamü rəhbərin.*
*(Qəz.299, səh.200-201)*

El arasında "tilavət" və ya "on iki imami" adlanan belə şeirlər çox güman ki, Səfəvilərin hakimiyyəti zamanı, Şah İsmailin şəxsi və fərdi təşəbbüsü və təşviqi ilə meydana çıxmışdır. Belə şeirlər adətən "Quran"ın tilavətindən sonra və xətm duasından əvvəl oxunur.

Şeirlərin bu cür adlanması və ayrıca növ kimi formalaşması buna görədir. Bəlli ənənəyə əsasən Qurani-Kərimin üç cür tilavəti vardır:

1. Allahın Peyğəmbər (s) üzərindəki təlavəti;

Sən onların (istəklərinə tam təslim olmayınca və təhrif olunmuş) dinlərinə tabe olmayınca, nə yəhudilər, nə də xaçpərəstlər səndən qətiyyən razı qalmayacaqlar. (Onlara) de: "Allahın göstərdiyi yol yeganə doğru yoldur". Əgər sənə gələn elmdən sonra onların (nəfslərindən gələn) istəklərinə uysan, o zaman Allah tərəfindən sənə nə bir hami, nə də bir köməkçi olacaqdır.; İbrahi-

min dinindən (bu qədər pak və aydın olduğu halda) səfeh və nadanlardan başqa kim üz döndərər? Həqiqətən, Biz onu bu dünyada seçdik və heç şübhəsiz, o, axirətdə də əməlisalehlərdən olacaqdır" ("Bəqərə", 120-130).

2. Peyğəmbərin (s) ümmət üzərindəki təlavəti:

"Möminlər yalnız o şəxslərdir ki, Allah adı çəkiləndə ürəkləri qorxudan titrəyər, Allahın ayələri onlara oxunduğu zaman imanları daha da artar, onlar ancaq öz Rəblərinə təvəkkül edərlər" ("Ənfal", 2)

3. Ümmətin ümmət üzərində tilavəti:

Allah zərrə qədər də zülm etməz. Əgər yaxşı bir əməl baş versə, onu iki qat artırar və Öz tərəfindən (bu əməl qarşılığında) böyük mükafat verər! ("Nisa", 40).

İmam Cəfəri Sadiqin (ə) göstərişinə görə hər bir müsəlman gün boyu Qurani-Kərimdən ən azı 50 ayə oxumalıdır. Buna "həddi-meysir" – (ən aşağı hədd) deyilir.

Digər tərəfdən, belə bir cəhətin üzərində sükutla keçməyək ki, Quran sözünün başlıca lüğəvi anlamı oxumalı kitab deməkdir. Belə olan surətdə Qurani-Kərimin oxunuşu əsasən iki sözdə "qiraət" və "tilavət" sözləri ilə bildirilir. Dilçi alimlərin yekdil rəyinə görə, qiraət diqqəti eyni istiqamətə cəmləyə-cəmləyə, fikri bir yerə toplaya-toplaya, tilavət isə ardıcıl olaraq durmadan və mütəmadi surətdə oxumaqdır.

## 3.7. ŞAH İSMAİL İRSİNİN 14 MƏSUM PAYI

Şah İsmailin irsinin 14 məsum payı ideya-bədii baxımdan dolğun və tutumlu, kəskin və kəsərli, əlvan və rəngarəng olduğundan ümumiləşdirmə aparmaq bir xeyli çətindir. Odur ki, biz belə şeirlərdən birini əsas götürüb, onun təhlili zamanı digərlərinin də ən səciyyəvi parçalarını tədqiqata cəlb etməyə çalışacağıq. Əsas götürdüyümüz şeir isə budur:

***Qədimi zati bi mislü bəqadur,***
***Qamu fanidürür, baqi Xudadur.***

***Neçə kim ənbiya gəldi cəhana,***
***Qamusindən quzidə Mustəfadur.***

***“Ələstu rəbbikum” ta həşr olunca,***
***Yəqin bil kim, Əliyyəl-Mürtəzadur.***

***Əmirəl-möminin Şübeyrü-Şəbbər,***
***Onlar ayineyi-giti-nümadır.***

***Həsən içdi ağuni, zəhri-qatil,***
***Şəhidi-din Hüseyni-Kərbəladur.***

***İmam ol seyyidi-övladi-Adəm,***
***Həqiqət bil, yəqin Zeynül-İbadur.***

***Məhəmməd Baqir, ol pakizə gövhər,***
***Çirağı-dideyi-əhli-səfadur.***

***İmam Cəfər təriqi qoyma əldən,***
***Vücudun şəhrinə ol kimiyadur.***

***İmam Musa Kazim, ol hadiyi din,***
***Kim, ol xurşidi-bürci-övliyadur.***

***İmami-həştüm ol Şahi-Xorasan,***
***Həqiqət bil, Əli Musər-Rzadur.***

***Muhəmməd Təqidür ol elmə təhqiq,***
***Ki, təqva əhlinə ol pişvadur.***

***Nəqiyyə mən mücəssəm canü dildən,***
***Əzəldən sahibi-taci-livadur.***

***Məvali məzhəbimdür Şahi Əsgər,***
***Səlatü vəssəlamü mərhabadur.***

***Mühəmməd Mehdiyi-Sahib-Zamanə,***
***Təbibü hadiyi-daruş-şəfadur.***

***İmamü mürşidi-dindür be təhqiq***
***Ki, məhşərdə qamuyə rəhnümadur.***

***Gəl ey arif, sən özün nəfsi tanı***
***Ki, nəfsi bilmiyən dur əz Xudadır.***

***Yəzid iqrarinə inkar olubdur,***
***Layiq inkardə ləfzi-bu riyadur.***

***Yəzidu müşrikin kəjdi damarın,***
***Nə qalmışdır giriftari-bəladur.***

***Duaçidür sənə şaha, Xətai,***
***Kim onun ruzü şəb virdi duadur.***

Şeirin ilk beyti belədir:

***Qədimi zati bi mislü bəqadur,***
***Qamu fanidürür, baqi Xudadur.*** *(Q.2, s.268)*

(Ulu Yaradanın əzəli-əbədi, zatı müqəddəsi daimidir. Onun vacibi vücudundan başqa bütün varlıqlar ötəri və keçəridir).

Xətainin 14 məsumun tərənnümünə Allah-təalanın zatı sifətləri haqqında yazmaqla başlaması qətiyyən təsadüfü xarakter daşımır. Çünki bu din böyüklərinin məsumluğu və müqəddəsliyi bilavasitə Ulu Yaradanın uca qatından qaynaqlanır. Allah-təalanın 6 zatı, 8-sübutu və saysiz-hesabsız səlbiyə sifətləri vardır. Ulu Yaradanın zatı sifətləri bunlardır. 1.Vücud 2.Qədim 3.Bəqad 4.Vəhdaniyyət 5.Müxalifətün lil havadis (hadisələr qarşısında dayanmaq) 6.Qiyami nəfsihi (mövcudluğu özündən olan) Allah-təalanın sübuti sifətlərinin miqdarı 8-dir: "həyat, elm, səmi, bəsər, iradə, qüdrət, kəlam" (danışan təkvin yəni yaradılışın sahibi)

Şeir Allah-təalanın qədim sifətlərinin tərənnümü ilə başlanır. Uca yaradanın bu sifəti Qurani-Kərimdə geniş yer tutur. Rəbbimizin bu sifətinin əksinin tapdığı ən səciyyəvi ilahi bəyanat mübarək "Hədid" surəsinin 3-cü ayəsidir: "Huvəl əvvəlu vəl axiru vəz zahiru vəl batinu və huvə bi kulli şəyin əlim. Əvvəl, axır, aşkar və gizli odur. O, hər şeyi bilir".

1. **Əvvəl, axır, aşkar, gizli:** "Əvvəl" və "axır" ifadələri Allahın əzəli və əbədi olmasını bildirən çox incə ifadələrdir. Çünki O, sonsuz və varlığı vacib olan varlıqdır. Yəni varlığı kənardan deyil, Özündəndir, başlanğıcı yoxdur, sonuda olmayacaq, əzəldən olub, əbədi də olacaq. O varlıq aləminin başlanğıcıdır, dünya məhv olduqdan sonra da olacaq. "Aşkar" və "gizli" ifadələri onun bütün varlığı əhatə etməsini göstərir. Hər şeydən aşkardır, çünki hər şey onun yaratdıqlarıdır. Hər kəsdən gizlidir, çünki, zatı heç kəsə aydın deyil. İmam Əli (ə) oğlu İmam Həsənə (ə) vəsiyyət edərkən belə buyurur: "O, əşyaların varlığından əvvəl,

başlanğıcı olmadan, hər zaman əvvəl olub. Sonu olmayan axırdır”. Peyğəmbər (s) hədislərinin birində belə buyurmuşdur: “Ey Rəbbim! Sən hər şeydən əvvəl olmusan və səndən əvvəl heç nə olmayıb. Sən hər şeydən sonrasan, Səndən sonra heçnə olmayacaq”.[1]

*Əvvəl birdür, axır birdür, zahir birdür, batin birdür,*
*Çü bildik, birgiyə irdik, şükür, irfanımız vardur.*

*Səfiyullah, Xəlilullah, Əsədullah, demiş billah,*
*Bihəmdillah ki, bunlardan qədim ərkanımız vardır.*
*(Q.70, səh.80)*

Bu motivin başqa şeirlərində də olması şairin Ulu Yaradanın bu sifətlərini çox sevdiyini, onlara sidq bağladığını göstərir.

*Xudavəndi ki, ol həyyul-bəqadur,*
*Həm ol darəndeyi-əhli-fənadür. (Q.63, səh.75)*

(O, diri və əbədi olan Allah-təala fani olacaq bütün mümkün varlıqların əsl sahibi və həqiqi malikidir).

Zahirən sinonim kimi görünməklərinə baxmayaraq, “əbədi” və “baqi” sözləri arasında incə fərqli məqamlar da vardır. Belə ki, Ulu Yaradana qırılmaz bağlılıq və üzvü uyarlıq içində götürdükdə əbədi özündən sonra heç bir şey olmayan “əbədi”, “baqi” – anba-an mövcud olan mənalarına gəlir.

Şair müqəddəsatın tərənnümündə çox doğru olaraq növbəlilik pirinsipini gözləyir, qətiyyən ölçü hissini itirmir, illüziyaya (illü-

[1] “Nümunə”, c.23, səh. 298; “Nəhcül-bəlağə”, 31-ci məktub; “Pəyame-Quran”, c.4, səh. 189; Ayətullah-üzma Nasir Məkarim Şirazi. “Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı”. (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, “Nurlar”, 2017. səh. 237

ziya psixoloji məfhum olub, qavrayışın təhrif olunmuş forması deməkdir) yol vermir. Eyforiyaya (eyforiya özünü təkrara və özünə vurğunluğa) qapılmır:

***Neçə kim ənbiya gəldi cəhana,***
***Qamusindən quzidə Mustəfadur.*** *(Q.2, səh.268)*

(Həzrəti-Muhamməd (s) dünyaya gəlmiş peyğəmbərlərin (ə) hamısından əqli-mənəvi yetkinlik və ilahi buyruqları yerinə yetirmə baxımından artıqdır, üstündür).

Bəllidir ki, islam dininə görə peyğəmbərlər (ə) dörd qismə bölünür: 124000 peyğəmbərin (ə) hamısı Nəbi olduğu halda 313-ü mürsəl, 5-i ulul-əzim, 1-i isə xətmul-Ənbiyadır. Lakin beytin yalnız bu müdəa üzərində qurulduğunu düşünmək sadəlövlük olardı. Çünki, Xətainin peyğəmbərlik anlayışı bundan qat-qat yüksəkdə durur. Buna şairin belə şeirlərindəki başqa örnəklərindən də görmək olar.

*Ki, munca ənbiyalər Haq yaratdı,*
*Qamudan bərgüzidə Mustafadır. (Q.63, s.73)*

Və ya,

*Bizə şəmi təcəlli Mustafadur,*
*Onunçün sərvəri "Ali-Əba"dur. (Q.62, s.74)*

Və ya,

*Əlidür ğazilər şahı, şəhənşah,*
*Muhamməd-Mustafa sahibliqadur,*

*Olardan ozgə kim vardır, mənə de,*
*Xudadur, Mustafadur, Murtəzadur. (Q.61, s.74)*

Və yaxud,

*Əzəldən ta əbəd Heydər gəlibdür,*
*Adəm övladinə sərvər gəlibdür.*

*Əli Şiri-Xudadır, Şahi-Mərdan,*
*Məhəmməd həqqə peyğəmbər gəlibdür.* (Q.57, s.53)

Göründüyü kimi gətirilən beş beytin beşində də Həzrəti-Muhamməd (s) həm Xatəmul-ənbiya, "həm pənci təni Ali-əba", həmdə silsilə məsumluğun öndəri, rəhbəri və birincisi yerində bədii qavrayışa təqdim olunur.

***"Ələstu rəbbukum" ta həşr olunca,***
***Yəqin bil kim, Əliyyəl-Mürtəzadur.*** *(Q.2, s.268)*

("Qiyamətə qədər mən sizin Rəbbiniz deyiləmmi?" – ayəsinin hökmü, tam yəqinliklə Həzrəti-Əliyə (ə) aiddir). "Ələstu Rəbbukum" ayəsi "Əraf" surəsinin172-ci ayəsidir: "Xatırla ki, bir zaman Rəbbin Adəm oğullarının bellərindən övladlarını çıxardıb özlərini-özlərinə şahid tutaraq: "Mən sizin Rəbbiniz deyiləmmi?" – (deyə soruşdu), onlar da: "Bəli, Rəbbimizsən!" – deyə cavab verdilər. (Bunu ona görə etdi ki, nəbadə) Qiyamət günü: "Biz bundan qafil idik",

Bu ayənin izahı haqqında çoxlu sayda fikir və rəylər mövcuddur. Ayənin daha məntiqli təfsirlərindən birində buradakı əhd-peymanla istedadlar aləminə, fitri sözləşməyə, yaradılışa və obyektivlik pirinsipinə işarə edildiyi qeyd edilmişdir.

Belə ki, Adəm (ə) övladları nütfə şəklində atalarının belindən ayrılıb analarının bətninə düşdükləri zaman zərrə şəklində olurlar. Həmin vaxt Allah bu zərrələrə tövhid həqiqətini dərk edəcək istedad və potensial bəxş edir. Bu ilahi sirr onların zatına və fitrətinə zati və daxili bir hiss, şüur və idraklarına isə şüurlu bir həqiqət şəklində əmanət edilir. Buna görə də bütün insan fərdləri tövhid ruhuna malikdirlər. Həm Allahın onlardan soruşduğu su-

alın, həm də insanların Allaha verdiyi cavabın dili obyektiv qanunlar sisteminə aiddir. Bu izaha görə, ayədəki sual-cavab forması və əhd-peyman fitri sözləşmə olmuşdur. Hər kəs bu fitrəti və onun təsirlərini ruhunda hiss edir. Hətta pixoloji araşdırmalara görə, dini hiss insanın şüuraltı psixikasının əsas hissələrindən biridir. Bəşəriyyəti bütün tarix boyu Allahpərəstliyə sövq edən məhz həmin hissdir. Belə bir fitrət olduğu üçün insanların "atalarımız bütpərəst olublar" bəhanəsi tamamilə əsassizdır. "Rum" surəsinin 30-cu ayəsində belə buyrulmuşdur: "Üzünü Allahın fitri olaraq insanlara verdiyi dinə tərəf tut. İlahi yaradılışda dəyişiklik olmaz."[1]

Fəsillərdə bu ayə müxtəlif baxış bucaqlarından açıqlanır. Belə baxış bucaqlarından biri də irfani şərhidir. Bu şərhin mərkəzində isə Həzrəti-Əli (ə) dayanır, belə şeirlərdə Həzrəti-Əli (ə) motivi geniş yer tutur.

*Mənim şahım Əliyyi-Mürtəzadur,*
*Yüzüm dünyavü üqbada onadur.*

*Əlidir şahi-Mərdan, şiri-Yəzdan,*
*Oni həq bilmiyən min gəz xətadur.*

*Xətai canü dildən şahə quldur,*
*Əlinün eşiyündə bir gədadur. (Q.65, s.74)*

Və yaxud

*Şəhi-mərdan Əliyyü hovzi-Kovsər,*
*Onundur kim, Əliyyəl-Mürtəzadur. (Q.63, s.75)*

---

[1] "Nümunə", c.7, səh. 4; Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 173

*Əli bəhri-həqiqətdür, yəqin bil,*
*Həyati-cavidani mötəbərdür.*

*Vilayət sirrinə yol bulmayanlar,*
*Gözi əmavü əhməq, bixəbərdür. (Q.73, s.83)*

Əgər bu örnəklərin birincisi Həzrəti-Əlini (ə) İmam, xəlifə, övliya, vəli və vəsi kimi hərəkətə gətirici və istiqamət verici qüvvə yerində görürüksə dördüncüsündə isə;

*Ki, Həqdən Zulfuqar oldi Əliyə,*
*Əli qulluğuna Qənbər gəlübdür. (Q.66, s.77)*

(Ona düşmən olan qüvvələr ifşa edilir yaxud beşinci örnəkdə Həzrəti-Əliyə (ə) inam fəlsəfi planda önə çəkildiyi halda, altıncı örnəkdə isə Həzrəti-Əlinin (ə) Ulu Yaradanının uca qatından gələn üstünlüklərini görməmək pislənilir).

*Çü şahi-cümleyi-mərdan-Əlidür,*
*Ənisü həmdəmi-rəhman Əlidür.*

*Cahan əhlinə sərtasər, yəqin bil,*
*Dəlilü hadiyü bürhan Əlidür.*

*Neçə kim, ənbiyavü, övliya var,*
*Hamusi qətrədür, ümman Əlidür.*
*(Q.117, s.106-107)*

(Ancaq son nümunələr o cənabın ümumi tərənnümünə həsr edilmişdir. Bəs, bütün bunların ana beyti ilə nə kimi əlaqəsi vardır. Bu cəhətlər birincisi ana beyti ideya bədii baxımdan möhkəmləndirir, məfkurə yönündə daha möhkəm əsaslandırır, məna-məzmunca dolğunlaşdırır, dil, üslub xüsusiyyətləri etibarı ilə zənginləşdirir və forma və janr çərçivəsində əlvan və rəngarəng edir).

***Əmirəl-möminin Şübeyrü-Şəbbər,***
***Onlar ayineyi-giti-nümadır.*** *(Q.2, s.268)*

(İmam Həsənlə (ə) İmam Hüseyn (ə) möminlər əmirinin Həzrəti-Əlinin (ə) istər övladı istərsə də həyat və fəaliyyətinin obiyektiv davamı kimi, dünyanı göstərən bir güzgüdür. Yəni, cəmiyyət hadisələri, insan münasibətləri ayrı-ayrı subiyektlərin onlara bəslədiyi münasibətdən aslı olaraq məna-məzmun qazanır).

"Ayineyi giti-nüma" klassik ədəbiyyatımız üçün səciyyəvi motivdir. Bunu makedoniyali İskəndərin güzgüsü, Cəmşidin camı və ariflərin işıqlı ürəyi kimidə götürürlər. Lakin praktikumda da vurğulandığı kimi "Ayineyi giti nüma" burada ictimai siyasi və istiqadi mədəni proseslər anlamındadır. Bu isə böyük bir dövlətin başında duran hökmdar-şairin qələmindən çıxdığına görə iki qat mənalıdır.

Beytdə diqqəti çəkən başqa bir motiv Həsəneyn (ə) motividir. Şübeyr-Şəbbər sözləri bunların daşıyıcılarıdır. Bu motiv Xətai lirikasında çevik və işləkdir: Məsələn,

*Həsəndür alimü şahi-şəriət,*
*Hüseyn şahi şəhidi-Kərbəladur. (Q.63, s.75)*

Və yaxud.

*Mənim mirim Həsən, şahim Hüseyndür,*
*Ki, Zeynül-Abidin dərdə dəvadur. (Q.63, s.75)*

***Həsən içdi ağuni, zəhri-qatil,***
***Şəhidi-din Hüseyni-Kərbəladur.***
*(Qəs.2, səh.268)*

(Qatilin verdiyi zəhəri Həsən (ə) ən şirin şərbət tək başına çəkdi, İmam Hüseyn də (ə) Kərbəla vaqiəsini bütün varlığı ilə din şəhidi olaraq qəbul etdi.)

Burada zahirən bir-biriylə paradoks və ziddiyyət təşkil edən şəxsiyyət və hadisələr arasındakı batini vəhdət bəhs mövzusuna çevrilir, ən qabaqcıl islam alimləri bu gerçəkliyin gözünün içinə dik baxmışlar.

**İmam Həsən (ə) və İmam Hüseynin (ə) həyatı**

İmam Həsən (ə) Hicri-qəmərinin 3-cü ili Ramazan ayının 15-də Mədinə şəhərində dünyaya göz açdı. Atası möminlərin ağası Həzrəti-Əli (ə), anası İslam Peyğəmbəri Həzrəti-Muhəmmədin (s) sevimli qızı, iki dünya xanımlarının rəhbəri Həzrəti-Fatimeyi-Zəhradır (s.ə).

İmam Həsənin (ə) ən məşhur ləqəbləri Müctəba və Sibti-Əkbərdir.

İmam Həsənin (ə) yaşayış dövrü üç hissəyə bölünür:

1. Peyğəmbərlə (s) birlikdə olan dövr – 7 il
2. Atası Həzrəti-Əliylə (ə) olan dövr – 37 il
3. İmamlıq dövrü – 10 il

İmam Həsən (ə) dünyaya gələndən sonra Həzrəti-Əli (ə) onu Peyğəmbərin (s) yanına apardı.

Peyğəmbər (s) buyurdu: “Ona bir ad qoymusunuz?”

Həzrəti-Əli (ə) ərz etdi: “Ona ad qoymaqda sizdən qabağa keçə bilmərəm”.

İslam Peyğəmbəri (s) buyurdu: “Mən də Allahdan qabağa keçə bilmərəm”.

Sonra Allah-təala Həzrəti-Cəbraili (ə) nazil etdi və buyurdu: “Məhəmməd (s) üçün bir oğlan uşağı dünyaya gəlib, Mənim salamımı ona çatdır. Ona de ki, Həzrəti-Əlinin (ə) sənə olan nisbəti Harunun (ə) Musaya (ə) olan nisbəti kimidir. Ona Harunun (ə) oğlunun adını qoy! Harunun (ə) oğlunun adı Şəbərdir, ərəb dilinə tərcümə etdikdə, olar Həsən”.

Allah-təalanın vəhy mələyi olan Cəbrailin (ə) Yer üzünə nazil olaraq Həzrəti-Əlini (ə) bu mövlud münasibətiylə təbrik etməsi

bu məqamının böyüklülüyünə ən gözəl dəlil və sübutdur. İmam Həsənin (ə) fəzilətləri o qədər çoxdur ki, nə yazmaqla, nə də danışmaqla tükənməz.

Həzrəti-Əlinin (ə) şəhadətindən sonra İmam Həsən Müctəba (ə) Allah-təalanın əmri ilə imaməti öz öhdəsinə götürdü. İslam Peyğəmbəri (s) müxtəlif ibarələrlə İmam Həsənin (ə) İmamətliyini bəyan etmişdir. Həm sünnü, həm də şiə alimlərinin yekdil nəqlinə görə Allahın Rəsulu Həzrəti-Məhəmməd (s) dəfələrlə buyurmuşdur: “O, (yəni Həsən) ağadır. Çünki ağa olmağı İmam ünvanıdır”.

Peyğəmbərin (s) buyurduğu bu hədis vacib edir ki, İmam Həsən (ə) Allah Rəsulunun (s) bütün ümmətinin ağası (İmamı) hesab edilsin. Bu o Həzrətin (ə) imamətinin bəyanıdır.

Peyğəmbər (s) buyurmuşdur: “Həsən (ə) və Hüseyn (ə) iki imamdırlar, istər qiyam edələr, istər oturalar”.

Başqa bir hədisdə Peyğəmbər (s) buyurub: “Həsən (ə) və Hüseyn (ə) keçmişdəki insanların arasında keçmişdəki və gələcəkdəki insanlar arasında behişt cavanlarının iki ağasıdır. Onların atasının (Həzrəti-Əlinin) məqamı isə onlardan da yaxşıdır”.

İmam Həsən (ə) Əhli-beytdən (ə.m) (beş kimsədən) biridir. **“Təthir”** ayəsində Allah-təala **“pənctəni-ali-əba”**dan bəhs edərək buyurur ki: “Allah siz Əhli-beytdən (ə.m) bütün çirkinlikləri apardı və Sizi pak-pakizə qərar verdi.” (“Əhzab”, 33).

Hər iki firqənin etiqadlarına əsasən **“pənc-təni-ali-əba”**dan məqsəd Həzrəti-Məhəmməd (s), Əli (ə), Fatimə (s.ə), Həsən (ə) və Hüseyndir (ə) ki, **“Təthir” ayəsi** onların şəninə nazil olub.Ayədən aydın olur ki, İmam Həsən (ə) bir kəsdir ki, Allah-təala hər bir pisliyi və çirkinliyi Onun qəlbindən silmiş, o mübarək və pak qəlbi Quranın sirr və hikmətlərinin xəzinəsi, İlahi vəhyin layiqli təfsirçisi, dini öz həyatı ilə təmsil edən ismətli bir rəhbər əta etmişdir.

İmam Həsənin (ə) barəsində nazil olan ayələrdən biri də **“Mübahilə”** ayəsidir Hər iki məzhəbin etiqadlarına görə Allah-təalanın **“Mübahilə”** ayəsində buyurduğu “Əbnaəna” kəlməsindən məqsəd yalnız İmam Həsən (ə) və əziz qardaşı İmam Hü-

seyndir (ə). Həmçinin İmam Həsən (ə) "Əhli-kisanın" 4-cü nümayəndəsidir.

Rəvayət ediblər ki, Allahın Rəsulu Həzrəti-Muhəmməd (s) bir gün Həzrəti-Əli (ə), Fatimə (s.ə), Həsən (ə) və Hüseyni (ə) bir əbanın altında cəm edib buyurdu: "Bunlar mənim Əhli-beytimdir ki, Allah-təala onları hər cür çirkinliklərdən və günahlardan pak etmişdir".

"Cəməl" müharibəsində üsyançılar Allahın xəlifəsini əhatə etdilər və cəngavərlər onların müqabilində aciz qaldılar. Həzrəti-Əli (ə) nizəni Məhəmməd İbni Hənəfiyyəyə verdi və ona əmr etdi ki, hücum etsin. Ancaq dəvə sahibləri ona mane oldular və nəticədə o geri qayıtdı. İmam Həsən (ə) nizəni onun əlindən aldı və Aişənin üstündə oturduğu dəvəyə vurdu. (Üsyançılar dəvəni ciddi-cəhdlə qoruyurdular). Nizəsindən qan damcılayan halda qayıtdı.

Məhəmməd ibn Hənəfiyyənin üzü qızardı. Həzrəti-Əli (ə) buyurdu: "Narahat olma. O, Peyğəmbərin (s) oğludur, Sən isə Əlinin oğlusan".

**İmam Həsənin (ə) fəsahət və elmi:** Bir gün Əmirəl-möminin Həzrəti-Əli (ə) oğlu İmam Həsənə (ə) buyurdu ki, xütbə söyləsin. İmam Həsən (ə) ayağa durdu, qısa və məna ilə dolu cümlələrlə Allaha mərifət, Onun zatı sifətlərindən və feli sifətlərindən o cür danışdı ki, Əmirəl-Möminin Əli (ə) ayağa durdu və onun iki gözünün arasından öpdü və **"Ali-İmran"** surəsinin 34-cü ayəsini oxudu: "Övladlardan bəziləri bəzi digərlərindəndir (onlar seçilmiş ataların olub, paklıqda da bir-birlərinə oxşardırlar). Allah eşidən və biləndir".

Ərabi Əbu Bəkrdən bir məsələ (ehram halında dəvə quşunun yumurtasını yemək hökmünü) soruşdu: – Əbu Bəkr məsələnin cavabında aciz qaldı və onu Ömərin yanına göndərdi. Ömər də bu suala cavab verməkdə aciz qaldı və onu Əbdürrəhmanın yanına göndərdi. O da aciz qaldı. Dedilər: "Sən gərək Əlinin (ə) yanına gedəsən".

Həzrəti-Əli (ə) buyurdu: "Bu iki oğlanın hər birindən (Həsən və Hüseynə (ə) işarədir) istəyirsən soruş".

İmam Həsən (ə) o cür cavab verdi ki, camaat təəccüb etdi və dedi: “O kəs ki, Süleyman ibn Davudu (ə)bilikli və alim etmişdir, bunu da bilikli və alim etmişdir”.

Peyğəmğbər (s) bir gün öz səhabələrinə buyurdu: “İstəyirsinizmi əmi və bibi cəhətdən ən üstün olan şəxslərin kim olduğunu sizə söyləyim?”

Səhabələr dedilər: “Bəli”.

Peyğəmbər (s) buyurdu: “Onlar Həsən (ə) və Hüseyndir (ə). Əmiləri Behiştdə qanadları ilə uçan Cəfər Təyyar və bibiləri də behiştdə olan Ümmü Hanidir”.

İmam Hüseyn (ə) hicrətin 4-cü ili Şaban ayının 3-də Mədinə şəhərində anadan olub. Atası – Həzrəti-Əli (ə), anası – Peyğəmbirn qızı Həzrəti-Fatimeyi-Zəhradır (s.ə). Məşhur ləqəbi – Seyidüş-şühədadır. Müqəddəs məzarı – Kərbəla torpağındadır.

İmam Hüseynin (ə) yaşayış dövrünü 4 yerə bölmək olar:

1. Peyğəmbər zamanı – 6 il.
2. Atası Həzrəti-Əliylə (ə) birlikdə – 30 il.
3. Qardaşı İmam Həsənlə (ə) birlikdə – 40 il.
4. İmamlıq etdiyi dövr –10 il.

Həzrəti-Peyğəmbər (s) nəvələri Həsən (ə) və Hüseyni (ə) çox sevərdi. Bir gün xanımı Aişəyə buyurdu: “Ey Ayişə, hər kəs nəvəm Hüseynin (ə) şəhadətindən sonra onun qəbrini ziyarət etsə, Allah-təala mənim Həcc ziyarətimin birinin savabını o şəxsə verər”.

Aişə dedi: “Ya Rəsulallah! Sənin həcclərinin birinin savabını-?!”

Peyğəmbər (s) buyurdu: “Bəli, hətta iki Həccimin savabını”…

Bu mövzu beləcə davam etdi. Nəhayət, Peyğəmbər (s) “Hətta Allah-təala mənim 90 ədəd həccimin savabını və bütün ümrələrimin savablarıyla birlikdə Hüseyni (ə) ziyarət edən şəxsə verəcək” – söylədi.

Peyğəmbər (s) daha sonra buyurdu: “Həsən və Hüseyn (ə) keçmişdəki və gələcəkdəki insanlar arasında behişt cavanlarının iki ağasıdır. Onların atası Həzrəti-Əlinin (ə) məqamı isə onlar-

dan da yaxşıdır”.

Əhli-beyt (ə.m) aşiqi ustad Füzuli yazır:

*Biz Hüseyn süfrəsinin nanü-nəmək pərvəriyik,*
*Adı hər yerdə çəkilsə, o ada müştəriyik.*
*Aylar, illər o şaha novhə deyib, ağlamışıq,*
*Gər qəbul etsə, onun nökərinin nökəriyik.*

İmam Hüseynin (ə) fəzilətləri barəsində nazil olan ayələrdən biri də **“Əl-Fəcr”** surəsinin 2-ci və sonuncu ayələridir. Bir qrup təfsirçi bu zaman kəsiyinin Məhərrəm ayının ilk on günlüyü olduğunu söyləmişlər. **“Əl-Fəcr”** surəsi Quranın 89-cu surəsidir. Bu surə 30 ayədən ibarətdir. Surə Məkkədə nazil olub. Həzrəti-Peyğəmbər (s) bu surənin fəziləti barədə buyurmuşdur: “Kim bu surəni (Zilhiccə və ya Məhərrəm ayının ilk on gecəsində) oxusa, Xudavəndi Aləm onun günahlarını bağışlayar, kim onu digər günlərdə tilavət etsə, Qiyamət günü onun üçün işıq və aydınlıq veriləcəkdir”.

1. And olsun dan yerinə; 2. And olsun on gecəyə.

Bu ayə barəsində müxtəlif şərhlər verilib.

Cabir İbn Abdullah Ənsari nəql edir ki, bu ayədə **“On gecə”** dedikdə Zilhiccə ayının birinci ongünlüyü nəzərdə tutulur. Çünki həmin vaxt dünya müsəlmanları bir yerə (Məkkədə Kəbə evinə) toplaşır və geniş bir siyasi birlik, həmrəylik nümayiş etdirirlər.

Başqa təfsirçilərin fikrincə **“On gecə”** dedikdə mübarək Ramazan ayının axırıncı on günlüyü nəzərdə tutulmuşdur ki, **“Qədr gecəsi”**də onların arasındadır. Başqa bir qrup təfsirçilər isə bu günlərin Məhərrəm ayının ilk on günlüyü olduğunu söyləmişlər.

Bir sıra İslami xəbərlərdə Quran mətninə söykənərək Fəcrin Həzrəti-Mehdi Sahib əz-Zamanın (əc.f.) vücuduna, ondan əvvəlki 10 imama, bu ayədən sonraki ayədə ifadə olunan **“Şəfənin”** isə Həzrəti-Əliyə (ə) işarə olunduğunu iddia etmişlər.

**“On gün”** anlayışı necə təfsir edilir-edilsin, həmin günlərin

son dərəcə böyük əhəmiyyətə malik olduğunu göstərir. Çünki hər adi şeyə and içmirlər, ən gərəkli, müqəddəs şeylərə and içirlər. Deməli, and içilən bu **"On gün"** çox mühüm bir mənaya malikdir.

***İmam ol seyyidi-övladi-Adəm,***
***Həqiqət bil, yəqin Zeynül-İbadur.*** *(Q.2, s.268)*

(Əsil İmamlardan biri də Adəm (ə) övladlarının ağası olan şiələrin dördüncü İmamı Əli ibni Hüseyn (ə) Həzrətləridir).

*Onu Allah İmam bilmiş,*
*Adın Zeynuləba vermiş,*
*Pənahi-Kərbəla gəlmiş,*
*Mübarəkdir, mübarəkdir.*

İmam Zeynəlabidin (ə) hicrətin 38-ci ili Şəban ayının 5-i Mədinə şəhərində dünyaya gəlmişdir. Atası Seyyüdüş-Şühəda İmam Huseyn (ə), anası Şəhrəbanu (Yezdəgirdin qızı), məşhur ləqəbləri: Səccad, Zeynəl-Abidindir (ə). Müqəddəs məzarı Mədinə şəhərinin Bəqi qəbirstanlığındadır.

Yaşayış dövrü: O, Həzrətin (ə) həyatını iki mərhələyə bölürlər:

1. Atası ilə birlikdə 22 il.
2. İmamlıq dövrü (35 il)

1) Yeziddən tutmuş Əməvilər sülaləsinin onuncu xəlifəsi Hişam ibn Əbdülməlikə qədər 9 nəfər tağut və zalım hökmdarla müasir olub.

2) O, Həzrət (ə) Hişam ibn Əbdülməlikin təhriki ilə zəhərləndirilmiş və 56 yaşında şəhadətə yetişmişdir.

İmam Zeynəl-Abidin (ə) **"Siffeyn"** müharibəsi davam edən vaxt dünyaya gəlir, Müaviyyənin ağır cinayətlər törətdiyi vaxtda boya-başa çatır. Müaviyyənin Həzrəti-Əlinin (ə) tərəfdarlarını öldürməsi, o Həzrətə (ə) nalayiq sözlər deməsi, Kərbəla faciəsi və özünün əsir düşməsi və hər an ölümlə üzləşməsi kimi hadisə-

lərlə qarşılaşır. İbni Ziyadın Yezidin məclislərində müsəlmanlara verilən əzab-əziyyətləri öz gözləri ilə görür.

İmam Zeynəl-Abidin (ə) anası İran padişahı II Yezdəgirdin qızı Şəhrəbanu xanım haqqında belə deyir: "Həzrəti-İmam Hüseyn (ə) 9-məsum İmamın atası olduğundan ona "imamlar atası", Həzrəti-Şəhrəbanu 9 məsum imamın (ə) anası olduğuna görə ona da *"*imamlar anası*"* deyilir".

Tavus Yəmani deyir: "Bir gecə Kəbənin kənarından keçirdim. Gördüm ki, İmam Zeynəlabidin (ə) **"Hifzi İsmail"** məkanına daxil olub namaz qılmağa başladı. Sonra səcdəyə getdi.

Mən eşitdim ki, O, Həzrət (s) səcdədə deyir: "İlahi! Sənin kiçik bəndən, sənin biçarə bəndən, sənin yoxsul bəndən və sənin xahiş edən bəndən sənin evinə gəlibdir".

Sözünün davamında Tavus Yəmani deyir: "Mən bu duanı dinlədim və öyrəndim. Mənə üz gətirən qəm-qüssə zamanı bu duanı oxuyurdum. Beləliklə, qəm-qüssə mənim üzərimdən götürülürdü".

Kərbəla hadisəsi baş verən zaman İmam Zeynəlabidinin (ə) 23 yaşı var idi.

Təəssüflə qeyd etməliyik ki, bəzi mənbələrdə 4-cü İmam (ə) daim xəstə kimi yad edilir və bununla da, camaatın fikrində o, cox zəif, əldən düşmüş, saralıb solmuş şəxs kimi canlanır. Halbuki, əslində belə deyil, çünki İmam (ə) ancaq Kərbalada çox qısa müddətdə xəstə olmuşdur. Faciədən sonra sağalmış və təxminən 35 il digər İmamlar (ə) kimi sağlam bədənlə fəaliyyət göstərmişdir. Şübhəsiz ki, o, Həzrətin (s) Kərbala hadisəsindəki müvəqqəti xəstəliyi Allahın bir məsləhəti idi. Belə ki, İmam (ə) bu vasitə ilə cihad vəzifəsindən azad olmuş və Yezidin muzdurlarının ölüm təhlükəsindən amanda qalaraq İmamət xəttini davam etdirmişdir. Əgər xəstələnməsəydi, gərək cihadda iştirak edəydi və bu təqdirdə də atasının digər oğul və dostları kimi şəhid olar və beləliklə də, İmamət nuru birdəfəlik sönərdi.

İmam Səccad (ə) çətin və acınacaqlı əsirlik müddətində əsirlərin ümid və pənah yeri olmaqla yanaşı, həmçinin düşmənə qarşı şücaət və vüqarla hərəkət etmişdir. Eyni zamanda Kərbala şə-

hidlərini də o dəfn etmişdir.

İmamın (ə) həyatının parlaq cəhətlərindən biri də, acınacaqlı və zülmlə dolu mühitdəki ictimai xidmətləridir. Bu xidmətlər istər "Hirrə" faciəsi zamanı kimi Mədinənin böhranlı və qarışıq günlərində, istərsə də kimsəsiz və miskinlərin nəvazişə ehtiyaclı, onlara tərəf lütf, mərhəmət əli uzadılması intizarında olduqları sakit günlərdə, o, Həzrətin (ə) ömrünün sonunadək davam etmişdir. İmam Səccadın (ə) həyatında eyni zamanda qul azad etmək məsələsi o qədər genişdir ki, onu yalnız böyük hesablamalarla deyil, bu işdə ali məqsədlərin varlığı ilə izah etmək mümkündür. Bu sahəyə diqqət yetirilsə aydınlaşar ki, Həzrət (ə) bu işə insani-tərbiyəvi məqsədlə yanaşmışdır. Yəni o, qulları alaraq onları bir müddət təlim-tərbiyə etdikdən sonra azad edirdi. Onlar isə öz növbəsində cəmiyyət arasında nümunə kimi mədəni və tərbiyəvi fəaliyyət göstərir və azad olduqdan sonra da, İmamla (ə) əlaqəni kəsmirdilər.

İmam Səccad (ə) hicrətin 94-95-ci ili dövrünün xəlifəsi tərəfindən zəhərlənərək şəhadətə qovuşmuşdur, mübarək məzarı **"Bəqi"** qəbirstanlığındadır.

Bir nəfər İmam Saccada (ə) dedi:"Yəbnə Rəsuləllah (s) gecəni necə keçirdin?"

O Həzrət (ə) cavabında buyurdu: "Gecəni bir halda keçirdim ki, məndən səkkiz şey tələb olunurdu: Allah məndən vacibatı, peyğəmbər (s) öz sünnəsini, əhli-əyalım məişətin təmin olunmasını, həvayi-nəfs şəhvəti (qane etməyi), şeytan günah iş görməyi, gözətçi mələklər (Rəqib və Ətid) düzgün əməli, Mələkul-movt (Əzrayıl (ə)) ruhumu, qəbr isə cəsədimi tələb edirdi. Mən də bu işlərin arasında onlara tələbkar idim".

*Əmirim miri Möhsindür yəqin bil,*
*Ki, Zeynül-Abidin ali-əbadur. (Q.63, s.76)*

*Həqiqət əbdiyəm Zeynül-ibadün,*
*Muhəmməd Baqirün xaki-dəriyəm.*
*(Q.245, s.173)*

Və yaxud

*Canü başı xanidanın yoluna tərk edərəm,*
*Şah Həsənü şah Hüseyn, Zeynül-ibanın həqqiçün.*
*(Q.272. s.187)*

*Olmasa hər bir könüldə mehri-Zeynül-Abidin,*
*Yoxdürür mənada onlardan yəhudi Xeybəri.*
*(Q.384, s.245)*

*Məgər daruş-şəfa gəldi ki, Zeynül-Abidin həqdən,*
*Ki, hər əma ona vardı, ğözünə rovşəna gəldi?*

Bu beytlər Xətainin bu din böyüyünün həyat və fəaliyyətinə biganə qalmadığını göstərir.

***Məhəmməd Baqir, ol pakizə gövhər,***
***Çirağï-dideyi-əhli-səfadur.*** *(Q.2, s.268)*

(Məhəmməd Bagir (ə) elə bir saf incidir ki, İmaməti bütün varlığıyla duyan zövq əhlinin göz bəbəyinin işığıdır).

**Peyğəmbər (s) elminin varisi.** İmam Məhəmməd Baqir (ə) Hicrətin 57-ci ilində Rəcəb ayının 1-də Mədinədə dünyaya göz açıb. Babasına çox bənzədiyi üçün o Həzrətin adını Məhəmməd (ə) qoyublar. Elmin sirlərini aşkar etdiyinə görə isə ona "Baqir" (ə) ləqəbi veriblər. İmam Məhəmməd Baqirin (ə) imamlıq dövrü atası İmam Səccadın (ə) şəhadətə yetişməsindən sonra təqribən 20 il davam edib. O Həzrət (ə) həm ata, həm də ana tərəfindən Həzrəti-Peyğəmbərə (s) çatan ilk İmam sayılır.

Həyatını iki hissəyə ayırmaq olar:

1. İmamətdən qabaqkı 35 illik həyatı. (Həmin dövrdə Mədinədə yaşayırdı).

2. Təxminən iyirmi il davam edən imamlıq dövrü. (Bu dövr islam elm və biliklərini təbliğ etdiyi zamandır).

İmam Məhəmməd Baqir (ə) həmişə təzə və səliqəli paltar geyər, özünə ətir vurar və yavaş-yavaş yeriyərdi. Heç vaxt ucadan gülməz, həmişə ahəstə və ədəbli danışardı. Heç vaxt əsəbləşməzdi, həmişə rastlaşdığı adama hörmət göstərib onunla mehribanlıqla görüşərdi. Özü bu haqda belə buyurur:

“Bu iş ürəkləri bir-birinə yaxınlaşdırıb, düşmənçilikləri aradan qaldırar”.

İmam (ə) dua edərkən çox ağlar, amma heç vaxt ucadan hönkürtüsü səslənməzdi. Danışarkən sözünü Allah adı ilə başladığı kimi Allah adı ilə də bitirərdi.

Çoxlu bağları və tarlası vardı. Özü də sadə bir əkinçi kimi tarlaya gedər, fəhlələrlə birgə işləyib yemək yeyərdi. Əldə etdiyi qazancı Allah yolunda sərf edib, fəhlələrin bütün ehtiyaclarını təmin edərdi. Belə ki, öz zamanında Hicazda ən səxavətli şəxsiyyət kimi tanınmışdı.

Şeyx Müfid İmam (ə) haqqında belə yazıb:“O, Həzrət (ə) bütün elm və mərifətlərə bələd idi. Bütün ömrünü öz Allahına itaət etməklə başa vurmuşdu. Təqva və pəhrizkarlığında möhkəm və sarsılmaz idi. Bağladığı əhd-peymanına həmişə sadiq qalardı. Ürəyinin saflığı, ruhunun paklığı və insani rəftarları hamını heyran qoymuşdu. Camaata İslam əxlaqını təlim edərək onları məhz belə tərbiyələndirirdi”.

Təəssübkeş sünnü alimlərindən olan Ibn Həcər İmamın (ə) əxlaqı barədə yazır: “İmam Məhəmməd Baqir (ə) şəfalı və pak qəlbə malik şəxsiyyətdir. Sözü ilə əməli biriydi. Davranışı insani və İslami idi. Böyük arif, misilsiz abid idi. Onun insani zinətlərini vəsf etməkdə acizəm”.

İmam Məhəmməd Baqirin (ə) elmi məqamı haqqında Şeyx Tusi belə yazmışdır: “Şam əhalisindən olan bir kişi İmam Məhəmməd Baqirin (ə) hüzuruna gəlib dedi:“Sən elmli və biliklisən. Məclisin də mənim üçün çox mənfəətli və dəyərlidir. Lakin sənin məclisində iştirak etsəm də özünü və xanədanını düşmən hesab edirəm”.

İmam (ə) heç bir cavab vermədi. Neçə gündən sonra həmin kişi xəstələnib yatağa düşdü. İmam (ə) dostları ilə birlikdə onun

əyalətinə gəlib yatağının yanında əyləşdi və halını soruşdu. Bu alicənablığı görən şamlı dediyi sözdən peşman olub İmamdan (ə) nə cür üzr istəyəcəyini bilmədi. Həzrət (ə) xəstənin dərmanları və pəhrizi haqqında ailəsinə bildirdi və sağalmasını dua etdi. Çox çəkmədi ki, kişi yaxşılaşıb xəstəlik yatağından qalxdı. Sabahı gün İmamın (ə) dərsinə gəlib dediyi sözündən peşman olduğunu söyləyərək Əhli-beytin (ə.m) dostlarından birinə çevrildi.

Digər məsumlar kimi, İmam Məhəmməd Baqirin (ə) də elm və biliyi vəhydən qaynaqlandığı üçün bütün məsələlərin cavabını bilirdi. Elmi səviyyəsi o qədər yüksək idi ki, alimlər onun məclisində uşaqlar müəllimin qarşısında əyləşdikləri kimi əyləşirdilər. İmam (ə) öz dərs məclisində bir bulud kimi elm yağışını tələbələrin zehninə yağdırırdı və hər kəs istedadı qədər istifadə edirdi. O, Həzrəti (ə) Peyğəmbər (s) elminin yeganə varisi sayırdılar.

İmam Sadiq (ə) buyurmuşdur: "Bir gün atamla birlikdə Hişamın məclisindən qayıdırdıq ki, yolumuz xristianların yığışıb alimlərinə sual verdikləri yerdən düşdü. Yaxınlaşdıq ki, görək nə xəbərdir."

Qoca bir xristian bizi gördükdə dedi:"Sən Məhəmmədin ardıcıllarındansan, gecə də, gündüz də olmayan saat hansıdır?"

Atam cavab verdi: "Dan yerinin söküldüyü ilə günəşin çıxdığı vaxtın arası".

Qoca soruşdu: "Hansı saatlardandır?"

Atam buyurdu:"Cənnətin saatlarındandır. Bu vaxt xəstələr ayılar, ağrılar toxtayar və gecə yuxusuz qalan yuxulayar".

Kişi dedi: "Cənnət əhli yeyib-içərlər, amma bir şey ifraz etməzlər. Bu dünyada da onlara bənzər bir şey varmı?"

Atam buyurdu: "Bəli, uşaq anasının bətnində yeyər, lakin yediyi şeyi ifraz etməz".

Qoca dedi: "İddia edirsən ki, cənnət əhli cənnətin meyvələrindən nə qədər yesələr də o meyvələrdən heç bir şey azalmaz və əvvəlki halına qayıdar. Dünyada da elə bir şey varmı?"

Atam buyurdu: "Bəli, çıraqdır. Əgər yüz çırağı bir çıraqdan

yandırsan yenə də ondan bir şey azalmaz”.

Xristian yerindən qalxıb dedi: “Bu kişi məndən daha alimdir və mübahisə etdiyi adamın İmam Muhəmməd Baqir (ə) olduğunu öyrənən kimi ona iman gətirib müsəlman oldu”.

O, Həzrətin (ə) biliyi vəhydən qaynaqlandığı üçün bütün məsələlərin cavabını bilirdi.

İmam Muhəmməd Baqir (ə) illərlə İslam yolunda zəhmətlər çəkmişdir. İslam Maarif və mədəniyyətinə xidmət etdikdən sonra hicri 114-cü ilin Zilhiccə ayının 4-də 59 yaşında ikən, Hişamın əmri ilə zəhərlənib şəhid oldu. O, Həzrətin (s) pak bədənini “Bəqi” qəbirstanlığında, digər İmamların (ə) yanında torpağa tapşırdılar.

Aşağıdakı beytlər şairin bu din böyüyünün də həyat və fəaliyətinə malik olduğu fəzilətləri sevə-sevə tərənnüm etdiyini göstərir.

*Məhəmməd Baqir oldi eyni-govhər,*
*İmam Cəfər, İmamü pişvadır. (Q.62, s.75)*

*Əli Zeynül-ibadün şah başıçün,*
*Yol içində Məhəmməd Baqiriyüz. (Q.157, s.128)*

*Bəd Zeynül-Abidindir, həm imami-möminan,*
*Çün Muhəmməd Baqiri oldi atası bunların.*
*(Q.299, s.201)*

*İmami-Zeynül-Abid, Baqiri bil,*
*Məvalilər imamı Cəfər oldi. (Q.376, s.241)*

Və yaxud

*Muhəmməd Baqir alim kim, oldur gözlərimin nuri,*
*Təriq əhliənə ol abid əcəb əhli-vəfa gəldi.*
*(Q.6, s.274)*

***İmam Cəfər təriqi qoyma əldən,***
***Vücudun şəhrinə ol kimiyadur.*** *(Q.2, s.268)*

(İmam Cəfəri Sadiqin (ə) adı çəkilər-çəkilməz o din böyüyünün yolu ilə getmək fürsətini əldən vermə. Ona görə ki, o, sənin varlıq şəhərinin mayasını təşkil edir).

Öncəki beytlərə baxanda bu beyt daha dərin məzmuna malikdir. Bu məzmunun dərinliyini şərtləndirən cəhətlər mətndə "təriq, qoyma əldən və kimya" sözləri ilə verilmişdir. Hər üç söz İmam Cəfəri Sadiqi (ə) şiə məzhəbinin başlıca ideoloqu kimi səciyələndirmək üçün kifayətdir.

İmam Cəfəri-Sadiq (ə) Hicri-qəməri ilinin 83-cü ili rəbiyüləvvəl ayının 17-də Mədinə şəhərində doğulub. Atası 5-ci İmam Məhəmməd Baqir (ə) və anası Ümmu Fərvədir. İmami Sadiqin (ə) imamət dövrü 34 il oldu. Bu müddətdə İmami Sadiq (ə) bütün qüvvəsini İslam dininin həqiqətini xalqa çatdırmağa həsr etdi. İmami Sadiqin (ə) imamət dövründə Bəni-Uməyyə və Bəni-Abbas bir-biri ilə müharibə edən zaman İmam (ə) fürsətdən istifadə edərək geniş elmi-dini hövzə yaratdı. Həmin bu hövzədə 4000 şagird təhsil aldı. Peyğəmbərin (s) hədislərinə ən sağlam yol Əhli-beyt (ə.m) yoludur və İmami Sadiq (ə) bu nöqtəni bir çox yerdə xalqa çatdırdı.

İmami Sadiq (ə) Yunis ibn Zəbyana buyurdu: "Ey Yunis, düzgün elmi istəsən, biz Əhli-beytdədir (ə.m). Çünki hikmət yolları və düzü əyridən ayırmaq ölçülərini biz irs aparmışıq".

İslam tarixini araşdıranlardan biri tarixçi Əban ibn Təğlib İslam dininin və Allah-təalanın tərəfdarlarını belə tərif edir: "Allahın tərəfdarları onlardılar ki, camaat əgər Peyğəmbərin (s) buyurduqlarında ixtilaf etsələr, Əlinin (ə) sözünü tutar və Əlinin (ə) sözündə ixtilaf etsələr, o zaman Cəfər ibn Muhəmmədin (İmam Cəfəri Sadiqin (ə) sözlərini əsas tutarlar. Çünki ən sağlam yol Peyğəmbərə (s) və Əliyə (ə) nisbət Əhli-beyt (ə.m) yoludur. Əgər İmamları (ə) rəvayət edən kimi də nəzərə alsaq, Peyğəmbərdən (s) ən etibarlı rəvayətçidilər.

Həzrəti-Əli (ə) buyurur:"Biz Əhli-beyt (ə.m) Allah elmindən

bilirik”.

İmam Sadiq (ə) buyurur: “Bizim yanımızda bir şeylər var ki, camaatın onlara ehtiyacı var. Peyğəmbərin (s) imla elədiyi və Əlinin (ə) yazdığı kitab bizim yanımızdadır. O kitabda bütün halal və haram yazılıb”.

İmami-Sadiqin (ə) zamanında İbn Əbul-Ovca adlı bir nəfər Allah-təalanın varlığını inkar etdi.

İmam (ə) onun bu cür batil fikrinə belə cavab verdi: “Allah-təala heç vaxt gizli deyil. Hər bir şey onun əsərlərindədir və ona şahidlik edir. Allah-təala insana onun boynunun damarından da yaxındır”.

İmami-Sadiq (ə) İslam maarifini diriltdi və böyük elmi məktəb yaratdı.

İmamın (ə) şagirdləri elmin müxtəlif sahələrində böyük məqamlara yiyələnib. İslam ölkələrində həqiqəti təbliğ etməklə məşğul oldular. Belə bir etiqadi məktəbi yaratmaq və İslam təlimlərini diriltmək İmami-Sadiqi (ə) haqq məzhəbinin rəhbəri kimi tanıtdı.

Həm İmami-Sadiq (ə), həm də ulu babası əziz İslam Peyğəmbəri Həzrəti-Muhəmməd (s) ibadət barədə belə buyururlar:“İbadət və təqva yalnız namaz qılıb, bir guşədə xəlvətcəsinə ibadət etmək deyildir. Əgər insan yerinə yetirdiyi hər hansı bir işi Allaha xatir görsə və onun fəaliyyəti sadiqcəsinə olsa, Allahın ibadətini yerinə yetirmiş olar”.

Abbasilərin 2-ci xəlifəsi Mənsur Dəvaniqi neçə dəfələrlə istəmişdir ki, İmami-Sadiqi (ə) qətlə yetirsin.

İmami-Sadiq (ə) öz səhabələrinə xilafətdən uzaqlaşmağı əmr etmişdir.

Bir gün Mənsur Dəvaniqi İmam Sadiqə (ə) məktub yazır: “Niyə başqaları kimi bizim yanımıza gəlmirsən?”

İmam Sadiq (ə) bu məktubun cavabında yazır: “Bizim dünyada bir mal-dövlətimiz yoxdur ki, ona xatir səndən qorxaq. Sənin də axirətə layiq bir əməlin yoxdu ki, ona xatir ümidvar olaq. Sən nemət içində deyilsən ki, ona xatir sənə təbrik deyək və sən özünü bəladə görmürsən ki, ona xatir sənə təsəlli verək. Nə üçün sə-

nin yanına gələk?”.

İmami-Sadiq (ə) çalışırdı ki, xalis İslam bulanmamış şəklində qorunsun.

İmami-Sadiq (ə) şəhadət yatağında olarkən çox mühüm olan iki məsələni sifariş etdi:

1. Allah ilə bəndə arasında sıx əlaqə yaradan namaz;

Namaz haqqında İmam (ə) buyurdu: “Həqiqətən biz Əhli-beytin (ə.m) şəfaəti namazı yüngül sayan şəxslərə çatmayacaq.”

2. Qohum-əqraba ilə əlaqə saxlamaq;

Imam (ə) özü bu barədə belə buyurub: “Öz ata və anasını özündən narazı edən şəxs və öz qohum əqrabası ilə get-gəl etməyən şəxs behiştin iyini duymayacaq.”

Həzrəti-İmam Cəfər Sadiq (ə) Mənsur Dəvaniqinin əmri ilə zəhərlənmənin təsirindən dünyasını dəyişdi. İmamın (ə) vəfatından sonra əmr verildi: “Mədinənin valisi İmamın (ə) vəsiyyət məktubunu əldə etsin və İmam (ə) hər kimsəni özü üçün vəsi təyin etsə onun boynunu vursun”.

Abbasilər hakimiyyəti beləliklə şiənin nurunu söndürmək istəyirdilər. Məhəmməd İbn Süleyman İmamın (ə) evinə gəlib vəsiyyətnaməni istədi. Bağlı zərfin ağzını açan kimi təccübdən heç bilmədi nə etsin. İmam Sadiq (ə) vəsilərinin adlarını vəsiyyətnaməsində yazmışdır:

1. Mənsur Dovaniqi (xəlifə)
2. Məhəmməd İbn Süleyman (Mədinənin valisi)
3. Abdullah Əftəh (Böyük oğlu)
4. Həmidə Müsəffah (həyat yoldaşı)
5. Musa İbn Cəfər (20 yaşlı kiçik oğlu)

Beləliklə, xəlifə öz hədəfinə çata bilmədi. İmamın (ə) vəsiyyət məktubunu oxuyarkən dedi: “Bunları öldürmək mümkün deyil”.

Bəs belə bir vəsiyyətlə şiələrin vəzifəsi nə cür olmalıdır? Həqiqi şiələr vəsiyyəti oxuyarkən öz dini vəzifələrini anladılar. Belə ki, Cənab Əbu Həmzə Sümali qoca yaşında İmam Sadiqin (ə) səhabəsi olaraq İmam Sadiqin (ə) vəfat xəbərini eşidərkən ağladı. Sonra vəsiyyətdən xəbər aldı. Vəsiyyətin məzmununu

eşidərkən dərhal dedi: "Vəsiyyətnamə səğirə dəlalət edir, böyük bir fıtnəniıı qarşısı alındı".

Sonra Əbu Həmzə Sumali sözünü açıqlayaraq dedi: "Vəsiyyətnamədə Mənsur və Valinin adlarının yazılması qətlin qarşısını aldı. Qadın imam ola bilməz. Kiçik və böyük oğulun adının bir yerdə gəlməsi böyüyün imam olmamasına dəlalət edir".

Beləliklə, şiələr başa düşdülər ki, İmam Sadiqin (ə) canişini Həzrəti-İmam Musa İbn Cəfərdir (ə). Belə ki, başqa sübutlar da bu mənaya dəlalət edirdi.

Mənsur Dəvaniqi məlum şəxslərin vasitəsi ilə zəhərlənmiş üzümlə İmami Sadiqi (ə) zəhərlədi. O Həzrət (ə) də bu zəhərin təsiri ilə Hicri 148-ci ilin Şəvval ayının 25-i Mədinə şəhərində 65 yaşında şəhadətə yetişdi. Məzarı Mədinə şəhərində yerləşən Bəqi qəbirstanlığındadır. Bu deyilənlər şairin aşağıdakı beytlərində bir daha öz təsdiqini tapmaqdadır:

*Açarım dini Muhamməd, məzhəbi Cəfər yəqin,*
*La fəta illa Əli, bu sirri pünhan məndədir.*

*Şahi-Mərdanın, Əlinin aliyəm, övladiyəm,*
*Zülfüqarı tacı Düldül uş bu nişan məndədir.*[1]

Və yaxud.

*Şah Xətaim İmam Cəfər müxbiri,*
*Haqqın yaranıdır Veysül-Qərəni.*
*Haqqın xəznəsindən gələn gövhəri,*
*Müştəri olmadan satmalı deyil.*[2]

---

[1] Şah İsmayıl Xətai. "Keçmə namərd körpüsündən" (Şeirlər və poemalar). Bakı, "Yazıçı", 1988. səh.52

[2] Şah İsmayıl Xətai. "Keçmə namərd körpüsündən" (Şeirlər və poemalar). Bakı, "Yazıçı", 1988. səh.310

Qəsidə 7-ci İmam Museyi-Kazımın (ə) tərənnümü ilə davam edir:

***İmam Musa Kazim, ol hadiyi din,***
***Kim, ol xurşidi-bürci-övliyadur.*** *(Q.2, səh.268)*

(Din üzrə yol göstərici olan o İmam Museyi-Kazım (ə) övliya bürcünün günəşidir).

Bu din böyüyünün vüsətli tərənnümü onun həyatının mürəkkəbliyindən irəli gəlir. Bəllidir ki, İmam Museyi-Kazım (ə) illərlə zindanda qalmışdır. Zindana düşməsinin səbəbi müxtəlif səbəblər deyilsə də ən başlıca amil kimi Bəni Abbas xəlifəsi Harun Ərrəşidlə İmamın arasında olan Fədək məsələsi olmuşdur. İmam Museyi-Kazım (ə) Məkkə və Mədinə arasında olan "Əbva" adlı bir kənddə anadan olmuşdur. Atası İmam Sadiq (ə), anası: Həmidə (s.ə) olmuşdur. Məşhur ləqəbləri: Əbdi-Saleh, Kazım, Babəl-Həvaic. Künyəsi: Əbul-Həsən, Əbu İbrahim.

Şəhadət tarixi: 25 Rəcəb, 183-cü il, 55 yaşında.

Şəhadət yeri: Bağdadda Harunun həbsxanasında, onun əmrilə zəhər verilmiş və şəhadətə çatmışdır.

Müqəddəs məzarı: Bağdadın yaxınlığında, "Kazimeyn" şəhərində.

İmam Museyi-Kazimin (ə) yaşadığı dövrü iki mərhələyə bölmüşlər.

– İmamlıqdan qabaqkı dövr, 128-148-ci illər (20 il).
– İmamlıq dövrü, 148-183-cü illər. (35 il)

O Həzrətin (ə) yaşadığı dövrdəki tağut və zalım xəlifələr bunlardan ibarət idi:

– Mənsur Dəvaniqi
– Mehdi Abbasi
– Hadi Abbasi
– Harun ər Rəşid.

Həzrəti-Kazimin (ə) ömrünün 23 il, 2 ay 17 günü Abbasilər xilafətinin beşinci xəlifəsi Harunun dövründə olmuşdur. Bu illər boyu o, müxtəlif həbsxanalarda dustaq olmuşdur.

İmam Sadiq (ə) şəhid olan zaman Mənsur Dəvaniqi öz hakimiyyətinin ən son həddini yaşayırdı. Mənsur elə bir şəxsiyyət idi ki, öz hakimiyyət dayaqlarını möhkəmlətmək üçün bir çox insanları qətlə yetirirdi. İmam Kazim (ə) atasının vəfatından sonra 20 yaşında İslam hökümətinin xəlifəsi sayılan bu kimi zalım bir hakimlə üzləşmişdi.

Dövrün vəziyyətinə nəzər saldıqda aydınlaşır ki, Mənsur hökümətinin əvvəlcədən üzərində nəzarəti olan hər hansı bir qəti iş və proqramı həyata keçirmək məsləhət deyildi.

Bu səbəbdən İmam Kazim (ə) atasının tutduğu elm yolunu davam etdirərək böyük elm ocağı (İmam Sadiqin (ə) elm ocağından kiçik) yaradıb tanınmış elmli və fəzilətli şəxsiyyətləri yetişdirməyə başlayır.

Lakin bütün bunlarla yanaşı eyni zamanda dövrünün xəlifələrinin ədalətsizliyi, zorakılıqları müqabilində öz etiraz əlamətlərini bildirməkdən çəkinmir, ədalət uğrunda mübarizə aparırdı. Zahiri hakimiyyət və qüdrət dövrünün xəlifələrinin əlində olsa da, yalnız camaatın **“cisminə”, “quru bədəni”** nə hakimlik edirdilər. Qəlblərə hakim olmaq ancaq İmam Kazıma (ə) məxsus idi. Ümumi fikirlərdəki məhəbbəti sayəsində mübariz və açıqfikirli müsəlmanlar sonda öz malının xumsunu, həmçinin beytül-mala mənsub olan digər vergiləri o Həzrətin (ə) hüzuruna göndərirdilər.

Dostlarından biri İmamın (ə) səbr və dözümü barədə belə demişdir: “Həzrət (ə) həmişə öz nümunəvi əxlaqi ilə düşməni utandırardı”.

Mədinədə bir kişi var idi ki, hər zaman İmamı (ə) görsəydi qabağını kəsib ona nalayiq sözlər deyərdi. Bir gün dostları İmama (ə) ərz etdilər ki: “Yəbnə Rəsulillah (ə) icazə ver biz onu tənbeh edək”. İmam (ə) buyurdu: “Onunla işiniz olmasın”.

Bu söhbətdən bir neçə gün keçdi, lakin həmin kişidən xəbər çıxmadı. İmam (ə) onun harada olduğunu soruşdu. Dostları dedilər ki: “O, Mədinə çölündəki tarlasına gedib”. Bunu eşidən İmam (ə) həmin tarlaya getdi. Tarlada işləyən həmin kişi İmamı (ə) uzaqdan görüb səsləndi: “Mənim tarlama girmə! Mən səni və

sənin ata-babanı özümə düşmən bilirəm”. İmam (ə) ona yaxınlaşıb salam verdi və mehribanlıqla sual etdi: “Bu tarlaya nə qədər xərcləmisən?” Kişi dedi: “Yüz dinar”. İmam (ə) sual etdi: “Nə qədər gəlirin olacağına ümid edirsən?” Kişi dedi: “İki yüz dinar”. İmam Kazım (ə) içində 300 dinar olan bir kisəni çıxarıb ona verdi və buyurdu: “Bu pulu al, tarlan da özünə qalsın”. Uzun illər İmamı (ə) təhqir edən həmin kişi belə bir hadisənin olacağını gözləmirdi. Bu hadisədən utanan kişi İmamın (ə) əlindən öpdü və ondan üzr istədi. İmam (ə) Mədinəyə qayıtdıqdan sonra buyurdu:“Şəri özünüzdən belə uzaqlaşdırın”.

Bu hadisədən sonra İmama (ə) ***“Kazım”*** ləqəbi verildi. ***“Kazım”*** ləqəbinin mənası qəzəbləndiyi zaman narahatçılığını büruzə verməyən və qəzəbləndiyi zaman qəzəbini udan deməkdir.

İmam (ə) öz qohumlarına məhəbbət bəsləyər və belə buyurardı:“Qohumların arasında nə qədər düşmənçilik olsa da əgər bir-birləri ilə qarşılaşdıqları zaman əl verib görüşsələr düşmənçilikləri aradan qalxar. Və hamısı dinclik və şadlıq içində yaşayar”.

İbni Şəhr Aşub belə nəql edir: “Bir gün Abbasi xəlifəsi Mənsur İmam Kazımı (ə) saraya dəvət edib əmr etdi ki, ***“Novruz bayramı”*** günü xəlifəyə gətirilən hədiyyələri təhvil alsın. İmamın (ə) bu işə razılığı olmasa da, məcburiyyət qarşısında qəbul etməli oldu. Rəsmi qarşılanma mərasimində iştirak edən böyüklər və zadəganlar Mənsurun əmri ilə hədiyyələri o, Həzrətə (ə) təhvil verirdilər. Bir nəfər də Mənsurun tərəfindən orada durub gətirilən hədiyyələri siyahıya alırdı. Axırda bir qoca gəlib dedi: “Ey Peyğəmbər övladı, mənim dünya malından hədiyyə etmək üçün heç bir şeyim yoxdur. Amma baban Hüseynin (ə) Kərbəla müsibətinə dair bir şeir yazıb sənə gətirmişəm”.

Qoca kişi yazdığı şeiri oxudu. Onun bu şeiri İmama (ə) çox təsir etdi. Həzrət (ə) Mənsurun məmuruna əmr etdi ki: “Get Mənsurdan soruş gör bu hədiyyələri nə edəcək?”. Məmur gedib qayıtdıqdan sonra İmama (ə) dedi. Mənsur deyir ki: “Hədiyyələrin hamısını sizə bağışladım. İstədiyiniz adama verə bilərsiniz”.

İmam (ə) həmin şeir yazan qoca kişiyə tərəf dönüb belə buyurdu: “Babam Hüseynin (ə) müsibətlərinə dair yazdığın şeirə

görə bu hədiyyələrin hamısını mən də sənə bağışlayıram ki, bu yoxsulluqdan qurtarasan”.

İmam (ə) həmişə özü öz məişətini təmin etmək üçün tarlada işləyər və heç kimsədən kömək istəməzdi. Bir gün Əli Bətaini adlı bir səhabəsi İmamı (ə) görmək üçün tarlaya gəldi. İmamı (ə) iş başında gördükdə ərz etdi ki; “Qurbanın olum, niyə bu işi başqa adamlara gördürmürsən?” İmam (ə) buyurdu: “Niyə başqalarına gördürüm? Halbuki, məndən daha yaxşı adamlar belə işlərlə məşğul olublar”. Əli Bətaini soruşdu: “O şəxsilər kimlərdir?” İmam (ə) buyurdu: “Allahın Peyğəmbəri (s), Əmirəl-Möminin və bütün ata-babalarım. İşləyib-çalışmaq Allahın Peyğəmbərləri (ə) və vəsilərinin üsuludur. Və Allahın ləyaqətli bəndələri həmişə öz güzaranlarını təmin etmək üçün öz işlərini özləri görüblər”.

Günlərin bir günündə İmam Kazım (ə) küçədən keçəndə bir evdən çal-çağır səsi eşidir. Böyüklərdən sayılan ev sahibi özü üçün kef məclisi qurub əylənməklə məşğul idi. Evin kənizi evdə olan zibilləri küçəyə atmaq üçün bayıra çıxdı. Kəniz İmamı (ə) görən zaman ona yaxınlaşıb salam verdi. İmam (ə) ondan soruşdu: “Bu evin sahibi bəndədir, ya azad insandır?” Kəniz dedi:“Azad insandır”. İmam (ə) buyurudu:“Azad olduğu bəllidir. Əgər bəndə olsaydı, Allahdan qorxub bu işləri görməzdi”. Kəniz evə qayıtdıqdan sonra ağası ondan nə üçün gec gəldiyini soruşdu. Kəniz əhvalatı olduğu kimi ağasına danışdı. Ağası bir az duruxub İmamın (ə) sözləri barədə fikrə getdi. Birdən yerindən qalxıb ayaqyalın İmamın (ə) dalınca qaçdı. Özünü İmama (ə) yetirib salam verdi və öz əməlindən peşman olduğunu söyləyib İmamın (ə) hüzurunda tövbə etdi. O gündən sonra kef məclisini ibadətgaha çevirdi. Həmin günün xatirəsini əbədi yaşatmaq üçün o gündən etibarən ayaqyalın gəzərdi. Buna görə də o **“Bişri-hafi”** (ayaqyalın) ləqəbi ilə məşhur oldu.

*Tövbə ilə əfv olur aləmdə çox cürmi-günah,*
*Hər iki aləmdə vardı çünki adil padişah.*
*Gər bəşər övladısan, olma Xudadan bipənah,*

*Adəmin şanində "Kərramna" dedi niqti-İlah,*
*Əhli-mənasan həqiqət sümmə-vəchullahı gör.*[1]

Haşiyə: Fədək Xeybərin yaxınlığında səfalı, bol, yaşıllıq olan və sərhədləridə heç kimə məxfi olmayan bir kənd olub. Harun Ərrəşid İmam Museyi-Kazimə (ə) təklif etmişdir ki, Fədək bağlarına sərhəd qoysun ki, onu Xanım Fatimeyi-Zəhranın (s.ə) varislərinə qaytarsın. İmam Museyi-Kazim (ə) isə cavabında buyurmuşdur: "Onu yalnız kamil şəkildə götürə bilərəm! Mən Fədəyi yalnız həqiqi sərhədləriylə geri alacağam!" Harun dedi: "Həqiqi sərhədləri haradır?" İmam Museyi-Kazim (ə) buyurdu: "Mən onları desəmdə əminəm ki razılaşmayacaqsan". Harun dedi: "And olsun baban Peyğəmbərin (s) haqqına, sən de, (mən qaytaracağam!)" İmam Museyi-Kazim (ə) buyurdu: "Bir tərəfdən ərazisi Ədən ərazisidir". Harun (üzü bozarmış halda) dedi: "Əcəb, Əcəb". İmam Museyi-Kazim (ə) buyurdu: "İkinci sərhəddi Səmərqənddi!" (Harunun üzündə narahatçılıq cizgiləri daha da artırdı). İmam Museyi-Kazim (ə) sözünə davam edərək buyurdu: "Üçüncü tərəfdən sərhəddi Afrikadı!" Harun (sifəti narahatçılıqdan qaralmış halda) dedi: "Əcəb". İmam Museyi-Kazim (ə) buyurdu: "Dördüncü tərəfdən sərhəddi Xəzər dənizinin sahilləridir!" Harun dedi: "Bizim üçün heç nə qalmadı ki, elə isə qalx mənim yerimdə əyləş camaata hökümətlik et!" (Mənası budur ki, sənin sadaladığın sərhədlər bütövlükdə İslam ölkəsinin sərhədləridir). İmam Museyi-Kazim (ə) cavabında buyurdu: "Sənə demədim ki, həqiqi sərhədləri bəyan etsəm onu mənə verməyəcəksən?!" İmam (ə) əvvəldə dediyi sözü ona xatırlatdı, məhz bu andan etibarən Harun öz zehnində İmamı (ə) qətlə yetirməyin planını fikirləşdi.

Bu mənalı hədis Fədəklə xilafət məsələsinin bir-birinə bağlı olduğunun aydın dəlilidir. Məsələnin əsas mahiyyəti Allah Rəsulunun (s) xilafətinin qəsb olunmasıdır. Harun həqiqətdə Fədə-

[1] Axund Hacı Soltanın Ş.İ.Xətaiyə yazdığı təxmis

yi İmama təhvil vermək istəmirdi, bu yalnız siyasi bir gediş idi. Beləki bu siyasi gedişi ilə xalqın gözündə özünü ədalətli xəlifə portreti çəkmək istəyirdi. Əgər Fədəyi əsl sahibinə qaytarsaydı, onda xilafəti də haqqı olduğu xanədana yəni İmam Musa ibn Cəfərə (ə) qaytarmaq məcburiyyətində qalacaqdı. Bu məntiqlə İmamın istənilən zaman qüdrət əldə edib onu xilafət taxtından devirə biləcəyi ehtimalı ilə xəlifə Harunun planlarına yeni bir cinayət əlavə etdi, Həzrəti-İmam Museyi-Kazimi (ə) şəhadətə yetirmək!

Həzrəti-Peyğəmbərin (s) rehlətindən sonra baş verən Fədək və digər kədərli hadisələr Əhli-beyti (ə.m) İslami xilafət və hökumətdən uzaqlaşdırmaq, onların vilayət və imamət məqamını görməməzliyə vurmaq məqsədini daşıyırdı. Siyasi oyunçular, İslamın ilk dövrlərindən xüsusilə də Bəni-Üməyyə və Bəni-Abbas tayfalarının hakimiyyətləri zamanından başlayaraq Əhli-beyti (ə.m) hər cəhətdən sındırır, onların adlarından istifadə edir, haqlarını əllərindən alırdılar. Bəni-Üməyyə və Bəni-Abbasın hakimiyyətləri dövründə İslam ölkəsinin ərazi sərvətlərinin həcmi və büdcə gəlirlərinin dünya tarixində nadir rastlanan və ya nümunəsi çox az gözə çarpan miqdar və miqyas da tərəqqi etməsi faktı danılmazdır. Təbii ki, kiçik bir kənd olan Fədəkin ərazisi və gəliri ölkənin ümumi göstəricilərinin yanında hesaba gəlməyəcək qədər kiçikdir. Amma şeytani düşüncələr yenədə hakimiyyətdəkilərə Fədək sahiblərinin Fədək ərazisi sayəsində qüdrət əldə edə biləcəkləri qorxusu olduğu üçün bu haqqı öz sahiblərinə qaytarmağa icazə vermirdi.

Fədək hadisəsi həqiqətdə İslam tarixinin gizli planlar və tarixi təxribatlarla zəngin elə bir səhifəsidir ki, onu mütaliə edənlər, Peyğəmbər (s) xanədanının məqamını, məzlumiyyətini (haqlarının tapdalanmasını) düşmənlər tərəfindən sıxışdırılaraq siyasət meydanından kənarlaşdırıldıqlarını açıq aşkar görə bilərlər.

Fədək hər bir dövrdə Əhli-beyt (ə.m) üçün xilafət rəmzi olmuşdur. Belə ki, Xanım Fatimeyi-Zəhra (s.ə) Fədək bağlarındaki haqqını tələb etdiyi zaman, onu maliyyə tərəfi maraqlandırmırdı.

Çünki sadə və pəhrizli həyata alışmış Həzrəti-Fatimeyi-Zəhra (s.ə) üçün dünya həyatının heç bir qiyməti yox idi. Həzrəti-Əli (ə) dünya həyatından danışaraq deyirdi: "Bəli göy üzünün kölgələndirdiyi bu dünya üzündə əlimizdə bir Fədək vardı, ona da cəmiyyətin bir qismi həris oldu və bir qismi də səxavət göstərdi. Mən neyləyirəm Fədəyi və yaxud ondan başqa bir yeri ki, bu nəfsin məkanı sabah məzardır".

Harun Ər-Rəşid İmam Museyi-Kazimə (ə) təklif etmişdir ki, Fədək bağlarına sərhəd qoysun ki, onu Həzrəti-Fatimeyi-Zəhranın (s.ə) varislərinə qaytarsın. İmam Museyi-Kazim (ə) isə cavabında buyurmuşdur: "Onu yalnız kamil şəkildə götürə bilərəm!"

Yuxarıda qeyd olunanlardan bir daha bu anlaşıldı ki, Fədək Həzrəti-Fatimeyi-Zəhranın (s.ə) nəzərində (və eləcədə Əhli-beyt (ə.m) İmamlarının nəzərində) Həzrəti-Əlinin (ə) xilafətdəki haqqına keçid körpüsü olmuşdur.

İmam Kazim (ə) hicrətin 183-cü (və ya 186) ilində zəhərlənərək şəhid olmuşdur. Məzarı İraqda **"Kazimeyn"** şəhərində böyük ziyarətgahdır.

***İmami-həştüm ol Şahi-Xorasan,***
***Həqiqət bil, Əli Musər-Rzadur.*** *(Q.2, səh.268)*

(Xorasan şahı olan 8-ci İmam, heç şübhəsiz, Əli Musa Rzadır).

Xorasan Səfəvi sülaləsi ilə bir xeyli bağlı yerdir. Bu barədə yuxarıda məlumat vermişdik. Digər tərəfdən Xorasan İmamın dəfn edildiyi yerlərin Səfəvilərin məkanı olan Ərdəbilə ən yaxınıdır. Odur ki, Xorasan motivi nəinki Xətainin, həmçinin klassiklərimizin yaradıcılığında da geniş yer tutur: Məsələn, Aşıq Qurbani, Məhəmməd Füzuli, Məhəmməd Əmani və Nəbati yaradıcılığında olan beytlərə nəzər salaq:

*Xorasanda qızıl gümbəz ağası!*
*Gözüm sənin intizarın çəkibdi.*

*Haqq buyurdu: Həbib getdi Meraca,*
*Ona peşkəş ol Quranı çəkibdir.*
*(Aşıq Qurbani)*

Xətainin özündən də örnəklər verək:

*Məhəmməd Baqirü, Cəfəri-Sadiq,*
*İmam Kazim, Əli Musa-Rizadur. (Q.63, səh.76)*

Və yaxud,

*Əli Musər-Riza şahun gələn çün daim əmrinə,*
*Dunu gün həqqə nalişdə be qayət biriya gəldi.*
*(Q.6, səh.274)*

İmam Rza (ə) 148-ci hicri qəməri ilinin Zilqədə ayının 11-də Mədinə şəhərində dünyaya gəlib. Atası İmam Kazım (ə), anası Tüktəm xanım idi.

İmam Rzanın (ə) anası haqqında bu cür deyilir: "Əcəmin böyüklərindən olan İmam Kazımın (ə) anası Həmidə bir kəniz aldı və onu **"Tuktəm"** adlandırdı. O kəniz əql, həya və din baxımından ən yaxşı qadınlardan idi. O, Həmidəyə çox ehtiram göstərirdi. Bir gün Həmidə onu övladı İmam Kazıma (ə) bağışladı və onun sifarişini İmama (ə) çatdırdı. İmam Kazım (ə) onunla ailə qurdu. İmam Rza (ə) dünyaya gələndən sonra isə Həmidə (ə) ona **"Tahirə"** ləqəbini verdi".

İmam Rzanın (ə) adı Əli, künyəsi Əbülhəsən, ən məşhur ləqəbi isə Rzadır (ə).

İmam Rzanın (ə) səhabələrindən biri İmam Cavada (ə) ərz etdi: "Sizin müxaliflərinizdən bir dəstə belə güman edirlər ki, Bəni Abbasi xəlifəsi Məmun İmam Rzanı (ə) özünə vəliəhd seçən vaxt **"Rza"** ləqəbini yüksək məqamlı atanıza verdi". İmam Cavad (ə) buyururdu: "And olsun Allaha, onlar yalan deyirlər. Allah-təala onu Rza adı ilə adlandırdı. Çünki asimanda Allah yanında bəyənilmiş, Yerdə isə Allah Rəsulu və Əhli-beyt (ə.m) on-

dan xoşnud olmuşlar və Allah onu imamətə bəyənmişdir”.

Bu şəxs deyir ki, İmam Cavaddan (ə) soruşdum: “Sənin keçmiş ataların Allah, Peyğəmbər (s) və İmamət (ə) tərəfindən bəyənilmişdimi?” İmam Cavad (ə)buyurdu: “Bəli!” Dedim: “Bəs nə üçün İmam Rza (ə) onların arasından bu ləqəblə tanınmışdır?” İmam Cavad (ə) buyurdu: “Çünki müxaliflər və düşmənlər də ondan razı olmuş, onu bəyənmişlər”.

İmam Rza (ə) atası İmam Kazımın (ə) şəhadətindən sonra hicri qəməri 183-cü ilində 35 yaşında İmamət məqamına çatdı. Onun imamət müddəti 20 il çəkdi. Birinci on ili Harun-ər Rəşidin xilafəti dövrünə, ondan sonra 5 il Harunun böyük oğlu Məhəmməd Əminin xilafətinə, axırıncı 5 ili isə Harunun kiçik oğlu Abdullah Məmunun xilafət dövrünə təsadüf etmişdir.

İmam Rza (ə) Harun-ər Rəşidin xilafəti dövründə Mədinə şəhərində yaşadı, İmam (ə) Mədinədə olduğu müddətdə çoxlu şagirdlər yetişdirmiş və şiəlik məktəbinin maarifi, elmlərinin nəşri sahəsində mühüm addımlar atmışdı.

Bəzi bədxahlar İmamın (ə) bu işlərindən xəbərdar olduqda Bağdada gəlib Harunla görüşür və ona çatdırırlar ki, bəs Musa İbn Cəfərdən sonra oğlu onun yerində oturub imamət iddiası edir. Bu, sizin xilafətiniz üçün qorxuludur. Harun əsəbi halda dedi: “Atası ilə etdiyimiz kifayət deyilmi? İstəyirsiniz qılıncı əlimə götürüb bütün ələviləri məhv edim?”

İstər Bəni Üməyyə, istərsə də Bəni Əbbasdan olan xilafət qəsbkarları Əhli-beytdən (ə.m) qorxurdular.

Çünki yaxşı bilirdilər ki, xilafət Əhli-beytin (ə.m) haqqıdır. Peyğəmbərin (s) varisləri olan bu pak ailəyə hər bir fürsətdən istifadə edərək əzab-əziyyət etməkdən çəkinmirdilər… Amma Məmun digər yolu seçdi. O, atasından daha zirək idi. Məmun İmam Rzanı (ə) zindana atmadı, ona zahiri işgəncə və əzab vermədi, onlardan daha ağır əzab verdi. İmam Rzanın (ə) ruhunu sıxıntı və təzyiqdə saxladı. Bu sıxıntı və təzyiqlərin çoxluğu sayəsində İmam Rzanın (ə) məcburi halda vəliəhdliyi qəbul etməsi baş verdi.

İmam Rza (ə) dəfələrlə Məmunun vəliəhdlik təklifindən bo-

yun qaçırdı. İş o yerə çatdı ki, Məmun bərk əsəbiləşərək İmamı (ə) ölümlə hədələdi. İmam Rza (ə) bir neçə səbəbə görə məcbur qalıb vəliəhdliyi qəbul etdi.

Bir rəvayətdə nəql olunmuşdur ki, "İmamdan (ə) hansı məcburiyyətə görə vəliəhdliyi qəbul etdiniz?" – deyə soruşduqda buyurdu: "Həmin məcburiyyətə görə ki, babam Həzrəti-Əli (ə) Şurada iştirak etməyə məcbur oldu". (Həmin Şura Ömər İbn Xəttabın göstərişi ilə xəlifəni təyin etməkdən ötrü təşkil edilmişdi).

Başqa bir rəvayətdə İmam Rza (ə) buyurub: "Onun (Məmunun) sözlərinə aldanmayın. And olsun Allaha, məni ondan başqası qətlə yetirməz. Amma səbr etməkdən başqa bir çarəm yoxdur ki, ömrümü başa vurum".

İmam Rza (ə) əlinə düşən bütün fürsətlərdən camaatı agah etmək üçün istifadə edirdi. Nişapur əhlinin yanında "Silsilətül-zəhəb" – "Qızıl Silsilə" hədisində buyurur: "La ilahə iləllah" mənim qalamdır. Ona daxil olan hər bir kəs mənim əzabımdan amandadır. Əlbəttə, bunun şərtləri vardır və mən də o şərtlərdən biriyəm".

İmam Rza (ə) Məmunun onun vəlihədliyindən öz xilafətinin qanuniləşdirilməsi üçün istifadə etməsinə imkan vermədi və Əhli-beytin (ə) vilayətinin haqq olduğunu hər yerdə hamıya bəyan etdi.

Məmunun vəliəhdliyi İmam Rzaya (ə) təklif etməsinin və onu məcburi şəkildə İmam Rzanın (ə) öhdəsinə qoymasının mühüm dəlilləri aşağıdakılardan ibarətdir:

1. İmam Rzanın (ə) mənəvi məqamına və üsyançı hesab etdiyi ələvilərə zərər yetirmək;
2. Abbasilərin hökumətini qanuni hökumət kimi qələmə vermək;
3. Əhli-beyt (ə.m) aşiqi olan və Abbasilərə nifrət bəsləyən camaatı cəzb etmək;
4. İmam Rzanın (ə) fəaliyyətini nəzarət altına götürmək;
5. Öz hökumətinin Xorasan əhalisi və bütün iranlılar tərəfindən qanuni hökumət kimi qəbul olunması.

"Uyunu-Əxbarir-Riza" kitabında yazılıb: "Bəni-Abbas xəlifə-

si Məmunun əmri ilə bütün alimlərin İmam Rzanın (ə) hüzuruna gəldikləri gün İmam (ə) onlardan soruşdu: "Qurani-Kərimdə "Ya-sin" kəlməsində kim nəzərdə tutulub?" Bəni-Abbas alimləri dedilər: "Ya-Sin"dən məqsəd Muhəmməddir (s). İmam (ə) buyurdu: "Allah-Təala İslam Peyğəmbərinə (s) bir üstünlük vermişdir ki, onu ağlı və düşüncəsi olmayanlar başa düşə bilməzlər. O üstünlük belədir. Allah-təala Qurani-Kərimdə Peyğəmbərlərdən (ə) başqa heç kəsi salamlamayıb. Belə ki, "Səffat" surəsinin 79-cu ayəsində "Salam olsun Nuh Peyğəmbərə (ə) bütün aləmlərdə", 109-cu ayədə "Salam olsun İbrahimə (ə), 120-ci ayədə "Salam olsun Musaya (ə) və Haruna (ə), 130-cu ayədə "Salam olsun "Ali-Ya-Sin"ə, 182-ci ayədə "Salam olsun bütün Rəsullara". Allah-təala "Salam olsun "Ali-Ya-Sin"ə buyurarkən "Ya-Sin" övladların nəzərdə tutur. Bir halda ki, "Ya-Sin" Peyğəmbərə (s) dəlalət edir, "Ali-Yasin"də Əhli-beytə (ə.m) dəlalət edir".

İmam Hicri-qəmərinin 203-cü ilinin səfər ayının sonunda Nuqanın Sənabad adlı məkanında Abbasi xəlifəsi Məmunun göstərişi ilə zəhərlənib 55 yaşında şəhid edildi. Onun pak və müqəddəs qəbri İranın Məşhəd şəhərindədir.

***Muhəmməd Təqidür ol elmə təhqiq,***
***Ki, təqva əhlinə ol pişvadur.*** *(Q.2, səh.268)*

(İmamlıq elminin sirlərini ortaya çıxmasında Məhəmməd Təqinin (ə) ayrıca yeri var. Ona görə də o, təqvalı şəxslərin başçısıdır, onlar üçün gözəl bir örnəkdir).

Allah-təala "Leyl" surəsində buyurur ki, Allah ona itaət, bəndəlik, təqva və xeyriyyəçilik yolunda ixlasla hərəkət edən adama uğur bəxş edir, onun bu yoldakı hərəkətini asanlaşdırır. Əslində yaxşı əməl başlanğıcda çətin olur, ancaq təkrar və davam etdirildikdə elə asanlaşır ki, insan ondan zövq alır, tərk etmək isə ona çətin gəlir. O qədər səxavətli adamlar var ki, qonağın süfrə başında əyləşməsindən zövq alirlar. Bir gün qonaq gəlmədikdə narahat olurlar. Bu, bir növ çətinliyin onlar üçün asanlaşdırılmasıdır. Ümumiyyətlə, axirət gününə və Allahın böyük mükafatlar

verəcəyinə inam insana çətinliklərə tab gətirməyi asanlaşdırır. Bu asanlıq elə həddə çatır ki, insan nəinki malını, hətta canını da rahatlıqla verməyə, böyük eşqlə müharibə meydanında şəhid olmağa və fədakarlığından ləzzət almağa hazır olur.

Təqva ən üstün libasdır: Allah insanın bədənini, ayıb yerlərini örtən, bədəninin çöldə qalmasının qarşısını alan libasdan danışdıqdan sonra insana zahiri libasdan daha yaxşı olan, onun batini, aşkara çıxarmasını qorxduğu eyblərini örtən batini libasdan söz açır. Bu libas Allahın göstəriş verdiyi təqva (Allaha görə günahlardan qorunmaq) libasıdır. Məlumdur ki, zahiri eyblərin aşkara çıxması ilə baş verən rüsvayçılıq və xarlıq batini eyblərin aşkara çıxması ilə baş verən rüsvayçılıqla eyni səviyyədə deyil. Çünki batini eyblərin aşkara çıxması Allahın qəzəbi və onun alovlanmış oduna bərabərdir. Deməli, batini libas olan təqva libası zahiri libasdan daha yaxşıdır. İmam Baqir (ə) "Əraf" surəsi 26-cı ayədən danışarkən "iffət"i təqva libasının bir nümunəsi kimi tanıtdırdıqdan sonra belə buyurmuşdur: "Təqva libası iffətdir. İnsanın ayıb yeri əynində libas olsa belə, iffət vasitəsilə örtülü olur. Günahkar insanın əynində paltar olsa belə, ayıbları çöldə olur".[1] Yəni, təqvalı insan əynində heç bir paltar olmasa belə, heç bir halda öz iffətini itirmir, iffəti bütün varlığının mahiyyətini təşkil edir. İffətsiz, həyasız insanın əynində növbənöv paltarlar olsa belə, hər bir şəraitdə həyasızdır.

Dünyada çox az ömür sürməsinə baxmayaraq bu din böyüyünün həyat və fəaliyyəti Şah Xətaini özünə doğru çox cəlb etmişdir. "Ol elm imamət elmi və pişva" (başçı və ya ən gözəl örnək) ifadələri bunu göstərir.

Ləqəbi Təqi və Cavad olan İmam Muhəmməd (ə) hicrətin 195-ci ilində Mədinə şəhərində doğulmuşdur. Anası Səbikə xa-

---

[1] Nümunə, c.27, səh. 74; Əl-mizan, c.8, səh. 71; Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 295-153

nım əxlaqi dəyərlər baxımından yüksək mərtəbədə dururdu. Atası İmam Rza (ə) vəfat edərkən İmam Təqinin (ə) təxminən 7 yaşı vardı.

O, İmam (ə) olduğu müddət ərzində iki Abbasi xəlifəsi – Məmun və Mötəsimlə bir dövrdə yaşamışdır. Adı çəkilən xəlifələrin hər ikisi o, Həzrəti (ə) məcburi şəkildə Mədinədən Bağdada gətizdirmiş və Məmunun İmam Rza (ə) barədə icra etdiyi siyasəti davam etdirərək onu paytaxtda saxlamaqla nəzarət altına almışlar.

İmam Rzanın (ə) ailəsində, həmçinin müsəlmanlar arasında İmam Təqi (ə) xeyir-bərəkətli bir uşaq kimi tanınmışdı. Kiçik yaşlarından İmamət məqamına yetişmiş ilk İmam olduğundan o Həzrətin (ə) həyatını mütaliə edərkən irəli çıxan ilk sual bu olur: “Azyaşlı bir kəs müsəlmanların rəhbərlik məsuliyyətini necə öz öhdəsinə götürə bilər?”

Bir uşağın ümmətə rəhbər seçilməsi onların ağlına sığmadığı üçün öz fikirlərində İmam Təqini (ə) elmi mübarizə meydanında məğlub edəcəklərini düşünüb, o Həzrətə (ə) çətin və dolaşıq suallar verirdilər. Ancaq bu müzakirələrin hər birində İmam Təqi (ə) öz qəti və aydın cavabları ilə özünün İmam (ə) olması məsələsi üzərində bütün şəkk-şübhəni qaldıraraq İmam (ə) olduğunu və ümumiyyətlə, İmamət məsələsini isbat edirdi.

Həzrəti-Rzanın (ə) şəhadətindən bir il sonra Məmun bir dəstə atlı ilə ova çıxmışdı. Küçədə uşaqlar oynayırdılar. Bir uşaq da qıraqda dayanıb onların oyunlarına baxırdı. Uşaqlar Məmun ilə atlılarını görən kimi qaçıb getdilər. Lakin on bir yaşlı uşaq yerində dayanıb tərpənmirdi. Abbasi Xəlifəsi Məmun uşağa yaxınlaşıb dedi: – Ay oğlan, bəs sən niyə o biriləri kimi qaçmadın?

On bir yaşlı oğlan belə cavab verdi: – Yol elə də darısqal deyildi ki, sənin yolunu tutmuş olam. Bir pis iş də görməmişəm ki, səndən qorxam. Sizin səbəbsiz olaraq birini incidəcəyinizi də güman etmirəm. Deməmk, qaçmağım mənasızdır.

Xəlifə Məmun uşağın ədəb və cəsarətindən heyrətə gəlib soruşdu:

– Sənin adın nədir?

Uşaq cavab verdi:
– Muhəmməd.
– Kimin oğlusan?
Dedi:
– Əlinin.
Məmun dedi: – Sən İmam Rzanın (ə) oğlu deyilsənmi?
Uşaq dedi: – Bəli.
Xəlifə uşağın bu ədəbindən ona afərin deyib, atlıları ilə çıxıb getdi.

İmamın (ə) əxlaqi xüsusiyyətlərindən çox danışmaq olar. Hələ atası sağ olarkən, atasının dostlarından biri o Həzrət (ə) üçün oyuncaq alıb gətirmişdi. Oyuncağı görən kimi Həzrət (ə) narahat olub buyurdu:– Mən bunları neynirəm? Allah bizim həyatımızda əyləncəyə yer qoymayıb. Biz elm və fəzilət xanədanıyıq.

Bəzəndi deyir: “Bir gün İmam Rza (ə) Mədinədə olan oğluna bu məzmunda bir məktub yazdı:

“Övladım, eşitdiyimə görə qulluqçular icazə vermirlər ki, xalq sizinlə asanlıqla əlaqə yaradıb öz məsələlərini soruşsunlar. Bunu bil ki, onlar sənin xeyir və səadətini istəmirlər. Sənə əmr edirəm ki, qapın hamının üzünə açıq olsun, qoy hamı gediş-gəlişdə sərbəst olsun ki, səndən bir şey soruşmaq istədikdə imkan tapsınlar. Bir yerə getmək istədikdə mütləq yanında pul götür ki, ehtiyacı olan bir şəxs ilə qarşılaşdıqda ona kömək edə biləsən. Çətinlikdə olan qohumlarını unutma. Onların vəziyyəti ilə yaxından və ən yaxşı şəkildə maraqlan. Heç vaxt yoxsullara kömək və yardım etməyi unutma!”

Abbasi Xəlifəsi Məmun İmam Rzanı (ə) şəhid etdikdən sonra İmam Cavadı (ə) Mədinədən Xorasana gətirdərək öz qızı Ümmü Fəzli İmamla (ə) evləndirmək istəyirdi. Sarayda olan xəlifənin adamları bu işə maneçilik törətmək istədilər. Ancaq Məmun qəbul etməyib dedi: “Siz onu tanımırsınız. Əgər onu tanısaydınız məndən Allahın ən yaxşı bəndəsi və xalqın ən biliklisini öz kürəkənim olaraq seçməyə maneçilik törətməzdiniz. Siz onu imtahan edə bilərsiniz. Əgər suallarınızın cavabını verib sizi məhkum etsə, daha heç bir söz deməyib istəyinizdən vaz keçin, yox

əgər cavabınızı verə bilməsə, mən sizin istəyinizi qəbul edib qızımı ona vermərəm".

Abbasilər Yəhya İbni Əksəmin yanına gələrək ondan bir neçə məsələ hazırlayıb Məmunun məclisində İmam Cavaddan (ə) soruşmasını istədilər. Yəhya onların istəyini qəbul etdi, onlar da Məmunun yanına gəlib Yəhyanın razı olduğunu Məmuna bildirdikdə, Məmun razu olub bu iş üçün xüsusi bir gün təyin etdi.

Abbasilər Yəhya İbni Əksəm ilə məclisə gəldilər. Təntənəli bir məclis qurmuşdular. Böyüklərin hamısı məclisdə iştirak edirdilər. Bu vaxt İmam Cavad (ə) məclisə daxil oldu. Məclisdə olanlar ayağa qalxdılar. İmam (ə) qabağa gəlib Məmunun yanında əyləşdi. Məmun İmama (ə) müraciət edərək dedi ki, Yəhya İbni Əksəm sizdən bəzi məsələləri soruşmaq istəyir. İmam (ə) buyurdu: "İstədiyi məsələni soruşa bilər". Yəhya dedi: "Ehram paltarı geyib Allahın evini ziyarətə gedən və orada bir heyvan ovlayan şəxs barədə nə deyə bilərsiniz?" İmam (ə) buyurdu: "Ey Yəhya, bu məsələnin müxtəlif şəkilləri var. Onlardan hansını soruşursan? Bu şəxs Hərəmin içində imiş, yoxsa bayırında? Bu işin haram olduğunu bilirmiş, ya yox? Heyvanı qəstdən öldürüb, yoxsa səhvən? Qul imiş, ya azad? Bu işindən peşman olub, yoxsa işinə davam etmək istəyir? Heyvanı gecə ovlayıb, ya gündüz? Birinci dəfə imiş, yoxsa ikinci, yaxud üçüncü dəfə? Heyvan quş imiş, ya yox? Böyük imiş, ya kiçik?"

İmamın (ə) məsələni bu cür xırdalığı ilə şərh etməsi Yəhya İbni Əksəmi çaş-baş etdi və dili tutuldu. Məclis əhli İmama (ə) afərin dedilər. Sonra İmam (ə) Yəhyaya belə buyurdu: "Mən də sizdən bir məsələni soruşmaq istəyirəm". Yəhya dedi: "Buyurun, əgər cavabını bilsəm deyərəm. Əgər bilməsəm, sizdən eşidib istifadə edərəm". İmam (ə) Yəhyadan həmin məsələni soruşdu. Məclis əhli Yəhyanın cavab verməsini gözləyirdi. Məmun və tərəfdarları Yəhyanın cavab verib, verə bilməməsindən narahat idilər və deyirdilər: "Əgər Yəhya cavab verə bilməsə hamımız rüsvay olacağıq və imamın nüfuzu daha da artacaq". Elə bu vaxt Yəhya utandığından başını aşağı salıb və İmama (ə) üz tutaraq dedi: "Məsələnin cavabını bilmirəm. Özünüz buyurun, biz

də istifadə edək”. İmam (ə) gözəl bir tərzdə sualın cavabını dedi. Dostları şad, düşmənləri isə qəmgin etdi. Bu vaxt Məmun ətrafında olanlara belə xitab etdi: “Sizin aranızda belə məsələlərə cavab verə bilən bir şəxs vardırmı?” Cavab verdilər ki: “Allaha and olsun ki, yoxdur”. Sonra Məmun elə həmin məclisdə qızı Ümmü Fəzli İmam Cavada (ə) ərə verdi.

Xətai tilavətlərində bu din böyüyü də unudulmamışdır:

*Muhəmməd Təqidür xoşxan könüllər aydını canım,*
*Mələk ərzü səmalərdan ona çox mərhəba gəldi.*
*(Q.6, səh.274)*

*Sevərəm mən Təqiyü, həm Nəqini,*
*Olar kim, şimdi nəqdi-övliyadur. (Q.62, səh.75)*

*Kəşf ola babi-təriqət həm Təqinin eşqinə,*
*Sidq ilə bel bağlayıb, tərk eyləgil canü sərin!*
*(Q.299, səh.201)*

*Şah Təqiyü ba Nəqinün quli ol, ey bəxtiyar,*
*Bunları sevənlərə rəhmət edər Pərvərdigar.*
*Mömin olan bu kəlamı yad edər leylü nahar,*
*Qibləgahümdür Muhamməd, səcdəgahümdür Əli.*
*(Mürəbbi.7, səh.311)*

***Nəqiyyə mən mücəssəm canü dildən,***
***Əzəldən sahibi-taci-livadur.*** *(Q.2, səh.269)*

(Mən bütün varlığımla İmam Nəqinin (ə) böyük şəxsiyyətini özümdə təcəssüm etdirməyə çalışıram. Çünki o, dünyaya gələndən bəri islam bayrağının və tacının əsil sahibidir).

Bu din böyüyümüzün də dünya həyatı çox qısa olmuşdur. Adı Əli olan onuncu İmamımızın atası Həzrəti-Məhəmməd Təqi (ə), anası Səmanə (s.ə). Ləqəbləri Hadi və Nəqi, kunyəsi isə Əbül-Həsəndir. Hicrətin 214-cü ilində anadan olmuşdur. İmam-

lıq müddəti 34 il olmuşdur. Cəmi 40 il ömür sürən İmamımız (ə) 254-cü Hicri-Qəməri ilində İraqın Samirra şəhərində vəfat etmişdir.

Həzrəti-Hadi (ə) **“Zöhd və Təqva”** baxımından misilsiz idi. Mütəvəkkilin məmurları onun evinə basqın etdikdə onu sadə bir otaqda ibadət halında görmüşdülər. O, Quranı çox sevər, xalqın işini sahmana saldıqdan sonra həmişə Quran oxuyardı. Camaatla xoş və gülərüzlə rəftar edər, ahəstə addımlarla yeriyərdi. Yoxsulların vəziyyəti ilə maraqlanar və bəzən otuz min dinara qədər pulu dar gündə olan yoxsullara bağışlayardı. Belə ki, bir gün Mütəvəkkil tərəfindən Həzrətə (ə) göndərilən 30 min dinarın hamısını yoxsul bir ərəbə bağışladı.

Mütəvəkkilin anası İmam Hadinin (ə) **“zöhd və imanına”** heyran olmuşdu. Bir gün ayağı yaralanmış Mütəvəkkili həkimlər sağalda bilmədikdə anası Fəth ibn Xaqanı o Həzrətin (ə) evinə göndərdi ki, İmamdan (ə) dərman alıb gətirsin. Həzrətin (ə) göndərdiyi dərman Mütəvəkkili sağaltdı.

Bütün həkimlər bu işə mat qalmışdılar. Anasının təşəkkür üçün göndərdiyi min dinarın hamısını Həzrət (ə) yoxsullar arasında payladı.

Bir gün rəssam Yunus qorxa-qorxa İmamın (ə) hüzuruna gəlib belə dedi: “Ey Peyğəmbərin (ə) övladı! Mən öldürülmək ərəfəsindəyəm. Siz ailəmə baxarsız?”. Həzrət (ə) əhvalatı soruşduqda o, belə izah etdi: “Abbasilərin adamlarından biri mənə bir daş-qaş verib ki, rəsm çəkim. Lakin üstündə işləyərkən yarı böləndü. Sabah onu geri almaq üçün gələcəklər, əgər əhvalatı bilsələr, məni öldürəcəklər”. İmam (ə) başını aşağı salıb dedi: “Sənin haqqında dua etdim. Arxayın ola bilərsən ki, onlar daha sənə heç bir ziyan yetirməyəcəklər. Əksinə bu iş sənin xeyrinə qurtaracaq”.

Sabahısı gün həmin kişi gəlib ona dedi: “Ey Yunus! Qaş-daşın üstünə bir rəsm çəkəcəkdin. Lakin iki qızım dalaşırlar. Əgər mümkündürsə, onu iki böl və hər birinin üstündə ayrı-ayrı naxış sal. Bu iş üçün sənə ayrıca bir mükafat da verəcəyəm”. Yunus “İcazə verin bu barədə fikirləşim” – deyə oradan çıxdı və sevin-

cək İmamın (ə) hüzuruna gələrək ona təşəkkür etdi.

Mütəvəkkil israf etməkdə, eləcə də xalqın sərvətini boş yerə xərcləməkdə şöhrət qazanmışdı. Hətta günü bu gün də Samirra şəhərində mövcud olan qüllənin ucaldılmasına bir milyon yeddi yüz min qızıl dinar pul xərcləmişdi. Lakin bütün bunlara baxmayaraq, Həzrəti-Peyğəmbərin (s) övladını elə ağır vəziyyətə salmışdı ki, qızları Mədinədə ip əyirməklə güzəranlarını təmin edirdilər. Hətta iş o yerə çatmışdı ki, əyinlərinə geymək üçün bir dənə təzə paltarları belə yox idi. Mütəvəkkil Əli (ə) övladları ilə sərt davranır, eləcə də onlara Həzrəti-Əli (ə) xanədanını ələ salıb təhqir etmək üçün külli miqdarda pul verirdi. Həmişə yanında bir təlxək də var idi ki, iyrənc rəftarları ilə Həzrəti-Əlini (ə) lağa qoyub Mütəvəkkili güldürürdü.

Mütəvəkkilin Əli (ə) övladlarına qarşı etdiyi hörmətsizlik hətta o dərəcəyə çatmışdı ki, bir gün öz məktublarının birində Mədinə valisinə belə yazdı: "Hər kim Əli (ə) xanədanına yardım etsə, yaxud onlarla oturub-dursa, onu ağır şəkildə cəzalandır!"

Mütəvəkkil 243-cü Hicri-qəməri ilində İmam Hadini (ə) Mədinədən Samirraya sürgün etdi və o Həzrəti oğlu İmam Həsən Əskəri (ə) ilə birlikdə ömürlərinin sonuna qədər hərbi bazanın yanında nəzarət altında saxladı.

Həzrət Hadinin (ə) elmi nübuvvət məktəbindən qaynaqlandığı üçün elm nuru mübarək ürəyinə saçılaraq onu yaradılış sirrindən xəbərdar edirdi. Onun elmi haqqında bir neçə örnəyi burada qeyd edirik:

Bir gün Rum padşahı Abbasi xəlifələrindən birinə belə bir məktub yazdı: **"İncil"**də oxuduğumuza görə səmavi bir surə vardır ki, hər kəs onu oxuyub əməl etsə, Allah onu cəhənnəmə atmayacaqdır. Bizə həmin surənin hansı olduğunu yazın. Abbasi xəlifəsi bütün alimləri topladı, lakin heç biri cavab verə bilmədi. Xəlifə İmam Hadini (ə) da dəvət edərək həmin məsələni soruşdu. İmam (ə) belə buyurdu: "O, hər bir müsəlmanın gecə -gündüz neçə dəfə namaz üstə oxuduğu "Həmd" surəsidir". Həzrət (ə) daha sonra bir sıra əlavə izahat da verərək bütün alimləri heyrətdə qoydu. Imamın (ə) verdiyi cavabı Rum padşahına gön-

dərdilər. O da məktubu oxuyaraq sevindi və Müsəlmanlığı qəbul etdi. İstər İmam Əliyyən-Nəqinin (ə) həyat və fəaliyyəti, istərsə də Şah İsmailin dövlət quruculuğu işləri “sahibi taci liqa” baxımından şairi İmama yaxınlaşdırır. Odur ki, bu ifadə çox yerinə düşmüçdür. Xətai poyeziyası bu din böyüyünün yanında xəcalətli qalmır.

*Təqi sultani-aləmdür, Nəqi din üstə möhkəmdür,*
*Olardan sonra meydanə Həsən sahibliqa gəldi.*
*(Q.374, səh.239)*

*Şah Təqi şahi-cahandır, həm Nəqi nuri-iman,*
*Yoxdürür sözdə xilaf, “Şəmsüz-Züha”nın həqqiçün.*
*(Q.272, səh.187)*

*Təqiyü ba Nəqi, şah Əsgəri həm,*
*Olar ki, sahibi-sirrül-bəqadur. (Q.63, səh76)*

*Əli Nəqi dürür şafi xamu dərdinə bimarun,*
*Onun şol xaki payindən həkimə tutiya gəldi.*
*(Q.6, səh.274)*

***Məvali məzhəbimdür Şahi Əsgər,***
***Səlatü vəssəlamü mərhabadur.*** *(Q.2, səh269)*

(Əsgəriyyə Şahı 11-ci İmam mənim məzhəbimin cövhəridir. Odur ki, ona saysız hesabsız, salavat, dua və salamlar olsun).

Beyt 12-ci imamın 11-cisinə aid olduğuna görə və şeirin sonlarına düşdüyü üçün burada salavatdan və salam duadan danışılması çox yerinə düşür: İmam Həsən Əsgəri (ə) Hicri-Qəməri təqvimi ilə 232-ci il, Rəbiəs-sani ayının 8-də (yaxud 24 rəbiyəl-əvvəl) Mədinə şəhərində anadan olmuşdur. Atası İmam Hadi (ə), anası Səlil (s.ə). Məşhur ləqəbi Əsgəri, Künyəsi Əbu Məhəmməd.

260-cı il Rəbiəl-əvvəlin 8-i, 28 yaşında XIV Abbasi xəlifəsi

Mötəmədin hiyləsi ilə Samirra şəhərində şəhid olmuşdur. Müqəddəs məzarı İraqın Samirra şəhərində ziyarətgahdır. O, Həzrətin (ə) həyatını 2 hissəyə bölürlər:

İmamlıqdan əvvəlki dövr – 22 il (232-254-cü illər)

İmamlıq dövrü – 6 il (254-260-cı illər)

İmam Həsən Əsgəri (ə) öz dövründəki zalım hökumətlərin zülmü altında ömrü boyu zindanda qalmışdır, nəhayət zəhərlənərək şəhadətə çatmışdır.

İmam Həsən Əsgəri (ə) öz zamanında Qurani-Kərimin misilsiz müfəssiri sayılırdı. Yüz nəfərdən çox məşhur alim o Həzrətin (ə) məclisində iştirak edirdi. İraqda qaldığı 16 il müddətində Şamdan Mədinəyə qədər olan ərazi İmamın (ə) nüfuz dairəsində idi. İmamın (ə) elmi və mənəvi nüfuzu o qədər böyük idi ki, Abbasi xəlifəsi Əlmötəzil sarayında çalışan alimlər heyran qalmışdılar.

İmam Həsən Əsgəri (ə) İrana səfər edərkən Qum və Rey şəhərlərindən keçərək Ləvasana gəldi. Əhli-beyt (ə.m) tərəfdarları Onu sevinclə qarşıladılar. Camaatla görüşüb, bir məscid tikərək onu öz mərkəzlərinə çevirmələrini tapşırdı. Bu iş xalqın həyatında təsiredici və mühüm rol oynadı. Deyilənlərə görə, İmamın (ə) bu əmrinə tabe olan insanlar bir gündə 70 məscid tikməyə başlamışdılar. Əhli-beytin (ə.m) düşmənlərindən olan və Abbasi hökumətində xidmət edən Əhməd ibn Xaqan adlı bir şəxs demişdir: "Mən Samirrada Bəni-Haşim xanədanında nəciblik, böyüklük və fəzilət baxımından İmam Həsən Əsgəridən (ə) başqasını görməmişəm. Əgər xəlifəlik Abbasilərin əlindən çıxsa, İmam Həsən Əsgəridən (ə) başqası xəlifə olmağa layiq deyildir". Həmən şəxs sözünə davam edərək demişdir: "Bir gün atamın yanında idim. Onun Peyğəmbər (s) xanədanının düşmənlərindən olmasına baxmayaraq, həmişə Həsən Əsgəri (ə) yanına gəldikdə yerindən qalxıb əlindən öpər, öz yerini ona verər və İmamı (ə) müəllimin qarşısında duran bir şagird kimi dinləyərdi". Əbu Yusif İmam Həsən Əsgərinin (ə) səxavət və əliaçıqlığı barədə deyirdi: "Mən çətin bir vəziyyətdə idim, belə ki, uşaqlarıma çörək pulu qazana bilmirdim. Hamımız ac və narahat idik. Dəfələrlə

Abbasilərin sarayına getmişdim ki, orada olan qohumlarımdan köməklik alım. Lakin onlar o qədər məğrur idilər ki, sözümə qulaq asmırdılar.

Bir gün İmam Həsən Əsgərinin (ə) hüzuruna gedib vəziyyətimi danışdım. İmam (ə) 400 dinardan ibarət pulun hamısını mənə verib buyurdu: "Get, ailəni ağır vəziyyətdən qurtar". Bir dəfə İmam (ə) 200 min dinarı Əli ibn Cəfərə göndərdi ki, onu yoxsul və möhtac əshabları arasında paylasın.

6 il davam edən İmamlıq müddətinin 3 ilini zindanda keçirməsinə, qarşılaşdığı çətinliklər və narahatçılıqlara baxmayaraq, o Həzrət (ə) həmişə xalqla yaxşı rəftar edərdi. Ən qəddar məmurları zindana keşikçi təyin etmişdilər ki, İmama (ə) əzab-əziyyət versinlər. Ancaq məmurlar İmamın (ə) zöhd və ibadətinə heyran qalıb onunla yaxşı rəftar edirdilər. Bir gün zindan müdiri belə rəftara etiraz edir və məmurlar deyirlər: "O bir insandır, həmişə Allahına ibadət və dua ilə məşğul olan bir insan. Gündüzlər oruc tutur, gecələr də ibadət edir. Bizə nəzər saldıqda isə bədənimiz titrəyir. Bizdən belə şəxsiyyətə əziyyət verməyi necə tələb edirsiniz?".

Mütəvəkkilin vəziri Abdullah Xaqan çox qürurlu və etinasız bir adam olmasına baxmayaraq, İmamı (ə) görəndə yerindən qalxar və əgər ata minmiş olsa, düşərdi. Abdullah Xaqan İmam (ə) haqqında deyib: "Həsən Əsgəri (ə) gecələr dua və ibadətlə məşğul olan, gündüzlər isə oruc tutan bir kişi idi. Ürəyi o qədər pak idi ki, hətta düşmənlərini dua etməyi belə unutmazdı. Yoxsul bir adamla qarşılaşanda bütün pulunu ona verərdi".

Samirrada bir monastr var idi ki, başçısı xristianların böyüklərindən heçab olunurdu. O çox hörmətli bir adam idi. Həmin xristian bir gün İmamın (ə) hüzuruna gələrək müsəlman oldu. Səbəbini soruşduqda dedi: "Mən bu kişidə yalnız Həzrəti-İsada (ə) mövcud olan nişanələri görmüşəm".

İmam Həsən Əsgərinin (ə) zəkası dalğalı bir dənizə bənzəyirdi ki, elm təşnələri öz susuzluqlarını burada doyururdular. Xarəzminin dediyinə görə, elm aşiqlərindən 18.000 nəfər İmamın (ə) məclislərindən istifadə edirdilər. Abbasi xəlifəsinin nüma-

yəndəsi Məhəmməd ibn Məsud Şirazi İmama (ə) beyət edən ilk saray alimi olub. Qaynaqlarda yazıldığına görə, Əbunəsr Fərabinin ustadı olan Kendi İmamla (ə) mübahisə edə bilməyib İslamın ziddinə yazdığı kitabını yandırmışdı. Xristian alimləri İmamın (ə) elminə, eləcə də dərin düşüncə və biliyinə o dərəcədə heyran olmuşdular ki, onu Məsih adlandırırdılar. İmam (ə) ayrı-ayrı ölkələrdən gələn və ona sual vermək istəyən şəxslərlə onların öz dili ilə danışdığı zaman hamını heyrət bürüyürdü.

İmam Həsən Əsgərinin (ə) dövründə Məsihilərin və onların böyük ruhanilərindən olan Casiliqin dualarından sonra yağış yağırdı, lakin müsəlmanların duasından sonra yağışın yağmaması həm müsəlmanları, həm də Abbasi xəlifəsi Mütəvəkkilin narahatçılığına səbəb oldu. Bəziləri hətta İslamın haqq din olmasına şəkk edirdilər. İmam (ə) həmin vaxt zindanda idi. Abbasi xəlifəsi İmamı (ə) zindandan çıxartdıraraq dedi: “Ey Əbu Məhəmməd, ceddinin dinini qoru”.

Məsihilər 6-cı gün Casiliq ilə birlikdə biyabana getdilər. İmam Həsən Əsgəri (ə) öz qulamlarından birinə buyurdu: “Sən də məsihilərin cəmiyyəti arasında ol. Casiliq dua etmək üçün əllərini göyə qaldıranda onun yanında dur və sağ əlinin iki barmağı arasındakı sümüyü götür və özünlə gətir”.

Həmin qulam məsihilərin arasında getdi. Casiliq dua etmək məqsədiylə əllərinə göyə qaldıranda dərhal iki barmağı arasındakı sümüyü götürdü və İmamın (ə) hüzuruna qayıtdı. Həmin gün məsihilər nə qədər dua etsələr də, yağış yağmadı. Mütəvəkkil İmam Həsən Əsgəridən (ə) soruşdu: “Bu sümük nədir və hadisənin sirri nədən ibarətdir?”

İmam Həsən Əsgəri (ə) buyurdu: “Bu sümük bir peyğəmbərin qəbrindən götürülüb. Hər vaxt hər hansı bir peyğəmbərin bədənindən sümük aşkar olsa, yağış yağar.

*Göydən yerə bir damla yağış yağmasa hərgah,*
*Rəhmət yağışın cari edər ayeyi-təkbir.*

Beləliklə də həmin gün İslam dininə mənsub olan insanlar

məsihilərin yanında izzət tapdılar.

İmam Sadiqin (ə) nəslindən olan Əbulhəsən Qum şəhərində yaşayırdı və çirkin əməllər sahibi kimi tanınırdı. Bir gün Əbulhəsən İmam Həsən Əsgərinin (ə) Qum şəhərində olan nümayəndəsi Əhməd ibn İshaq Əşərinin evinə gəldi və içəri girməyə icazə istədi. Lakin İmamın (ə) nümayəndəsi onu gördüyü pis işlərə görə evə buraxmadı. Əbulhəsən kor peşman geri qayıtdı və ona qarşı edilən bu hörmətsizliyə görə çox narahat oldu. Həmin il Əhməd ibn İshaq Əşəri Məkkəyə getdi. Oradan qayıdarkən İmam Həsən Əsgərinin (ə) yanına gəldi, amma İmam Əşəri (ə) onu qəbul etmədi. Çox yalvar-yaxardan sonra İmamın (ə) hüzuruna gəlib səbəbini soruşdu. İmam (ə) buyurdu: "Səninlə mən, sən bizim əmioğlumuzla etdiyin kimi rəftar etdim". Əşəri dedi: "Ey Peyğəmbər övladı, mən onu tərbiyələndirmək və gördüyü pis işlərdən uzaqlaşhdırmaq üçün bu işi gördüm". İmam (ə) buyurdu: "Sənin gördüyün iş doğru deyildi. İslamda yolunu azmış insanla belə rəftar etməzlər, əksinə onları hidayət edib, doğru yol göstərərlər". Əşəri Quma qayıtdı. Bu münasibətlə hamı onun görüşünə gəlmişdi. Onların arasında Əbulhəsən də var idi. Əşəri onu görən kimi yerindən qalxıb hörmət etdi və yerini ona verdi. Əbulhəsən bu işdən heyrətlənib dedi: "Bu işin keçmişdəki rəftarınla fərqlidir. Məni əhvalatdan xəbərdar et". Əşəri əhvalatı olduğu kimi danışdı. Əbulhəsən o qədər utanmışdı ki, evə qayıtdıqdan sonra pis işləri buraxıb, təqvalı olmaq qərarına gəldi və ondan sonra zahid və pak insanlardan biri oldu. "Bəndələrim məni səndən soruşanda (de ki,) Mən (onlara) yaxınam. Məni çağıranda çağıranın səsinə səs verirəm. Onlar da mənim çağırışımı qəbul edib, Mənə iman gətirsinlər ki, doğru yolu tapsınlar (məqsədə çatsınlar)" ("Bəqərə", 186).

Bu ayə Allahın bəndələrinə lütfü və məhəbbəti ilə doludur. Allah bu ayədə öz adından danışmış, yeddi dəfə birinci şəxs əvəzliyindən (altı dəfə bitişən əvəzlik, bir dəfə isə birinci şəxsə olan feildən) istifadə etmişdir. "Mənim bəndələrim", "Mənim haqqımda", "Mən yaxınam", "Məni çağıranda", "cavab verirəm" (səs verirəm), "çağırışımı", "Mənə iman gətirsinlər". Qura-

nın heç bir yerində belə bir ayə tapmaq olmaz. Allah bu ayədə duanın qəbul olunması üçün əsaslı bir şərt göstərərək buyurur: "Məni çağıranda". Yəni dua edənin, Məni çağıranın duası, çağırışı ürəkdən gəlməlidir. Yalnız dildə olmalı deyil. İmam Sadiqdən (ə) nəql olunan bir rəvayətdə deyilir: "Allah unutqan qəlbin duasını qəbul etmir". Həmçinin bəndə dua edərkən öz hacətini həqiqətən Allahdan istəməlidir. Digərlərini Allah yanında kiçik sanmalıdır. Məxluqatı vasitə hesab etsə də, ilkin səbəbin Allah olduğunu bilməlidir. Hədisi-qudsidə deyilir: "Kim məndən başqasına tapınarsa, göylərdəki və yerdəki bütün qapıları onun üzünə bağlayaram. Məndən bir şey istəsə ona verməræm. Məni səsləsə, ona cavab verməræm. Elə bir məxluq yoxdur ki, Mənə tapınsın, göyləri və yeri onun ruzisinə zamin etməyim. O məni çağırsa, cavab verəcəyəm, Məndən bir şey istəsə, verəcəyəm. Məndən bağışlanmaq istəsə, onu bağışlayacağam".[1]

"Yoxsa dara düşən şəxs dua etdiyi zaman onu qəbul edən, şəri sovuşduran və sizi yer üzünün xəlifələri edən? Allahla yanaşı başqa bir məbudmu var? Çox az xatırlayırsınız" ("Nəml", 62).

Bu ayədə Allah tərəfindən problemlərin həlli və duaların qəbul edilməsindən danışılır. Səbəblər dünyasının bütün qapıları insanın üzünə bağlandıqda bıçaq sümüyə dirəndikdə, insanın əli hər tərəfdən üzüldükdə problemlər düyününü açan, müşkülləri aradan qaldıran, qəlblərə ümid nuru bəxş edən, rəhmət qapılarını dara düşmüş insanın üzünə açan yalnız Allahdır. Allah bütün dua şərtlərini özündə cəm edən duaçının duasını qəbul etməsinə baxmayaraq, bu ayədə "dara düşən şəxs" ifadəsini xüsusi olaraq qeyd edir. Çünki duanın şərtlərindən biri insanın bütün səbəblər aləmindən əl üzməsi, bütün qəlbini və ruhunu Allahın ixtiyarına verməsi, hər şeyin ondan olduğuna, bütün müşküllərin həllinin Onun əlində olmasına əmin olmasıdır. Bu düşüncə isə özünü

[1] Əl-Mizan, c.2, səh. 31, 36; Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 28-382

yalnız insan darda olduğu vaxt büruzə verir. Doğrudur ki, bu dünya səbəblər dünyasıdır və mömin bütün səy və fəaliyyətlərini bu istiqamətdə həyata keçirir, ancaq səbəblər dünyasında itib-batmır, hər şeyin Onun pak zatının bərəkətindən qaynaqlandığını yaddan çıxarmır. Bu isə duanın qəbul olmasının ən mühüm şərtidir. Bəzi hədislərdə bu ayə İmam Mehdinin (ə) qiyamına yozulmuşdur. İmam Sadiq (ə) hədislərinin birində belə buyurmuşdur: "Bu ayə Ali-Muhamədin (ə) Mehdisi haqqında nazil edilmişdir. And olsun Allaha, qəm-qüssə içində olan və çıxılmaz vəziyyətdə qalan odur.

İbrahim məqamında iki rükət namaz qılıb əlini Allah dərgahına qaldıraraq dua etdiyində Allah-təala onun duasını qəbul edəcək, narahatlıqlara son qoyacaq və onu yer üzünün xəlifəsi edəcək." Təbii ki, ayənin məzmunu daha genişdir. Onun nümunələrindən biri Həzrəti-Məhdinin (əc.f) varlığıdır. Yer üzünü fitnə-fəsad bürüdüyü, insanların çətinliklər içində çıxılmaz vəziyyətdə qaldığı, bütün dünyanı qəm-qüssə bürüdüyü vaxt o, dünyanın ən müqəddəs yerində dua edəcək, çətinliklərin aradan qalxmasını istəyəcək və Allah-təala da onun duasını müqəddəs dünya inqilabının başlanğıcı edərək, "Sizi yer üzünün xəlifəsi edəcək" ayəsində də buyurulduğu kimi, onu və dostlarını yer üzünün canişinləri edəcək.[1]

"Allah və onun mələkləri Peyğəmbərə salavat göndərirlər. Ey iman gətirənlər! Sizdə ona salavat göndərib, salam deyin və tam şəkildə itaət göstərin". ("Əhzab", 56).

Keçən ayələrdə Peyğəmbərə (s) hörmət edilməsi, heysiyyətinin qorunması, ona əziyyət verilməməsi haqqında danışıldıqdan sonra bu ayədə öncə Allah və mələklərin Peyğəmbərə (s) olan xüsusi sevgisi qeyd edilir, ardınca möminlərə buyurulur ki, Həzrəti-Peyğəmbərin (s) dərəcəsi o qədər yüksəkdir ki, varlıq aləmi-

[1] Nümunə, c.15, səh. 517-520; Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 28-382

nin yaradıcısı olan Allah və Allahın əmri ilə kainatı idarə edən bütün mələklər ona salam göndərirlər. İndi ki, belədir, siz də bu işə qoşulun. O, yaradılış aləminin qiymətli gövhəridir. Əgər Allahın lütfü ilə onunla görüşmək sizə nəsib olsa, qiymətini bilin, onun Allah və mələkləri yanındakı qiymət və dəyərini unutmayın. Sünni və şiə raviləri tərəfindən nəql edilən çoxlu sayda hədisdə Peyğəmbərə (s) salavat göndərilərkən "Ali-Muhamməd" ifadəsinində salavata əlavə edilməsinin zəruriliyi açıq şəkildə qeyd edilmişdir. Hədislərinin birində Həzrəti-Peyğəmbər (s) belə buyurmuşdur: "Mənə yarımçıq salavat göndərməyin. Soruşdular: Yarımçıq salavat nədir? Buyurdu: təkcə "Əllahummə salli əla Muhamməd" deyib davam etdirməmək. Əslində, belə deməlisiniz: "Əllahummə salli əla Muhammədin və ali Muhamməd".[1]

Xətai poyeziyasının İmam Həsən Əskəri (ə) soraqlı beytləri az deyil:

*Həsən Əsgərini candan sevənlər həqqə vaslildür,*
*Onun əyninə rəhmətdən neçə dolu qəba gəldi.*
*(Q.6, səh.274)*

Və ya,

*İy vəllah xaki-payi-Əskərinün,*
*Çəkər mən çeşmimə, çün tutiyadur. (Q.62, səh.75)*

***Mühəmməd Mehdiyi-Sahib-Zamanə,***
***Təbibü hadiyi-daruş-şəfadur.*** *(Q.2, səh.269)*

(Zəmanə sahibi olan yol göstərici Məhəmməd şəfa evinin əsil bələdçisinin loğmanıdır).

[1] Nümunə, c.17, səh. 415; Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 426

Məlum şiə əqidəsinə görə zəmanə İmamı zühur edənədək onun həqiqi adını çəkmək olmaz. Belə olan surətdə bəs beyti necə başa düşək? Buna daha çox Şah İsmailin zəmanə İmamına (əc.f). ərki kimi qavramalıyıq. Bütünlüklə səciyələndirmə xüsusiyyəti olan ikinci misra bunun bariz təzahürüdür. Zəmanə İmamının (əc.f) dilindən söylənilən parlaq incilər belə yanaşmanı dini-mənəvi baxımdan hər tərəfli surətdə əsaslandırır.

İmam Məhdi (ə) Hicri-qəməri 255-ci il Şəban ayının 15-də Samirra şəhərində anadan olmuşdur.Tarixdən məlum olduğu kimi 3 şəxsin anadan olması gizli şəkildə baş vermişdir.Onlardan biri Həzrəti-İbrahim (ə) idi. Həzrəti-İbrahimin (ə) anası onu gizli şəkildə dünyaya gətirib, həddi büluğa çatana qədər bir mağarada saxladı.

İkincisi, Həzrəti-Musadır (ə) ki, anası onu dünyaya gətirəndən sonra Fironun zülmündən amanda qalması üçün bir sandığa qoyub dənizə buraxdı.

Üçüncüsü, Həzrəti-Mehdidir (ə).

Əsas səbəbi bundan ibarətdir ki, həmin zaman Həzrəti-Mehdinin (ə) İmam Həsən Əsgərinin (ə) sülbündən dünyaya gəlməsi xalq arasında yayılmışdı. O dövrün xəlifəsi Fironun Bəni-İsrailə etdiyi rəftarı həyata keçirmək istədi. Elə fikirləşdi ki, bu işi həyata keçirməklə İlahi əmrin qarşısını ala biləcək. İlahi-günəşin nurunu heç kəs söndürməyə qadir deyil.

Həzrəti-Mehdinin (əc.f) atası İmam Həsən Əsgəri (ə), anası Nərgis Xatundur. İmam Həsən Əsgəri (ə) İmam Mehdini (əc.f) təsdiq edən bu üç nişanəni səhabəsi Əbul-Ədyana tanıtdıraraq buyurdu: "Məndən sonra hər kəs üç əlamət və nişanəyə malik olsa, o mənim canişinim və məndən sonra imamdır.

1. Mənim məktublarımın cavabını səndən istəyən şəxs;
2. Mənim cənazəmə namaz qılan şəxs;
3. Kisənin içində olan əşyalardan xəbər verən şəxs"

Atası İmam Həsən Əsgəri (ə) Hicrinin 260-cı ilində 28 yaşında şəhid edildikdən sonra İmamlıq Həzrəti-Mehdiyə (əc.f) çatdı.

Həzrəti-Mehdinin (əc.f) yaşadığı dövrü 4 hissəyə bölmək

olar:

1. Uşaqlıq dövrü;
2. Qeybəti-Suğra dövrü;
3. Qeybəti-Kübra dövrü;
4. O, Həzrətin (əc.f) parlaq zühuru dövrü və onun bəşəriyyətə rəhbərlik dövrü.

Həzrəti-Mehdinin (ə) **"Qeybəti-Suğra"** dövrü məşhur nəzəriyyəyə əsasən 69 il çəkib və 329-cu ildə sona çatıb. Bu 69 il müddətində Həzrəti-Mehdinin (əc.f) xüsusi canişinləri olub və onların vasitəsi ilə camaatla əlaqə saxlayıb.

Bu xüsusi canişinlər 4 nəfər idi:

1. Osman İbn Səid – 260-280-cı illər olub (20 il);
2. Muhəmməd İbn Osman – 280-305-ci illər olub (25 il);
3. Hüseyn İbn Ruhi Nobəxti – 305-326-cı illər (21 il);
4. Əli İbn Muhəmmədi Seymuri – 326-329-cu illər olub (3 il)

Sonuncu canişinin ölmünə altı gün qalmış İmam (əc.f) ona məktub yazır və Qeybəti-Kübranın (böyük qeybətin) başlandığını bildirir. Həzrəti-Mehdi (əc.f) yazır: "Bismillahir Rəhmanir Rəhim! Ey Əli İbn Muhəmmədi Seymuri! Allah-təala qardaşlarına sənin əzanda əcr versin. Çünki sən 6 gündən sonra həyatla vidalaşacaqsan. Bəs öz işlərini sahmana sal və özündən sonra heç bir kimsəni canişin kimi sifariş etmə. Çünki tam qeybət baş veribdir və Allah-təala izn verməyincə zühur olmayacaq!"

Beləliklə, **"Qeybəti-kübra"** Hicri-qəməri 329-cu ildən başladı. 13 əsrə yaxındır ki, zəmanənin sahibi qeyb olub. Müsəlmanlar onun intizarındadırlar. O, məzlumların haqqını zalımlardan alacaq, İlahi ədalətlə dünyanı yenidən quracaq.

Bu cür uzun qeybət təkcə səmavi alimlərdən İmama (ə) aid deyil, başqa səmavi alimləri Allah-təala Qurani-Kərimdə bizə misal gətirir. Həzrəti-Saleh (ə) və yaxud Həzrəti-Musa (ə) öz qövmlərini sınaqdan çıxarmaq üçün müəyyən müddət camaatın gözündən qeyb olub və sonra yenidən qayıdıblar.

Peyğəmbər (s) buyurub: "Əfzəlul ibadət, İntizarul-fərəc" – "Ən fəzilətli ibadət, Zəmanə İmamının (əc.f) fərəcidir" – yəni zühurudur.

Sarbon Universitetinin fəlsəfə fakültəsinin müəllimi Professor Henri Korbon deyir: "Mənim inamım belədir, şiə yeganə məzhəbdir ki, Allah-təala ilə insanlar arasında olan vasitəni həmişə qorumuşdur. Çünki, yəhudilər insanla Allah arasında olan rabitənin davamını Həzrəti-Musadan (ə) sonra kəsiblər, xristianlarda isə Həzrəti-İsadan (ə) sonra belə bir rabitənin davamı olmayıbdır. Həmçinin, müsəlmanların içində **"Əhli-Sünnə"**nin bir qismi Həzrəti-Məhəmməddən (s) sonra Tanrı ilə bəndə arasında olan rabitəni kəsilmiş hesab edirlər. Bunlardan fərqli olaraq şiə məzhəbi peyğəmbərliyi Həzrəti-Məhəmməd (s) ilə tamamlanmış bilib, hidayət yolunun təkmilləşməsini **"Vilayət"** adı ilə tanınan İmamət məhfumuna aid edirlər."[1]

Bu alimin fikirlərinin Əhli-beyt (ə.m) aşiqi, Həzrəti-Əlinin (ə) məslək və əqidə davamçısı Ş.İ.Xətai də təsdiq edir və yazır:

*Eydi-Əkbərdir cəmalın, eydə can qurban olum,*
*Şəhi-Məhdi dövri gələr, bir əcəb dövran olar.*

*Ey yəqin əhli, yəqin bil ki, olar surqu hesab,*
*Şəhi-Məhdi Xanədanda bir ulu divan olar.*

*Pərdəni üzdən götürər Həzrəit Sahib-Zaman,*
*Kim onun üzünü görsə, yengidən oğlan olar.*

Qətiyyən təsadüfü hal sayıla bilməz ki, Xətai irsinin əhəmiyyətli bir hissəsi on ikinci İmamın (əc.f.) tərənnümündən ibarətdir. Elə belə örnəklərin çoxluğuna görədir ki, biz burada yuxarıda ayrıca bölüm vermişdik. Şair təlavat və ya on iki İmama adlandırılan bu şeir növündə də, bu din böyüyünün biri digərindən yüksək olan məziyyətlərini tez-tez yada salır.

[1] Məktəbu Təşəyyu. "Əl-Mizan" təfsirinin müəllifi Həzrət Əllamə Təbatəbayi Təbrizi ilə Henri Korbonun şiə məzhəbi barəsində olan müsahibəsi) // Seyyid Kazım Pərpənci. "Üsuliddin". Bakı, "MBM", 2008. səh. 62-63

*Muhəmməd-Məhdidür bu gün ki, sirri-övliya bişək,*
*Təriqi-dini-islamə bizə ol rəhnüma gəldi.*
*(Q.6, səh.274)*

*Muhamməd-Məhdi-Hadi kim, oldur dinün ustadı,*
*Bu dinə girmiyən devdür ki, meydandan cuda gəldi.*
*(Q.374, səh.240)*

*İrişdi vədəsi Sahib-Zamanun,*
*Ulu divan quruldi, məhşər oldi.*

*Zühur etdi təcəllasi İmamın,*
*Xəvaric görmədi, kurü kər oldi. (Q.376, səh.241)*

*Yenə Düldülə mindi şah Məhdi,*
*Əlündə Zülfüqari-Mürtəzadur! (Q.62, səh.75)*

*İmamım hüccətül-Qaim, Muhamməd*
*Kim, ol Sahib-Zəmanü rəhnəmadur.*

*Yedi iqlimə oldi hökmü fərman,*
*Əzəldən yoluna can-baş fədadur.*

*Ki, hər kim on iki İmamı bildi,*
*Ona qırmızı tac geymək rəvadur. (Q.63, səh.76)*

*Ya ilahi, bu Xətainin günahın əfv qıl,*
*Şah Muhamməd-Məhdiyi-Sahib-Zəmanın həqqiçün.*
*(Q.272, səh.187)*

Beləliklə aydın olur ki, şair Allah-təalanı, Onun Peyğəmbərini (s), eləcədə Peyğəmbərin Əhli-beytini (ə.m) ardıcıl olaraq tərənnüm etməyi çox sevmiş, buna könül vermiş, onu özünün yaradıcılıq istəyinə çevirmişdi. Lakin o bununla kifayətlənməyərək

onların əqidə düşmənlərinə etiraz yönündə öz sənətkar sözünü demişdir. Məsələn, şeir belə davam edir:

***İmamü mürşidi-dindür be təhqiq***
***Ki, məhşərdə qamuyə rəhnümadur.***

*(Q.2, səh.269)*

(Həqiqəti araşdırdıqda bütün aydınlığı və genişliyi ilə ortaya çıxır ki, zəmanə İmamı dini mürşid və islami rəhbərdir. Odur ki, məhşər günündə hamıya yol göstərən o olacaqdır).

Burada "rəcət" məsələsi bədii şəkildə qoyulub həll edilmişdir.

Quranda Rəcət nədir?

Rəcət" lüğətdə "qayıtmaq", istilahda isə "insanların öldükdən sonra elə bu dünyada və qiyamətdən öncə qayıtması" mənasınadır. Bu İmam Zamanın (əc.f) dünya səviyyəli hərəkatı zamanı baş verəcəkdir. Bu müddəanın nə əql ilə ziddiyyəti vardır, nə də vəhy məntiqi ilə.

İslam dini, eləcə də digər ilahi dinlər nəzərindən insanın cövhərini və əsasını mücərrəd ruh təşkil edir ki, ona nəfs də deyilir. Bədən çürüdükdən, fani olub aradan getdikdən sonra ruh qalır və öz əbədi həyatını davam etdirir. Digər tərəfdən, böyük Allah qadiri-mütləqdir və heç bir maneə Onun qüdrətini məhdudlaşdıra bilməz.

Bu iki müqəddimə ilə aydın olur ki, rəcət məsələsi əql baxımından tamamilə mümkün olan bir işdir. Çünki azacıq təfəkkür etməklə məlum olur ki, insanlardan bir qrupunun həyata qaytarılması onların ilkin yaradılışından qat-qat asandır. Deməli insanları ilk dəfə yaradan Allah, şübhəsiz onları yenidən qaytarmağa da qadirdir.

Vəhy məntiqi əsasında rəcətin nümunələri keçmiş ümmətlərdə mövcud olmuşdur. Qurani-Məcid bu barədə buyurur: "Yada salın o zamanı ki, siz (yəhudilər) dediniz: Ey Musa, biz böyük

Allahı aşkar şəkildə görməyincə sənə iman gətirməyəcəyik. Bu zaman saiqə sizi tutdu, halbuki, siz baxırdınız. Sonra sizi, öldüyünüzdən sonra diriltdik, bəlkə şükr edəsiniz.”

Digər bir ayədə Həzrəti-İsanın (ə) dilindən buyurulur: “Ölüləri Allahın izni ilə dirildirəm.”

Qurani-Kərim təkcə rəcətin mümkünlüyünü təsdiq etmir, əksinə bəzi insanların bu dünyada öldükdən sonra və qiyamətdən öncə yenidən həyata qayıtmalarını da təsdiq edir. Quran aşağıda qeyd olunacaq iki ayədə insanlardan bir qrupunun öldükdən sonra və qiyamətdən öncə bu dünyaya qayıtmasına işarə edir:

“Elə ki, Bizim sözümüz onlara vaqe oldu, onların arasından bir varlığı yerdən çıxardarıq ki, camaatla Bizim sözümüzə inanmadıqları barəsində danışsın.

O gün ki, hər ümmətin arasından Bizim ayələrimizi təkzib edənlərin bir qrupunu dirildərik və onlar tutularlar.”

Rəcət məsələsini bu iki şərif ayə əsasında isbat etmək üçün yaxşı olar ki, aşağıda qeyd olan məsələyə də diqqət yetirək:

1 – İslam müfəssirlərinin inancına görə bu iki ayə qiyamətlə əlaqədar məsələni bəyan edir. Birinci ayədə qiyamətdən öncə baş verən hadisələrə işarə edilir. Belə ki, Cəlaləddin Süyuti özünün “Əddurrul-Mənsur” adlı təfsirində ibni Əbi Şeybədən, o da Hüzeyfədən nəql edir ki, (ayədəki) “xürucul-dabbə” qiyamətdən öncə baş verən hadisələrdir.

2 – Şübhəsiz, qiyamət günündə müəyyən bir ümmətin arasından bir qrup deyil, bütün insanlar dirildiləcəkdir. Quran qiyamətdə bütün insanların dirildilib məhşər səhnəsinə gətiriləcəyi barəsində belə buyurur: “O (Qiyamət) elə bir gündür ki, bütün insanlar bir yerə toplanar.”

Başqa bir ayədə buyurulur: “O gün (Qiyamət günü) ki, dağları hərəkətə gətirərik, yeri aşkar şəkildə görərsən və onların hamısını bir yerə toplayarıq, heç kəs qalmaz.” Deməli, qiyamət günündə bütün insanlar dirildiləcəkdir və bu, hər hansı qrupa məxsus deyildir.

3 – Qeyd olunan ikinci ayə isə bütün insanların deyil, müəy-

yən ümmətlərin arasından xüsusi bir qrupun dirildiləcəyini aşkar şəkildə bəyan edir. Çünki, həmin ayədə buyurulur: "Və o gün hər ümmətin arasından Bizim ayələrimizi təkzib edən bir qrupu dirildərik". Bu cümlə həmin gündə bütün insanların dirildiləcəyinə aşkar dəlildir.

Bu üç müqəddimədən aydın olur ki, ilahi ayələri təkzib edən insanlardan xüsusi bir dəstənin dirildilməsi ilə (bu, ikinci ayədən məlum olur) qiyamətdən öncə baş verən bir hadisəyə işarə olunur. Çünki qiyamət günündə insanların dirildilməsi bütün bəşər övladına şamildir və heç də xüsusi bir qrupla məhdudlanmır. Deməli buradan bir qrup insanın qiyamət baş verməmişdən öncə (və öləndən sonra) dirildilməsi isbat olunur ki, bu da rəcət adlanır. Quranın bərabərləri və vəhy müfəssirləri olan Peyğəmbər (s) Əhli-beyti (ə.m) bu barədə əlavə izahlar da vermişlər. Biz ixtisara riayət edərək onların birini qeyd edirik. İmam Sadiq (ə) buyurur: "Allah günləri üçdür: Həzrəti-Mehdinin (əc.f) qiyam etdiyi gün, rəcət günü və qiyamət günü."

Digər yerdə buyurur: "Bizim dünyaya yenidən (həyata) qayıdışımızı qəbul etməyən şəxs bizdən deyildir".

Yaxşı olar ki, burada iki mühüm məsələni qeyd edək.

**1. Rəcətin fəlsəfəsi.** Rəcətdən məqsədin nə olmasında düşünməklə bu hadisənin yüksək hədəflərindən ikisi ilə qarşılaşırıq: Biri Islamın həqiqi əzəmət və cəlalını göstərib kafirlərin zəlilliyini və həqirliyini aşkar etmək, digəri isə imanlı və əməlisaleh insanları mükafatlandırıb kafir və zalımlara cəza verməkdir.

**2. Rəcətin tənasüxlə bariz fərqləri.** Qeyd olunmalıdır ki, şiələrin nəzərində olan rəcət heç vaxt tənasüxə etiqadı gərəkli etmir, çünki, tənasüx nəzəriyyəsi Qiyamətin inkar olunması əsasındadır. Bu nəzəriyyə ardıcılları dünyanın daimi dövr etmə əsasında cərəyan etdiyinə inanır və deyirlər ki, hər dövr özündən əvvəlki dövrün təkrarıdır.

Bu nəzəriyyəyə əsasən hər insan öldükdən sonra onun ruhu, bir daha dünyaya qayıdır və başqa bir bədənə nəql olunur. Əgər ruh keçmiş dövrdə yaxşı əməl sahiblərinin bədənində olmuşsa

sonrakı dövrü xoşluqla keçirən bir bədəndə qərarlaşır. Əgər pis əməl sahibi olmuşsa sonrakı dövrü çətinlik və məşəqqətlə keçirəcək bir bədənə nəql olunur. Və bu qayıdış da onun qiyamətdəki dirçəlişi kimidir! Halbuki rəcətə inananlar islam şəriətinə tabe olaraq qiyamətə və məada iman gətirir, digər tərəfdən də ruhun ayrıldığı bədəndən başqa bir bədənə nəql olunmasını qeyri-mümkün hesab edirlər. Yalnız buna inanırlar ki, insanların bir qrupu qiyamət baş verməzdən öncə elə bu dünyada diriləcək və onların hikmət və məsləhətləri gerçəkləşdikdən sonra yenidən əbədi dünyaya doğru tələsəcəklər ki, qiyamət günündə sair insanlarla birlikdə dirilsinlər. Bir ruh bədəndən ayrıldıqdan sonra heç vaxt başqa bədənə nəql olunmur.[1]

Göründüyü kimi, İmam, Mürşid və rəhnüma sözlərində bu deyilənlər sanki bədii baxımdan kodlaşdırılmışdır. Başqa sözlə bu sözdə "rəcət"in bədii simvolikasını, rəmzini təşkil edir.

***Gəl ey arif, sən özün nəfsi tanı***
***Ki, nəfsi bilmiyən dur əz Xudadır.*** *(Q.2, səh.269)*

(Ey arif sən gəl öz bilik və bacarığınla nəfs məsələsini dərindən öyrən. Ona görə ki, bu məsələlərdən xəbərsiz qalan həmişə Allahdan uzaq olar).

Yuxarıda bədii şəkildə qoyulub həll edilən məsələlər özünün estetik yerini yavaş-yavaş etik-didaktik tona verir. Beytin nəfs anlayışı üzərində qurulması buradan irəli gəlir. Beytin əsasında Həzrəti-Əlinin (ə) özünü tanıyan Allahını tanıyar məhşur kəlamı durur.

Füzulinin "Mətləül-etiqad" (inanışın başlanışı) adlı fəlsəfi traktatından aydın olur ki, orta əsr alimləri İmamın (ə) bu sözünə on beşə qədər məna vermişdir.

---

[1] Seyyid Rza Hüseyni Nısəb. "Şiə cavab verir". Əhli-Beyt məktəbi, 1999. səh. 45-49

Bu motivlə biz Nəsimi yaradıcılığında da rastlaşırıq:

*"Arifi-nəfs olmayan bulmaz həqi" – dedi Əli,*
*Cümleyi-əşyanı gör mirati-dildə müncəli.*
*Bas ayaq vəhdət yolunda, çək bu kəsrətdən əli,*
*Qəhrü lütfün mənşəyi mənada vahiddir vəli,*
*Bilmədi şeytan bu tövhidi, Əhəddən düşdü dur.*

Şair burada birinci misrada Həzrəti-Əlinin (ə) bir hədisindən istifadə etmişdir. Həmin hədisdə deyilir: "kim ki özünü tanıdı, həqiqətən öz Allahını tanıdı". Lakin insanın özü-özünü tanıması iki yolla mümkündür. Bunlardan biri insanın özü-özünü zahirən (surətdən) tanımaqdır ki, burada insan özü-özünü cismən tanıyır, sənədlər yolu ilə kimin oğlu və ya hansı nəslə mənsub olduğunu bilir və bu tanımaqlıqda bir çox insanı xalq arasında ucalmaqdansa, onların qiymətlərinin düşmələrinə səbəb olur; çünki çox zaman həmin insanlar elm və hikmət bilmədikləri üçün özlərinə arxalanaraq, hansısa bir nəslə mənsub olmaları, yaxud onunla qohumluqları ilə fəxr edirlər. Lakin dərindən düşünüb dərk etmirlər ki, özləri həqiqətən də fəxr olunmağa ata, ana və nəslə layiq bir övlad və yaxud qohum ola bilirlərmi? Öz əməlləri ilə onların vaxtilə qazanmış olduqları nüfuzu aşağı salıb, onları hörmətsiz etmirlərmi? Bəzən isə əksinə olaraq, xalq arasında çoxda nüfuzlu hesab olunmayan bir şəxsin övladı və yaxudda onun hər hansı bir yaxın qohumu özünün elm, sənət, əxlaq və davranışı ilə xalq arasında elə hörmət və nüfuza sahib olur ki, ailəsini və qohumlarını hörmətə mindirərək, xalq arasında onların şənini ucaldır. Bu barədə yaxşı atalar misalları var: "atanla atama baxınca, özünlə özümə bax"; "Qeyrətli oğul neylər ata malını, qeyrətsiz oğul söndürər ata ocağını". Dediyimiz fikirlər barədə klassiklərimizdən bir qədər misallar göstərək. Həzrəti-Əli (ə) deyir: "Mərd o kəs deyildir ki, desin mənim atam filankəsdir, mərd o kəsdir ki, desin mən filankəsəm". Və yaxud Nizami Gəncəvi deyir:

*Girəm, pədəri-to bud fazil,*
*Əz fəzli-pədər tora çe hasil?*

(Ey oğul, tutaq ki, sənin atan alim və fazil (üstün və dəyərli) bir adamdır, lakin atanın elm və fəzlindən sənə nə fayda vardı-r?).

Məhəmməd Füzuli deyir:

*Fəxr olur sanma sana mənzilətü-əslü nəsəb,*
*Fəxr olur sanma sana kəsrəti-ərbabi-cihad."*

Cəfər Cabbarlı:

*Cəfər, həmişə hikməti-xilqət nihan olur,*
*Zatın zəkavü əqlə mübərra bilənlərə.*

(Ey Cəfər, zatını, əsil-nəsəbini öz əql və zəkasından pak və təmiz (üstün) bilənlərə xilqətin hikmət sirləri həmişə sirli qalır, onlar həmin hikmət sirlərini dərk etməkdən məhrum olurlar).

Və yaxud Əliağa Şərqi deyir:

*Qəni təbani alim kəsbi-şanilə nəsəblənməz,*
*Nəsəblən məclisi-ürfanda cahil müntəxəblənməz.*

(Təbən dövlətli olan alim ona nəslən yetişən ucalığı ilə öyü-nüb fəxr etməz; çünki, cahil adam ariflər məclisində öz əsil-nə-səbi ilə seçilməz).

Lakin ikinci tanımaqlıq isə insanın "özü-özünü batinən, mə-nəvi halda həqiqi tanımasıdır. Belə ki, insan özünü əqlən dərk edib, bəsirət, yəni idrak edici Qəlb gözü ilə özü-özünü tanıyıb, Allahına yaxın olmalıdır. Əgər daha açıq desək, insan özü-özünə dərindən diqqət yetirib fikirləşsə ki, Allah-təala onu bir qətrə

murdar sudan (nütfədən) necə xəlq edib, ananın bətnində sadədən mürəkkəbə doğru necə inkişaf etdirərək, nəhayətdə onu necə kamil insan mərtəbəsinə yetirib, o zaman əql gözü ilə (bəsirətlə) öz Allahını dərk edər, sidq və ixlasla (batini təmizlənmə yolu ilə) öz Allahına iman gətirib, şəhadətlə onun varlığını tam təsdiq etmiş olar. Məhz Həzrəti-Əli (ə) hədisində söylənilən Allahı tanımaqda sırf bu cür tanımaqdır.

"Cümleyi əşyani gör mirati-dildə müncəli" – Yəni, "ey insan, sən bütün şeylərin könül güzgüsündə açıq və aşkar bir şəkildə əks olunduğunu gör". Əgər zahirən lüğəvi mənada yanaşılsa, "cümleyi-əşya" dedikdə, Allahın xəlq etmiş olduğu bütün cansız (cəmadan), bitki (nəbatat) və canlı varlıqlar (heyvanat) hesab olunur ki, insanlar da bu canlı varlıqlar təbəqəsinə daxildir. Lakin insan özünün nitq, əql və şüuru etibailə bu canlı varlıqlar sinfinin ən yüksək olan şərafətli və fəzilətli bir dərəcəsidir.

Məhz buna görə də fəlsəfə və təsəvvüf elmində insana "heyvani-natiqə" – yəni danışan canlı, yaxud "heyvani-lətif" – yəni təmiz, pak və incə canlı, digər canlılara (heyvanlara) isə "heyvani-kəsif" – yəni napak, murdar heyvanat deyilir. Əlbəttə, burada "murdar heyvanat" dedikdə, heç də onların şəriətcə haram olmaları deyildir; çünki, insanlar həmin heyvanların bəzilərindən özlərinin məişətləri üçün istifadə edir; onların ətini yeyir, südünü içir və sairə. Murdar dedikdə, yuxarıda qeyd etdiyimiz kimi, onların dərəcə etibarı ilə insandan aşağı olduğu nəzərdə tutulur. Necə ki, Mövlana Cəlaləddin Rumi deyir:

*Pəs dər in tərkib "heyvani-lətif",*
*Afərid u kərd ba danış əlif.*

Şair deyir ki, Allah bu tərkibdə "heyvani-lətif" (pak, incə və təmiz bir heyvan) – yəni insan yaratdı, sonra onu elmlə dost eləyib, "heyvani-kəsif"dən fərqləndirdi. Deməli, insanı "heyvani-lətif" edən xüsusiyyətlərdən biri və demək olar ki, ən ümdəsi onun elmidir. Təxmisdəki "bütün əşyanın könül güzgüsündə əks olunduğu" fikrinə gəldikdə isə, bu heç də bütün şeylərə aid de-

yildir. Doğrudur, bir çox hədis və Quran ayələrində xüsusilə də 55-ci "Ər-Rəhman" surəsində deyildiyi kimi bütün varlıqlar Allahın varlığını özündə əks etdirərək, onu varlığına sanki şəhadət edirlər və məhz bizim yuxarıda qeyd etdiyimiz kimi, hər bir varlıq özlüyündə Allahı əks etdirən bir aləm adlanır. Lakin bütün bu dediklərimizə baxmayaraq, hər bir varlıq, xüsusən də cansız varlıqlar, bitkilər aləmi və "heyvani-kəsif" insanın könül güzgüsündə əks oluna bilməz; çünki bir çox hədis, Quran ayəsi və İslam təsəvvüfi fəlsəfəsinin alimlərinin buyurduqlarına görə, insanın qəlbində (mənəvi qəlbində olan könlündə) Allah, məhəbbət və məhəbbətin ən yüksək məqamı olan eşq məskən salıb, əks olunmuşdur. Məhz buna görə də "bütün əşyanın insanın könül güzgüsündə əks olunması" dedikdə ilahi eşq, məhəbbət və Allah-təalanın insanda əks etdirdiyi "sifati-cəmaliyyə"si nəzərdə tutulur ki, bu da Allahın insanda əks etdirdiyi gözəl sifətlərdən ibarətdir.

Təxmisin "Bas ayaq vəhdət yolunda, çək bu kəsrətdən əli" misrasında "vəhdət" (birlik) yuxarıda şərh etdiyimiz kimi, Allah-təalada birləşmək, yəni cüzviyyatın külliyata qovuşması deməkdir. Bir qədər təkrar olsa da, qeyd edək ki, cüzviyyat zərrələrdən ibarətdir, Allah isə əsl, vacibi varlıq, yəni hər şeyin əsli, zatı, mənbəyi olduğu üçün külliyyat adlanır.

Lakin "cüzviyyatın külliyyata qovuşması" dedikdə, burada birinci növbədə insan nəzərdə tutulur; çünki, Allah-təalanın varlığı deyildikdə ruhani varlıq nəzərdə tutulduğu kimi, cüzviyyat deyildikdə də bütün canlılarda, ələlxüsus insanlarda olan ruhlar nəzərdə tutulur; belə ki, Allah-təala öz ruhundan bir zərrə insana üfürmüş və həmin insan cismən həlak olduqdan sonra həmin ruh onun bədənindən çıxaraq, geri qayıdır və bir neçə mərhələ və mərtəbə keçdikdən sonra yenidən öz əslinə (Allaha) qovuşur ki, buna da "panteizm", yəni "vəhdəti-vücud" fəlsəfəsindən (təsəvvüfdə) cüzviyyatın (zərrələrin) külliyata (tam olan varlığa-Allaha) qovuşması və onda birləşməsi deyilir. "Panteizm" yunan sözüdür. Yəni, "pan" birləşmə, "teos" isə Allah deməkdir ki, bu da Allahla və yaxud Allahda birləşmək mənasını verir. Şairin şərh

etdiyimiz bu misrası ilə əlaqədar olaraq fikrimizi daha da aydınlaşdırmaq üçün əlavə bir neçə misal göstərək. Seyyid Əzim Şirvani bir qəzəlində deyir:

*Bəhri-vəhdət mövc edib, dışra dağıldı qətrələr,*
*Oldular ol qətrələrdən dürri-lala müxtəlif.*

Yəni, Allahın birlik dəryası təlatümə gəldi (ləpələndi) və onun qətrələri (damcıları) xaricə (ətrafa) səpələndi və o qətrələrdən müxtəlif parlaq incilər əmələ gəldi (yarandı). Şair "müxtəlif parlaq inci (mirvari)" dedikdə, həmin ifadədən bir təşbih kimi istifadə etmişdir, çünki, Allah-təalanın yaratmış olduğu müxtəlif növlü insanları, eləcə də müxtəlif növlü varlıqları nəzərdə tutmuşdur. Zahiri varlıqlar (cismani varlıqlar) içərisində dürr qiyməti və dəyəri etibarı ilə ən yüksək, insan isə özünün elm, hikmət və mənəvi dəyəri etibarı ilə canlı varlıqlar arasında ən uca və qiymətli, ən şərəfli varlıq hesab olunur. Yaxud Seyyid Əzim başqa bir qəzəlinin məqtəsində deyir:

*Həmişə kəsrəti-qəm kəsrət içrədir, Seyyid,*
*Xoşa ol aşiqə kim, kəsrət içrə vəhdəti var.*

Təxmisin hal-hazırda şərh etdiyimiz bu misrasında və eləcə də Seyyid Əzimdən misal gətirdiyimiz bu beytin birinci misrasının əvvəlində və eləcə də ikinci misrasında işlədilən "kəsrət" sözü "çoxluq", beytin birinci misrasının axırında işlədilən "kəsrət"sözü isə "azlıq" mənasındadır. Necə ki, hesab elmində vahiddən kiçik olan rəqəmə "kəsr" deyilir. Məsələn, filankəsin işi kəsirdədir və eyni zamanda "kəsr" sınıq mənasında da işlədilir. Necə ki, bəzi şeirlərdə, tarixlərdə və Quranda deyildiyi kimi, Musa (ə) "kəsriəlvah" etdi – yəni qəzəbindən Allah-təala tərəfindən ona nazil olan lövhləri yerə vurub sındırdı və eləcə də "kəsr" çatışmazlıq, naqis mənalarında da işlədilir.

Lakin bu sözlərin hər ikisi ərəb dilində olduqları və eləcə də ərəb əlifbasında işlədilən "s" samitinin üç cür yazılıb, müxtəlif

cür səsləndikləri üçün bu iki "kəsrət" sözünün arasındakı məna fərqi həmin sözlərin iki müxtəlif "s" hərfi ilə yazılmalarındadır. Seyyid Əzim beytində deyir: "Ey Seyyid, həmişə aləmdə qəmin çoxluğu azlıq içərisindədir, yəni azalmaq üzrədir, xoş olsun o aşiqin halına ki, onun çoxluq içərisində birliyi var" – yəni, xoş o aşiqin halına ki, o, çoxlu varlıqdan əlaqəsini kəsərək, özünün əsli, vahid olan Allaha sığınaraq onunla birləşir. Eyni zamanda, Seyyid Əzim birinci misrada "həmişə qəmin çoxluğu azalmaq üzrədir və yaxud azlıq içərisindədir" deməklə, bu dünya evini qəmxanə adlandıraraq, insanların bir-bir ölüb getmələri ilə onların dünya evindən xilas olaraq qəmlərinin azaldığını, onların öz əsillərinə doğru qayıtdıqlarını, "vacibi varlıq" olan Allaha qovuşaraq, onunla birləşdiklərini bildirmək istəmişdir və yaxud "Vəhdəti" təxəllüslü bir şair bir qəzəlində deyir:

*Aşiqəm bir qara göz, zülfi-siyah dilbərə mən,*
*Vəhdəti, vəhdətara gör nə kəsim var mənim.*

Və yaxud mütəsəvvüf şair İsmail Həqqi bir qəzəlinin mətləsində deyir:

*Kəsrəti-əsmadan ey dil, eyni-vəhdətdir qərəz,*
*Qəlbi təthir eyləməkdən yənbi-hikmətdir qərəz.*

Yəni, şair özü öz cismani mənliyini unudaraq, ruhani olan həqiqi mənliyinə (mənəvi qəlbi olan könlünə) müraciət edərək deyir ki, ey könül, adların çoxluğundan, daha dəqiq desək, Allah-təalanın adlarını zikr etməkdən məqsəd onun birliyinə yetişmək, həmin birliyə qovuşaraq, həmin varlıqda ruhən birləşməkdir. Eyni zamanda, qəlbi pak etməkdə də əsas məqsəd Allahın hikmət bulağını həmin qəlbə (könülə) axıtmaqdır. Necə ki, bu barədə Peyğəmbər (s) bir hədisində deyir: "Hər kəs ki, qırx gün ixlas ilə-yəni, həqiqi qəlb təmizliyi, batini olan nəfsani təmizliyi ilə Allaha ibadət etsə, Allah hikmət çeşmələrini (bulaqlarını) onun qəlbindən (könlündən) onun dilinə axıdar və yaxud "Niyazi" tə-

xəllüslü bir mütəsəvvür şair bir qəzəlində deyir:

*Zəri-dəryayi-vəhdət kim, kəsilməz hərgiz ənvaci,*
*Bu kəsrət aləmi andan doğub, naçar olur peyda.*

Yəni, Allahın birlik dəryası nə xoş bir dəryadır ki, onun mövcləri (ləpələri) əsla kəsilmir, azalmır, bu yer üzündə olan "çoxluqlar aləmi" istər-istəməz həmin birlik dəryasından (bir olan Allahdan) doğub (zühura gəlib) aşkar olur. Şair bu beytdə "həmin birlik dəryasının ənvacı (ləpələri)" dedikdə, Allahın öz qüdrəti ilə çoxlu varlıqlar yaratdığına və daima həmin varlıqları yaratmağa qadir olduğuna işarə etmişdir.

Yenidən Təxmisin şərhi üzərinə qayıdaq; yəni şair demək istəyir ki, ey insan, sən Allaha qəlbən eşq yetirib iman gətirməklə onunla qovuşmaq yolunu tut, bu "çoxluq aləmi"ndən, yəni müvəqqəti və fani olan dünyəvi varlıqlardan əl çəkib, onlardan uzaqlaş. Təxmisin bu bəndinin son iki misrasında (Qəhrü lütfün mənşəyi-mənidə vahiddir, vəli; Bilmədi şeytan bu tövhidi, "Əhəddən" düşdü dur) "qəhrü lütf" "qəzəb və mərhəmət", "mənşəyi-mənidə vahid" "mənaca yaradılışından eyni", vəli "lakin", tövhid "Allahın bir olduğu" deməkdir. Əhəd bir olan Allahın adıdır. Dur-farsca uzaq deməkdir. Şair bu beytdə Allaha məxsus olan iki sifəti qeyd etmişdir; onlardan biri qəhr, digəri isə lütfdür və bu sifətlərdən hər ikisi Allah-təalanın sırf adil (ədalətli) olduğuna dəlalət edir. Məhz buna görə də "üsuliddin"in ikincisi "ədl" adlanır. Ərəbcə lüğəvi mənada "tərazünün hər iki gözünün bərabər olması"na deyilir, qəhr ərəbcə qəzəb deməkdir; necə ki, Quranın bir çox ayələrinin axırlarında Allah haqqında "Vahidul-qəhhar", yəni "bir və qəzəb edən" ifadəsi işlədilir. Qəhr ona görə Allahın ədalətli sifətlərindən hesab olunur ki, Allahın haqlı olaraq yolundan çıxan kafirlərə qəzəb etməsi, onlara öz əməllərinə görə yerli-yerində cəza verməsi (onları mükafatlandırması) onun tam ədalətli olduğunu göstərir. Yeri gəlmişkən, biz burada bu günkü gün üçün aramızda mövcud olan ən vacib bir məsələni xüsusi olaraq qeyd etməliyik, o da budur

ki, çox zamanlar dini məclislərdə ərəb dilini bilməyən və eləcə də Quranı oxuyub onun mənasını dərindən dərk etməyən üzdəniraq din xadimləri xalq arasında işlədilən əcr və cəza sözlərinin nə demək olduğunu düzgün izah edə bilmirlər. Belə ki, hətta bəzi yerlərdə xalqın bir çox firqələrindən bir-birlərinə söyləmiş olduqları "Allah sənə əcr versin" sözünü işlətmələri də din xadimləri onlara yasaq və hətta qadağan edərək, guya bu ifadənin düzgün işlədilmədiyini, guya həmin ifadənin pis məna daşıdığını söyləyirlər. Doğrudur, əgər biz bir tərəfli yanaşsaq, yerinə görə bu ifadənin pis mənası da vardır. Belə ki, əcr ərəbcə lüğəvi mənada muzd, haq, mükafat deməkdir, bunu da ki, hər bir insan özünün görmüş olduğu işi və etmiş olduğu əməli müqabilində alır. Lakin görülən işi və edilən əməlin yaxşısı və pisi olduğu kimi, onun əvəzində Allah tərəfindən verilən əcrin (mükafatın) da yaxşısı və pisi olur.

Belə ki, Allah hər bir insanın yaxşı əməlinə görə ona yaxşı, pis əməlinə görə isə pis mükafat vermiş olur və tam dəqiqliyi ilə desək, bu ifadənin xalq arasında yaxşı tərəfinə "əcri-xeyr", pis tərəfinə isə "əcri-zərər" deyilir.

Hətta bizim işlətmiş olduğumuz dualar arasında "Mucir duası" adlanan bir dua da vardır ki, bununda mənası "əcrlənmə, mükafatlanma duası" deməkdir və bu dua da Peyğəmbərə (s) merac zamanı deyilən duadır. Dua sözünün ərəb dilində lüğəvi mənası isə hər hansı yaxşı və yaxud pis əmələ görə Allah-təalanı imdada (köməyə) çağırmaq deməkdir ki, bunun da cəminə dəvət (çağırışlar), çağırana isə "dai" deyilir ki, "nida edən" sözü də bu mənadadır. Əcr sözü haqqında dediklərimiz eynilə cəza sözü haqqında da, deyə bilərik. Çünki, lüğəvi mənada da cəza sözü də əcr sözü kimi eyni bir məna daşıyır. Lakin pisliyi orasındadır ki, bizim dilimizə bu sözün əslində ərəb dilindən keçərək daxil olmasına baxmayaraq, bu söz hələ də bizim dilimizdə yalnız bir tərəfli mənada – yəni mənfi (pis, zərərli) mənada işlədilir. Halbuki, əcr sözü kimi cəza sözünün də iki mənası – yəni "cəzayi-xeyr" və "cəzayi-zərər" mənaları vardır. Necə ki, Hüseyn Cavidin "Şeyx Sənan" faciəsində kor ərəb şeyxlərindən biri deyir: "Tanrı

versin cəzayi-xeyr sana".

Və mütləq onu da qeyd etmək lazımdır ki, bayaqdan bəri mənalarını araşdıraraq izah etdiyimiz sözlərin hər ikisi, ələlxüsus əcr sözü Quranda işlədilmişdir. Quranın bir çox ayələrinin axırlarında "əcrün əzimin – böyük əcr" ifadəsi işlədilmişdir və bu əcr sözü həqiqətdə yaxşı mənada işlədilməsinə aid olan dəlilimiz budur ki, Quran ayələrində işlədilən əcr sözlərinin heç biri pis (mənfi) mənada işlədilməmişdir. Belə ki, bu əcr sözü Quranda yalnız həqiqi mömin və müslimlər barəsində nazil olan ayələrdə işlənmişdir. Əksinə olaraq, kafir və müşriklər haqqında nazil olan ayələrdə isə "əzabun əlim – şiddətli əzab", "əzabun mübin – aşkara əzab" və sairə bu kimi ifadələr işlədilmişdir. Biz həmin bu izah etdiyimiz əcr və cəza sözlərinin hər birinin ayrı-ayrılıqda yaxşı (müsbət) mənada işlədilmələri xüsunda Qurandan ayələr misal gətirməklə kifayətlənəcəyik. Ikinci "Əl-Bəqərə" surəsi, 62-ci ayə: "Və o kəs ki, iman gətirdi (inandı) Allaha və qiyamət gününə və düzgün əməllər etdi, o kəsin və eləcə də o cür kəslərin öz Rəbbləri (Allahları) yanında əcrləri (mükafatları) var və onlara əsla qorxu yoxdur və onlar əsla qəmgin olmazlar." "Yasin" surəsində: "Kişi dedi: ey qövm, tabe olun o kəslərə ki, onlar doğru və düzgün yola dəvət etməkdən başqa heç bir muzd, mükafat istəmirlər". 98-ci "əl-Beyyinə" surəsi: "Həqiqətən o kəslər ki, Allaha və onun Peyğəmbərlərinə iman gətirdilər və düzgün işlər gördülər, onlar xeyirli və yaxşı olan kəslərdirlər və onların öz Allahları yanında cəzaları (mükafatları) əla bağlar və bostanlardır ki, onların altından çaylar axır və həmin şəxslər əbədi olaraq o bağlarda və bostanlarda qalacaqlar".

Və nəhayət bu dediklərimizdən sonra üzümüzü bəzi din xadimlərinə tutub, onlara müraciət edərək deyirik: Məgər zəhmət çəkib uzaqdan və yaxından tə`ziyə saxlayan şəxsə baş sağlığı vermək üçün bir-birinin yas mərasimlərinə gəldikləri zaman həmin adamlar ev sahibinə və yaxud da bir-birinə "Allah sizə və yaxud sənə əcr versin" dedikdə, bu ifadəni pis mənada işlədərlərmi!

Təxmisin şərhinə qayıdaq. Lütv də Allah-təalanın ədalət si-

fətlərindən biridir və lüğəvi mənası mehribanlq, yumşaqlıq, mərhəmət göstərmək deməkdir. Hər bir xeyir iş, hər bir namaz, Quran surələrinin (9-cu surədən başqa) qiraəti və eləcədə hər hansı bir niyyətə görə oxunan duanın əvvəli Allah-təalanın mehriban və mərhəmətli adı ilə və yaxud adının köməkliyi ilə başlanır ki, bu da "Bismillahir-rəhmanir-rəhim" deməkdir. Tarixlərin və yuxarıda qeyd etdiyimiz təfsirlərin yazdıqlarına görə, "Bismillahir-rəhmanir-rəhim" ayəsi Peyğəmbərə (s) 3 dəfə nazil olmuşdur. Belə ki, Peyğəmbər (s) kafir və müşriklərə bir olan Allahı tanıyıb, ona iman gətirmələrini təklif edib, əvvəlcə onlara "bismillah" demələrini buyurduqda, onlar "biz Allah tanımırıq, hansı Allah?" dedilər. Peyğəmbər (s) onlara "Ər-Rəhman – xalqın üzünə ruzi qapıları açan Allah" deyə cavab verdi.

Onlar yenidən "biz Rəhman tanımırıq, daha hansı Allahı deyirsən?" deyə soruşduqları zaman Peyğəmbər (s) onlara "ər-Rəhim – axirətdə yalnız möminlərə rəhm edən Allah" cavabını vermişdir. Və lütv sözü Allah-təalanın ədalət sifətlərindən biri olmasıına aid olan ən mühüm dəlillərdən biri də həmin sözün rəhm sözü ilə tam və sıxı surətdə əlaqədar olmasındadır. Hətta əlavə olaraq onu da qeyd edək ki, rəhm sözü ilə əlaqədar olaraq, Allah-təalaya "ərhəmər-rahimin-rəhm edənlərin rəhmlisi"sifəti də isnad olunmuşdur. Məhz bu lütf etmək felinin məsdər şəklində götürülərək, Allah-təalaya "ismi-fail" olduğu üçün lətif – yəni "lütf edən" deyilmişdir. Allah-təalanın "lətif" olduğu ifadəsinə biz ayrı-ayrı Quran təfsirlərində də rast gəlmişik. Hətta yuxarıda adlarını dönə-dönə qeyd etdiyimiz tarix və təfsirlərin yazdıqlarına görə, Alahın "Əsmaül-hüsna"sında, yəni gözəl adlarından biri də Lətifdir. Allaha məxsus olan bu "Lətif" sifətinin Allah-təalanın özünün buyurduğu – ləmisə", yəni sürtünmə qüvvəsi və yaxud "qüvveyi-basirə", yəni görmə qüvvəsi vasitəsi ilə təyin etdiyimiz cismani, maddi incəlik deyildir, zahirən insan əqlinin qəbul edə bilmədiyi, idrak qüvvəsinin dərk etməyə qadir olmadığı bir incəlikdir. Çünki Allahın valığını zahiri, cismani aləmdə oun əks olunan sifətləri vasitəsilə, ruhani aləmdə isə ona sidq ilə iman gətirib, həqiqi eşq yetirmək yolu ilə dərk etmək

mümkündür.

Təxmisin şərhi üzərinə qayıdaq. Yəni, Nəsimi deyir ki, Allahın qəzəb və mərhəməti eynilə vahid olan bir əməldir, yəni bunların hər ikisinin yaradılış mənası bir olan Allah-təalanın eynilə bir olan "könül" əmrindəndir. Lakin şeytan (Əzazil, İblis) həmin bu birliyi dərk edə bilmədiyi üçün – yəni Allah-təalanın lütfü (mərhəməti) ilə bərabər qəhri (qəzəbi) də olduğunu dərk edə bilmədiyi, əmrinə tabe olmadığı üçün bir olan Allahdan (Əhəddən) uzaq düşdü – yəni Allah onu öz lənətinə düçar, rəhmətindən uzaq edib öz dərgahından qovdu. Lakin Allah öz mərhəmətini şeytandan tam əsirgəmədi, özünün tam ədalətli olmaq sifətini bir daha biruzə verərək, şeytanın uzun müddətdən bəri onun dərgahında xidmətini nəzərə alıb, əvəzində onun istəmiş olduğu şeyi – insanların qəlbini ona verdi.[1]

***Yəzid iqrarinə inkar olubdur,***
***Layiq inkardə ləfzi-bu riyadur.*** *(Q.2, səh.269)*

(Yezid əvvəllər təsdiq etdiyi dini hökmləri sonradan həyasızcasına danmışdır. Ona görə də onun bu inkarı, belə murdar və idbar hərəkəti başdan-ayağa riyakarlıqla dolu sözlərdən başqa bir şey deyil).

***Yəzidu müşrikin kəjdi damarın,***
***Nə qalmışdır giriftari-bəladur.*** *(Q.2, səh.269)*

Yezid ibn Müaviyə Əməvilər soyunun Süfyanilər qoluna mənsubdur. Hicri 25-ci ildə (miladi 645-ci il) doğulmuşdur. Anası Bəni-Kəlb qəbiləsindən Bəcdəlin qızı Meysun idi. Bəni-Kəlb qəbiləsi bədəvi qəbilələrdən sayılırdı. Buna görə, Yezid anasının tərbiyəsi altında böyüyərək, bədəvilərə xas olan adət-

---

[1] Ramiz Faseh. "S.İ.Nəsiminin seçilmiş bəzi şeirlərinin şərhi". Bakı, "Şərq-Qərb", 2007. səh. 162-171

ənənələrə (ov və şeirə meyllilik, əyləncəyə aludəlik və s.) yiyələndi. Zahiri görünüşcə kök, bədəni tüklü idi.

Yezid cavanlığından eyş-işrətə, içkiyə, musiqiyə, zinaya, meymunbazlıq və itbazlığa həvəsli idi. Hətta xəlifə olduqdan sonra da bu adətlərindən əl çəkməmişdi. Tarix kitablarında yazırlar ki, o, öz meymununa insan kimi Əbu Qeys adını vermişdi. Meymuna bahalı paltarlar geyindirir, başına papaq qoyur, məclislərdə yanında saxlayır, onunla eyni qabdan içki içir, hətta öz qədəhinin dibində qalan şərabı meymuna içizdirirdi. Cıdır yarışlarında Əbu Qeysi bir vəhşi qatırın belinə mindirib yarışa buraxırdı.[1] Cıdır yarışlarının birində Əbu Qeys qatırın belindən yıxılıb atların tapdağı altında qalaraq öləndə Yezid onun üçün mərsiyə söyləyib ağladı. Yezid deyirdi ki, Əbu Qeys əslində Bəni-İsrail qövmündən qoca bir kişi olub, sonra Allah onu meymuna döndərib.[2]

Yezidin zamanında günah və fisq açıq-aşkar edilən əmələ çevrildi, Məkkə və Mədinə kimi müqəddəs şəhərlərdə haram məclislərə xas əyləncə səsləri eşidilməyə başladı. Məhz bundan istifadə edən Abdullah ibn Zübeyr Məkkədə qiyam qaldırdı və bütün Hicazın hakimiyyətini ələ keçirdi.

Yezid şair idi, əsasən, kef məclislərinə aid olan mövzularda şeir deyirdi. Bəzi şeirlərində İslam dinini, vəhyi inkar edir, Peyğəmbərlə (s) və nəsli ilə düşmənçiliyini açıq-aşkar şəkildə dilə gətirirdi.

Həsən Bəsri deyirdi ki, camaatın taleyini iki nəfər zay etdi. Birincisi, Əmr ibn Asdır ki, Siffeyn savaşında Quran səhifələrini nizələrin ucuna taxmağı Müaviyəyə məsləhət gördü. Nəticədə xəvaric tayfası meydana çıxdı, həkəmeyn hadisəsi baş verdi və qiyamət gününə kimi bunun ziyanını çəkəcəyik. İkincisi isə, Müğeyrə ibn Şöbədir ki, Müaviyəyə özündən sonra Yezidi vəliəhd etməyi məsləhət gördü. Müğeyrə Kufə valisi idi. Müaviyə

---

[1] Məsudi. “Mürucüz-zəhəb”, III cild, səh. 67-68
[2] Bəlazuri. “Ənsabül-əşraf”, V cild, səh. 300

ona məktub yazıb vəzifədən azad etdiyini bildirdi. Müğeyrə də Müaviyənin qəzəbini soyutmaq və vəzifədə qalmaq üçün bu hiyləni fikirləşdi, Şama gəlib Müaviyəyə məsləhət verdi ki, hakimiyyəti əldən buraxmamaq üçün camaatdan Yezidin adına beyət alsın. Müaviyə soruşdu ki, sən özün bu işə rəhbərlik edə bilərsənmi? Müğeyrə razılığını bildirdi və həqiqətən bu işin öhdəsindən uğurla gəldi. Həsən Bəsri deyirdi ki, məhz bu hadisədən sonra hakimiyyətin atadan oğula keçməsi adət halına keçdi və şura ənənəsi yaddan çıxdı.[1]

Yezid atasının sağlığında hakimiyyət işlərinə qarışmadan, eyş-işrət içində gününü keçirirdi. Müaviyə onu dövlət işlərinə alışdırmaq üçün ardıcıl cəhdlər göstərirdi. Hətta Bizans yürüşlərinin birinə Yezidi sərkərdə təyin etmişdi. Bu missiya Yezidin ürəyincə olmasa da, atasının sözündən çıxa bilmədi. Bəzi böyük səhabələrin (məsələn, Əbu Əyyub Ənsarinin) də qatıldığı yürüş Konstantinopolun qala divarlarının qarşısında sona çatdı və müsəlmanlar şəhəri uzun müddət mühasirədə saxladıqdan sonra nəticəsiz halda geri qayıtmağa məcbur oldular.

Müaviyə can verəndə belə, Yezid sarayda deyildi, ova getmişdi. Atasının ölümündən sonra o, hakimiyyətə keçdi və ilk növbədə ona beyət etməmiş şəxsləri özünə ram etmək uğrunda tədbirlər görməyə başladı. Yezid təqribən 3 il yarım davam etmiş xəlifəlik dövründə üç böyük cinayətə imza atdı.

Hakimiyyətə gəldikdən təqribən altı ay sonra Kərbəla səhrasında Peyğəmbərin (s) əziz nəvəsi Imam Hüseyni (ə), ailə üzvlərini və yaxın silahdaşlarını görünməmiş qəddarlıqla qətlə yetirdi.

Bundan iki il sonra – hicri 63-cü ildə Yezid ona qarşı qiyam qaldırmış Mədinə əhalisini amansızlıqla cəzalandırdı. Mədinəlilər Şama nümayəndə heyəti göndərmişdilər ki, sarayda baş verən hadisələri izləyib xəbər gətirsinlər. Onlar Şamda olduqları müddətdə Yezidin və əlaltılarının dindən uzaq bir adam olduqlarını müşahidə etdilər, Əməvilər soyunun hakimiyyətə layiq ol-

---

[1] Cəlaləddin Süyuti. “Tarixül-xüləfa”, səh. 164

madığı qənaətinə gəldilər. Şəhər əhalisi Hənzələ qəsilül-məlaikənin (yəni mələklərin qüsl verdiyi Hənzələnin) oğlu Abdullaha beyət etdi. Abdullahın atası Hənzələ Ühüd savaşında cənabətli halda şəhid olmuşdu. Peyğəmbər (s) onun şəhadətindən sonra buyurmuşdu ki; "indi behiştdə mələklər Hənzələnin cənazəsinə qüsl verirlər".

Abdullahın başçılığı altında Mədinəlilər Yezidin valisini şəhərdən qovdular. Yezid hadisədən xəbər tutan kimi Müslim ibn Əqəbə adlı sərkərdəni böyük qoşunla Mədinə üzərinə yolladı. Şəhər kənarındakı Hərrə adlı daşlıq məkanda tərəflər arasında toqquşma baş verdi. Mədinəlilər şücaətlə savaşsalar da, qüvvələrin qeyri-bərabərliyi döyüşün taleyini həll etdi. Qalib gəlmiş Şam qoşunu Mədinəyə daxil oldu. Müslim ibn Əqəbənin əmri ilə Mədinə şəhərindəki hər şey – sakinlər də daxil olmaqla – əsgərlərə halal elan edildi. Tarixçilər yazırlar ki, Şam qoşunu Mədinədə misli görünməmiş qətlü-qarət törətdi. Öldürülənlərin sayını minlə on min nəfər arasında qeyd edirlər. Hətta, Peyğəmbər (s) məscidinə pənah gətirənlərə də aman verilmədi. Qətlə yetirilənlərin arasında 700-dən artıq elm əhli və Quran qaresi vardı ki, bunların bir hissəsi səhabə idi. Peyğəmbərin (s) əmisi oğlu Abdullah ibn Cəfəri-Təyyarın iki oğlu, Peyğəmbərin (s) əmisi Əbu Ləhəbin oğlu Abbas, Peyğəmbərin (s) digər əmisi Harisin nəslindən olan bir neçə nəfər, o cümlədən, səksən nəfərə yaxın səhabə bu faciə zamanı şəhid oldular. İbn Kəsir, İbn Qüteybə kimi məşhur tarixçilər yazırlar ki, vaxtilə Bədr savaşında iştirak etmiş qocaman səhabələrin hamısı Hərrə faciəsində qətlə yetirildilər. Əsgərlər Mədinə camaatını ya öldürür, ya da işgəncəyə məruz qoyurdular. Əbu Səid Xüdrinin evinə soxulan Şam ordusunun əsgərləri ələ keçirmək üçün qənimət tapa bilməyəndə qəzəblənib bu möhtərəm səhabənin saqqalını yolmuşdular. Müslim ibn Əqəbənin əsgərləri Mədinədə üç gün rüsvayçılıq etdilər. Qadınların və qızların namusu tapdalandı. Sonra Yezidin əmri ilə Hüseyn ibn Nümeyrin başçılığı altında qoşun Məkkəyə sarı istiqamət aldı. Onun məqsədi Məkkədə hakimiyyət sürən və Yezidə meydan oxuyan Abdullah ibn Zübeyri məğlub etmək idi. Mək-

kəlilər şəhərə çəkilib müdafiə olunmağa başladılar. Şam qoşunu Məkkə kənarındakı Əbu Qübeys dağının üzərində mancanaqlar quraşdırdı. Bu mancanaqlardan şəhərə iri daşlar atmağa başladılar. Ucu yandırılmış oxlar da müqəddəs şəhəri hədəfə götürdü. Mancanaqlardan atılan daşlar Kəbənin divarlarına dəyib Allahın evini uçurdu. Kəbənin üzərindəki kisvə (örtük) yandı. Əgər bu minvalla davam etsəydi, Məkkədə daş üstə daş qalmayacaqdı.

Ancaq bir neçə gündən sonra Şamdan Yezidin ölüm xəbərini gətirdilər. Qoşun Məkkənin mühasirəsindən əl çəkib Şama qayıtdı. İbn əl-Cövzi bunları nəzərdə tutaraq deyirdi: "Nə deyim bir adamın barəsində ki, üç il hakimiyyət sürmüş, birinci il Hüseyn ibn Əlini (ə) qətlə yetirmiş, ikinci il Mədinə əhalisini qorxudub camaatın qanını halal elan etmiş, üçüncü il də Allahın evini mancanaqlardan daşa tutmuşdur?"[1]

Yezidin aqibətinin nə ilə qurtardığı da maraqlı məsələlərdəndir. Tarix səhifələrini öz qanlı cinayətləri ilə bulamış əksər şəxslər kimi Yezidin də həyatının faciəli şəkildə və ağır əzablar içində bitdiyini gözləmək təbiidir. Onun ölüm tarixçəsi barədə bir neçə fərqli nəzəriyyə vardır. Əvvəla, bunu qeyd edək ki, Yezidin hicri 64-cü il 14 və ya 15 rəbiül-əvvəl tarixlərində (miladi 683-cü il), təqribən 39 yaşında öldüyünü yazırlar.

Mərhum Şeyx Səduq yazır ki, Yezid gecə sərxoş halda yatdı, səhər onu ölmüş vəziyyətdə gördülər. Bədəni qapqara qaralmışdı, sanki dərisinə qatran sürtmüşdülər.

Başqa bir rəvayətə görə, Yezid eyş-işrət məclisində içib sərxoş olmuşdu. Qalxıb rəqs etmək üçün taxtından endi, amma qəfildən ayağı büdrəyib yıxıldı, başı zərblə yerə dəyib yarıldı, hətta beyni kəlləsindən çölə töküldü.[2]

Yezidin zəhərlə öldürüldüyü haqqında da fikir vardır. Bu nəzəriyyəyə görə, vaxtilə Müaviyənin qətlə yetirdiyi Hücr ibn Ədiyyin qızı Səlma Hücrün qardaşı oğlu Əbdürrəhmanla kö-

---

[1] Sibt ibn əl-Cövzi. "Təzkirətül-xəvass", səh. 291-292
[2] Zəhəbi. "Siyərü əlamin-nübəla", IV cild, səh. 37

məkləşib Yezidi zəhərləyirlər.

Yezidin ölümü haqqında daha bir nəzəriyyə ilə Seyyid ibn Tavusun “Lühuf” kitabında rastlaşırıq. Bu nəzəriyyəyə görə, Yezid öz adamları ilə Dəməşqdən xeyli uzaqlarda, səhrada ova çıxır. Rastına çıxan bir ceyranı ovlamaq üçün dəstədən ayrılır və təkbaşına ceyranın dalınca düşür. Ceyranı qova-qova bir quyunun başına çatır. Görür ki, bir nəfər quyudan su çəkməklə məşğuldur. Yezid həmin adama yaxınlaşıb su istəyir, amma ondan xəlifəyə layiq təzim və ehtiram görmür. Qəzəblə deyir: “Yəqin mənim kim olduğumu bilmirsən. Bilsəydin, mənə layiq olan hörməti göstərərdin. Mən möminlərin əmiri Yezid ibn Müaviyəyəm”. O adam bu sözləri eşidən kimi qılıncını çəkib Yezidin üstünə hücum edir: “Sən mənim ağam Hüseyni (ə) səhrada susuz öldürtdürmüsən. Vallahi, mən də səni o şəkildə həlak edəcəyəm”. O adamın qılınc zərbəsi Yezidin atına dəyir. Hürkmüş at şaha qalxır, sonra sürətlə çapıb gedir. Yezid atın tərkində özünü saxlaya bilməyib yıxılır. Amma bir ayağı üzəngidə qaldığı üçün at onu səhra boyunca sürüdüb aparır. Bir neçə gündən sonra nökərləri səhrada Yezidin atını tapırlar. Atın üzəngisindən bir ayaq asılmışdı. Məlum olur ki, Yezidin bədəni yerə sürtünərək tikə-tikə olub dağılıb, yalnız üzəngiyə ilişmiş ayaq salamat qalıb. Onun cəsədinin qalıqlarını Şama gətirib, Babüs-səğir məntəqəsində dəfn edirlər. Hər bir halda, bu gün Yezidin qəbri kimi tanınan məzar Əməvilər məscidinin yaxınlığında, Bəni-Üməyyə soyunun mənsublarının basdırıldığı uçuq-sökük bir məqbərədə yerləşir. Atası Müaviyə kimi onun da dəfn yeri Dəməşq əhalisinin zibilxanasına çevrilib.Əməvi sülaləsindən yeganə ədalətli xəlifə kimi tanınan Ömər ibn Əbdüləziz deyirdi ki, bir gecə yuxuda qiyamətin başlandığını gördüm.

Cəhənnəmdə əzab çəkənlərə baxanda gördüm ki, alovla dolu olan dərənin içində bir nəfər var, hər nə qədər dərədən çıxmağa çalışırsa da, cəhənnəm qoruqçuları atəşin gürzlərlə onu vurub yenə dərənin içinə qaytarırlar. O adamın kim olduğunu soruş-

dum, dedilər ki, Yezid ibn Müaviyədir.[1]

Bir gün Ömər ibn Əbdüləzizin yanında bir nəfər Yezidin adını çəkəndə "əmirəl-möminin" ləqəbini işlətmişdi. Ömər o adama qəzəbləndi və iyirmi şallaq vurdurdu.[2]

Bir çox müsəlman alimləri Yezidin törətdiyi zülmlərə əsaslanaraq, onun ruhuna lənət oxumağı icazəli bilmiş, hətta onu kafir saymışlar. Bunların sırasında Ibn əl-Cövzi, Təftazani, Qazı Əbu Yəla, Əllamə Süyuti, Imam Şafei, Cahiz, Şovkani kimi böyük alimlərin adlarına rast gəlirik. Lakin Qəzzali, İbn Teymiyyə və sələfi görüşlü müasir alimlər onu küfrdə təqsirli bilməmiş, ruhuna lənət oxunmasını rəva görməmişlər. Bunu ya Yezidin İmam Hüseyni (ə) öldürmək niyyətində olmaması, bu işin onun razılığı olmadan baş verməsi, yaxud Kərbəla faciəsindən sonra Yezidin tövbə etməsi, ya da ümumiyyətlə qətl törətmiş şəxsi kafir adlandırmağın düzgün olmaması ilə izah etmişlər.

Şiə məzhəbinin isə məsələyə münasibəti birmənalıdır. Peyğəmbərin (s) nəvəsini qətlə yetirmək üçün əmr verdiyinə, qeyri-islami və qeyri-əxlaqi həyat tərzi sürdüyünə, eləcə də, istər söhbətlərində, istərsə də yazdığı şeirlərdə açıq-aşkar küfr əqidəsini tərənnüm etdiyinə görə şiələr Yezidi kafir sayır və lənətə layiq bilirlər. İbni Muhamməd Əl-Qəzzalinin "Yezidə lənət oxumaq olmaz" fətvasından sonra Əlişir Nəvainin Qəzzaliyə iki beytdən ibarət olan tutarlı cavabını burda qeyd etmək yerinə düşərdi:

*Sən deyirsən ki, Yezid əhlinə lənət demə,*
*Tövbə etmiş bəlkə, Tanrı eyləmiş rəhmət ona.*
*Əhli-beytin qatilin əfv eyləyən Pərvərdigar,*
*Əfv qılmazmı məni gər, söyləsəm lənət ona?*

[1] "Məqtəlül-Xarəzmi", II cild, səh. 86
[2] Cəlaləddin Süyuti. "Tarixül-xüləfa", səh. 167

***

***Duaçidür sənə şaha, Xətai,***
***Kim onun ruzü şəb virdi duadur.***

*(Q.2, səh.269)*

(Ey şah, yəni ya Əli (ə) Xətai ömür boyu sənə duaçıdır. Gecə-gündüz onun dilinin əzbəri sənə dua etməkdir). Xətai qəsidənin məqtəsində yenidən Həzrəti-Əli (ə) duhasına üz tutur "şaha" xitabı məhz, bunu göstərir. "Duaçıdır virt və dua" sözləri isə şairin könül səmimiyyətinə dəlalət edir. Bu sözlərdən anlaşılır ki, şairin gözündə Həzrəti-Əli (ə) bir yanadır, digər on üç məsum isə bir yana. Odur ki, qəsidə boyu Həzrəti-Əli (ə) dühası həqdən yanan əzəli-əbədi şam, digər məsumlar isə o şamın çevrəsində dövrə vuran pərvanə yerindədir. Ədəbiyyatımızda daha çox bu mövqeyi tutan yalnız iki şair Xətai və Nəbatidir.

"Görünür" rədifli qəsidəsində Nəbati deyir:

*Həmdülillah ki, qəbul oldu duayi-səhərim,*
*Əsəri-kəşməkəşi-Qənbəri-Mövla görünür.*[1]

Şah İsmail Xətai "Mən" rədifli qəzəlində deyir:

*Mən Xətai çəkmənəm ğəm, çün ənəlhəqq demişəm,*
*Çəkmişəm Heydər təki meydanda "Hu" mərdanə mən.*

Beytinə Nəbati belə bir nəzirə yazır:

*Hər nə etdim mürği-bəxti ram edəm ram olmadı,*
*"Hu" çəkib, bir şəhpəri-şunqari gözlər gözlərim.*

[1] Seyid Əbülqasim Nəbati. "Sənsiz, ey gül". (Seçilmiş şeirlər). Bakı, "Gənclik", 1997. səh. 64

*Məstü mədhuş eyləyib çoxdan məni bir xirqəpuş,*
*Göz dikib, bir sağəri-sərşarı gözlər gözlərim.*

*Bir şahənşahi-büləndəxtər, xidivi-bəhrübər,*
*Bir Qəzənfər həmlə, bir sərdarı gözlər gözlərim.*

*Müxtəsər, yeydir, Nəbati, bir sözü çox çeynəmə,*
*Söylə bir yol, Heydəri-Kərrarı gözlər gözlərim.*

*(Qəs.91, s.91)*

Bu deyilənlər inkar olunmaz surətdə sübuta yetirir ki, "Tilavət" və ya "On iki İmamı" adlandırılan şeir növü həm Şah İsmail Xətai, həm də Seyid İmadəddin Nəsimi poyeziyası üçün olduqca doğmadır və çox dərin mövzu, məzmun, məfkurə, dil üslub və janr forma incəliklərinə malikdir.

## 3.8. ŞAH XƏTAİ YARADICILIĞINDA İNTİZARUL-FƏRƏC

Şiə məzhəbinə əsasən əsnai-əşirə (12-İmam əqidəsi) zəmanə İmamının zuhuruna dərin inam üzərinə qurulmuşdur. Sinəsində Əhli-beytə (ə.m) məhəbbət bəsləyən hər bir kimsə bu inamla yaşaya bilməz çünki, zəmanə İmamının zühuruna inam Əhli-beyt (ə.m) məktəbinin tamamilə qanuna uyğun nəticəsidir.

Allah-təala "Ənbiya" surəsinin 105-ci ayəsində buyurur: "Və biz Zəburda Tövratdan sonra yazmışıq ki, mənim saleh bəndələrim bu yeri irs aparacaq".

**"Qəsəs"** surəsinin 5-ci ayəsində buyurulur: "Biz yer üzündə olan müstəzəflərə minnət qoyub onlara nemət vermək və onları başçı və varis etmək istədik".

Alimlərdən biri yazır ki: "Allah-təala biz insanların hidayəti üçün 12 ulduz yaratdı. Təəssüf ki, vəzifəpərəst insanlar bu ulduzların qədrini bilməyib, onlardan 11-ni müxtəlif vasitələrlə söndürdülər. Buna görə də Allah-təala 12-ci ulduzu uzaqlaşdırdı, ta xalq o səviyyəyə çatsın ki, qaytarılmasına layiq olsun".

İmam Mehdinin (əc.f) qeybdə olduğu dövrdə xalqın təklif və vəzifəsi bu şərtlərdən ibarət olmalıdır:

– O, Həzrətin (əc.f) qeybdə olduğu dövrdə qəmgin olmaq – necə ki, "Nüdbə" duasında oxuyuruq: "Mənim üçün çətindir xalqı görəm, amma səni görməyəm və səndən bir səs və nida eşitməyəm".

– Yer üzünün ədalətlə dolması və İslam dininin bütün dinlərə qalib gəlməsi üçün hər bir zaman və məkanda O, Həzrətin (əc.f) zühurunu gözləmək;

– O, Həzrətin (əc.f) mübarək vücudunu bütün insanlardan və cinlərdən ibarət olan şeytanların şərindən qorunması üçün dua etmək, O, Həzrətin (əc.f) zühurunun tezliklə olmasını Allahdan istəmək, kafirlərə və münafiqlərə qələbə çalmasını istəmək;

– O, Həzrətin (əc.f) mübarək vücudunun qorunması üçün hər vaxt mümkün olan miqdarda sədəqə vermək;

– O, Həzrətin (əc.f) əvəzində Həccə getmək;

– O Həzrətin (əc.f) mübarək adını eşidən zaman onun hörmətinə xatir ayağa qalxmaq, xüsusilə mübarək Qaim (əc.f) adını eşitdikdə;

– İmanın və dinin şeytanların şübhələrindən qorunması üçün yazılmış duaları oxumaqla Allahdan yardım diləmək;

– Xəstəliklər, çətinliklər və bəlalar insana üz verən zaman kömək istəmək və hər hansı bir şübhənin dəlili üçün Həzrətə (əc.f) üz tutub yalvarmaq.

Bu sayılan şərtləri biz bir çox alimlərin və klassik şairlərin həyatında müşahidə etmişik. S.Ə.Şirvani yuxarıda sadaladığımız keyfiyyətləri özündə cəmləşdirmiş və öz qəzəllərində səadət intizarında olanlara çatdırmışdır:

*Hanı o mah ilə mən işrət etdiyim gecələr,*
*Tüliyi-sübhə kimi söhbət etdiyim gecələr.*

*Gedəndə yar, durub naz ilə kənarından,*
*Alıb ələ ətəyin minnət etdiyim gecələr.*

*Düşəndə xatirimə göylərə çıxar ahım,*
*O mahparə ilə xəlvət etdiyim gecələr.*

*Ayaq yalın, baş açıq, zəmzəmi-sirişk töküb,*
*Təvafi-kuyi üçün niyyət etdiyim gecələr.*

*Mükərrər eyləyib ol acı sözlərin, Seyyid,*
*Özüm-özümə dönüb ləzzət etdiyim gecələr.*

M.Füzuli bir qəzəlində nə qədər ki, İmam (əc.f) zühur etməyib, dünyanı zülmət gecəyə bənzədir:

*Sübhətək yatmayıram, yoxdur mədarım gecələr,*
*Qəmi-qüssəndir işim, ahu-fəğanım gecələr.*

*Lütf qıl, bir gecə gəl külbeyi-əhzanıma sən,*
*Gör mənim halimi bil, yoxdur mədarım gecələr.*

M.Ə.Sabir də İmamın (əc.f) mübarək zühurunu istəmiş və öz dərdini ona çatdırmağa can atmışdır:

*Zairi-kuyinəm ey məh, qoy öpüm xalından,*
*Həcəri öpməyənə xəlq deməzlər Hacı.*

*Gecə-gündüz, səri-kuyində sızıldar Sabir,*
*Neyləsin, qovma qapından kəsilib illaci.*

Peyğəmbəri-Əkrəm (s) buyurub: "Mehdi mənim övladlarımdandır. Onun, millətləri çaşqınlığa salacaq qeybəti olacaqdır. O, Peyğəmbərlərin (ə) miraslarının sahibi kimi gəlib Yer üzünü zülm və təcavüzdən azad edəcək və dünyanı ədalətlə dolduracaq".

Son illərdə geniş yayılmış təsəvvürlərə görə, orta əsrdə müsəlman Şərq poeziyasının xeyli hissəsi 12-ci İmamın zuhuru ilə bağlı motivlər üzərində qurulmuşdur.

Belə əsərlərə "Intizarul-Fərəc" – "fərəc qurtuluşu həsrəti" adı verilmişdir. Özlüyündə gün təki aydındır ki, könlü Əhli-beyt (ə.m) məhəbbəti ilə dolub-daşan Şah İsmail Xətai də "İntizarul-Fərəc" motivlərini tərənnüm etməyə bilməzdi. Belə ki, onun 408 qəzəlinin 40-45-i, deməli 10-da biri bu və digər dərəcədə belə motivlərlə bağlıdır. Bu mənada Xətai lirikasında intizar sözünün dəfələrlə işlənməsi qətiyyən təsadüfü deyildir. Məsələn:

*Cəmalün gülşəniyçün, mürgizarəm,*
*Nedim kim, həsrəti-ol mərğzarəm.*

*Bu mənidən xilas olmaz qəmündən,*
*Vüsalündən sənün ümmidivarəm.*

*Cəmalün vərdini gülşəndə gördüm,*
*Fəraqündən saçun tək biqərarəm.*

*Yüzüni görcəyin can vermədim, çün*
*Bu işimdən be qayət şərmsarəm.*

*Xətai ömrü xətm oldu, hənüz ah,*
*Cəmalün görməgi çün intizarəm. (Q.205, səh.153)*

Göründüyü kimi cəmalın “gülşəni, xəmindən-vüsalından, cəmalın vərdi, fəraqun, üzün, cəmalun” ifadələri məmduha (12-ci İmama) aiddirsə “mürğüzar”, həsrət, ümidvarəm, biqərarəm, şərmüsarəm, Xətai ömrü, intizarəm ifadələri də lirik “mən”in “intizarül-fərəc” soraqlı duyğu və düşüncələrini bildirir.

*Firqətün çəkdüm, nigara, şimdi yar olmazmısan?*
*İxtiyarum getdi əldən, ixtiyar olmazmısan?*

*İntizarun həddən aşdı, hicr ilə oldum həlak,*
*Qəmlü könlüm halünə bir qəmgüsar olmazmısan?*

*Düşmədüm sevda əlindən bülbüli-can oldu lal,*
*Vəqtidür, gül çehrə açıb, novbahar olmazmısan?*

*Munca mehnət çəkdün ey dil zülməti-hicran şəbi,*
*Ol məhin vəslinə yetdün, bəxtiyar olmazmısan?*

*Gər günahın çoxdur, ey miskin Xətai, qəm yemə,*
*Rəhmətinə Xaliqin ümmidivar olmazmısan?*
*(Q.252, səh.177)*

Göründüyü kimi “firqətin çəkdin, nigara, ixtiyar olmazmısan, bir qəmgüzar, növbahar, ol məhin vəsli, rəhmətinə Xaliqin”, ifadələri 12-ci İmama aid olduğu halda “ixtiyarın, intizarın həddən aşdı, qəmli könlüm, bülbülü can oldu lal, bəxtiyar olmazmısan, miskin Xətai” ifadələri isə ürəyi qurtuluş həsrətilə döyünən aşiqin hiss həyəcanını xəbər verir. Aşağıda təhlil edəcəyimiz iki şeir Xətai irsinin intizarı fərəc payı haqqında ümumi təsəvvür oyada bilər:

***“Təala şənuhu Əkbər” ki, bir nuri-Xuda gördüm,***
***Qaşını qibləgah etdüm, yüzün “Şəmsüz-Züha” gördüm.***

***Mənüm pərvin kimi çeşmim gecələr uyxusuz qaldı,***
***Səadət asimanində, çü bir bədrüd-düca gördüm.***

***Mənim dərdüm əlacı şol təbibi-ləmyəzəldür kim,***
***İçəndən şərbəti-ləlün vücudumni şəfa gördüm.***

***Şəbi-hicranda, ey yaran, hidayət şəminə yandum,***
***Yüzünün afitabində yüz ənvari-səfa gördüm.***

***Görənnən bərli didarün Xətai xəstədir heyran***
***Ki, onun asitanində, səlatinlər gəda gördüm.***

***“Təala şənuhu Əkbər” ki, bir nuri-Xuda gördüm,***
***Qaşını qibləgah etdüm yüzün “Şəmsüz-Züha” gördüm.***
*(Q. 225, səh.162)*

(Ulu yaradanın uca şanına saysız-hesabsız alqışlar olsun ki, mən bir İlahi nur görmüşəm. Mən həmin nurun qaşını özümçün qibləgaha çevirdim. Onun mübarək camalı mənim gözümə “parlaq bir günəş” kimi göründü).

Şair 12-ci İmamın eşqində yazdığı bu qəzəli Ulu Yaradana alqışla başlayır. Bu isə İslam dinində həmd-səna deməkdir. “Təala-şənuhu-Əkbər” – tərkibinin hər üç tərəfi Qurani-Kərimdə öz əksini tapmışdər. Məsələn: “Təala-uca yüksək deməkdir. Sözün bu anlamı Mübarək “Ali-İmran” surəsinin 61-ci ayəsində vardır:

“(İsa haqqında) sənə çatan məlumatdan sonra səninlə mübahisə edənlərə de: “Gəlin biz də oğlanlarımızı, siz də oğlanlarınızı, biz də qadınlarımızı, siz də qadınlarınızı, biz də özümüzü, siz də özünüzü çağıraq! Sonra nifrin edib yalançılara Allahın lənət etməsini diləyək!”

Mübahilə (qarşılıqlı nifrin) Əhli-beytin (ə.m) haqq olduğuna sübutdur: “Mübahilə” sözünün mənası qarşılıqlı nifrin etmə deməkdir. İmam Sadiq (ə) bu ayənin izahıyla bağlı buyurduğu bir hədisdə belə qeyd edir: “Nəcran yəhudilərindən bir qrupu Peyğəmbərin (s) yanına gəlib ona dedi: “Nəyə çağırış edirsən?” Peyğəmbər (s) buyurdu: “Sizi Allahdan başqa Allah olmadığına, mənim Allahın Peyğəmbəri olduğuma, İsanın yaranmış və qidalanan bəndə olduğuna şahidlik etməyə çağırıram”.[1]

Uzun mübahisədən sonra bir qrup xristian haqqı – İsanın (ə) Allahın bəndəsi olduğunu qəbul etmək istəmədi. Həmin vaxt bu

[1] “Əl-Mizan”, c.3, səh. 264; Ayətullah-üzma Nasir Məkarim Şirazi. “Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı”. (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, “Nurlar”, 2017

ayə nazil oldu. Peyğəmbər (s) onlara dedi: "Gəlin bir-birimizi nifrin edək. Əgər mən haqlı olsam, Allahın lənəti sizə olsun, yox əgər siz haqlı olsanız, Allahın lənəti mənə olsun." Onlar qəbul etdilər və sabahısı gün bir yerdə görüşüb bir-birini nifrin etmək qərarına gəldilər. Başçılarının yanına qayıtdıqdan sonra bu hadisəni ona danışdılar. Başçı dedi: "Əgər tayfasını gətirsə, peyğəmbər deyil, yox əgər təkcə ailəsini gətirsə, hökmən peyğəmbərdir." Ertəsi gün peyğəmbər (s), Əli (ə), Fatimə (s.ə) Həsən (ə), Hüseynlə (ə) birlikdə mübahiləyə hazır oldu.Bunu görən xristianlar Peyğəmbərdən (s) mübahilədən əl çəkməsinə, öz dinlərində qalmasına və peyğəmbərə (s) cizyə ödəməyə icazə verməsini istədilər. Peyğəmbər (s) razılaşdı və onlar geri döndülər."

Rəvayət olunur ki, xristianların yepiskopu onlara deyirmiş: "Mən elə simalar görürəm ki, əgər Allahdan dağları yerindən qoparmasını istəsələr, Allah edər. Onlarla əsla mübahilə etməyin, yoxsa həlak olarsınız və Qiyamətə qədər yer üzündə bir nəfər xristian qalmaz". Mübahilə hadisəsi peyğəmbərin (s) xüsusi bir bilgiyə malik olduğunu göstərməklə yanaşı, onun dua və istəyinin də təsirli olduğunu göstərir.[1]

Burada çox mühüm nüanslardan biri də "ənfüsəna" (biz özümüz) ifadəsidir. Bu sözün aid olduğu insan kamillik baxımından və üstün keyfiyyətlərinə görə elə yüksək həddə olmalıdır ki, "Peyğəmbərin (s) canı, özü" sayıla bilsin. Qeyd etdiyimiz kimi, bu sözün aid olduğu şəxs Əlidir (ə).[2]

Peyğəmbərə (s) həsr etdiyi "nət"də Xətai də bu sözü işlətmişdir:

---

[1] "Nümunə". c.2, səh. 679; "Təfsiri-Mövzui", c.9, səh. 178; "Mənşuri-cavid", c.7, səh. 106; Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 57

[2] Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 57

*Təalallah, gəl ey gör kim, yenə nuri-Xuda gəldi,*
*Cəmii-Ənbiya xətmi Məhəmməd Mustəfa gəldi.*
*(Q.344, səh.181)*

Tərkibin ikinci sözü "şən"dir. Sözün lüğəvi anlamı şan-şövkət, şərəf və izzətdir. Söz bu mənada Qurani-Kərimdə öz əksini tapmışdır: "Kim qüdrət (sahibi olmaq) istəsə, (bilsin ki,) qüdrət bütünlüklə ancaq Allaha məxsusdur. Pak sözlər ancaq ona tərəf yüksəlir və saleh əməli ucaldır. Pis və məkrli planlar hazırlayanları şiddətli bir əzab gözləyir. Onların məkrləri puça çıxacaqdır". ("Fatir", 10).

Ayənin Ərəbcə orijinalındakı "əl-kəlimut" ifadəsinin mənası "pak sözlər"dir deyilərkən sözün ifadə etdiyi məzmunun paklığı nəzərdə tutulur. Məzmun paklığı isə pak və parlaq reallığı ehtiva edən obyektiv reallıqlara əsaslanır. Allahın pak zatından, Onun haqq dini və ədalətindən, bu dinin yayılmasında rol oynamış təmiz insanlardan daha üstün paklıq ola bilərmi?! Buna görədə pak söz yaradılış və məada düzgün inanc və Allahın pak dini kimi izah edilir. Allaha doğru yalnız belə bir inanc yüksələ, sahibinidə özü ilə qaldıra və Allahada yaxın edə bilər. Bəzi təfsirçilər "pak" sözünü "la ilahə illəllah", Əhli-beytin (ə.m) rəhbərliyi və sair kimi yozmuş, bu ifadənin izahı ilə bağlı müxtəlif versiyalar irəli sürmüşlər. Ümumiyyətlə, bu ayə pak və yüksək məzmuna malik olan istənilən sözə şamil olur.[1]

Tərkibin üçüncü sözü isə daha böyük, çox böyük mənalarına gələn "Əkbər" sözüdür. İbadət əhlinin hər gün dəfələrlə işlətdiyi bu söz də Qurani-Kərimdə mövcuddur: "Əgər onlardan soruşsan (ki, "bu səhv addımı nə üçün atdınız?") "Biz ancaq zarafatlaşıb əylənirdik", – deyə cavab verərlər. De: "Allahı, Onun ayələrini və peyğəmbərini məsxərəyə qoyursunuz?!" ("Tövbə", 65).

[1] "Nümunə", c.18, səh. 194; Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 435

Münafiqlərin günahlarından pis olan üzürləri: Münafiqlərin əli boşa çıxdıqdan və planları heç bir nəticə vermədikdən sonra peyğəmbər (s) onlardan qurduqları pusqu və gözlənilməz hücümları haqqında soruşduqda deyirlər: Bizim pis bir niyyətimiz yox idi. Vəziyyət siz şübhələndiyiniz kimi deyil. Biz oyun oynayıb əylənirdik, niyyətimiz ciddi deyildi. Allah peyğəmbərinə (s) onlara belə deməsini göstəriş verir: "Günahlarınızdan daha pis bir üzr gətirirsiniz?" Hazırladığınız mənfur plan günah idi. Peyğəmbəri məsxərəyə qoymaq üçün uydurduğunuz bu üzr isə başqa bir günahdır, Allaha, Onun peyğəmbərinə və ayələrinə qarşı küfrdür".[1]

Və bu sözlər birləşdikdə "Əlhəmdulillah" – "Allaha həmd olsun" kimidə dərk oluna bilir. Qurani-Kərimin beş surəsi həmdlə başlanır. ("Fatihə", "Ənam", "Kəhf", "Səba" və "Fatir") surələri həmdlə başlanır.

1. "Həmd aləmlərin Rəbbi Allaha məxsusdur!" ("Həmd", 1).
2. "Həmd bu kitabı Öz quluna nazil edən və onda heç bir nöqsana yol verməyən Allaha məxsusdur". ("Kəhf", 1).
3. "Həmd göylərdəkilərin və yerdəkilərinin hamısının sahibi olan Allaha məxsusdur! Axirətdə də həmd ona məxsusdur. O, hikmət sahibidir, xəbərdardır". ("Səba", 1).
4. "Həmd göyləri və yeri yaradan, mələkləri iki, üç və dörd qanadlı elçilər edən Allah üçündür. O, yaratdıqlarından istədiyini artırır. O, hər şeyə qadirdir". ("Fatir", 1).
5. "Həmd göyləri və yeri xəlq edən, Zülmətləri və nuru yaradan Allaha məxsusdur! Lakin kafirlər öz Rəblərinə bənzər və şərik qoşurlar. (Halbuki dünya Onun təkliyini sübut edən dəlillərlə doludur") ("Ənam", 1).[2]

---

[1] "Əl-Mizan", c.9, səh. 343; Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 197

[2] Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017

Zəmanə İmamının şənində deyilmiş bir şeir də İlahi nur məfhumunun olması tamamilə təbii haldır. İslamda heç bir şeyi Allah-təalaya bənzətməyi icazə verilmir. Ulu Yaradanın bənzədildiyi yeganə anlayış "Nur" məfhumudur: "Allah göylərin və yerin nurudur. Allahın nuru, içində çıraq olan bir çıraqdana bənzəyir; bu çıraq ulduz kimi bərq vuran parlaq və şəffaf bir şüşənin içindədir. Bu çıraq nə şərqə, nə də qərbə aid olan mübarək zeytun ağacının yağı ilə yandırılır. (Bu yağ o qədər şəffafdır ki,) od toxunmadan belə, sanki işıq saçır. Nur üstünə nurdur. Allah dilədiyini Öz nuruna yönəldir. Allah insanlar üçün misallar çəkir. Allah hər şeyi biləndir". ("Nur", 35).

Bu ayənin adına "Nur" ayəsi deyilir. Allahın pak və ulu zatının bu dünyanın hiss olunan varlıqlarından hansınasa bənzətmək istəsək, bunun üçün nurdan başqa bir varlıq tapa bilərikmi? Allah dünyaya işıq bəxş edir. Əgər öz lütfünü bir anlığa kainatdan əsirgəsə, varlıq aləmi fəna və yoxluq zülmətinə qərq olar. Hər bir varlıq ondan mövqeyinə və münasbət dərəcəsinə uyğun işıq alır. Quran nurdur, çünkü Allahın kəlamıdır. Peyğəmbərlər (ə) nurdurlar, çünki, Allahın elçiləridirlər. Əgər nur sözünü "zatı aşkar olub başqalarını aşkara çıxaran" mənasında götürsək, o zaman nur sözü Allah haqqında işlədilmiş bənzərlik səciyyəsini itirəcək. Çünki kainatda Allahın zatından aşkar heçnə yoxdur. Allahdan başqa nə varsa, Onun nuru ilə aşkardır.[1] Quran gözəl bir misalla ilahi nuru izah edir. Belə ki, möminin qəlbindəki iman nuru işıqlı çırağın malik olduğu dörd funksiyaya malikdir.

1. Çıraq möminin qəlbində aşkar olan və ətrafa hidayət nuru yayan iman şölələridir.
2. Şüşə imanı möminin varlığında nizama salan qəlbdir.
3. Çıraqdan möminin sinəsi və ya onu hadisələr girdabında qoruyan şəxsiyyəti və ayıqlığıdır.

---

[1] "Nümunə", c.14, səh. 474; Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 354

4. Mübarək zeytun ağacı möminin imanını şöləələndirən və son dərəcə pak olan ilahi vəhydir. Allah göyləri və yeri işıqlandıran nurdur; möminlərin qəlbindən baş qaldırıb onların bütün varlıqlarını işıqlandırır. Onlar özlərinin öz ağılları ilə əldə etdikləri dəlilləri vəhy nuru ilə çulğalaşdırıb "nur üstünə nur"un nümayəndəsinə çevrilirlər. Beləliklə, ilahi nuru qəbul edəcək qabiliyyətə malik qəlb sahibləri hidayət tapır və Allahın "Allah dilədiyini Öz nuruna yönəldir" cümləsində nəzərdə tutduğu şəxslər olurlar.

Bu vəhy nuru kin-küdurətlərin yaranmasına səbəb olan şərq və qərb meyillərinin fəsadlarından uzaq tutulmalıdırlar. Vəhy nuru istənilən sapmadan elə uzaq tutulmalıdır ki, heç nəyə ehtiyac duymadan insan varlığının bütün qüvvələrini səfərbər edərək "od toxunmadan belə, sanki işıq saçır" cümləsinin ehtiva etdiyi subyektə çevrilsin.[1]

Bundan başqa "Tövrat, Zəbur, İncil, Qurani-Kərim, Namaz, Oruc və s. bütün mübarək anlayışlar "nur" olaraq səciyyələndirilir: "Allah iman gətirənlərin vəli və rəhbəridir, onları zülmətlərdən nura çıxarır. Kafirlərin vəliləri isə tağutlardır, onları nurdan zülmətlərə sövq edirlər. Onlar od əhlidirlər və daim orada olacaqlar". ("Bəqərə", 257).

Möminlər nura daxil olur, kafirlər nurdan çıxırlar: Bu ayədə "nur" və "zülmət" deyilərkən hidayət və sapma nəzərdə tutulur. Burada belə bir sual yarana bilər ki, məgər kafirlər nurda idilər ki, Allah onları küfrlərinə görə nurdan çıxarıb zülmətə daxil edir? Bəzi təfsirçilər hesab edirlər ki, insan ilk yaranış mərhələsində fitri və ilahi nura malik olur, elə yaradılıb ki, onu və dünyanı yaradanı tanımaq istəyir. Ancaq Allahın peyğəmbər (s) vasitəsi ilə insanlara göndərdiyi din və proqramla tanış deyil. Əgər insan ağlı və peyğəmbərin (s) tərbiyəsi ilə yaxşı tərbiyə olunsa, həmin

[1] "Nümunə", c.14, səh. 474; Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 354

nur insanın canına və ruhuna yayılar, uşaqlıq bilgisizliyi Allah və onun nişanələrini tanıma ilə əvəzlənər. Yox əgər kafir olsa, fitri nurdan küfr və itaətsizlik zülmətlərinə doğru süqut edər. Diqqət çəkən nüanslardan biri də budur ki, nur sözü Quranda hər zaman təkdə işləndiyi halda, zülmət sözü cəmdə (zülmətlər) işlənmişdir. Bu da onu göstərir ki, düz və haqq yol çox deyil, birdir. İki nöqtəni birləşdirən düz xətti buna misal göstərə bilərik. Buna görə də haqq tərəfdarları hər zaman vəhdətdətdə olurlar. Batil yol isə çoxlu və saysız-hesabsızdır. Buna görədə batil tərəfdarları öz batil davranışlarında bir deyillər.[1]

"Allah razılığına uyğun davrananları onunla (Quranla) əmin-amanlıq yollarına yönəldər, onları Öz izni ilə zülmətdən nura çıxarar və düz yola istiqamətləndirər!" "Onların (əvvəlki peyğəmbərlərin) ardınca Məryəm oğlu İsanı özündən qabaq göndərilmiş Tövratı təsdiqləyici olaraq göndərdik. Ona içində haqq yolu və nur olan, özündən əvvəlki Tövratı təsdiq edən, müttəqilər üçün doğru yol və nəsihət olan İncili verdik". ("Nur", 16-46).

"İman gətirib yaxşı işlər görənləri zülmətlərdən nura çıxartmaq üçün Allahın aydın ayələrini sizə oxuyan bir elçi göndərmişdir. Hər kəs Allaha iman gətirib saleh əməllər etsə, onu içində əbədi qalacağı, ağacları altından çaylar axan Cənnət bağlarına daxil edər. Allah ona gözəl ruzi təyin etmişdir"[2] ("Təlaq", 11).

Unutmayaq ki, mübarək kitabımızın mübarək surələrinin birinin adı da "Nur"dur. Zəmanə İmamının haqq-ədalətin bərpası, gəlib yerini alması ilə bağlılığına heç bir şəkk-şübhə yoxdur. Ötəri deyildir ki, Həzrəti-Muhamməd (s) inci sözlərinin birində belə buyurur: "Hər bir qəlbdə nur vardı. Haqqa tabe olmadıqca bu nuru heç vaxt üzə çıxardmaq olmaz. Allah-təala bu nuru Pey-

---

[1] "Əl-mizan", c.2, səh. 350; "Nümunə", c.2, səh. 285; Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017

[2] Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 559

ğəmbərin (s) və möminlərin qəlbinə əmanət olaraq qoymuşdur". Bütün bunları nəzərə aldıqda biz zəmanə İmamını işıqlı, parlaq, nurani camalını gözlərimiz önündə aydın canlandıra bilirik. Deməli, Xətai bir şair kimi qarşısına qoyduğu başlıca yaradıcılıq istəyinə çatmışdır. Zəmanə İmamının (əc.f) mübarək camalını günəşə və Quran surəsinə bənzətmək də elə buradan irəli gəlir: "And olsun günəşə və onun işığının yayılmasına". ("Şəms", 1). Bu surədə nəfsin çirkinlikdən paklanıb təmizlənməsindən bəhs edilir.[1]

"And olsun səhərə!" ("Zuha", 1).

Peyğəmbərə (s) on beş gün vəhy nazil olmadığını eşidən müşriklər deyirlər: "Muhamməddin (s) Rəbbi onu tərk edib, ona qəzəbi tutub. Əgər o, doğrudan da Allah tərəfindən göndərilibsə, vəhy əlaqəsi heç zaman kəsilməməli idi". Bu surə nazil olur və müşriklərə cavab verir. Allah peyğəmbərə (s) onu tərk etmədiyini, razı qalacağı qədər ona rəhmət göstərəcəyini müjdə verir; peyğəmbərin (s) keçmişini xatırlayaraq hər zaman onu necə himayə etdiyini xatırladır.

Buna görə də verilən nemətlərin şükrünu etməsi üçün ona yetimlərə və yoxsullara mehribanlıq göstərməsini, Allahın nemətini xatırlamasını göstəriş verir.[2]

Zəmanə İmamının (əc.f) mübarək qaşlarının qiblə olaraq şeirə gətirilməsi də qətiyyən təsadüfü səciyyə daşımır. Xətainin yanaşmasında bu o deməkdir ki, ey zəmanə İmamı (əc.f) mən hər bir düşüncə, danışıq, dolanışıq və davranışımda sənin bizdən tələb etdiyin pirinsipləri gözləyəcək, yerinə yetirilməsini istədiyi müddəaları bütün varlığımla əməl edəcəyəm çox güman ki, şair bu zaman aşağıdakı bəyanatdan ilham almışdır: "De: "Mənim namazım da, ibadətim də, həyatım və ölümüm də, aləmlərin

---

[1] "Nümunə", c.27, səh. 36

[2] "Nümunə", c.27, səh. 92; Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 595-596

Rəbbi olan Allah üçündür!” (“Ənam”, 162”).

***Mənüm pərvin kimi çeşmim gecələr uyxusuz qaldı,***
***Səadət asimanində, çü bir bədrüd-düca gördüm.***

(Mənim gözüm gecələr ülkər (yeddi qardaş) ulduzu kimi yuxusuz qalıb, əqli-mənəvi cəhətdən oyaq olduğum üçün mən xoşbəxtlik göylərində bir yandan bütöv və parlaq ay, yəni Zəmanə İmamının (əc.f) gözəl üzünü, bir yandan da qaranlıq-yəni onu tanımayanların əmələ gətirdiyi nadanlıq və cəhalət zülmətini gördüm).

Beyt Füzulinin:

*Gözü yaşlıların halın nə bilsin mərdümü-qafil,*
*Kəvakib seyrini şəb ta səhər bidar olandan sor!*

beyti səpkisindədir.

Əlbətdə bu o deməк deyildir ki, Füzulinin qəzəli də Zəmanə İmamının (əc.f) eşqində deyilmişdir. Ancaq Xətai poyeziyasının Füzuli lirikasına böyük təsir göstərdiyinə və Füzulinin şiə məzhəbində olduğunu nəzərə aldıqda bunun belə olmadığınıda iddia etmək çətindir. Beytin astranomik müşahidələr və astraloji təsəvvürləri üzərində qurulduğu özlüyündə bəllidir.

“Pərvin”, gecələr, uyxusuz qaldı, asiman, bədr, düca” – sözləri bunun danılmaz dəlilidir. Şair bu sözlər arasında duyğu və düşüncə get-gəli etməklə əlvan və dolğun bir bədii mənzərə yaratmağı bacarmışdır. Belə ki, beyti oxuyan hər bir oxucu gecənin bir aləmi oyaq qalmış Şah İsmailin ucsuz-bucaqsız göyün ənginliklərinə baxaraq, ulduzlar arasında Zəmanə İmamını (əc.f) axtaran parlaq obrazını gözləri önündə aydın canlandıra bilər.

Bu isə özlüyündə çox uğurlu bədii gedişdir. Çünki, lirik “mən”in gördükləri heç də həmişə istədiklərinə uyğun deyildir. Belə ki, “bədr” hər tərəfdən “düca” ilə əhatə olunmuşdur.

***Mənim dərdüm əlacı şol təbibi-ləmyəzəldür kim,***
***İçəndən şərbəti-ləlün vücudumni şəfa gördüm.***

(Mənim düşdüyüm ruhi mənəvi çətinliklərin aradan qaldırılma yolu o əzəli-əbədi həkim və hikmət sahibidir. Çünki, mən onun ləl dodaqlarından süzülüb gələn sağ mənəviyyat şərbətini içəndən bəri varlığımın başdan-ayağa kimi daim şəfaya qovuşduğunu müşahidə etdim).

“Təbib” sözünə aid edilmiş “ləmyəzəl” epteti ifadəni ilk baxışda “Allah” mənasında götürməyə sövq edir. Lakin qəzəlin məmduhunu 12-ci İmam olduğunu nəzərə aldıqda ifadə istər-istəməz həmin şəxsiyyətlə bağlanır. Belə olan surətdə məhz (adətən) Allaha aid edilən “ləmyəzəl” (əzəli-əbədi varlıq) epitetini İmam olsa belə insana şamil edilməsini necə başa düşək.

Bəllidir ki, İmamlıq institutu Peyğəmbərlik qurumunun təbii davamıdır. Yəni Peyğəmbərdə (s) olan keyfiyyətlərin müəyyən bir qismi İmamlarda da, mövcutddur. Peyğəmbərlər də (ə) və İmamlar da (ə) daima İlahi nəzarət altında fəaliyyət göstərirlər. Üstəlik şiə məzhəbində bəzi işlərin idarəsinin zəmanə İmamının (əc.f) ixtiyarına verildiyini və bu müddianın Səfəvi dövlətinin qurulmasında böyük rol oynadığını nəzərə aldıqda belə düşünmək bir az da asanlaşır. Estetik baxımdan yanaşdıqda beyt struktur və kompazisiya etibarı ilə Füzulinin bu məşhur beytini xatırladır:

*Mən bilməzəm mənə gərəyin, sən həkimsən,*
*Mən eylə, vermə, hər nə gərəkməz, sana, mana.*

*(Q.1. s.3)*

Füzuli həmin beytdə Rəsulullahın (s) dilindən söylənilən “Ey Allahın bəndələri, siz hamınız xəstə kimi, Allah isə həkim yerindədir. Xəstənin dərdinin əlacını isə yalnız həkim bilər” hədisini nəzmə çəkmişdir.

Yuxarıdakı faktoru yada saldıqda Allaha ünvanlanan bu söz-

lərin zəmanə İmamına (əc.f) aid edilməsi irfani baxımdan və bədii estetika yönündə əsassız görünmür. Belə olan surətdə Füzulinin Türkcə və Farsca divanlarındaki “ey həkim” və “ey təbib” rədifli qəzəlləri asosiativ surətdə və intiutiv olaraq 12-ci imamla bağlamaq mümkün olur. Bəs görəsən, o hansı ləl şərbətidir ki, içəndən bəri şairin vücuduna “şəfa” vermişdir. Əgər Qurani-Kərimdə və Qurani-Kərimin şəfa kitabı olmasının üç dəfə vurğulanmasını nəzərə aldıqda və bu barədə çox saylı hədislərin geniş yayılmasını yada saldıqda buna heç bir şəkk-şübhə qalmır.

“Beləcə, kitabı (bu Quranı) sənə nazil etdik. Kitab verdiyimiz şəxslər də ona iman gətirirlər. Bunların (müşriklərin) arasında da ona iman gətirənlər vardır. Bizim ayələrimizi yalnız kafirlər inkar edirlər”. (“Ənkəbut”, 47). “Hər kəs ölümü dadacaqdır. Sonra sizi bizə doğru qaytaracaqlar”.[1] (“Ənkəbut”, 57). “Quranda şəfa və rəhmət olanı möminlərə nazil edirik. Zalımların isə ancaq ziyanını artırır” (“İsra”, 82).

“İçəndən şərbəti-ləlin” – tərkibi 12-ci imamı hikmət sahibi olan Əli (ə), dili və könlü şəfalı böyük bir həkim kimi qavratdığından burada Şah İsmail Xətainin muasiri olmuş və ona dərin rəğbət bəsləmiş aşıq Qurbaninin aşağıdakı sözləri yada düşür:

*Doxsan min kəlmədə doludur camın,*
*İçginən qırxlardan alginən kamın.*
*İstəyəsən bişə, qalmaya xamın,*
*Eşqin kürəsində giryan dedilər.*

Bu şeiri foklorumuzun cəfakeş araşdırıcısı və milli mənəvi dəyərlərimizin yorulmaz təbliğatçısı filologiya elmləri doktoru professor Məhərrəm Qasımlı “Qurbani” dastanının 1954-cü ildə mərhum ustad Aşıq Oruc Göyçəlidən yazıya alınmış variantın-

---

[1] Ayətullah-üzma Nasir Məkarim Şirazi. “Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı”. (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, “Nurlar”, 2017. səh. 290, 402, 403

dan götürüldüyünü qeyd edir. Professor bildirir ki, "bütün başqa variantlara nisbətən daha dolğun və əhatəli olan bu variant hələlik çap olunmayıb. Əlyazması oğlu İsmayıl Məmmədovun şəxsi arxivində saxlanılır. Mətni istifadə üçün bizə təqdim etdiyi üçün İsmayıl müəllimə təşəkkürümüzü bildiririk..."[1]

***Şəbi-hicranda, ey yaran, hidayət şəminə yandum,***
***Yüzünün afitabində yüz ənvari-səfa gördüm.***

(Ay dostlar, ayrılıq gecəsində hidayət şamının oduna yandım. Onun günəş üzündə yüzlərlə səfa nuru gördüm).

"Şəb" sözü təsəvvüfdə qeyb aləminə işarə sayıldığından burada onu zəmanə İmamının (əc.f) qeybəti-kubrası (böyük (qeybət) mənasında götürmək daha artıq yerinə düşər. Belə olan surətdə "hidayət şəmi" o həzrətin nəzəri və əməli irsi, hədisləri və fəaliyəti kimi başa düşülür. Deməli lirik "mən"in məmduhun günəş yüzündə gördüyü üz "ənvari-səfa"dır.

Xətainin bu beyti Hafizin:

*Əla ya əyyuhəs saqi, gətir camiylə mey əldə,*
*İşim müşküldədir, rəhm et ki, eşq aldatdı əvvəldə.*[2]

və Füzulinin

*Məni candan usandırdı, cəfadan yar usanmazmı,*
*Fələklər yandı ahimdən, muradım şəmi yanmazmı?*

- beytlərinə bənzəyir.

---

[1] Məhərrəm Qasımlı. "Ozan-aşıq sənəti". Bakı, "Uğur", 2007. səh. 144
[2] Hafiz Şirazi. "Seçilmiş əsərləri". Bakı, Azərbaycan Dövlət Nəşriyyatı, 1967. səh. 10

*Şəbi-hicran yanar canım, tökər qan çeşmi-giryanım,*
*Oyadar xəlqi əfğanım, qara bəxtim oyanmazmı?*

*Gülü-rüxsarına qarşu gözümdən qanlı axar su,*
*Həbibim, fəsli güldür bu, axar sular bulanmazmı?*[1]

***Görənnən bərü didarın Xətai xəstədir heyran***
***Ki, onun asitanində, səlatinlər gəda gördüm.***

**(**Ey Zəmanə İmamı sənin görüşünə qovuşandan bəri Xətai nə edəcəyini bilməyən bir xəstəyə çevrilmişdir. Çünki, mən onun qapısının ağzında sultanların gəda vəziyətinə düşdüyünü gördüm).

Beyt Füzulunin:

*Vadiyi-vəhdət həqiqətdə məqamı-eşqidir*
*Kim, müşəxxəs olmaz ol vadidə soltandan gəda.*

beyti səpgisindədir. Digər tərəfdən düşünmək olar ki, Seyyid Əzim Şirvani də:

*Bizi rüsva görüb zahirdə, bizdən etmə nifrət kim,*
*Gədayi-kuyi-eşqik biz ki, soltanlar gədamızdır.*

deyərkən Xətai və Füzulidən ilham almışdır.

Şeirin məzmunundan belə anlaşılır ki, ömründə bir dəfə də olsa 12-ci İmamla görüşmək Xətaiyə qismət olmuşdur. Bu motiv Xətainin başqa şeirlərində də var:

---

[1] Məhəmməd Füzuli. "Türkcə divanı". (tərtib edən: Əmin Səduqi). Tehran, 1996

*Qeybdən dəlil göründün,*
*Dədəm, xoş gəldin, xoş gəldin!*
*Bizi sevib-sevindirdin,*
*Dədəm goş gəldin, xoş gəldin!*

*İki can idik, birləşdik,*
*Məhəbbət qapısın açdıq.*
*Şükür, didarə irişdik,*
*Dədəm xoş gəldin, xoş gəldin!*

*Üstümüzə yol uğratdın,*
*Göhər aldın, göhər satdın.*
*Ərliyini isbat etdin,*
*Dədəm xoş gəldin, xoş gəldin!*

*Bir ağacda güllər bitər,*
*Dalında bülbüllər ötər*
*Şahıma bərgüzar gedər,*
*Dədəm xoş gəldin, xoş gəldin!*

*Böylə, Şah Xətaim, böylə,*
*Pirim dəstur versin, söylə.*
*Şaha məndən niyaz eylə,*
*Dədəm xoş gəldin, xoş gəldin!*

*(Gəraylı.32, səh.355)*

Şiə qaynaqları belə mənqəbələrlə doludur. Misal olaraq bir neçə kəramətləri qeyd edək. Seyyid Cavad Amuli belə nəql edir: "Bir axşam Seyyid Bəhrul-Ulumu Kufə məscidində Həzrəti-İmam Zaman (əc.f) ilə danışdığını gördüm. O, İmam Zamandan (əc.f) bir məsələ haqda soruşduqda, Həzrət (əc.f) buyurdu: "Sizin vəzifəniz zahiri dəlillərlə kifayətlənməkdir və batini həqiqətlər sizə aid deyil".[1]

[1] Mirzə Məhəmməd Tonekaboni. "Qisəsul-Uləma". səh. 173

***

Molla Haşim Qəzvini Haşımxan qəsəbəsindən olub, Məşhəddə yaşayırdı və orada elmi hövzənin birinci dərəcəli ustadlarından sayılırdı. Rza xan Pəhləvinin islam əleyhinə çıxardığı qanunlara etiraz etdiyi üçün, şah onu Məşhəddən Qəzvinə sürgün etdirmişdir. Qəzvinə gələndən sonra Haşimxan qəsəbəsini əhalisi öz həmvətənlərini camaata yol göstərib, moizə etmək üçün öz doğma yurduna dəvət edir. Qəzvinin tanınmış şəxsiyyətlərindən biri... Seyyid Haşim adlı şəxsin dilindən nəql edirdi ki, deyir: “Atam vəfat edəndən sonra, ailənin məsuliyyəti mənim üzərimə düşdü. Mən həm cavan həm də olduqca kasıb idim. Bir gün “Təzrək” əhlindən və atamım muridlərindən olan bir nəfər mənə bir odun şələsi verdi ki, qəsəbəyə aparım. Yolda gördüm alicənab bir seyyid mənə tərəf gəlir. Yaxınlaşanda gördüm ki, başında qara əmmamə, belində yaşıl şal var. Mübarək üzünə baxdım, camalı günəş kimi nur saçırdı, ixtiyarsız camalı qarşısında əriyib məhv oldum. Mənə dedi: Seyyid Haşim, dərs oxu, niyə dərs oxumursan? Seyyidə savadsızlıq yaraşmaz. Dedim: “Ağa mənim məktəbə verməyə pulum yoxdur”. Buyurdu: “Mən Molla Haşimə tapşıraram sənin məktəb pulunu verər, bir də qəsəbə əhlinə de ki, niyə bu ağaya əziyyət verirlər?” (Qəsəbədə Mənsurus-Səltənə adlı bir nəfər ağaya çox əziyyət verirdi). Bunu deyib bir anın içində gözümdən qeyb oldu. Başa düşdüm ki, İmam Zaman (əc.f) imiş. Mən gözü yaşlı evə gəldim. Evdə oturub ağlayırdım və təəssüf edirdim ki, niyə İmam Zamanı (əc.f) tanımadım. Anam dedi: niyə ağlayırsan? Mən başıma gələnləri anama danışırdım ki, bu vaxt Molla Haşıimin külfəti Səkinə xanım gəldi və dedi: Ağa sizi çağırır. Qalxıb molla Haşimin evinə getdim. Ağa dedi: Seyyid Haşim, nə var, nə yox? Bu gün yolda kimi gördün və o sənə nə dedi? Mən yolda gördüklərimi ona danışdım. Dedi: Bəli, o İmam Zaman (əc.f) idi, mənim evimə gəldi və səni mənə tapşırdı. Amma neçə ki, mən sağam bu əhvalatı heç kimə danış-

ma, mən də kimsəyə bir söz deməmişəm.[1]

***

Şeyx Müctəba Qəzvini deyir: Rza şah zamanı üləmalara gün-güzaran vermirdilər – axund libasları, əmmamə qoymaq qadağan edilmiş, rovzəxanlara rovzə oxumağa, dərs deməyə icazə vermirdilər. Biz – Mirzə Mehdi İsfəhaninin bir qrup şagirdləri gizlincə, küçələrin arası ilə dərsə gedirdik. Mirzə Mehdi İsfəhani arada bizə bir az pul da verirdi. Bir gün yenə hərəmizə bir az pul verib dedi: bu mənim axırıncı köməkliyimdir, sizin İmam Zamanınız var, gedin ondan kömək istəyin, o sizin nemətinizin vəlisi və ağanızdır. Şeyx Müctəba Qəzvini deyir: mənim maddi vəziyyətim olduqca ağırlaşdı, çörəkçidən, baqqaldan, əttardan götürdüyüm nisyə mallar yığışıb 30 tümən oldu. Ağır borcun altında artıq dükandan nisyə alış-veriş etməyə üzüm gəlmirdi.

Bir gün əli boş evə qayıdıb bir kənarda əyləşdim. Anam vəziyyətimi başa düşüb dedi: Müctəba niyə narahatsan? Dedim: narahat deyiləm. Dedi: mən görürəm ki, narahatsan, məgər bizim İmam Zamanımız yoxdur? Məgər bizim sahibimiz bizi yaddan çıxara bilər? Anam o qədər belə sözlər dedi ki, axır mənim halım xarab oldu. Bütün vücudumla anam deyən sözləri fikirləşirdim ki, "biz yiyəsiz deyilik, İmam Zaman bizi görür, bizim hacətimiz onun əlindədir", elə bu vaxt qapının döyüldüyünü eşitdim. Gedib qapını açdım, gördüm qoca bir kişidir. Soruşdu Müctəba sənsən? Dedim bəli mənəm. Mənə içində pul olan balaca bir kisə verdi və dedi: bu sənə çatacaq. Bunu deyib çıxıb getdi.

Evə gəlib kisənin ağzını açdım, gördüm mənim borcumun miqdarından da bir az artıq pul var kisənin içində. Tez bazara gedib borclarımı qaytardım, bir az da bazarlıq edib evə gəldim və anamla birlikdə oturub çörək yedik.

[1] Seyyid Nemətullah Huseyni. "Mərdane elm dər meydane əməl", c.5, səh. 398

O gündən sonra nə almaq istəsəm, həmin kisədən bir az pul götürüb ehtiyacım qədər xərcləyirdim, amma kisənin pulu öz yerində dururdu, qurtarmaq bilmirdi.

Bir müddət güzəranım bu cür keçdi. Bir gün necə oldusa dura bilmədim, əhvalatı dostlarımdan bəzisinə danışdım. Bundan sonra pullar tamam oldu, o cür böyük nemət əlimdən çıxdı!![1,2]

Şair özünün "Görmədim" rədifli başqa bir qəzəlini belə bitirir:

*Vücudum şəhrinə girdim, irişdim gövhəri-kanə,*
*Cəmalın asitanında Xətaini gəda gördüm.*

*(Q.224, səh.162)*

Beləliklə, aydın olur ki, Şah İsmail Xətai irsinin zəmanə İmamına ünvanlanmış payı mövzuca geniş, məzmunca dərin; üslubca iti və kəsərli, mənaca dolğun, tutumlu və çevik bədii ifadə vasitələri ilə zəngin forma baxımından da əlvan və rəngarəngdir.

*Ney kimi hərdəm ki, bəzmi-vəslini yad eylərəm,*
*Ta nəfəs vardır quru cismimdə, fəryad eylərəm.*

*Ruzi-hicrandır, sevin, ey mürği-ruhum kim, bu gün,*
*Bu qəfəsdən mən səni, əlbətdə, azad eylərəm.*

*Vəhm edib, ta salmaya ol mahə mehrin hiç kim,*
*Kimə yetsəm zülmü-cövründən ona dad eylərəm.*

*Qan yaşım qılmaz vəfa giryan gözüm israfinə,*
*Bunca kim, hər dəm ciyər qanımdan imdad eylərəm.*[3]

---

[1] Əbdul-Cavad Qərəviyan. "Cilvehaye rəbbani", səh. 25
[2] Əbddur Rəhman Baqirzadə Babuli. "Alimlərin kəramətləri haqqında maraqlı əhvalatlar" (tərcümə edən Məlahət Şəfiyeva). Bakı, 2006
[3] Məhəmməd Füzuli. "Seçilmiş əsərləri". Bakı, "Yazıçı", 1984. səh. 75

Və ya,

*Eşqidən canımda bir pünhan mərəz var, ey həkim!*
*Xəlqə pünhan dərdim izhar etmə zinhar, ey həkim!*

*Gər basıb əl nəbzimə, təşğis qılsan dərdimi,*
*Al əmanət, qılma hər bidərdə izhar, ey həkim!*

*Gör təni-üryan ilə əhvalımı hicran günü,*
*Var imiş ruzi-qiyamət, qılma inkar, ey həkim!*[1]

[1] Məhəmməd Füzuli. "Seçilmiş əsərləri". Bakı, "Yazıçı", 1984. səh. 71

## 3.9. XƏTAİNİN HECA ŞEİRLƏRİNDƏ ƏHLİ-BEYT (Ə) MƏFHUMU

Ş.İ.Xətai lirikasını özündən öncəki və muasir şairlərdən fərqləndirən başlıca cəhət yaradıcılığında heca vəznli şeirlərin geniş yer tutmasıdır. Belə ki, şair bu səpkili şeirlərini iki məcmuədə toplamışdır. Həmin məcmuədə toplanan şeirlərdə də Əhli-beyt (ə.m) məhəbbəti aparıcı xətlərdən birini təşkil edir. Xətainin əruz vəznli lirik nümunələrində olduğu kimi, folklor danışıq üslublu əsərlərində də Əhli-beytlə (ə.m) bağlı bir çox köklü məsələlər geniş şəkildə bəhs mövzusuna çevrilir. Lakin mifalogiya, şifahi tarix, folklor və etnoqrafiyadan, eləcə də öz soy kökündən gələn bir sıra cəhətlər vardır ki, onlar şairin klassik kitab üslubunda qələmə aldığı əsərlərində yoxdur. Ona görə də biz Xətainin heca vəzinli lirikasındakı Əhli-beyt (ə.m) payına nəzər salmağa, dərindən ehtiyac duyuruq:

***Enib yerdən göyə bina quranlar,***
***Əli ilə Muhammədin eşqinə,***
***Mələklər misalı səcdə duranlar,***
***Əli ilə Muhammədin eşqinə.***

***Şeytanı sürdilər duş eylədilər,***
***Yəzidin bağrını daş eylədilər,***
***Qırxlar vilayəti faş eylədilər,***
***Əli ilə Muhammədin eşqinə.***

***Muhamməd Əlidür quran bu yolu,***
***Möminə seçildi təriqət gülü,***
***Bir ulu dərgahdır sözün bu dəmi,***
***Əli ilə Mühəmmədin eşqinə.***

***Mühəmməd Əlinin əminə vardı,***
***Qırxlar sirkələnüb ayağa durdu,***
***Doxsan min ərənlər simaya girdi,***
***Əli ilə Mühəmmədin eşqinə.***

***Şah Xətaim, xətm eylədim kəlamı,***
***Əvvəl Cəbrəilə verdi səlamı,***
***Məhrum olmaz sevən şahı, imamı,***
***Əli ilə Mühəmmədin eşqinə. (Q.3, səh.329)***

Şeirdə Əhli-beytlə (ə.m) bağlı əksini tapan birinci dərəcəli məsələ Məhəmməd (s) Əli (ə) vəhdəti və Peyğəmbər (s) İmam ardıcıllığıdır. Kəlam elmində dini-fəlsəfi problem olan bu ayrılmaz vəhdət və ardıcıllıq İmaməti nübuvvətin tərkib hissəsi kimi qavratdığından və "Mənlə Əli bu ümmətin atalarıyıq" hədisinə əsasən Həzrəti-Əlini (ə) İslam rəhbərlərindən biri olaraq təqdim etdiyindən çox önəmlidir. Belə ki, İlahi qüvvələr, mələklər, haqqa qarşı çıxan mücərrəd və konkret dairələr – şeytan və Yezid (şeytanın Yezidləşməsi və əksinə Yezidin şeytanlaşması), məhrəmanə təriqət təmaülü (40-lar), dini-banilik (Məhəmməd Əlidir quran bu yolu), sözün təsir gücü (bir ulu dərgahdır sözün bu dəmi), sırf təriqət sirləri (qoşmanın 4-cü bəndi), bütün bunları özünün başlıca həyat və fəaliyyət məramnaməsi bilmək (Şah Xətaim, xətm eylədim kəlamı), Məhəmməd (s) Əli (ə) məhəbbətinin vahid müstəvidə və eyni qayə ətrafında bir araya gətirilməsi (Məhrum olmaz sevən şahı, imamı). Beş bəndlik bu qoşmanı məfkurəvi-ideoloji bazada dini baxımdan möhkəmləndirir, ideya-bədii istiqamət etibarı ilə məzmunca dərinləşdirir ki, bu da şairin biri o birindən daha əlvan və rəngarəng bədii çalarlarla bərq vurmasına və dil-üslub xüsusiyyətləri ilə zənginləşməsinə yol açır; Məsələn,

*Şeytanı sürdilər duş eylədilər,*
*Yəzidin bağrını daş eylədilər,*
*Qırxlar vilayəti faş eylədilər,*
*Əli ilə Muhammədin eşqinə.*

Göründüyü kimi Xətainin yuxarıda şərhini verdiyimiz qoşması özünün orjinal və novator ideya – bədii keyfiyyətləri və dil-üslub xüsusiyyətlri ilə dərhal seçilərək zövq oxşayır və könül

sevindirir.

Dünya ədəbiyyatında bir metostofel obrazı vardır. Hötenin Faust faciəsində özünün zirvə nöqtəsinə çatan bu obraz yaxın və orta şərq müsəlman mədəniyyətində yalnız Yezidlə eyniləşdirilə bilərdi. Bunu edərkən Xətai, heç şübhəsiz, Qurani-Kərimin "İblis və Şeytan"la bağlı müddəa və qənaətlərinə istinad etmişdir:

*Mən onu bilmişəm qövli Xudadır,*
*Onunçün oxuram lənət Yəzidə,*
*Yəzidə lənət etmək səzadır,*
*Onunçün oxuram lənət Yəzidə.*

*Cəhan fəxri Muhəmməd (s.ə) Mustəfadır,*
*Əliyyəl-Murtəza, Şirri-Xudadır.*
*İmam çün "Həsən" xulqi-rizadır,*
*Onunçün oxuram lənət Yəzidə.*

*Hüseyn – Kərbəladur dürri-gövhər,*
*İmam Zeynül-İbadur sirri-Heydər,*
*Mühəmməd Baqir oldı pak sərvər,*
*Onunçün oxuram lənət Yəzidə.*

*İmami-Cəfərin mən kəmtəriyəm,*
*Kazimi sevməyənlərdən bəriyəm,*
*Əli Musər-Rizanın qənbəriyəm,*
*Onunçün oxuram lənət Yəzidə.*

*Təqi könlümdə imanım olubdur,*
*Nəqi sirrimdə sultanım olubdur.*
*Canımda "Əsgəri" dinüm olubdur,*
*Onunçün oxuram lənət Yəzidə.*

*Mühəmməd Mehdidür aləmdə şahüm,*
*Dünü gün oldürür həm səcdəgahüm,*
*Xətaiyəm, Əlidürür pənahüm,*
*Onunçün oxuram lənət Yəzidə. (Mürəbbe. 6. səh.310)*

Ş.İ.Xətainin bu qoşmasının şərhində diqqəti cəlb edən mühüm məsələlərdən biri də “Qırxlar məclisi”ndə və 90 min kəlamda təsəvvüfün mərhələlrinə münasibətdir. Bu səbəbdən Səfəvilikdə təsəvvüfün mərhələlərinə münasibət barəsində mühüm mənbələrə istinad edərək məlumat verməyi məqsədə uyğun hesab edirik:

Şeyx Səfinin yaratdığı “Səfəviyyə” təriqəti öz mahiyyətinə görə ilkin dövrlərdə Sufiliyin mötədil qanadına aid olub şəriət-təriqət-həqiqət formulunu qəbul edirdi. Şeyx bu barədə söyləyirdi: “…hər kim onun təqvası ola və şəriəti olmaya, o, qabığı olmayan yemişə bənzər və hər kim də təriqət ilə həqiqət var ola və şəriəti olmaya, onun nə təriqəti var, nə həqiqəti”.[1] Göründüyü kimi təriqət Şeyxi bir sıra təriqətlərdə olduğu kimi şəriət prinsiplərindən imtinanı lüzumsuz sayır və şəriətin tələblərinin yerinə yetirilməsini vacib hesab edirdi. O, şəriəti olmayan kimsənin nə təriqətinin, nə də həqiqətinin olmasına inanmırdı. Şah İsmail Xətai “Nəsihətnamə” əsərində şəriət-təriət-mərifət və həqiqətin özünü bilib, bu yolda möhkəm olanların, tərqi-övliyaların yolu olduğunu vurğulayaraq yazırdı:

*Nə kim vardı bu surətdə göründü,*
*Təcəlla şövqini münda gör indi.*
*Ki, munda görməyən can onda görməz,*
*Bu vəchin təfsiri Tövratü, İncil,*
*Edərlər onu fürqan əhli təvil,*
*Şəriət və təriqət yollarıdır,*
*Ki, mərifət, həqiqət hallarıdır.*
*Budur bu dörd kitabın mənisi həm,*
*Özün bilib olsan yolda möhkəm.*

---

[1] Şeyx Səfi Təzkirəsi. “Səfvətüs-səfa”nın XVI əsr türk tərcüməsi. Bakı, Nurlan, 2006. səh. 707

*Yəqin əhli yanında yol birikdi*
*Ki, münkirlər bu dərgahdan sürükdi.*[1]

***

*Tərqi-övliya bir doğru yoldur,*
*Yetər hər yetənə kəndini yoldur…*
*Əgər olmaz isən bu yolda gerçək,*
*Vilayət süfrəsindən sən əlin çək.*[2]

Qeyd edək ki, mötədil sufilik (yaradıcısı, əsasən Cüneydi və onun ardıcılları olub) şəriət-təriqət-həqiqət formulunu irəli sürərək, kamil insanın Allaha qovuşmasının şəriət-təriqət-həqiqət mərhələlərindən keçməklə mümkün olduğunu bildirirdi (bəzi sufilər insanın mənəvi cəhətdən saflaşaraq, kamilləşərək (əl-insan, əl-kamil) Allaha qovuşmasının dörd mərhələdən, şəriət-təriqət-mərifət-həqiqətdən ibarət olduğunu bildirirlər). Onlar, ifrat, nəzarətsiz "vəcdəgəlmə"nin müsəlmançılığa ziyan vuracağını söyləyir və buna qarşı çıxırdılar. Mötədillər təsəvvüflə ilahiyyatı birləşdirməyə çalışaraq, sufilərlə ruhanilər arasında ziddiyyətləri aradan qaldırmağa cəhd edərək şəriət prinsiplərinə əməl edilməsinə çalışırdılar. Onlar Quran və sünnəyə sadiq qalıb səssiz zikr və sakit ibadət etməyi düzgün sayırdılar.[3]

"Səfəviyyə" təriqətində də sufiliyə aid mürşid-mürid münasibətləri, bəqa, fəna, məqam, hal, nəfsin mərtəbələri, vəcd və s. kimi sufi elementlərindən, eləcə də xəlvətə çəkilmə, riyazət, səma, xirqə geyinmə, zikr etmə, tac qoyma və s. kimi mərasim və adətlərdən geniş istifadə olunurdu.

"Səfəviyyə" təriqətində mürşid-mürid münasibətlərinin Şeyxlik mərtəbəsinə yüksəlməyin digər sufi təriqətlərində olduğu ki-

---

[1] Şah İsmayıl Xətai. "Seçilmiş əsərləri". Bakı, "Şərq-Qərb", 2005. səh. 231
[2] Şah İsmayıl Xətai. "Seçilmiş əsərləri". Bakı, "Şərq-Qərb", 2005. səh. 232
[3] Əsgər Əhməd. "Səfəviyyə təriqəti". "Kamal" jurnalı, №3(7), İyun, 2010. səh. 36-37

mi mühüm əhəmiyyəti var idi. Öz mürşidinə sadiq olma, onun tapşırıq və göstərişlərini danışıqsız yerinə yetirmə, münasibətlərdəki ciddi nizamlılıq və s. keyfiyyətlər sonradan təriqətin hərbi-siyasi ordenə çevrilərək böyük uğurlar qazanmasında mühüm rol oynamışdı. Ümumiyyətlə, sufilikdə Şeyxlik mərtəbəsinə yüksəlmə ancaq seyri-sülukun (təriqətə qəbul edilən kişinin, müridin ta əvvəldən sona – vüsalət məqamına yetişməsinə aparan mənəvi yolçuluq) təriqət Şeyxindən öyrənməklə və əziyyətlərlə dolu müridlik mərhələsini keçməklə mümkündür. "Səfəviyyə" təriqətində Şeyx bir yolgöstərici, hər cür problemlərin həlli üçün müraciət edilə bilinəcək bir insan olub və tərbiyəedici funksiyaya malik mənəvi bir şəxs idi. Bu barədə Şah İsmail Xətai şeirlərinin birində yazırdı:

*Mürid oldur ola əhli-ibadət,*
*Hər işdə var ala pirdən icazət.*[1]

***

*Pir oldur ki, pir yurdunda otura,*
*Talibin nöqsan yerini yetirə,*
*Təsəlli veribən yola gətirə,*
*İrişdirə dörd qapının cəminə.*

Mürşid-mürid münasibətlərinə, müridlərin tərbiyə olunması məsələsində riyazət və xəlvətə çəkilmə kimi adətlərin yerinə yetirilməsinin önəminə diqqəti çəkən böyük sufi intellektualı Şeyx Səfiəddin söyləyirdi ki, "Mürid gərək kim mücahidət ilə riyazətdə üç qatla başından ayağınadək dərisi tökülə, ta onun adı mücahidə çəkilmiş xəlvətlü deyə bilələr".[2]

Səfəviyyə təriqəti Şeyx Səfiəddinin varislərinin zamanında

---

[1] Şah İsmayıl Xətai. "Seçilmiş əsərləri". Bakı, "Şərq-Qərb", 2005. səh. 231

[2] Şeyx Səfi Təzkirəsi. "Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi. Bakı, Nurlan, 2006. səh. 707

daha da inkişaf edərək təkmilləşdirildi. Eyni zamanda səfəviliyin ideyalar sistemində də ciddi dəyişikliklər baş verdi. Belə ki, bu yeniliklər və ideyalar bütövlükdə bir məzhəb kimi şiəliyin inkişafına, onun ideya cəhətdən zənginləşməsinə təsir göstərərək onu yeni elementlərlə bir xeyli zənginləşdirdi. Digər tərəfdən o zamanlar Səfəviliyin gətirdiyi yeniliklər və onların praktiki fəaliyyətləri Azərbaycanın ictimai-siyasi həyatında mühüm rol oynamaqla yanaşı, onun gələcək inkişaf yönümünü müəyyən edən amillərdən birinə çevrildi.[1]

Təriqətin ideyalar sistemindəki ciddi dəyişikliklər Şeyx Səfiəddinin nəvəsi 38 il təriqətə rəhbərlik etmiş (1392/3-1429) Xoca Əlinin dövründən etibarən həyata keçirilməyə başlandı, təriqətdə şiəliyə meyl və şiəliyin tərəfini saxlamaq kimi meyllər üstünlük təşkil etdi. İbrahim Şeyxşah (1429-1447) tərəfindən Ərdəbildə dünyəvi hakimiyyətin ələ keçirilməsindən sonra isə təriqətin siyasiləşməsi və hərbi ordenə çevrilməsi prosesi gücləndi. Batini-siyasi şiəlik təriqətin əsas ideologiyasına çevrildi. Bu dövrdən etibarən təriqət dini –siyasi təsisat funksiyasını yerinə yetirməyə başladı və hərbiləşdirilmiş, qarşısına ciddi siyasi məqsəd qoyan bir ordenə çevrildi.

Səfəvilər “Əhli-beyt” (ə.m) (müqəddəs ailə, “Əhli-beyt”ə Muhəmməd peyğəmbər özü, kürəkəni və əmisi oğlu Əli, qızı Fatimə, nəvələri Həsən və Hüseyn, eləcə də onlardan törəyən 9 müqəddəs şəxs daxildir) tərəfdarlarına sevgi (təvəlla), Kərbəla matəm kultu, 12 imam, “qeyb olmuş imam” kimi şiəliyin əsas təlimlərinə istinad edərək xüsusilə də siyasi şiəliyin təlim və ehkamlarını daha da zənginləşdirdilər. Səfəvilərin şiəliyin siyasi doktrinasına gətirdiyi bir sıra yeniliklər və praktiki addımlar təriqətin daha çox qızılbaşlıq dövrü ilə bağlı idi. Şeyx Heydərdən etibarən 12 imamı simgələyən 12 zolaqdan ibarət tac qoyulması və qırmızı rəngli qurşağın bağlanması ilə səfəviləri qızılbaşlar

[1] Əsgər Əhməd. “Səfəviyyə təriqəti”. “Kamal” jurnalı, №3(7), İyun, 2010. səh. 36-37

adlandırmağa başladılar. Səfəvilər bunu onunla əsaslandırırdılar ki, Şeyx Heydər guya “yuxuda Həzrəti-Əlidən göstəriş alır ki, adamların 12 imamı simvolizə edən qırmızı dolaqdan papaq qoysunlar”.[1] Bir cəhəti də qeyd edək ki, səfəvilər qırmızı qurşağı müridlərə dərəcələrinə görə bağlayırdılar. Aşağı dərəcəyə malik müridlər 12 zolaqlı tac qoyur, ancaq qırmızı qurşaq bağlamırdılar. Qızılbaşlar başlarını qırxdırır, bığ uzadır və qırxıq başlarında kəkil saxlayırdılar. Döyüşdən qabaq onlar Azərbaycan dilində dua edir və deyirdilər: “Ey pirim, ey mürşidim, sənə mənim canım qurban!”[2]

Tədqiqatçılardan biri olan Ənvər Behnan Şapolyo bütün şiə təriqətlərini birləşdirən vahid xətt kimi təsəvvüf ədəbiyyatına böyük önəm vermişdir. “Türk Büyükleri” adlı əsərində Ənvər Behnan bu barədə yazır: “Ələvilik üç yola ayrılır, Bektaşilik, Qızılbaşlıq və Şiəlik”. Zənnimizcə bu elmi təsnifat müəyyən kriteriyalarla sırf Qızılbaşlıq istiqamətində təsnif olunsa daha məqsədəmüvafiq hesab oluna bilər. Ona görə ki, bütün şiə təriqətlərinin dinamik dialektikası Şah Xətai “Divan”ında poetik qızılbaş-sufi folklorunda daha çox sonuclanmışdır. Cəlaləddin Ruminin “Məsnəvi”si sufizmin ensiklopediyasıdırsa, onda tam dürüslüyü ilə Xətai “Divan”ı da qızılbaş sufizmin folklorlaşmış təkyə, ayin və mərasimlərinin ana abidəsidir. Ələlxüsus Bəktaşiliyin qaynayıb-qarışdığı, qovuşduğu qızılbaşlıq zəminində bu məsələ bütün aydınlığı ilə görüntüyə gəlir:

*Xətai biçarə güldür şahına,*
*Hünkar Hacı Bəktaş nəzargahına,*
*Dəli könül, haqq ol düş dərgahına,*
*Ər olayım dersən, ər ilə görüş.*[3]

---

[1] Əsgər Əhməd. “Səfəviyyə təriqəti”. “Kamal” jurnalı, №3(7), İyun, 2010. səh. 37

[2] Əsgər Əhməd. “Səfəviyyə təriqəti”. “Kamal” jurnalı, №3(7), İyun, 2010. səh. 37-38

[3] Şah İsmayıl Xətayi. “Sazım” (Qoşmalar, bayatılar, qəzəllər). Bakı, “Gən-

Göründüyü kimi Xətai qızılbaş-sufi təriqətindən qaynaqlanan – boy göstərən bu səpgidən olan şeirlərlə bütün şiə məzhəb təriqətləri bir araya gətirməklə ideoloji islahat proqramını da bir məqsəd, bir vəzifə kimi qarşısına qoymuşdur. Ümumi qayə və məqsədlərinə görə Bəktaşiliklə "qohumluq" keyfiyyətlərinə əsasən sufi-qızılbaş təkyələrinin icra və zikrlərində demək olar ki, onlardan fərqlənmirdilər. Hər iki təriqət əsasən təsəvvüfdə bir-biri ilə eyni qütbdə dayanırdılar. Başına dördguşəli tac qoyan Hacı Bəktaşi dörd rəqəminin mütəsəvvüflüyünü simvolik olaraq dörd qapı – Şəriət qapısı, Təriqət qapısı, Mərifət qapısı və nəhayət, Həqiqət qapısı ("Dörd qapı, qırx məkan, yetmiş iki qat" – Ş.İ.Xətai) mənasında rəmzləşdirmişdir. Qızılbaş dərvişləri kimi bəktaşilər də mərasimlərdə saz musiqisindən, təkyə rəqslərindən və şamanizm mənşəli nəfəslərdən geniş şəkildə istifadə edirdilər. Nəzm parçalarından istifadə məsələsində isə bəktaşilər əsasən Xətainin şeirlərindən bəhrələnirdilər:

*Qırxlar içdi ol şərbətdən məst oldu,*
*Şahi-Mərdan cümləsindən üst oldu.*
*Sətirpuş bağlandı kəmərbəst oldu,*
*Səmaə girdilər üryan, hu deyü.*

*Hu demənin əsli böylədir, böylə,*
*Zahid, nədir sözün, gəl bəri, söylə,*
*Təsdiq, iman gətir, şəhadət eylə,*
*Gəl sən də bu rəngə boyan, hu deyü.*[1]

Bu bəndlər batini mənası ilə bir sıra sufi mərasimlərinin icra mənzərəsini, həmçinin, ümumtəsəvvüf səciyyələrinin folklorativ

clik", 1973. səh. 44

[1] Şah İsmayıl Xətayi. "Sazım" (Qoşmalar, bayatılar, qəzəllər). Bakı, "Gənclik", 1973. səh. 45

məqamlarını bədii və obrazlı şəkildə ehtiva edə bilmişdir. Belə ki, "Qırxlar" sufi-qızılbaş məclislərinin rəmzi say təyinatıdır ki, nağıl və dastanlarımızda "qırx gün, qırx gecə", "qırxıncı qapı", "qırx quldur" ifadələrini xatırladır. Şərbət isə məcazi məna daşısa da səma rəqslərində sufi dərvişlər bu ifadə ilə vəhdəti-vücuda çatmanı mənalandırmışlar. "Şahi-Mərdan cümləsi" deyəndə sufilər "Ya Əli" nidasını nəzərdə tuturlar. Yəni, gəşt icrasına qədər "Ya Əli" nidası dəfələrlə səslənir ki, bundan sonra "Üst" olmaq məqamına çatılır. Burada "üst" üstübanə-yəni sütun şəklini almaq mənasında işlənmişdir. Hazırda sufiyanə ağ libasda, sütun duruşla Türkiyədə mərasim rəqsləri kimi bu gəştlər Türk-folklor rəqslərinin əsasını təşkil edir. Sətirpuş-bağlanmaq – gizlin, mübhəmlik, kəmərbəst isə – itaət və xidmət mənasını daşıyır. Səma isə sufi-dərviş rəqslərindən biridir ki, bu rəqs zamanı sazdan və saz havacatlarından istifadə olunurmuş. Xətai şeirlərində tez-tez rast gəldiyimiz "Hu" sufi təkyələrində, zikrlərdə və gəştlərdə Allahın təsəvvüf rəmzli adlarından biridir. Gəşt ürfan fəlsəfəsinin son ekstaz pilləsidir ki, bundan sonra yalnız vəhdəti-vücudun ilahi əlaqə arealında bir real məqam qapısı başlanır. Səfəvi sufilərinin Əmir Teymurla bağlı əfsanələşmiş bir süjetində Xətainin ulu babası Şeyx Əlinin gəşti məqamı təsvir olunur. Belə ki, darül-irşada gələrkən Əmir Teymur sınaq və bu sınağın nəticəsində Ərdəbil pirinə iman gətirmək məqsədilə Şeyx Əliyə şərbətlə zəhər içirir. Dodaqaltı zikr və gəştin gücü ilə Şeyx Əlinin əynindəki ağ xirqə yamyaşıl rəng alır– zəhər ilahi hökm ilə Şeyxin libasına hopur. Tarixilikdən daha çox xalq ədəbiyyatının materialına çevrilmiş bu əfsanə başlıca olaraq təsəvvüf simvolikalarının məcmu-məndəricəsidir.[1]

Miskin Abdalın aşağıdakı gəraylısı da XVI əsrdə belə mənqəbələrin yayıldığını söyləməyə imkan verir:

---

[1] Şöhrət Bədəlov. "Səfəviyyə və Xətai yaradıcılığı". "Folklor və etnoqrafiya" jurnalı, №2. Bakı, 2005

*Anadan pür kamal olub,*
*Şəriətə tapınmışam.*
*Din yolunda abdal olub,*
*Təriqətə tapınmışam.*

*Miskin günüm gəlməz saya,*
*Qismətimdi ismət, haya,*
*Qulluq edib tək Xudaya,*
*Mərifətə tapınmışam.*

*Miskin Abdal Tanrı qulu,*
*Qəlbindədi haqqın yolu,*
*Ululardan daha ulu,*
*Həqiqətə tapınmışam.*[1]

Qoşmanın möhürbəndində olan başqa bir cəhətə diqqət yetirək:

***Şah Xətaim, xətm eylədim kəlamı,***
***Əvvəl Cəbrailə verdi səlamı,***
***Məhrum olmaz sevən şahı, imamı,***
***Əli ilə Mühəmmədin eşqinə.***

"Məhəbbət" sözünün kökü "habəbə"dir. Bu kökdən gələn 83 söz Qurani-Kərim də işlənmişdir. Belə ki, otuza yaxın ayədə Allah-təalanın nəyi sevib, nəyi sevmədiyi aydın bildirilir:

"Ey iman gətirənlər!, Sizlərdən hər kim dinindən dönsə, Allah onun əvəzinə Özünün sevdiyi və Onu sevən, möminlərə qarşı mülayim, kafirlərə qarşı isə sərt olan Allah yolunda cihad edən və tənə edənin tənəsindən qorxmayan bir camaat gətirər. Bu, Allahın lütfüdür. Allah hər şeyi əhatə edəndir, biləndir" ("Maidə", 54).

[1] Miskin Abdal. Bakı, "Səda", 2001. səh. 231

Məsələn, göstərilir ki, “Allah israf edənləri sevmir” (“Əraf”, 31); “Allah özünü bəyənib fəxr edənləri sevməz!” (“Nisa”, 36); “Allah səbrliləri sevər” (“Bəqərə”, 156); “Allah təqvalıları sevər”; “Allah imanı sizə sevdirmişdir” (“Hucurat”, 8); “İman gətirənlərin Allaha məhəbbəti çox böyük olar” (“Bəqərə”, 165); (“Ali-İmran”, 31); (“Taha”, 39-40) və bu kimi.

İmamət səmasının 5-ci parlaq ulduzu İmam Məhəmməd Baqir (ə) “məgər din məhəbbətdən başqa bir şeydir?” buyuraraq sanki bütün bu İlahi bəyanatlara yekun vurur. Aşağıdakı misralarda Xətai heç şübhəsiz, həm də bu din böyüyümüzün məhşur kəlamından ilham almışdır:

*Batinində dedi mənə bir əziz,*
*Məhəbbətdən keçən həqdən də keçər.*
*Verməz nəsibini kəsin qəzasın,*
*Məhəbbətdən keçən həqdən də keçər.*

*Məhəbbət adəmi həqqə yaradır,*
*Məhəbbət etməyən can mudardır,*
*Dünya-axirətdə üzü qaradır,*
*Məhəbbətdən keçən həqdən də keçər.*

*Gerçək olan bir nəfəsə inana,*
*Canımız veririz qurban canana,*
*Lənət olsun iqrarından dönənə,*
*Məhəbbətdən keçən həqdən də keçər.*

*Məhəbbətdən hasil oldı Məhəmməd,*
*Əliyə verildi cümlə vilayət,*
*On ikimamın ərkanı şəfaət,*
*Məhəbbətdən keçən həqdən də keçər.*

*Dörd qapı, qırx məqam, yetmiş iki qat,*
*Məhəbbət dedilər təcəlliyi-zat,*
*Möminə, müslimə xeyir, nəsihət,*
*Məhəbbətdən keçən həqdən də keçər.*

*Məhəbbət dediyin xaslar xasidir,*
*Məhəbbət olmiyan həqqin nəsidir?*
*Dost "Xətai"nin bu həq nəfəsidir,*
*Məhəbbətdən keçən həqdən də keçər.*

*(Q.14; s.240)*

***

*Məhəbbət edənlər qismətin alır,*
*Arayır dərd əhlinin dərmanın bulur,*
*Sərçeşmə Muhamməd Əlidən gəlür,*
*Tükənməz dalğası göldür məhəbbət.*

*Məhəbbətdir "La İlahə İlləllah",*
*Məhəbbətdir "Muhamməd Rəsulullah",*
*Məhəbbətdir "Əliyyən vəliyyullah",*
*Üçü də mənada birdir məhəbbət.*

*Axar sular kimi, axasım gəlməz,*
*Yəzidin yüzünə baxasım gəlməz,*
*Şəhrinə gəlincə çıxasım gəlməz,*
*Əcibə bir gizli sirdir məhəbbət.*

*Həqiqət kitabın oxur Cəbrəil,*
*Məhəbbət loqməsin sunan Mikail,*
*Canı həqqə təslim edər Əzrail,*
*İsrafil dilində surdur məhəbbət.*

*"Xətai" bu məqam özgə məqamdır,*
*Məqamın mehri on iki imamdır,*
*Şeyx Səfinin buyruğunda təmamdır,*
*Zira can arzusu, didar məhəbbət.*

*(Q.21; s.346)*

***

***Məhəmməd Əlinin aldım əlini,***
***Həq deyib tutduğum əldən ayrılmam.***
***On iki imamın tutdum yolunu,***
***Həq deyib tutduğum yoldan ayrılmam.***

***Mürşidin nəfəsi həq nəfəsidir,***
***Mürşid sözün tutmayanlar asidir,***
***Mürşidin rizası həq rizasıdır,***
***Həq deyib tutduğum yoldan ayrılmam.***

***Mürşidin getdiyi vəli yoludur,***
***"Getmə" – dediyinə getməlidir,***
***Zahirdə, batində Məhəmməd Əlidir,***
***Həq deyib tutduğum yoldan ayrılmam.***

***Həqq ərənlər bir araya dərilsə,***
***Cümlə aşıqlara nəsib verilsə,***
***Aşkara həq gözü ilə görülsə,***
***Həq deyib tutduğum yoldan ayrılmam.***

***Şah Xətaim həq bir tutduğum əli,***
***Zahirdə, batində həq gördi səni,***
***Gerçək ərənlərdən aldım xəbəri,***
***Həq deyib tutduğum yoldan ayrılmam.***

***(Q.10. s.335)***

Bu şeirdə Peyğəmbər (s) İmam vəhdətiylə başlanır lakin bu motiv burada haqq yolu motivinə calanır. **"On iki imamın tutdum yolunu"** misrası isə şairin "haqq yol" deyərkən "isna əşəri" fəlsəfəsini nəzərdə tutur. Bu fəlsəfə isə Qurani-Kərimin "Nisa" surəsinin 59-cu ayəsində daha parlaq şəkildə öz əksini tapmışdır. "Ey iman gətirənlər! Allaha, peyğəmbərə və əmr sahiblərinə (peyğəmbərin canişinlərinə) itaət edin!"

Peyğəmbərin (s) xüsusi səhabələrindən olan Cabir ibn Abdullah Ənsariyə aid edilən bir rəvayətdə belə qeyd edilmişdir: "Bu ayə nazil olduqda peyğəmbərdən (s) soruşdum: "Ey Allahın Rəsulu (s), Allah və peyğəmbərini tanıdıq, bəs əmr sahibləri kimlərdir ki, Allah onlara itaəti Öz itaəti ilə yanaşı qeyd etmişdir?" Peyğəmbər (s) buyurdu: "Ey Cabir, onlar mənim canişinlərim və məndən sonra müsəlmanların rəhbərləridirlər. Onlardan birincisi Əli ibn Əbutalib (ə), sonra Həsən (ə), sonra Hüseyn (ə), sonra Əli ibn Hüseyn (ə), sonra Tövratda Baqir adı ilə qeyd edilmiş Muhamməd ibn Əli (ə). Cabir, sən onu tezliklə görəcəksən. Onunla görüşəndə salamımı ona çatdırarsan. Ondan sonra Sadiq Cəfər ibn Muhamməd (ə), sonra Musa ibn Cəfər (ə), sonra Əli ibn Musa (ə), sonra Muhamməd ibn Əli (ə), Əli İbn Muhamməd (ə), sonra Həsən ibn Əlidir (ə). Sonra Həsən ibn Əlinin oğlu, Muhamməd, mənim adaşım, həmkünyəm[1], Allahın yer üzündəki dəlili və Allahın bəndələri arasında qoruduğudur. O, elə bir şəxsdir ki, Allah onun vasitəsilə Öz adını bütün dünyaya yayacaq. O, elə bir şəxsdir ki, şiələri və dostlarının gözündən uzaq düşəcək. Bu qeyb şəraiti elə olacaq ki, Allah qəlbini iman ilə yoxlamayıncaya qədər heç kəs onun İmamətinin inamında sabitqədəm olmayacaq."

Dedim: "Ey Allahın Rəsulu (s) o, qeybdə olduğu vaxt şiələr ondan faydalanacaqlarmı?"

Buyurdu: "Bəli, and olsun məni Peyğəmbər göndərənə, buludlarla örtülməsinə baxmayaraq, insanlar günəş işığından faydalana bildiyi kimi, qeyb dövründə şiələr onun nurundan nur alacaq, rəhbərliyindən faydalanacaqlar. Cabir, bu, Allahın gizlətdiyi sirlərdən və Allahın gizlətdiyi bilgidir. Buna görə də onu yalnız layiq olana söylə.")

("Künyə" – Ərəb dilində kişinin öz böyük oğlunun, qadının isə böyük övladının adının qarşısına "əb" (kişilərdə) və "ümm" (qadınlarda) sözləri əlavə edilərək adlandırılması bir ənənə olmuşdur. Ərəb qəbilələri arasında şəxslər üçün künyə formasında

ad qoymaq ənənəsi o şəxs üçün hörmət və ehtiram əlaməti sayılır. Məsələn, Əbülqasim, Ümmi-Sələmə, Ümmi Gülsüm və s).[1]

Şair ikinci bənddə mürşidlik məsələsini şeirə gətirir. Mürşid sözü "Rəşədə" kökündən gəlib, əqli-mənəvi yetkinliyə malik olan şəxs deməkdir. Söz Qurani-Kərimdə bir neçə yerdə işlənmişdir:

"Bəndələrim məni səndən soruşanda (de ki,) Mən (onlara) yaxınam. Məni çağıranda çağıranın səsinə səs verirəm. Onlar da Mənim çağırışımı qəbul edib Mənə iman gətirsinlər ki, doğru yolu tapsınlar (məqsədə çatsınlar)". ("Bəqərə", 186)

Bu ayə Allahın bəndələrinə lütfü və məhəbbəti ilə doludur. Allah bu ayədə Öz adından danışmış, yeddi dəfə birinci şəxs əvəzliyindən (altı dəfə bitişən əvəzlik, bir dəfə isə birinci şəxsə olan feildən) istifadə etmişdir. "Mənim bəndələrim", "Mənim haqqımda", "Mən yaxınam", "Məni çağıranda", "cavab verirəm" (səs verirəm), "çağırışımı", "Mənə iman gətirsinlər". Quranın heç bir yerində belə bir ayə tapmaq olmaz. Allah bu ayədə duanın qəbul olunması üçün əsaslı bir şərt göstərərək buyurur: "Məni çağıranda". Yəni, dua edənin, Məni çağıranın duası, çağırışı ürəkdən gəlməlidir. Yalnız dildə olmalı deyil. İmam Sadiqdən (ə) nəql olunan bir rəvayətdə deyilir: "Allah unutqan qəlbin duasını qəbul etmir". Həmçinin bəndə dua edərkən öz hacətini həqiqətən Allahdan istəməlidir. Digərlərini Allah yanında kiçik sanmalıdır. Məxluqatı vasitə hesab etsə də, ilkin səbəbin Allah olduğunu bilməlidir. Hədisi-qudsidə deyilir: "Kim məndən başqasına tapınarsa, göylərdəki və yerdəki bütün qapıları onun üzünə bağlayaram. Məndən bir şey istəsə, ona verməərəm. Məni səsləsə, ona cavab verməərəm. Elə bir məxluq yoxdur ki, Mənə tapınsın, göyləri və yeri onun ruzisinə zamin etməyim. O, Məni çağırsa, cavab verəcəyəm, məndən bir şey istəsə, verəcəyəm.

[1] Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 87

Məndən bağışlanmaq istəsə, onu bağışlayacağam”.[1]

“Dinin qəbul olunmasında məcburiyyət yoxdur. (çünki) artıq doğru yol azğınlıqdan ayırd edilmişdir. Kim Tağutu (şeytanı, bütləri və eləcə də digər azğın varıqları) inkar edib Allaha iman gətirsə, o, əsla qırılmayan ən möhkəm bir tutacaqdan yapışmışdır. Allah eşidən və biləndir”. (“Bəqərə”, 256)

Ümumiyyətlə, İslam və heç bir haqq məzhəb iki cəhətdən məcburiyyət səciyyəsinə malik ola bilməz:

1. Açıq-aşkar dəlil və möcüzələrdən sonra məcburiyyətə ehtiyac yoxdur. Zorakılığa qətiyyətli məntiqi olmayanlar əl atarlar, aydın və güclü məntiqi olan İslamın buna ehtiyacı yoxdur;

2. Din daxili inanc və etiqadlara əsaslandığı üçün məcburi olması mümkün deyil. Məcburiyyət insanın cismini təslim edə bilər, ancaq etiqadlarını və inanclarını əsla! Əlbəttə, bu, o demək deyil ki, İslam ümumiyyətlə, icbardan (məcburiyyət) istifadə etməmişdir. İslam dinində üç halda hərbi güc tətbiq edilmişdir:

1. Müşrikliyin təsirini aradan qaldırmaq üçün. İslama görə bütpərəstlik din deyil, əksinə bir xəstəlik və xurafatdır. Insan cəmiyyətinin yüz faizlik səhv və yalnış yolda yürüməsinə və bununla da süquta uğramasına icazə vermək olmaz.

2. Müsəlmanları məhv etmək üçün hücum planı hazırlamış insanlara qarşı müdafiə cihadına qalxmaq əmri verilmişdir. Peyğəmbər (s) zamanında baş vermiş müharibələrin demək olar ki, çoxu bu qəbildəndir.

3. Azad təbliğata nail olmaq üçün. Haqq olunan din azad şəkildə təbliğ oluna bilər. Din bu fəaliyyətə mane olan şəxslərə qarşı zor tətbiq edib, öz haqqını əldə edə bilər.[2]

---

[1] Əl-mizan, c.2, səh. 31, 36; Ayətullah-üzma Nasir Məkarim Şirazi. “Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı”. (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, “Nurlar”, 2017. səh. 28

[2] Nümunə, c.2, səh. 281; Ayətullah-üzma Nasir Məkarim Şirazi. “Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı”. (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, “Nurlar”, 2017. səh. 28

***Mürşidin nəfəsi həq nəfəsidir,***
***Mürşid sözün tutmayanlar asidir,***
***Mürşidin rizası həq rizasıdır,***
***Həq deyib tutduğum yoldan ayrılmam.***

Bu dörd misradan aydın görünür ki, şair burada mürşid deyərkən Həzrəti-Əlini (ə) nəzərdə tutur. Bu motiv şairin başqa şeirlərində də özünü göstərir:

*Şah Xətai, sənin dərdin deşilməz,*
*Dərdi olmayanlar dərdə tuş olmaz.*
*Mürşidsiz, rəhbərsiz yollar açılmaz,*
*Mürşid ətəyində əlin varmıdır? (Q.17, səh-343)*

***Mürşidin getdiyi vəli yoludur,***
***"Getmə" – dediyinə getməlidir,***
***Zahirdə, batində Məhəmməd Əlidir,***
***Həq deyib tutduğum yoldan ayrılmam.***

Lakin 3-cü bəndin **"mürşidin getdiyi vəli yoludur"** misrası ilə başlaması burada mürşid sözünün Həzrət-Əliyə (ə) işarə olmayıb, nisbətən aşağı dərəcəli erarxiya nümayəndəsini – övliyanı bildirdiyini göstərir. Əks təqdirdə, "vəli" sözü gərək Rəsulullaha (s) işarə olardı ki, bu da qeyri-mümkündür. Belə olan surətdə bəs buradakı mürşid kimi bildirir? Xətai irsinin çoxsaylı nümunələri bir mənalı surətdə göstərir ki, bu bənddə işlənilən mürşid sözü təriqət şeyxi mənasındadır.

Qoşmanın dördüncü bəndində şair **"haqq ərənlər", "cümlə aşıqlar", "nəsib"** – sözləri ilə vermək istədiyi fikirləri sırf foklor müstəvisinə keçirir.

***Həqq ərənlər bir araya dərilsə,***
***Cümlə aşıqlara nəsib verilsə,***
***Aşkara həq gözü ilə görülsə,***
***Həq deyib tutduğum yoldan ayrılmam.***

Qoşmanın möhürbəndi də bu yöndə olub, “Rəsulullah (s) Əliyyən vəliyullah (ə)” vəhdətinin təkidli və israrlı tərənnümünə qulluq edir:

***Şah Xətaim, həq bil tutduğum əli,***
***Zahirdə, batində həq gördi səni,***
***Gerçək ərənlərdən aldım xəbəri,***
***Həq deyib tutduğum yoldan ayrılmam.***

***(Q.10. s.335)***

***

Aşağıdakı qoşma Əhli-beyt (ə.m) məhəbbətini gələcək nəsillərə ötürmə istəyi baxımından çox səciyyəvidir:

***Ərənlər sərvəri şahi-vilayət,***
***Aldı möminlərin əlin əlinə,***
***Xandan dostuna eylər hidayət,***
***Mömin olanları çəkər yoluna.***

***Əgər bəndə isən Şahi-mərdana,***
***Əli kimi səndə qalma nuqsana,***
***Bir talibi pişir gətir meydana,***
***Əzəl, əbəd “La”gəlməyə dilinə.***

***Nəsihətdir məndən sənə əmanət,***
***Sadiq əmanətə etməz xəyanət,***
***Yemək ilə içmək üçün bir adət,***
***Qurdu həq aslanı mömin quluna.***

***Ərənlər getdiyi yolları gözlə,***
***Gözət bir kamilin izini izlə,***
***Mömin qardaşların eybini gizlə,***
***Girmək istər isən rəhmət gölünə.***

***Mürşidə rəhbərə eylə itaət,***
***Zahirdə batində gözlə sədaqət,***
***Muhamməd-Əlidən qaldı əmanət,***
***Bağça dolanınca güllər alına.***

***Muhəmməd Əli qırxlara qatıldı,***
***Anda varlıqları cümlə atıldı,***
***Bir yahuya qul olubən saltıldı,***
***İstək həq olduğu bundan bilinə.***

***Şah "Xətai" cənnət qapusın açdım***
***Cumərd olanların dolusun içdim,***
***Bəxil olanları ayırdım, seçdim,***
***Bəxildən qeyrisi cəmdə buluna.***

***(Q. 6. s. 331-332)***

Qoşmanın birinci bəndində "ərənlər sərvəri" və "şahi-vilayət" adlandırılan Həzrəti-Əli (ə) möminləri bir başa hidayət etməsi və onlara doğru yol göstərməsi vurğulanır. İkinci bənddə bəndəlik özünü dərki önə çəkilərək Həzrəti-Əlinin (ə) örnək alınması, kamilləşmə yönündə insanların bir-birinə təmənnasız yardım göstərməsinə çağırılır, üçüncü bənddən bütün bu cəhətlər etik-didaktik səpkidə və xalq pedaqoqika ruhunda ümumiləşdirilir və ümmət-rəhbər xəttinin gözlənilməsi məsləhət görülür (Qurdu həqq aslanı mömin quluna), dördüncü bənd də bu deyilənlərin çox asanlıqla İlahi mərhəmətə yol açacağı qeyd edilir, beşinci bənddə bir daha Həzrəti-Muhamməd (s) İmam Əli (ə) vəhdətinə qayıdaraq, dini rəhbərlik, dindar itaəti, gizlilik – aşkarlıq prinsipləri, dürüstlük əqidəsi, əmanətdarlığa çağırış biliyi, mərifəti yaymağa dəvət məsələləri motivləşdirilir.

Birinci misradan belə anlaşılır ki, şair "mürşid" dedikdə Rəsulullahı (s), "rəhbər" dedikdə Əliyyən-Vəliyulllahi nəzərdə tutmuşdur. Bu isə bilavasitə Qurani-Kərimin mübarək "Rəd" surəsinin 7-ci ayəsindən irəli gəlir: "Kafir olanlar deyirlər: "Niyə

ona Rəbbindən bir möcüzə endirilməyib?" Sən ancaq qorxudansan. Hər qövmin bir yolgöstərəni vardır".

Peyğəmbər (s) şəriətin təsisçisi, İmam (ə) isə onu qoruyandır: Qorxutmaq, qorxu gəlmək və təhdid etmək yolunu azmışları yola gətirilməsi və doğru yolu tapmaları üçündür. Yolgöstərən, hidayətçi isə insanların doğru yolda yürüməsi üçündür. Əslində, "qorxu gələn" yaradan, var edən, "yolgöstərən" isə qoruyan və irəli aparandır. Biz bu ikisini Peyğəmbər (s) və İmam (ə) adlandırırıq. Peyğəmbər (s) şəriətin əsasını qoyur, İmam (ə) isə onu qoruyur. Peyğəmbərdən (s) nəql edilən çoxlu sayda hədis bu izahı təsdiq edir. İbn Əbbasa istinad edilən bir hədisdə bu ayə nazil edilərkən Peyğəmbərin (s) əlini sinəsinə qoyaraq "Mən qorxudanam" deməsi, sonra İmam Əliyə (ə) işarə edərək "Sən yolgöstərən və hidayətçisən. Məndən sonra hidayət olunmuşlar sənin vasitənlə hidayət olunacaqlar", – deyə buyurması nəql edilmişdir.[1]

Ayədəki bu gerçəkliyi Həzrəti-Məhəmməd (s) bir daha vurğulamışdır. "Mən xəbərdarlıq edənəm, Həzrəti-Əli (ə) isə doğru yol göstərəndir! Məndən sonra doğru yol tapanlar yalnız sənin vasitənlə tapacaqlar ya Əli!"

Qoşmanın 6-cı bəndi bütünlüklə "vəhdəti-vücud" fəlsəfəsinin üzərində qurulmuşdur. Peyğəmbərlə (s) imamın (ə) qırxlara qoşulması və onlarla canbir qəlb olması, son dərəcə təvazökar olmaları və bunun onları haqdan, Allahdan gəldiklərini subuta yetirməsi önə çəkilir.

Ən nəhayət, şeirin möhürbəndində şair öz lirik "mən" inə cənnət qapısını açdırıb, comərd olanların dolusunu içdiyini yəni, kamil şəxsiyyətlərin verdikləri ilahi vəhdət şərabını nuş etdiyini və bunun nəticəsində də paxıl adamları, yəni mənəviyyatca çürük insanları saf simalardan birdəfəlik uzaqlaşdıraraq, saf, duru və bütöv bir cəmiyyət yaratmağa nail olduğunu sevinc hissi ilə

---

[1] Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 250

elan edir.

Nəinki Xətai irsi üçün, bütövlükdə klassik Azərbaycan ədəbiyyatı və aşıq yaradıcılığı üçün son dərəcə yeni olan qoşmanın altıncı bəndidir. Müstəsna hal budur ki, burada cəmiyyətin rəhbərlərə yox, rəhbərlərin cəmiyyətə qovuşması tərənnüm olunur: "Məhəmməd Əli qırxlara qatıldı". İkinci misradan rəhbərlərin bir cüz kimi cəmiyyət küllündə əriyib getdikləri anlaşılır. Bəndin bütün sirri-sehri son iki misradadır. Belə olan surətdə bir sual doğur "Bir "Yahu"ya qul olub satılmaq" nə deməkdir? Xətai bu təlmihlə nə demək istəyib? Burada "Qirxlar vadisi" adlanan bir əhvalata işarə vardır:[1] "Peygamber Muhammet Mustafa (s) Miraca giderken, yolda önüne bir arslan çıktı, arslan yatmış, yolu kesmişti, o an, "Amcam oglu Hazreti-Ali (ə), şimdi burada olasaydı bu arslanın hakkından gelirdi" diye düşündü. Bu sırada bir ses duydu: "Yüzügünü (hatemini) arslana ver, Həzrəti-Peygamber (s) yüzügünü çıkardı arslanın karşısına qoydu. Orada nişan kaldı, arslan sakinleşti. Peygamber (s) "Sidretül-Münteha"ya erişti. Dost-dosta kavuştu. Doksan bin kelam söylendi, otuz bini şeriat, otuz bini tarikat, otuz bini ise hakikattı. Şeriat ve tarikat diğer mezheplere düştü. Hazreti-Alide (ə) ve Ehli-beytde (ə) 30 bin kelam olan hakikat kaldı. Cenab-I Hak ile 90 bin kelam konuşur. Bunun 30 bini sırrı hakikat olup Hazreti-Alide (ə) kalır. Bu sırr bir çok sırra gebedir. Evrenin nasıl ne şekilde yaratılıştan tutun Peygamber'imizden (s) sonra neler olacaklarını bilmesine kadar. "Ben ilmin şehriyim, Ali ise kapısıdır" buna işarettir. 60 Bin kelamı halka anlatır. 30 Bin kelam Hazreti-Ali (ə) ve Ehlibeytde sırr olur. Alevilik bu sırrın sadece küçük bir damlasıdır.

Miraçta Hazreti-Muhammete (s); süt, bal ve elma verildigi rivayet edilir. Bal aşka, süt sevgiye elma ise dostluğa işaret eder. Miraçtan döndükten sonra Resul hazretleri, ashabi Suffanın kapısına vardı. Kırklar orada sohbet ederlerdi. O, hazreti-Resul, kapıya vurdu. "Kimsin" dediler. "Nedir istedigin?" Resul hazret-

[1] Bu vaqiənin türkcə mətnini olduğu kimi veririk.

leri: Peygamberim (s), açın kapıyı, içeri gireyim, siz erenler ile dem-i didar görelim” dedi. İçerdekiler:” Bizim aramıza Peygamber sığmaz. Peygamberligini var ümmetine eyle dediler. Peygamber hazretleri bunu işitip hemen geri döndü. Hak-teala Hazretinden ol vakit ses geldi ki, “Ya Muhammet (s), ol kapıya var...” Resul hazretleri o sesi işitip derhal geri döndü. Yine geldi, ol kapının halkasına vurup kapıyı tıklattı, içeriden “kimsin?” dediler. Hazreti-Resul (s) dedi ki, Ben Resulüm...açın kapıyı, içeri gireyim, mübarek cemalinizi göreyim” dedi. İçerdekiler: “Bizim aramıza Resul sığmaz ve hem bize gerek degildir” dediler. Resul (s) bu sözü işitince geri döndü, diledi ki, feraget gele, kendi makamına geri sakin ola. Tanrıdan Peygamberin (s) kulağına aynı ses erişti: “Ya habibim, var yine o kapıya, o meclise dahil ol.

Nere gidersin, dön geri”. “Seyyid geri döndü. Geldi o kapının halkasına el vurdu. Işaret eyledi.” Yine dönüp geldigini bildirdi, dediler ki, “Kimsin?” Resul dedi ki? “Sırrul kayyum, hadimül fıkarayım”.– (Yoksulların hizmetçisi olduğunu söyleyen Peygamberin o esnada”Ene biatihim, ene miskinim, ene fıkarayı” dedigi de rivayet olunur...Bu, “Yoksulum, sizlerden birisi ve sizlere uyanım” demek olur.) Kırklar dediler ki “Merhaba! Ehlen ve Sehlen” dediler. Yani, Hoş geldin, kadem getirdin, gelmekliğin mübarek olsun” dediler. Resul hazretleri “bismilləh” deyip, ol kapıdan içeri girdi. Evveli sağ ayağını bastı baktı gördü ki, otuz dokuz sahabe otururlar. Tam 39 kişi vardır. Üstelik bu meclis kadın ve erkeklerden oluşmuştur. Bunların 22-si erkek 17-si kadındır. Muhammete (s) yer gösterilir. O, da gösterilen yere oturur. Hazreti-Ali de meclistedir. Muhammet (s) tesadüfen Alinin (ə) yanına oturur. Hazreti-Muhammet (s) sorar. “Size kimler denir?” der. “Bize Kırklar denir” diye yanıt alır. “Ama burada 39 kişi saydım” der. “Selmanı Pak Can Parstadır”denir. “Peki sizin ulunuz, büyüğünüz, küçüğünüz kim” diye sorar Hazreti-Muhammet. Gelen yanıt şöyle olur: “Bizim küçüğümüz, büyüğümüz yoktur. Küçüğümüz de uludur, büyüğümüz de uludur. Birimiz kırkımız, kırkımız birimizdir” denir. Bunun üstüne Muham-

met (s) meclisten bunu kendilerine kanıtlamalarını söyler. O sırada Ali (ə) kolunu uzatır ve gömleğini sıyırır. İçlerinden biri "destur" diyerek bıçağın ucu ile kolunu hafif kanatır. Kolundan bir damla kan akar. Onu, her canın kolundan birer damla kanın gelmesi izler. 40. canın bir damla kanı da pencereden içeri gelir. Bu ise Selman-ı Pak'ın kanıdır. Sonra Hazreti-Ali (ə) kolunu bağlar, hepsinin kanaması durur. Selmanı Pak, Parstan dönüşte bir üzüm tanesi getirir. Onu Hazreti-Muhammete (s) verir ve bölüştürmesini ister. Muhammet erilen kapta üzüm tanesini ezer, çıkan dem meclisteki kadın-erkek canlara dağıtılır. Kırklar üzüm suyunu içerler. Hep birlikte mest olurlar. "Ya Allah" deyip semah dönerler. Hazreti-Muhammette (s) onlara katılır. Büyük bir coşku ile vecd halinde semah dönülürken Hazreti-Muhammetin başından sarığı (imamesi) düşer. Kırk parçaya bölünür. Kırklar parçaları bellerine bağlarlar, kemerbest olurlar. Dönüşte Ümmetine anlatırken yaşadıklarını içeriye Hazreti-Ali (ə) girer. Peygamberin önüne ağzından çıkardığı yüzüğü koyar. Bu olaydan sonra Allah'ın aslanı denirmiştir. Bu olayın kaynağı İmam Cafer Sadık'ın buyruğunda yazar. Yeddi Ulu Ozanların deyişlerinde dile gelir".[1]

Yeddi Ulu Ozanlardan biri də Şah Xətaidir.

*Ol şerbetten biri içti,*
*Cümleside oldu heyran.*
*Mömin, müslim üryan, büryan,*
*Hep girdiler semaha.*

*Cümleside el çırpıben,*
*Dedilerki Allah-Allah.*
*Muhammed bele girdi,*
*Kırklar ile semaha.*

---

[1] Kırklar Meclisi. Bektaşilik // Həsən Hüseyni. Ariflərin haqqa qovuşma məqamı (Şəriət, Təriqət, Mərifət, Həqiqət). Bakı, 2016

*Muhammedim cuşa geldi,*
*Tacı başından tüştü.*
*Kemeri kırk pare oldu,*
*Hepsi sardı kırklara.*

*Muhammed evine gitdi,*
*Ali Haqqı tevaf etdi.*
*Hatemi önüne koydu,*
*Dedi saddaqsın ya Ali.*

*Evveli sen, ahiri sen,*
*Zahiri sen, batini sen.*
*Cümle sırlar sana ayan,*
*Dedi şahi-Evliya.*

*Şah Hatayım vakif oldum,*
*Ben bu sırrın ötesine.*
*Hakkı inandırammadım,*
*Özü çürük ervaha.*

***

Türk dilini bilməyən həmvətənlərimizə "Qırxlar cəmi"nin kimliyi daha aydın olsun deyə Azərbaycan dilində oxucuların diqqətinə çatdırırıq:

"Əziz Peyğəmbərimiz Muhəmməd-Mustafa (s) Meraca gedərkən yatıb yolu kəsmiş bir aslanla rastlaşdı. O an "əmim oğlu Həzrəti-Əli (ə) indi burada olasaydı, bunun öhdəsindən gələrdi" – deyə düşündü. Bu anda səs eşitdi: "Üzüyünü aslana ver".

Peyğəmbər (s) üzüyünü çıxardı və aslanın ixtiyarında qoydu. Artıq nişan qaldı aslan sakitləşdi.

Peyğəmbər (s) "Sidrətül-Müntəha"ya çatdı. Dost dosta qovuşdu. Doxsan min kəlam deyildi, otuz mini şəriət, otuz mini təriqət, otuz mini isə həqiqət haqqında.

Meracdan döndükdən sonra Rəsulullah (s), əshabi-süffənin

qapısına gəldi. "Qırxlar" orada söhbət edirdilər. Rəsulullah (s) qapını döydü. İçəridən: "Kimsən, nədir istəyin? Rəsulullah (s): "Peyğəmbərəm, açın qapını, içəri girim, siz cəm əhlinin cəmalını görüm" – dedi. İçəridəkilər: "Bizim aramıza Peyğəmbər (s) sığmaz. Yaxşı olar, peyğəmbərliyini ümmətinə elan edəsən" dedilər. Allah Elçisi (s) bunu eşidib dərhal geri döndü. Haqq-təaladan nida gəldi ki: "Ya Muhəmməd (s), o qapıya qayıt". Rəsulullah (s) İlahi səsi eşidib dərhal geri döndü və yenidən həmin qapını döydü. Yenə soruşdular ki, kimsən? Rəsulullah (s) dedi: "Sirrul Qəyyum, hadimül fıkarayam": (Yoxsulların xidmətçisi olduğunu söyləyən Peyğəmbərin (s) o əsnada "ənə biatihim, ənə miskin, ənə füqara" dediyi də rəvayət olunur. Yəni, yoxsulam, sizlərdən biriyəm və sizlərə qoşulanam.

Qırxlar: "Salam! Əhlən və səhlən!" Yəni, xoş gəldin, qədəm gətirdin, gəlişin mübarək olsun, – dedilər. Rəsulullah (s) "Bismilləh" deyib, qapıdan içəri girdi. Baxıb gördü ki, otuz doqquz səhabə oturublar. Onlardan biri bazara çıxıb yemək almağa getmişdi.

Yemək dalınca gedən Səlman Farsi idi. Səlman Farsinin Mərdlərin şahı Həzrəti-Əliyə (ə) məhəbbəti vardı. İçəridəkilər ayağa qalxıb o Həzrətə (s) yer göstərdilər. Seyid keçib Murtəza Əlinin (ə) yanında oturdu. Lakin Əli (ə) olduğunu bilmədi. Rəsulullah (s) baxıb gördü ki, oturanların 22-si kişi, 17-si qadındır. Xanım Fatimə (s.ə) ana da oradadır. Rəsulullah (s) soruşdu: "Sizlər kimlərsiniz? Cavab verdilər ki, "bizə qırxlar" deyərlər. Həzrəti-Muhəmməd Mustafa (s) dedi: "Mənə qaranlıq qaldı, sizin kiçiyiniz və böyüyünüz kimdir? Həm də ki, 40-dan biriniz əskikdir, o hardadır?". "Ya Seyidullah, o biri Səlmandır, yemək ardınca getdi" – deyə buyurdular. Həmçinin dedilər ki, nə üçün soruşdunuz? Səlman da burada hazırdır. Rəsulullah (s) onlardan bunun üçün bir nişan istədi. Bu vaxt Şahı-Mərdan Əli (ə) mübarək qolunu uzatdı və digəri "dəstur" deyə, ona neştər (yaxud xəncər) vurdu. Bir damla qan rəvan oldu, o vaxt cümləsinin biləyindən də qan axdı. Bir damla qan da pəncərədən gəlib meydana töküldü. Həmin bir damla eşikdə olan Səlman Farsinin qanı idi.

Əliyyəl-Mürtazanın (ə) qolunu bağladılar, cümləsinin qanı dayandı.

Səlman Farsi gəldi. Bir üzüm dənəsi gətirib Həzrəti-Seyidin önünə qoydular. Birlikdə "Ey fəqirlərin xadimi, xadimilik edib, bu üzüm dənəsini qırxlara payla!" – dedilər. Həzrəti-Seyyid (s) bir az düşündükdən sonra: "Bunlar qırx kimsənədir, bir üzüm giləsini kimə verim?" – dedi.

Dərhal uca Tanrıdan Cəbrayıla (ə) əmr olundu ki, "Ey Cəbrayıl, Həbibim müşkül işə düşüb, tez yetiş, cənnətdəki nurdan bir qab al, Həzrəti-Muhəmmədə (s) çatdır. Bu üzümü həmin qabın içində əzib şərbət etsin. Qırxlar içsinlər" – dedi. Cəbrayıl (ə) cənnətdən nur götürüb Rəsulullahın (s) hüzuruna gəldi. Haqq-təalanın salamını Həzrəti-Peyğəmbərə (s) çatdırdı. Cənnətdən gətirdiyi qabı Onun önünə qoydu: "Şərbət et, ya Muhəmməd!" – dedi. Qırxlar baxıb gördülər ki, Seyyidin qarşısında nurdan bir qab zahir oldu. Qab gün kimi şölə saçırdı. Seyid o qabın içində üzümü şərbət edib qırxlara payladı. Bu işdə Haqq-təalanın hikməti var idi. Gərək bu qüdrət zahir olaydı. Qırxlar o şərbətdən içdilər. Cümləsi məsti-ələst oldular, bir dəfə "Ya Allah" deyib dəst verdilər, sidqi-candan meydana girdilər, yəni özlərindən keçdilər. Seyyidin mübarək başından yerə düşən əmmaməsi qırx yerə bölündü, qırxlar hərəsi birini götürüb bellərinə bağlayıb, Haqq üçün səma etdilər. Daha sonra Rəsulullahın (s) ətrafına toplanıb Meracı soruşdular. Onlar dedilər": Ya Rəsulullah, Allah xatirinə, Haqq-təalanın sizlərə bəyan etdiyi sirlərdən nə isə bəyan et ki, bizlər də bəhrələnək. O sırada Şahi-Mərdan Əli (ə) da yerindən qalxıb Peyğəmbərin (s) yanına gəldi. Həzrəti-Peyğəmbər (s) gördü ki, Merac yolunda önünə çıxan aslana verdiyi üzük onun barmağındadır. O zaman həqiqəti fəhm etdi. Səhabələrinə dedi ki: "Gəlin həqiqətə talib olun ki, Haqqın sirrinə yaxın olasınız".

Sonra səhabələr soruşdular: "Həqiqət nədir, bəyan eylə, görək!". Peyğəmbər (s) buyurdu: "Həqiqət odur ki, özünüzü Haqqa təslim edəsiniz və Onun əmrlərini yerinə yetirəsiniz". Səhabələr Rəsulullaha (s) dedilər ki; "Biz belə bir beyətə razıyıq". İqrar

verib talib oldular. Rəsulullah (s) buyurdu ki: “Ey səhabələr, həqiqət Həzrəti-Əli (ə) ilədir, Həzrəti-Əliyə (ə) iman gətirin”.

Səhabələr gəlib Həzrəti-Əliyə (ə) beyət etdilər, talib olub and içdilər. (Rəsulullah (s) buyurdu) O cəmdə əvvəl iki adamı müsahib eylədilər, ən son Peyğəmbər (s), Əli (ə) ilə müsahib və qardaş oldu. Birlik mənasını göstərdilər. Həzrəti-Peyğəmbər (s) öz mübarək əliylə qurşağını açdı, Həzrəti-Əlini (ə) bağrına basdı. İkisi bir köynəyə girdilər iki baş, bir gövdə olduğu göründü. Həzrəti-Peyğəmbər (s) Həzrəti-Əli (ə) haqqında bu hədisi oxudu: “Ləhmukə ləhmi, dəmukə dəmi, ruhukə ruhi, cismukə cismi”. Yəni, Əlinin (ə) əti mənim ətim, qanı mənim qanım, ruhu mənim ruhum, cismi də mənim cismimdir. Həzrəti-Adəmdən (ə) Xatəmul-Ənbiyaya (s) gələnə qədər yol, ərkan yox idi. Həzrəti-Muhəmməd Mustafa (s) və Əliyyəl-Mürtəza (ə) cümlə-aləmə rəhmət üçün gəldilər, dini zahir etdilər. Ərkan qoydular. Şəriət zahir oldu. Təriqət gizli, həqiqət sirr olaraq qaldı. Şəriət Muhəmmədin (s) gətirdiyi hökmlərdən ibarət idi. Təriqət Həzrəti-Əlinin (ə) xas insanlara öyrətdiyi elmi-nur idi. Həqiqət isə sirr olaraq qaldı. (Bu rəvayətin mənbəyi İmam Cəfəri Sadiqin (ə) buyurduğu hədisə əsaslanır və yeddi ulu ozanın dilindən qələmə alınıb).

*“Mustafa gördü səni aslan sifətli bir mələk,*
*Sahibi-meraci, həm tacı-livasan, ya Əli”.*

*(Q.395 s.251).*

*“Çıxdı meraca Muhəmməd, qıldı doxsan min kəlam,*
*Sirri-Həqq, həm məhrəmi-əsrar sənsən, ya Əli.*

*(Q.396.s.252)*

Bu yerdə yadıma mədrəsədə “Nəhcül-bəlağə”də olan “Həmmam” xütbəsini bizə anladan Höccətül-islam vəl-müslimin Ağa-yi-Qadir Fazilinin söylədiyi bir əhvalat düşür. O danışırdı ki, rəvayətə görə, Rəsulu-Əkrəm (s) Merac etdiyi gecənin sabahı günü Həzrəti-Əlinin (ə) cinlərlə müharibəsinin nəticəsi ilə maraqlanır

və üzünü səhabələrə tutaraq buyurur ki, kim Həzrəti-Əlinin (ə) qələbə müjdəsini mənə birinci gətirsə, hər nə mükafat istəsə verəcəyəm. Çox vaxt olduğu kimi bu dəfə də Salman öz fərasəti ilə digər səhabələri geridə qoyur. Surətlə yola çıxan Salman Həzrəti-Əlini (ə) uzaqdan görər-görməz ucadan ondan soruşur ki, ya Əli (ə), qalibsən, yoxsa məğlub? O, Həzrəti-Əlinin (ə) "Əllahu-Əkbər, La İlahə İlləllah" söylədiyini görən kimi, dərhal Əlinin (ə) qalib gəldiyini başa düşür və Həzrəti-Əlidən (ə) yeyin getməməsini xahiş edir ki, qayıdıb Həzrəti-Peyğəmbərdən (s) muşduluq alsın. Salman geriyə doğru bir-neçə addım atdıqdan sonra belə düşünür ki, qoy elə Həzrəti-Peyğəmbərdən (s) nə istəyəcəyimi Həzrəti-Əlidən (ə) soruşum. O, bunun üçün yenidən Həzrəti-Əlinin (ə) yanına gəlir və məqsədini ona söyləyir. Həzrəti-Əli (ə) ona bildirir ki, dünən gecə Allah-təala Meracda doxsan min kəlmə danışmışdır. İlahi buyruğa əsasən Peyğəmbər (s) onun otuz minini hamıya deyə bilər, otuz minini yalnız xüsusi şəxslərə bildirməlidir, otuz minini isə sirr olaraq saxlamalıdır.

Ey Salman, sən Həzrəti-peyğəmbərdən (s) sirr olan otuz min kəlmədən soruş". Həzrəti-Əliyə (ə) təşəkkür edən Salman Peyğəmbərin (s) yanına qayıdaraq, Həzrəti-Əlinin (ə) öyrətdiyi kimi Həzrəti-Peyğəmbərdən (s) sirr olan kəlmələrdən birini ona bildirməsini xahiş etdi. Peyğəmbər (s) İlahi sirri açmadıqda Salman məyus olur, bu zaman Peyğəmbər (s) ona təsəlli və təskinlik verərək buyurur ki; "Salman darıxma gəl Allah-təalanın əmrini gözləyək". Bu əhvalatdan bir müddət keçdikdən sonra İslam Peyğəmbəri (s) "Fədək" bağında Əhli-beyti (ə.m) ilə son dərəcə məhramani bir məclis təşkil etdiyi zaman Səlman da oraya gəlir.

Lakin xidmətçi onun içəriyə daxil olmasına izin vermir. Bu zaman Həzrəti-Cəbrail (ə) nazil olub Salmanın Əhli-beytə (ə.m) məhrəm olmasına dair İlahi xəbər gətirir və Həzrəti-Mühəmməd də (s) Salmanı həmin məclisə dəvət etdi və buyurdu: "Səlman biz Əhli-beytdəndir (ə.m)". Biz bu motivlə Aşıq Qəribin "Ya Əli" rədifli şeirinin bir bəndində də rastlaşırıq:

*Bir gilə göndərdi qırxlar cəminə,*
*Hökm olundu ərşi-kürsi-zəminə,*
*İşarə eylədi göydəki günə,*
*Günü günortadan qaytaran Əli.*

Şah İsmail Xətai yaradıcılığında da "Qırxlar piri"ndən söhbət açılır və Xətai də "Qırxlar piri"nin yüksək məqam sahibi olduğunu qeyd edir. Bu qırx nəfərin 23-ü kişi, 17-si isə qadındır. Rəvayətlərə görə onların məzarı Dağıstan ərazisindədir. Şah İsmail Xətai Qırxlardan danışarkən onların əzəmətini qəlb süzgəcindən keçirərək insanların qırxlara oxşamasını tövsiyə edir:

*Qırxlar meydanına vardım,*
*Gəl bəri, ey can, dedilər.*
*İzzət ilə salam verdim,*
*Gəl uş da meydan, dedilər.*

*Qırxlar bir yerdə durdular,*
*Otur, deyə yer verdilər.*
*Önümə surba sərdilər,*
*Əl loxmayasun, dedilər.*

*Qırxların qəlbi durudur,*
*Gələnin qəlbin arıdır.*
*Gəlişin hardan bəridir,*
*Söylə, sən kimsən? – dedilər.*

*Gir simayə, belə oyna,*
*Silinsin, açılsın ayna,*
*Qırx il qazanda dur, qayna,*
*Daha çiy bu tən, dedilər.*

*Gördüyünü gözün ilə,*
*Söyləmə sən sözün ilə,*
*Ondan sonra bizim ilə,*
*Olasan mehman, dedilər.*

*Düşmə dünya möhnətinə,*
*Talib ol Haqq Həzrətinə,*
*Abi-Zəm-zəm şərbətinə,*
*Barmağını bən dedilər.*

*Şeyx Xətai, nədir halın?*
*Haqqa şükr et, qaldır əlin,*
*Qeybətdən kəsə gör dilin,*
*Hər qula yeysən, dedilər.*[1]

***

Ş.İ.Xətai özü də müqəddəs övliyalardan və "Qırxlar məclisi"nin üzvlərindən biri olub. Bu övliya da tarix boyu bir çox şair və aşıqlar tərəfindən vəsf olunub:

*Gözlərimə can göründü,*
*Şah Xətai, Şah Xətai.*
*Qırxlara meydan göründü,*
*Şah Xətai, Şah Xətai.*

*Göydən yerə endi Heydər,*
*"Hu, hu!" deyib olduq əsgər,*
*O şah kimdi? Qulu Qənbər,*
*Şah Xətai, Şah Xətai.*

*Önündədir yeddi mələk,*
*Əlindədir çərxi-fələk,*
*Min bir adın bilmək gərək,*
*Şah Xətai, Şah Xətai.*

---

[1] Şah İsmayıl Xətai. "Keçmə namərd körpüsündən" (Şeirlər və poemalar). Bakı, "Yazıçı", 1988. səh. 322

Yeddi ulu ozandan biri olan Pir Sultan Abdal da “Qırxlar cəmi”ndə Salmanın içdiyi üzüm suyundan (şərbətdən) içməyi təmənna edir:

*Payım gelir erenlerin payından,*
*On iki imam nesli Ali soyundan.*
*Selmanın içtigi üzüm suyundan,*
*Bir sen iç sevgilim, bir de bana ver.*
*(Pir Sultan Abdal)*

Ş.İ.Xətai yaradıcılığında olduğu kimi orta əsr aşıq yaradıcılığında da “Qırxlar piri” sözünə çox rast gəlinir:

***

*Qurbani der: “Arayıban tapmışam,*
*Qırxlar məclisindən bir pay qapmışam,*
*Kəbədisə, mən də birin yapmışam,*
*Min könüldən bir yol gedər o bürcə”.*[1]

və ya

*Gətirdi kəlamı cümlə cahana,*
*Qırxları göstərdi əhli-ürfana.*
*Peyğəmbər xitabın gətdi dəhana,*
*Həbibin söhbətin şur eylədin, Şah.*[2]

***

*Yatmışdım qəflətdə, açdım gözümü,*
*Dindirdilər, haqq söylədim sözümü,*
*Ərənlər payinə sürtdüm üzümü,*
*Doxsan min kəlməyə bəyan dedilər.*[1]

---

[1] Qurbani. Bakı, Bakı Universiteti Nəşriyyatı, 1990. səh. 136
[2] Qurbani. Bakı, Bakı Universiteti Nəşriyyatı, 1990. səh. 249

***

*“Qırxlar piri” özün yetiş dadıma,*
*Bir də yetir məni yar ayağına.*
*Üzün görüm, könül alsın təsəlli,*
*Xınatək yaxılım əl-ayağına.*[2]

***

*Yeri, göyü qüdrətindən xəlq edən,*
*Qadir Sübhan, bir Allaha qulam mən.*
*Qırxlar məclisində qulluq eyləyən,*
*İsmi-lamı Yadullaha qulam mən.*[3]

***

*Bu nə qəmdir mən çəkirəm,*
*Mən ki, Əli nökəriyəm.*
*Onda çoxdur rəhmi-kərəm,*
*Onun bəli, nökəriyəm.*

*Xəlili nardan qurtaran,*
*İsanı dardan qurtaran.*
*Çağıranda uzaqlardan,*
*Dadagəli, nökəriyəm.*

*Şəmşir, çağır qırxlar cəmin,*
*İmdad elə ərşi-zəmin.*
*Bu bivəfa, ömrü kəmin,*
*Bütün ili nökəriyəm.*[4]

---

[1] Qurbani. Bakı, Bakı Universiteti Nəşriyyatı, 1990. səh. 253
[2] Abbas Tufarqanlı. “72 şeir”. (tərtib edəni: Araz Dadaşzadə). Bakı, “Gənclik”, 1973. səh. 47
[3] Aşıq Xındı Məmməd. “Meydanda mərdi-mərdana”. Bakı, “Borçalı”, 2001. səh. 31
[4] Aşıq Şəmşir. “Öyüdlər”. Bakı, “Ozan”, 1996. səh. 199

***

Əhli-beyt (ə.m) anlayışı və Əhli-beytə (ə.m) məhəbbət məfhumu Kərbəla vaqiəsi ilə qırılmaz tellərlə bağlıdır. Kərbəla vaqiəsinin memarı isə İmam Hüseyndir (ə). İmam Hüseynin (ə) şəxsiyyəti, keçdiyi ömür yolu, həyat və fəaliyyəti, apardığı mübarizə tarixçəsi, silahdaşları və bu kimi başqa cəhətlər o, din böyüyünün hərakatını şərtləndirən başlıca amillərdir. Bütün varlığı ilə Əhli-beyt (ə.m) aşiqi olan Ş.İ.Xətai özünün zəngin irsində yeri düşərdüşməz Kərbəla vaqiəsinin ən müxtəlif tərəflərinə toxunmuş, sadalanan və sadalanmayan bu səpkili cəhətləri çeşidli bədii boyalarla qələmə almışdır. Lakin çox qəribə haldır ki, Xətai irsində İmam Hüseyn (ə) haqqında yalnız bir ayrıca mərsiyyə vardır. Bu mərsiyyə sırf folklor danışıq üslubunda olub, bir el ağsaqqalının söylədiyi ağı kimi xalq elegiyası təsiri bağışlayır:

*Bu gün matəm günü gəldi,*
*Ah Hüseynü va Hüseyn.*
*Sənin dərdin bağrım dəldi,*
*Ah Hüseynü va Hüseyn.*

*Kərbəlanın önü yazı,*
*Ürəyimdən çıxmaz sözi,*
*Yezidlərmi qırdı sizi?*
*Ah Hüseynü va Hüseyn.*

*Bizimlə gələnlər gəlsin,*
*Sirrini meydana qoysun,*
*Hüseyn ilə şəhid olsun*
*Ah Hüseynü va Hüseyn.*

*Kərbəlanın yaziləri,*
*Şəhid düşdü qaziləri,*
*Fatma ana quzuları,*
*Ah Hüseynü va Hüseyn.*

*Kərbəlanın önü düzdür,*
*Gecələr mənə gündüzdür,*
*Şah Kərbəlada yalqızdır,*
*Ah Hüseynü va Hüseyn.*

*Göydə ulduz paralandı,*
*Şəhrəbanu qaralandı.*
*İmam Hüseyn yaralandı,*
*Ah Hüseynü va Hüseyn.*

*İmam Hüseyn atdan düşdi,*
*Kafir gəlib qanın içdi,*
*Atı Mədinəyə qaçdı,*
*Ah Hüseynü va Hüseyn.*

*Bir su verin məsum cana,*
*Yəzid içdi qana-qana,*
*Fatma ana yana-yana,*
*Ah Hüseynü va Hüseyn.*

*Kərbəladə bitər yonca,*
*Boyu uzun beli incə.*
*Şah Xətaim kəsərincə*
*Ah Hüseynü va Hüseyn.*[1]

Gəraylı olan bu mərsiyədə Aşura gününün möhtəşəmliyinin vurğulanması ilə başlanır. Bu isə İslami qaynaqlarda geniş əks-səda verən bir məsələdir:

[1] Şah İsmail Səfəvi (Xətai) külliyyatı. Qəzəllər, qəsidələr, nəsihətnamə, dəh-namə, qoşmalar. (Tərtibatçısı: Mirzə Rəsul İsmailzadə). Bakı, Əlhuda, 2004. səh. 356-357

*Sənin dərdin bağrım dəldi,*
*Ah Hüseynü, va Hüseyn,*

beyti isə Kərbəla vaqiəsinin şairin sınıq könül sazını necə hərarətlə dilləndirdiyini göstərir.

İkinci bənddə isə sanki bütün Kərbəla şəhidlərinə üz tutur. "Yazı" əski Azərbaycan dilində çöl deməkdir. "Kərbəlanın önü yazı" – deyərkən şair İmam Hüseynin (ə) başçılıq etdiyi dəstənin gözdən iraq bir yerdə mühasirəyə salındığına işarə vurur. "Ürəgindən çıxmaz sözü" misrası ilə şair bu faciənin heç vaxt unudulmayacağını diqqətə çatdırır.

Bəllidir ki, xalq Yezidən son dərəcə çox nifrət bəslədiyindən el içində Kərbəla qatilləri Yezidlər şəklində ümumiləşdirilmişdir. Bu, bir növ yezidlər – Yezid əqidəsini daşıyanlar kimi də başa düşülür. Bu dərk İmam Hüseynin (ə): "Mənim əqidəmdə olan şəxsiyyətlər Yezidin əqidəsində olan şəxslərə beyət etməz!" – sözünə söykənir.

Ancaq bu yozumu şübhə altına almamaqla yanaşı aydın şəkildə bildirilməlidir ki, deyimin el variantı burada daha çox yerinə düşür.

Şah İsmail mənsub olduğu xalqın bir fərdi kimi, Yedizə gör nə qədər dərin nifrət bəsləmişdir ki, mürəbbilərin birində bu nifrəti aparıcı misraya çevirmişdir:

*Mən onu bilmişəm qövli Xudadır,*
*Onunçün oxuram lənət Yezidə.*
*Yezidə lənət etmək həm səzadır,*
*Onunçün oxuram lənət Yezidə.*

*Cahan fəxri Məhəmməd Mustafadır,*
*Əliyyəl-Mürtəza, şiri-Xudadır.*
*İmamçün Həsən xülqi-Rzadır,*
*Onunçün oxuram lənət Yezidə.*

*Hüseyni Kərbəladır dürrü-gövhər,*
*İmam Zeynül-İbadur, sirri-Heydər.*
*Məhəmməd Baqir pak-sərvər,*
*Onunçün oxuram lənət Yezidə.*[1]

Bəllidir ki, Tasuadan Aşuraya keçən gecə İmam Hüseyn Ağa (ə) ətrafındakıların hamısının üzərindən beyəti götürərək onlara "Gecənin qaranlığını dəvə kimi minin gedin!" – deyə səslənmiş, onları Kərbəla çölündən uzaqlaşmağı çağırmışdır. Bu zaman o din böyüyünün ətrafında olan yüzlərlə silahlı şəxs çıxıb getmiş, yalnız Ağanın sadiq silahdaşları qalmışdır.

Gəraylının üçüncü bəndində məhz, bu tarixi hadisəyə işarə edilir. Bənddə diqqəti çəkən başqa bir cəhət İslamın şəhidlik və cihad konsepsiyalarının Kərbəla vaqiəsinin və İmam Hüseyn (ə) hərəkatının başlıca ideoloji mənbəyi olaraq bədii qavrayışa təqdim edilməsidir. Aşağıdakı Quran ayələri bu konsepsiyaların aparıcı keyfiyyətlərini özündə birləşdirir. ("Bəqərə", 154; "Ali İmran", 169-170; "Tövbə", 111; "Səff", 4, 10, 12).

Dördüncü bənddə Aşura gününün "əsr namazı"ndan sonrakı mənzərəsi əks olunur.

Məqtəllərdə deyildiyinə görə Xanım Zeynəb (s.ə) İmam Zeynəlabidindən (ə) soruşduqda ki, biz indii nə edək, haraya gedək, kimə pənah aparaq?. O din böyüyü "Bibican, Sizin yeganə çıxış yolunuz Kərbəla çöllərinə səpələnməkdir!" – deyə cavab verir. "Kərbəlanın yazıları" misrası bu hadisəyə işarədir.

"Fatma ana quzuları" isə İmam Hüseynin (ə) anası Xanım Faimeyi-Zəhranı (s.ə) şeirə gətirdiyinə görə mərsiyəni bir qədər də təsirli etdiyi üçün çox yerinə düşür. Digər tərəfdən bu misra Kərbəla şəhidlərindən bilavasitə 17-nin Əhli-beyt (ə.m) nümayəndələrini olmalarını xatırladır. Bu isə, bir yandan şairin Əhli-

[1] Şah İsmail Səfəvi (Xətai) külliyyatı. Qəzəllər, qəsidələr, nəsihətnamə, dəhnamə, qoşmalar. (Tərtibatçısı: Mirzə Rəsul İsmailzadə). Bakı, Əlhuda, 2004. səh. 310

beytə (ə.m) bəslədiyi xüsusi məhəbbətə dəlalət edir, bir yandan da gəraylıya bütövlükdə həzin bir matəm abu-havası gətirir.

Gəraylının beşinci bəndi sadə və şirin bir xalq mahnısını xatırladır. Yada sal:

*Evlərinin dalı qaya,*
*Qaladan baxırlar aya,*
*Mənim yarım Ağca maya,*
*Üç telli, dörd telli, beş telli durna.*

Şair Kərbəla şəhidlərinin dərdindən gecələri yatmamasını olduqca obrazlı bir şəkildə ifadə edə bilmişdir. “Gecələr mənə gündüz”.

“Şah Kərbəlada yalqızdır” misrası isə klassiklərimizin şah sözü ilə bəzən İmam Hüseyni (ə) də nəzərdə tutduqlarını göstərmək kimi zahiri əlamətlə yanaşı. İmam Hüseyn (ə) Ağanın Həzrəti-Abbasdan və Əli-Əkbər Ağadan sonra tamamilə tək-tənha qalması batini məsələni də bəhs mövzusuna çevirir.

Altıncı bənddə şair Kərbəla vaqiəsinin faciəsini miqyas genişliyi üsulundan istifadə etməklə kainat səviyyəsinə qaldırır.

“Göydə ulduz paralandı” misrası məhz, bundan soraq verir. Lakin, mərsiyə üçün yeni olan cəhət Şəhrəbanu adının çəkilməsidir. “Şəhrəbanu qaralandı” misrası bir tərəfdən bu xanımın soy kökünün ali zadəgan nəslindən gəlməsinə, bir tərəfdən də murdar və idbar Yezid qoşunun əlsiz-ayaqsız Əhli-beyt (ə.m) xanımlarının xeymələrini talamasına işarədir.

Mərsiyənin növbəti bəndində İmam Hüseynin (ə) Zülcənah adlı atı bəhs mövzusuna çevrilir. Bəllidir ki, İslam dini ən böyük cihad vəsiləsi olaraq ata olduqca böyük önəm verir. Qurani Kərimin “Adiyat” (dırnaqları ilə qığılcım qoparan atlar) adlı 100-cü surəsi bunun ən bariz təzahürüdür:

“And olsun tövşüyə-tövşüyə çapanlara!; And olsun dırnıqları ilə qığılcım çıxaranlara, And olsun sübh çağı həmlə edənlərə ki, hücuma keçərək, tozanaq qaldıraraq, qoşunun içərisinə soxulur-

lar”. (“Adiyat”, 1-5)

İmam Hüseynin (ə) atının Mədinəyə qaçmasının bildirilməsi bəndin din və folklorun sinkretik sintezinin üzərində qurulduğunu sübuta yetirir. Bəllidir ki, at istər Azərbaycan şifahi xalq ədəbiyyatında, istərsə də ərəb folklorunda işlək və çevik bir motivdir. “At mürazdır”. “At igidin qardaşıdır”, “İgid odur atdan düşüb-atlana, İgid odur, hər əzaba qatlana”, “Bir mıx bir nalı, bir nal bir atı, bir at bir igidi, bir igid bir eli saxlar” kimi folklor vahidləri bunu göstərir.

Növbəti bənddə Kərbəlanın məşhur sususzluq motivi önə çəkilir. Çox güman ki, birinci misra yaşca ən kiçik Kərbəla qurbanı olan Əli-Əsğər Ağaya işarədir. Məqtəllərdə bildirildiyinə görə İmam Hüseyn (ə) Ağa Əli-Əsğərin körpə qundağını qucağına alıb qoşunun ön sıralarına gəlir: “Bir damcı su verməklə Peyğəmbər (s) balasının boynuna minnət qoyun və bununla da onun cansız əşyaya çevriməsinin qarşısını alın!” – deyə düşmən qoşununa səslənir. Düşmən qoşununun cavabı isə məlun Hərmələ ibn Kahilin üçşöbəli oxla Əli-Əsğər Ağanın mübarək boğazını üzməsi olur.

“Yezid içdi qana-qana” misrası isə Yezid idarə üsulunun qan içənliyi ən adi idarə metoduna çevrilməsinə işarədir. Bəndin üçüncü misrasında yenidən xanım Fatimeyi-Zəhranın (s.ə) xatırlanması bu faciənin köklərinin o din böyüyünün yaşadığı çağlara gedib çıxdığına işarədir. Belə ki, yüksək səviyyəli oxucu burada “Ğədir-Xum” hadisəsini, “Fədək əhvalatı”nı və başqa bu kimi motivləri dərhal xatırlayacaqdır. Bu mərsiyə-gəraylı əsl ağı kimi ağıçıya işarə ilə bitir.

“Kərbəlada bitər yonca” – Yoncanın çox uzun ömürlü bir bitki olması hamıya bəllidir. Şair burada yoncanı şeirə gətirməklə Kərbəla vaqiəsinin heç vaxt unudulmayacağına, həmişə tazə-tər qalacağını, daim onun üçün ağlayanlar olacağını bildirir.

Filologiya üzrə fəlsəfə doktru Vərağa Almasov 2016-cı ildə çap etdirdiyi “İmam Hüseyn aşiqi Füzuli” monoqrafiyasında Kərbəla vaqiəsinin bədii ədəbiyyatımızdakı əksi məsələsini kök-

lü biçimdə qoyub həll etdiyindən, biz alimin böyük zəhmətini təqdir edərək yuxarıdakı mərsiyənin daha yaxşı qavranılması üçün ədəbi-ictimaiyyətin həmin kitaba müraciət etməsini tövsiyə edirik.

Bu deyilənlər danılmaz biçimdə göstərir ki, Ş.İ.Xətainin heca vəznli şeirlərinin Əhli-beyt (ə.m) payı mövzuca geniş, məzmunca dərin, məfkurəcə möhkəm bədii –ifadə vasitələri ilə zəngin, dil-üslub xüsusiyyətləri ilə dolğun və folklordan barınma baxımından tutumludur. Odur ki, bu şeirlərin hər biri qulağa xoş gəlir, zövq oxşayır, könül xoşlandırır və qəlb sevindirir.

## 3.10. XƏTAİ POEMALARINDA ƏHLİ-BEYT (Ə) ANLAYIŞININ BƏDİİ ƏKSİ

Şah İsmail irsini səciyyələndirən başlıca cəhətlərdən biri də onun rəngarəng, lirik şeirlərlə yanaşı iki poema da yazmasıdır. "Dəhnamə" və "Nəsihətnamə" adlı poemalar Azərbaycan ədəbiyyatı tarixində xüsusi yer tutur. Bu əsərlərdə Əhli-beyt (ə.m) məhəbbətinin şairin şəxsiyyətinin ayrılmaz tərkib hissəsi olduğunu danılmaz biçimdə bir daha göstərir.

"Dəhnamə" – Ş.İ.Xətainin həcm etibarilə ən böyük əsəri olub 1532 beytdən ibarətdir. "Dəhnamə" adı ilə daha çox şöhrət tapan bu əsər ilk mənbələrdə "Aşiq və Məşuq" kimi də tanınmaqdadır. Lakin, "Dəhnamə" yalnız məhəbbət dastanı deyil, əsərin əxlaqi təlimi və tərbiyəvi əhəmiyyəti də vardır. "Dəhnamə" nin yazılış tarixi haqda poemanın sonunda aşağıdakı qeyd vardır:

*Hicrində çü "zad"ü "nun" keçdi.*
*"Sin"dən dəxi bir füzun keçdi.*

Bu misralardan "Dəhnamə" məsnəvisinin əbcəd hesabı ilə hicri tarixi 911-ci il, yəni 1506-cı ildə yazılması anlaşılır.[1]

Xətai "Dəhnamə"ni 18 yaşında bir gənc ikən qələmə almışdı və "Dəhnamə" Azərbaycan ədəbiyyatında doğma dildə ilk poemalar sırasındadır. Az sonra dahi Füzuli Azərbaycan dilində klassik epik şeirin zirvəsi sayılan ölməz "Leyli və Məcnun" əsərini yaradacaqdı. Lakin, hələlik məhz, Xətai bu yönümdə başlanğıc pilləyə qədəmini qoyanlardan oldu. Birincilər isə heç zaman unudulmurlar. Xətai "Dəhnamə"si yalnız Azərbaycan dilində ilkin epik nümunələrdən olduğu üçün qiymətli deyil, o, həm də Vətənini, xalqını sevən Azərbaycanlı şairin ürək döyüntülərinin, doğma yurda, elinə –obasına məhəbbətinin bədii təzahürü kimi

---

[1] Əzizağa Məmmədov. İzahlar. // Şah İsmayıl Xətai. "Əsərləri". İki cilddə, 2-ci cild. (Tərtib, müqəddimə, lüğət və izahlar: Əzizağa Məmmədov). Bakı, "Azərnəşr", 1976. səh. 178-179

misilsizdir. Xalq adət-ənənələri, xalq məişətinin cizgiləri "Dəhnamə" də elə canlı lövhələrlə təsvir olunur ki, bu həyatı duyursan, görürsən…

*Daylar tülədi buraxdı yalı,*
*Kişnər çalağan, qulun misalı,*
*Quzuladı qoyun, töküldü döllər,*
*Yaylax həvəsini qıldı ellər.*[1]

Hökmdar-sərkərdə Xətai sanki xalqın lap içsərilərinə girmiş, əhalinin köçəri hissəsinin belə yaşayışına nüfuz etmişdir. Əslində bu belə də olmuşdur. Şah Xətai elə xalqın içərisində də boya-başa yetmişdir. Burada bir sıra müəyyən tarixi siyasi hadisələrin gedişi də az əhəmiyyət kəsb etməmişdir.

"Dəhnamə"də Azərbaycanın zəngin təbiəti, çeşməli, sulu bağları, nərgizli laləli çölləri, yamacları dərin bir vətənpərvərlik hissi ilə tərənnüm olunub. Şairin qələmə aldığı təravətli, əlvan bahar lövhələri insanın gözlərini oxşayır:

*Sərv etdi çəməndə sərfərazı,*
*Gül cilvələnir başında nazı.*
*Çıxmış budaq üstə əndəlibi,*
*Mənbərdə oxur çəmən xətibi.*
*Cular axıdır çəməndə hər su,*
*Nərgiz gülünün gözündə uyqu.*
*Al ilə yaşıl geyindi bağlar,*
*Ağ ləçəyi sərpə saldı dağlar.*
*Süsən qılıc aldı bi xəncər,*
*Eyş etməyənin gözünə sancaq.*[2]

---

[1] Azadə Rüstəmova. "Xalq yaradıcılığı Xətai şeirinin estetik qaynaqlarından biri kimi" // "Şah İsmayıl Xətai". (Məqalələr toplusu). Bakı, "Elm", 1988. səh. 96

[2] Azadə Rüstəmova. "Xalq yaradıcılığı Xətai şeirinin estetik qaynaqlarından biri kimi" // "Şah İsmayıl Xətai". (Məqalələr toplusu). Bakı, "Elm", 1988. səh. 97

"Dəhnamə" əsəri ənənəvi hissələrlə başlanır:

"Tovhidi-həqq", "Zikri-tələbi-rəhmət" (bağışlanılmağını istəmək haqqında), "Dər nəti-rəsul", "Dər mənqəbəti-Şahi-mərdan Əli" (Əlinin tərifi), "Mürəbbe", "Fi zikri əsmai əimmi" – 12 İmamın tərifi.

Göründüyü kimi əsər sırf dini məzmunda olan 6 hissə ilə başlanır.Bu hissələrdə Əhli-beyt (ə.m) özünün bütün səciyyəvi keyfiyyətləri ilə öndədir. Belə ki, Tovhid Allahın varlığına və birliyinə inam, bəndəlik özünüdərki, əfv diləmə və sair motivlər burada məhz, Əhli-beyt (ə.m) çevrəsində birləşməkdədir.

22 bənddən ibarət olan "Mürəbbə" bölümü bu xüsusiyyətlərin hamısının özündə birləşdirdiyindən burada onu ayrıca təhlil etməyi məqsədə uyğun hesab edirik:

***Şah iki cahanın əfzəlidir,***
***Allahın əli, anın əlidir.***
***Ol söz ki, zəmanə heykəlidir,***
***Allahü Məhəmmədü Əlidir.***

***Olmağ diləsin işin mülayim,***
***Olgil Əlinin işinə qayim.***
***Kim əhli-həqin dilində dayim,***
***Allahü Məhəmmədü Əlidir.***

***Ol sirri-vilayətü kəramət,***
***Sahib hünərü-düri-vilayət.***
***Həqqi sevənə qılan himayət***
***Allahü Məhəmmədü Əlidir.***[1]

---

[1] Şah İsmayıl Xətai. "Keçmə namərd körpüsündən" (Şeirlər və poemalar). Bakı, "Yazıçı", 1988. səh. 226-228

1. (Həzrəti-Əli (ə) (Şah) hər iki dünyanın ən fəzilətli şəxsiyyətidir. Çünki, onun əli ilahi qüdrət və hikmətə malikdir. Zəmanənin heykəlini, yəni hadisələrin, proseslərin gedişatını və məğzini təşkil edən əsas düstur və başlıca xətt Allah "Allah Məhəmməd və Əli" sözlərində əksini tapan "Tovhid", "Peyğəmbərlik" və "İmamlıq" fəlsəfəsidir.

2. (Əgər insanlarla orta yolla rəftar etmək istəsən Əlinin (ə) həyat və fəaliyyətini özün üçün örnək götür. Çünki, xalis Allah bəndələrinin dilinin daimi virdi, (zikri) "Allah", "Məhəmməd" və "Əli"dir).

3. (O vilayət və kəramət sirri hünər sahibi və vilayət incisi olan Həzrəti-Əlidir (ə). Könlündə ilahi sevgi olanlara daima kömək edən "Allah", "Məhəmməd" və "Əli"dir).

***Gər dilər isən olasan adəm,***
***Xəlq içrə sözün ola mükərrəm,***
***Yad et duayi-ismi-əzəm:***
***Allahü Məhəmmədü Əlidir.***

***Övqati-cəmadü virdi-heyvan,***
***Bər ruyi-zəminü çərxi-eyvan,***
***Təsbihi-mələk, duayi-insan***
***Allahü Məhəmmədü Əlidir.***

***Səhradə zəbani-hər giyahi,***
***Dəryadə həmişə zikri-mahi,***
***Hacət diləyəndə, ya İlahi***
***Allahü Məhəmmədü Əlidir.***

***Murü məgəsü tüyurü zənbur,***
***Huşyarü divanə, məstü məxmur,***
***Hər şamü səhər dilində məzkur***
***Allahü Məhəmmədü Əlidir.***

4. (Əgər kamil insan olmağını və sözünün cəmiyyətin müxtəlif təbəqələrinə təsir göstərməsini istəyirsənsə, "İsmi-əzəm" duasının "Allah", "Məhəmməd" və "Əli"dir kəlmələrindən ibarət olduğunu bir an belə unutma).

5. (Cansızların vaxtı, zamanı, məqamı və heyvanların özlərinə görə Allaha təşəkkürü, yer üzündə və göylərin eyvanında, mələklərin təsbihi və insanların duası "Allah", "Məhəmməd" və "Əli"dir).

6. (Çöllərdə hər bitki öz dilində, dənizlərdə balıqlar öz zikrində "Ya Rəbb!" deyib Allahdan bir şey dilədikləri zaman o üç kəlməni dilə gətirirlər: "Allah", "Məhəmməd" və "Ya Əli!").

7. (Qarışqa, milçək, quşlar və arılar, kamil və qeyri-kamil şəxslər, bütün sərxoş və xumarlı adamlar, onların hamısının dilində səhər-axşam "Allahü", "Məhəmməd" və "Əli"nin zikridir).

***Əsrari-məqami-qabi-qövseyn,***
***Gözlərdə rəvaqi-qürrətül-eyn,***
***Dillər diləki, muradi-kövneyn***
***Allahü Məhəmmədü Əlidir.***

***Hər şey ki, yaratdı dər du aləm,***
***Adəm dəmidin be dövri-xatəm,***
***Zikrində həmin səbahü əxşəm***
***Allahü Məhəmmədü Əlidir.***

***İqbali-üməm, kəmali-taət,***
***Ənvari-hüda, çirağı-dövlət,***
***Miftahi-kəlid, babi-cənnət***
***Allahü Məhəmmədü Əlidir.***

***Yazıldı vəlilər adı üstə,***
***Həm Zülfiqarın poladı üstə,***
***Cəbraili-Əmin qanadı üstə***
***Allahü Məhəmmədü Əlidir.***

8. (Qabi – qövseyn məqamının sirləri, ğürrətül – eyn (göz aydınlığı) parlaqlığının gözlərdə əksi, hər iki cahanın yaradılış məqsədinin ürəklərdəki əks-sədası “Allah”, “Məhəmməd” və “Əli”dir).

9. (Allah-təalanın iki dünyada yaratdığı şeylərin hamısı – Aədmin ilk nəfəs çəkməsindən tutmuş, ta sonuncu Peyğəmbərin (s) yaşadığı “əsli-səadət” (xoşbəxtlik zamanı) adlanın sonuncu dövrədək, eləcə də Qiyamətə kimi səhər-axşam, gecə-gündüz “Allah”, “Məhəmməd” və “Əli”nin zikrindədir).

10. (İmamların bəxt-taleyi və ardıcıllarının onlara etdiyi tamam-kamal itaət, hidayət nuru və səadət çırağı, qıfılın açarı və cənnət qapısı “Allah”, “Məhəmməd” və “Əli”dir).

11. (“Allah”, “Məhəmməd” və “Əli” kəlmələri övliyaların adları, “Zülfüqar”ın poladı, əmin Cəbrailin qanadı üzərində yazılmışdır).

***Mömində nihadi-əsli-iman,***
***Həm dəfi-bəlayi-şərri-şeytan,***
***Həqdən səbəbi-nüzuli-fürqan***
***Allahü Məhəmmədü Əlidir.***

***Qəlxani-qəza-zəmani-möhlət,***
***Tiği-kərəmü kəmani-nüsrət,***
***Ümmidi-cəhan, şəfii-ümmət***
***Allahü Məhəmmədü Əlidir.***

***Həm mötəkifin könüldə fikri***
***Həm sufilərin dilində şükri,***
***Həm qazilərin qəzadə zikri***
***Allahü Məhəmmədü Əlidir.***

12. (Mömünin köklü surətdə imana malik olması şeytanın şər və bəlasını aradan qaldırmaq, “Fürqan”ın Allah tərəfindən gəlməsinin səbəbi “Allah”, “Məhəmməd” və “Əli”dir).

13. (Qəzavü-qədərə qalxan və əvvəlcədən möhlət, könül genişliyi və əliaçıqlıq qılıncı və yardım yayı üçün bütün dünya insanlarının yeganə ümidi və ümmətin şəfaətçisi "Allah", "Məhəmməd" və "Əli"dir).

14. (Etiqad edənlərin könüllərindəki ən gizli fikirlər, sufilərin dillərində etdikləri şükr, qazilərin də döyüş zamanı etdiyi zikrlər "Allah", "Məhəmməd" və "Əli"dir).

***Möminlərə yarü ğəmgüsari,***
***Üsyan qışının gözəl bəhari,***
***Ərşin dirəgi, yerin qərari***
***Allahü Məhəmmədü Əlidir.***

***Başlarda hümayi-taci-dövlət,***
***Mərvanə bəla, Yəzidə lənət,***
***Həm qazilərin qolunda qüvvət***
***Allahü Məhəmmədü Əlidir.***

***Fəxrü şərəfü nüfusi-əyyam,***
***Zikrü, həvəsi-xəvasü əvam,***
***Nəqşi-ələmi-dəvazdəh imam***
***Allahü Məhəmmədü Əlidir.***

15. (Möminlərin dostu və dərd bölüşdüyü sığınacaq yerləri "Üsyan qışının gözəl baharı", Allah ərşinin sütunu və yer kürəsinin oxu "Allahü", "Məhəmməd" və "Əli"dir).

16. (Başlarda hökmdarlıq tacının quşu, məlun Mərvan üçün Allahdan istənilən bəla və Yezidə yönəldilən ilahi lənət və eləcə də döyüşlərdə qazilərin qollarna verilən qüvvət "Allahü", "Məhəmməd" və "Əli"dir).

17. (Zəmanə insanlarının fəxr və şərəfi, xüsusilərin və ümumilərin. böyük simalarla adi adamların həvəslə etdikləri zikr, on iki imam bayrağındakı yazı "Allahü", "Məhəmməd" və "Əli"dir).

***Mətlubi-ibadətü şəriət,***
***Məzmuni-iradətü təriqət***
***Məqsudi-həqaiqü həqiqət***
***Allahü Məhəmmədü Əlidir.***

***Musayə mədəd qılan əsanı,***
***Həm Xızra həyati-cavidanı,***
***İsa dəmi, Nuh gəştibanı***
***Allahü Məhəmmədü Əlidir.***

***Yəqubi ğəm ilən ağladan zar,***
***Yusifə verən cəmali-rüxsar,***
***Həm odu qılan Xəlilə gülzar***
***Allahü Məhəmmədü Əlidir.***

18. (İbadət və şəriətdən güdülən ilahi məqsəd, müridlərin istəkləri və mürşidlərin göstərdikləri yolların məzmunu, həqiqətlər həqiqətinin, gerçəkliklər gerçəkliyinin məğzi, mahiyyəti, substansiyası “Allahü”, “Məhəmməd” və “Əli”dir).

19. (Əsanı Musanın köməyinə verən də, Xızra (ə) əbədi həyat bəxş edən də, İsa nəfəsi də, Nuh (ə) gəmisi də “Allahü”, “Məhəmməd” və “Əli”dir).

20. (Yəqub peyğəmbəri (ə) qəm içərisində zar-zar, yana-yana ağladan da, Yusifə gözəl camal bəxş edən də, Nəmrudun qaladığı odu İbrahim üçün çəmənliyə çevirən də “Allahü”, “Məhəmməd” və “Əli”dir).

***Qəmxari-əmanü hövli-məşhər,***
***Əllər dutuban siratə rəhbər,***
***Mizanda ağır, behiştə yavər***
***Allahü Məhəmmədü Əlidir.***

***Şəh qullarının ümidgahı,***
***Dünya billə üqba padşahı,***
***Biçarə Xətayinin pənahı***
***Allahü Məhəmmədü Əlidir.***

21. (Məhşər qorxusunun amanda saxlayanı və qəm azaldanı, sirat körpüsünü keçərkən əllərin yapışacağı qüvvələr, tərəzidə ağır gələn və cənnətdə kömək olan "Allahü", "Məhəmməd" və "Əli"dir).

22. (Hökmdar təbəələrinin, Həzrəti-Əli (ə) ardıcıllarının ümid yeri dünya və axirətin hökmdarı, çarəsiz Xətainin sığınacaq yeri "Allahü", "Məhəmməd" və "Əli"dir).

Daha çox bu şeirə xas olan cəhətlər aşağıdakılardır:

1. Tovhid, Peyğəmbərlik və İmamlıq fəlsəfəsinin vəhdəti;
2. Orta yolla getmək üçün Həzrəti-Əlinin (ə) həyat və fəaliyyətini örnək götürmək;
3. Həzrəti-Əlinin (ə) vilayəti;
4. Həzrəti Əlinin (ə) kəramətləri;
5. "İsm-əzəm"də Həzrəti-Əlinin (ə) adının yer alması.
6. Bu üç sözün açar olaraq mələklərin təsbihi və insanların duasını birləşdirməsi.
7. Tovhid, Peyğəmbərlik və İmamlıq fəlsəfəsnin vəhdətinin kainatın özəyini təşkil etməsi.
8. Bu üç sözün əbədiyyət nişanı olması;
9. Bu üç sözün axirəti də əhatə etməsi.
10. Bu fəlsəfə bütün dini müqəddəsatı özündə birləşdirir.
11. Bu fəlsəfə şeirdə Qurani-Kərimlə əlaqələndirilir.
12. Şeirdə bu fəlsəfə İslamın ümid və şəfaətlə bağlı görüşlərinə də aid olunur.
13. Bu üç söz etikaf – ibadət növü, sufilik və qaziliklə üzvi uyarlıqda təqdim edilir.
14. Bu üç söz ərş və fərş anlayışları üzərində mənalandırılır.
15. Tovhid, Peyğəmbərik və İmamlıq fəlsəfəsinin Mərvan və Yezidin timsalında həyata konkret tətbiqinə çağırış.

16. On iki imam bayrağının bu fəlsəfə ilə bağlanılması.
17. Fəlsəfə ibadətlə də əlaqələndirilir.
18. Fəlsəfənin təsəvvüf təriqətləri üzərində mənalandırılması.

Bu motiv təkcə Xətai yaradıcılığında deyil, onun xələfləri və sələflərinin yaradıcılığında da öz əksini tapmışdır. Sələfi Azərbaycanın böyük filosof şairi S.İ.Nəsimi "Nədir" rədifli qəzəlində yazır:

*Dörd müxalif cəm olanda bil ki, əsması nədir?*
*Elm ilə bilgil anın ismi-müsəmması nədir?*[1]

(Bir -biri ilə ziddiyyət təşkil edən dörd şey bir yerə toplandıqda arif şəxs gərək onun adını mütləq bilsin. Həmin ad isə kodlaşdırılaraq gizli şəkildədir. Odur ki, bunu yalnız batini elmlər vasitəsilə bilmək olar).

"dörd müxalif" dedikdə şair aşağıdakı cəhətləri nəzərdə tuta bilərdi:

a) Su, od, torpaq, hava; b) Şəriət, Təriqət, Mərifət, Həqiqət;

Həzrəti-Məhəmməd (s) buyurmuşdur: "Şəriət mənim sözlərim, Təriqət mənim əməllərim, Həqiqət mənim real vəziyyətim, gerçək durumum, Mərifət (Allahı tanımaq) isə sərvətimin başı, yəni varlığımın mahiyyətini təşkil edən mənəvi-əxlaqi resursum, ehtiyat mənbəyim, müsbət gücüm və pozitiv enerjimdir".[2]

Aşağıdakı beyt bu fikrin şairin yaradıcılığında geniş yer tutduğunu danılmaz biçimdə sübuta yetirir:

*Həm Şəriətlə Təriqət, həm Həqiqət, Mərifət,*
*Ayətul-elmul-yəqin, elm ilə Qurandır Əli.*

---

[1] İmadəddin Nəsimi. "Seçilmiş əsərləri". Bakı, "Azərnəşr", 1973. səh. 464
[2] V.Almasov, H.H.Hüseyni. "Nəsimidən nəsimlər". I cild. Bakı, "Ecoprint", 2020. səh. 64-65

1. Fəlsəfənin keçmiş ümmətlərin peyğəmbərləri üçün də bəlli və qüvvədə olması fikrinin irəli sürülməsi.
2. Şeirdə fəlsəfənin axirət tərəfi də qeyd olunur.
3. Fəlsəfənin Əhli-beyt (ə.m) anlayışının Ş.İ.Xətai şəxsiyyətinə təsirinin də vurğulanılması.

Əlbəttə, bu cəhətlərin hər biri ilə bağlı, ayrıca olaraq da geniş şəkildə mühakimə yürütmək mümkündür. Ancaq biz burada bu cəhətlərin yalnız bilavasitə Şah İsmail şəxsiyyəti ilə bağlı olanlarına toxunmaqla kifayətlənəcəyik.

Bəllidir ki, Səfəvilər dövlətinin ideologiyası Tovhid, Peyğəmbərlik və İmamlıq fəlsəfəsi üzərində qurulmuşdur. Fuad Qasımzadə Axund Hacı Soltan Hüseynqulu oğlunun "Ş.İ.Xətai" kitabının 1997-ci il nəşrində "Siyasət, sənət və elm müsəxxiri" adlı məqaləsində yazırdı: "Dünyanın neçə-neçə böyük dühaları, görkəmli tarixi şəxsiyyətlər Şah İsmailin adını çəkmiş, əsasən tərifləmiş. çox yüksək qiymətləndirmişlər. Lakin, çox təəssüf ki, Ş.İ.Xətaidən bəhs edən müəlliflərimizdən heç biri böyük ingilis filosofu Frensis Bekonun Şah İsmail haqqında qiymətli sözlərinin olduğunu deməmişlər. O, 1597-ci ildə nəşr olunmuş "Mənəvi və siyasi təcrübələr və ya öyüdlər" adlı əsərinin "Gözəllik haqqında" adlanın paraqrafında yazır ki, "İran şahı İsmail ülvi və müəzzəm ruha malik idi və öz zəmanəsinin ən gözəl adamlarından olmuşdur".[1]

Yenə də həmin əsərin "Şərəf və şöhrət haqqında" hissəsində isə deyir ki, mən yüksək hakimiyyətə malik olan adamları şöhrət pilləkənində bu qaydada düzərdim: Birinci yerdə dövlətlərin və birliklərin Romul, Kir, Sezar, Osman, İsmail kimi baniləri.

Pak və ülvi şəxsiyyət, əsl qüdsi xarakterinə malik olan böyük alim, yazıçı və mütəfəkkir, ilk maarifçimiz A.Bakıxanov (Qüdsi) "Gülüstani-İrəm"də yazır ki, Şərq yazıçıları Şah İsmaili dost-

[1] Fuad Qasımzadə. "Siyasət, sənət və elm müsəxxiri" // Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. "Şah İsmayıl Xətai" (xronoloji-tarixi məlumatlar). Bakı, "Ozan", 1997. səh. 5

larını nurlandıran, düşmənlərini isə yaxıb-yandıran bir günəşə bənzədirlər. O, özünün yaratdığı böyük dövlətin işləri ilə məşğul olmaqdan başqa digər elmlərlə də məşğul olur, üləmalarla görüşür və Xətai təxəllüsü ilə xalq arasında indi də yaşayan əsərlər yazır.

Ş.İ.Xətai haqqında sanballı tədqiqatları olan Əzizağa Məmmədov üç cildlik "Azərbaycan ədəbiyyatı tarixi"nin birinci cildində Xətaidən bəhs edən hissədə yazır ki, XIX əsrin əvvəllərindən başlayaraq Qərbi Avropa şərqşünasları Xətaidən danışır və bu sahədə az-çox iş görmüş alimlər arasında Hammerin, Şarl Rayonun, Gibbin, E.Braunun və F.Babingerin adlarını çəkir.[1]

Həqiqətən də ədəbiyyat tarixçilərimiz onu "Xətai" təxəllüslü şair kimi tədqiq edir. O, ədəbiyyat dərsliklərimizdə doğma Azərbaycan dilində yazan lirik bir şair kimi qeyd olunur, öyrənilirdisə bir sıra tarixi və siyasi məzmunlu yazılarda "işğalçı", şah və hökmdar kimi pislənilirdi.[2]

Məgər "işğalçılıq", müharibələr aparmaq, hər hansı bir hökmdarı pisləmək üçün, onun barəsində birtərəfli söz söyləmək üçün əsasdırmı? Əlbəttə, yox. Əvvəla, ona görə ki, müharibələri müdafiə məqsədi ilə də aparmaq olar. Yəni ədalətli müharibə. İkincisi, "işğalçılığın" özünə siyasi mənafe, "sinfilik", uydurma, "partiyalılıq" mövqeyindən yanaşmaq olar və bu barədə nümunələr də az deyil.

Üçüncüsü, "işğalçı" hökmdarın kim olduğuna, nələr etdiyinə, tarixdə nə kimi rol oynadığına da gərək fikir verilsin.[3]

---

[1] Fuad Qasımzadə. "Siyasət, sənət və elm müsəxxiri" // Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. "Şah İsmayıl Xətai" (xronoloji-tarixi məlumatlar). Bakı, "Ozan", 1997. səh. 5-6

[2] Fuad Qasımzadə. "Siyasət, sənət və elm müsəxxiri" // Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. "Şah İsmayıl Xətai" (xronoloji-tarixi məlumatlar). Bakı, "Ozan", 1997. səh. 6

[3] Fuad Qasımzadə. "Siyasət, sənət və elm müsəxxiri" // Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. "Şah İsmayıl Xətai" (xronoloji-tarixi məlumatlar). Bakı, "Ozan", 1997. səh. 7

Məgər tarixdə azmı işğalçı hökmdarlar olmuşdur? Əksəriyyəti məhz, işğalçı olmuş, bununla belə tarixdə mühüm yer tutmuş, şöhrətlənmişlər və onları öz xalqları heç də pisləmir. Şərqdə Çingiz, Batı, Teymur öz geniş işğalçılıqları, böyük dövlətlər yaratmaqları ilə tanınmamışlarmı? Avropada ən böyük işğalçılardan biri kimi tanınmış Napoleon bütün dünyada məşhur deyilmi? Fransızlar Parisə gələn qonaqlara ondan fərəhlə danışır, qəbrini qürurla göstərirər. II Dünya Müharibəsinin qan içməkdən doymayan səbəbkarları on milyonlarla günahsız adamın ölümünə, milyonların şikəst olmasına, neçə-neçə ölkələrin dağılmasına səbəb olublar. Amma, bunlara bəraət qazandırılır.

Rusiyanın özündə işğalçı hökmdarların adı böyük bir qürurla çəkilir. İvan Qroznı Kazan və Həştərxan xanlıqlarını, Sibirin bir çox torpaqlarını tutmadılarmı? I Pyotr azmı yerləri işğal etdi. I Aleksandr Gürcüstanı, Azərbaycanı, Fillandiyanı, Bessarabiyanı, Varşava hersoqluğunu tutdu. Eləcə də digər Rusiya çarları. Amma, onlar heç də pislənmir. Fəxr və qürurla yad edilirlər.[1] Bu bəraət onunla əsaslandırılır ki, bu yürüşlər böyük imperiyaların yaranmasına, şan-şöhrətə xidmət edir. İmperiya yaratmaq, dövlət və siyasi təsisatlar qurmaq böyük əzm, zəka və güc tələb edir. Etiraz edilə bilər ki, insanlar dövlət yaratmazdan əvvəl sürü halında daha xoşbəxt idi. İnsan sürüdən yaranıb və sürüyə də dönəcək. “Dövlət zor aparatıdır” – imperiya isə daha pis. Dövlət insanların tabeçiliyidir – imperiyalar isə dövlətlərin tabeçiliyi.

Bəli, düzgün arqument kimi görünə bilər. Amma, dövlətsizlik də anarxiyaya yol aça bilər. Hətta, ən pis dövlət dövlətsizlikdən yaxşıdır. “Dövlət ona görə yaranmır ki, ölkəni abad eləsin, ona görə zəruridir ki, ölkəni xarabazara çevrilməyə qoymasın”. Bu da politoloqların yekun fikridir. Dövlət qurmaq baxımından bu ağır yükü öz çiyninə götürdüyündən Ş.İ.Səfəviyə hələ bundan

---

[1] Fuad Qasımzadə. “Siyasət, sənət və elm müsəxxiri” // Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. “Şah İsmayıl Xətai” (xronoloji-tarixi məlumatlar). Bakı, “Ozan”, 1997. səh. 7

sonra daha çox ehtiram bəslənəcək. Çünki, onun gördüyü işin müsbət nəticələrini hələ uzun zaman Azərbaycan xalqı dadacaq.

Məşhur filosov M.Şahtaxtınski deyirdi: “Roma imperiyasının məhv olduğunu düşünənlər səhv edir. Bu gün Avropanın bütün siyasi təsisatlarında Roma ruhunu görmək mümkündür”. Bu fikirdən çıxış edərək bildirirəm ki, Səfəvi imperiyasının məhv olduğunu düşünənlər səhv edir. Bu gün Azərbaycan adlı müstəqil bir dövlət mövcuddursa onun mayasında Səfəvi ruhu hakimdir.

Qəribədir, Rusiya Qafqazı, o cümlədən Zaqafqaziyanı da Orta Asiyanı, Sibiri, Volqaboyunu və neçə-neçə digər yerləri tutmuş, işğal etmiş, böyük imperiya yaratmış, zəbt etiyi yerləri müstəmləkəyə çevirmiş, biz isə marksizm ideologiyasından proletar diktaturası, “sinfilik”, “partiyalılıq”, “sovet siyasəti” baxımından çıxış edərək əvvəlcə bu yerlərin “ilhaqından”, Rusiya ilə birləşməsindən, sonralar isə Rusiya tərkibinə daxil olmasından fərəh və razılıqla, minnətdarlıqla danışırıq. Əcəba, tarixin hikməti, taleyin hökmünə bir bax…

Amma, Şah İsmail sənin öz doğma övladın olsa da, sənin üçün ilk güclü Azərbaycan dövləti yaratsa da təriflənə bilməzdi.

Ayrı-ayrı şəxsi keyfiyyətlərindən asılı olmayaraq Makedoniyalı İsgəndər ilə yunanların, Sezar ilə italyanların, Çingiz ilə monqolların, Teymur ilə özbəklərin, II Mehmut (Fatih), Sultan Səlim Yavuz, I Süleyman (Qanuni) ilə türklərin və İvan Qroznı və I Pyotrla rusların, Napoleon ilə fransızların fəxr etməyə haqqı var. Bu siyahını artırmaq da olardı…

Biz Azərbaycanlıların da Şah İsmaillə fəxr etməyə, öyünməyə haqqımız var. Böyük şəxsiyyətdir. Dünya şöhrətli siyasi xadim, dövlət başçısı və sərkərdə, böyük şair və görkəmli alimdir.[1]

Şah İsmail Xətainin xələfi M.Füzuli “Bəngü-badə” əsərinin Həzrəti Əli (ə) soraqlı bölümündə vilayət məsələsinə toxunuraq

[1] Fuad Qasımzadə. “Siyasət, sənət və elm müsəxxiri” // Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. “Şah İsmayıl Xətai” (xronoloji-tarixi məlumatlar). Bakı, “Ozan”, 1997. səh. 7-8

yazır:

*Oldur ayinədari-surəti-həqq,*
*Nə vəsi, varisi-nəbi mütləq.*

(Allahın camalının güzgü tutanı odur, Odur ki, o, Həzrəti-Məhəmmətin (s) təkcə vəsisi yox, həm də yeganə varisidir)

Ümumiyyətlə, vilayət məvhumu dini-fəlsəfi çevrələrdə həmişə mübahisə doğurmuşdur. Anlayışın kamil insanla bağlı tərəfləri ən yüksək səviyyədə "Nəhcül-Bəlağə"də Həzrəti-Əli (ə) tərəfindən əsaslandırılmışdır.

"Nəhcül-bəlağə"də "104 yerdə ümumi kamil insan anlayışından bəhs olunmuşdur". Həsənzadə Amuliyə görə bunlar beş yerə ayrıla bilər:

1. Kamil insan, süfəra (Tanrı elçiləri) hüccəc (Allahın dəlilləri).
2. Həzrəti-Məhəmmədin (s) səciyyələri.
3. Əhli-beytin (ə.m) özünə məxsusluqları.
4. Həzrəti-Əlinin (ə) öz xüsusi mövqeyi.
5. Bəzi ibarə və işarələrdən incə mənaların çıxarılması.

Alim birinci qismə aid olan müqəddəslərin bir neçə səciyyəsini göstərir; məs, Əbdullah (Allah bəndəsi) və İzzətullah (Tanrı qatına yüksəlmə), vəliyullah (vəhy gəlməyə və peyğəmbər vəlisi olmağa layiq qəlb), qotbe-adəme-emkan (mümkün varlıqların istinadgahı), "rasex dər elm" (ilahi mənşəli elmlərin dərkində yetkinlik), yünbiu-l-bekəm (ilahi və nəbəvi hikmət bulaqları), "suranəndeye-dəfaine-uqul" (ilahi mənşəli idrak dəfinələrinin tənzimləyicisi), "motəcətref dər kainat" (bütün dünyada mövcud olan əşyalara hakimkəsilmə bacarığı). Yer üzü bu cür insanlardan heç vaxt boş qalmır.

Sonra alim Xacənin "İşarat"ın şərhindəki belə bir mülahizəsinə yer verir: "Aqil kəmali-Mütləqin abi-həyatını istisqa edəndir" (yüksək dərrakə sahibi qaçılmaz, labüd yetkinlik və bitkinliyin –

Allahın bəxş etdiyi dirilik suyunu – vəhyi var gücü ilə və son damlasınadək içib qanına-canına hopdurandır). "Arif isə cəmale-Həqqin mütaliəsində məhvdir" (dünyanın get-gəlindən baş çıxaran – ictimai-siyasi, iqtisadi, mədəni, əxlaqi-fəlsəfi, ruhi-mənəvi, təbii-fiziki proseslərin hamısını istər ayrılıqda, istərsə də küll halında bütün aydınlığı və genişliyi ilə qavrayan kamil insan isə Allahın camal sifətlərinin dərkində hər şeydən keçəndir).

Daha sonra alim İshaqinin insanın uca məqamına dair mülahizəsini verib, ondan belə bir nəticə çıxarır: "Arif təkcə varlığın zahiri əlamətlərinə və batini mahiyyətinə bələd olmayıb, həm də varlıq üzərində tam qüvvə sahibi olmaqdır".[1]

Alim bir qədər də irəli gedərək yazır ki, əgər arif öz yaratdığından qafil olsa, yəni onu qoruyub saxlaya və inkişaf etdirib artıra bilməsə, məxluqun illəti (valıqların yaranma səbəbi) aradan qalxdığından arifin araya-ərsəyə gətirdiyi məhsul səbəbin məhvinə aparıb çıxarar, yəni bütövlükdə insanlıq zərər çəkmiş olar. Bu o zaman olmaz ki, arif bütün "həzərat"a (üzdə olan təzahür amillərinə) nəzarət etmiş olsun.[2]

Alim "həzərat" dedikdə, ilk növbədə kamil insana məxsus əsas beş halın göz önündə tutulduğunu göstərir:

1. Aləme-məane və əyane-sabitə (mənalar aləmi və sübuta yetirilmiş görümlü dəlillər).
2. Aləme-ərvah (bərzəxdəki ruhlar aləmi)
3. Aləme-mesal (hal-hazırda bizimlə birlikdə mövcud olmalarına baxmayaraq, duyğu və hisslərimizlə dərk edə bilmədiyimiz varlıqlar).
4. Aləme-şəhadət (hal-hazırda duyub qavradığımız maddi aləm).
5. Bu amillərin hamısını özündə birləşdirən kamil insan.

---

[1] Vərağa Almasov. "Həzrəti-Əli (ə) aşiqi Füzuli". Bakı, "Çaşıoğlu", 2010. səh. 76

[2] Vərağa Almasov. "Həzrəti-Əli (ə) aşiqi Füzuli". Bakı, "Çaşıoğlu", 2010. səh. 77

Bununla belə, alim "həzərat" ifadəsi altında başqa bir irfani dərkin də başa düşülə biləcəyini göstərərək yazır ki, ələviyyeyi-səmaviyyə (uca göylər) və sibliyyeyi-ərziyyə (aşağı yerlər) dir.

O, belə davam edir: "arif heç vaxt bu amillərin hamısından mütləq surətdə və eyni zamanda xəbərsiz qala bilməz. O, nəyin bahasına olursa-olsun, bunların biri ilə gizli rabitədə, üzvi əlaqədə olacaq. Belə ki, arif "sifliyyə hüzurları"nın (aşağı yer faktorlarının) birinə çatdığı təqdirdə "ələviyyə"dəki (yuxarı göylərdəki faktorları) da qavramış olur, yaxud əksinə…".[1] Bu, həmişə səbəbin nəticəni, nəticənin isə səbəbi tələb etməsindən irəli gəlir.

Tovhid, Peyğəmbərlik və İmamlıq fəlsəfəsi bütün müqəddəsatı özündə birləşdirir. Bu isə Xətai lirikasının leytmotividir. İndiyədək təhlilə çəkilən şeirlərin çoxu bunu sübuta yetirir. Tovhid, Peyğəmbərlik və İmamlıq fəlsəfəsi istər ayrı-ayrılıqda, istərsə də küll halında Qurani-Kərimdə hər baxımdan təsbit olunmuşdur. Doğrudur, biz yuxarıda bu qəbildən olan bir neçə ilahi bəyanatla bağlı geniş bilgi vermişik. Ancaq bu səpgili ayələr o qədər çox saylı, o qədər çox qatlı və çoxşaxəlidir ki, onlardan yenə də örnək vermək olar.

"Fatihə", 6; "Bəqərə", 2, 37, 207, 274, "Ali-İmran", 61, 67, 103, "Nisa", 59, "Maidə", 55, 67, 3; "Təthir", 33; "Şura", 23; "Rəd", 43, 7; "Buruc", 1; "Təhrim", 4; "Zumər", 33; "Fürqan", 54; "Ər-Rəhman", 19-22; "Vaqiə", 10-14, 27; "Mücadilə", 12, 13; "Bəyyinəh", 7; "Səffat", 130; "Yasin", 12; "Adiyat", 1-11; "İnsan", 7, 8, 9 və s.

Bəllidir ki, İslam birbaşa mənəviyyata xitab edən və saf əxlaqa çağıran bir dindir. Bu dinimizin etiqad əsaslarında da köklü surətdə əksini tapmışdır. Belə ki, İslamın bu dünyada başlıca təsəlli və təskinlik qaynağı olması ("Rədd", 28) son dərəcə ümid bəxş etməsi ("Hud", 22-23; "Kəhf", 110) axirət üçün də möhtə-

[1] Vərağa Almasov. "Həzrəti-Əli (ə) aşiqi Füzuli". Bakı, "Çaşıoğlu", 2010. səh. 335-337

şəm şəfaət fəlsəfəsinə hazırlıq işi aparması (“İsra”, 78; “Taha”, 110) heç kimə gizli deyildir. Bu motiv Xətainin başqa şeirlərində olduğu kimi bu mürəbbesində də bütün aydınlığı və genişliyi ilə özünü göstərir.

***

Dinimizdə nadir hallarda rast gəlinən ibadət növlərindən biri də etikafdır. Sözün islami söykənəcəyi mübarək “Bəqərə” surəsinin 187-ci ayəsindədir. Həmin şanlı ayənin bir yerində oxuyuruq: “Məscidlərdə etikafda olarkən qadınlarla yaxınlıq etməyin. Bunlar Allahın (halal və haram) sərhədləridir, onlara yaxınlaşmayın (onları pozmayın) Allah Öz ayələrini insanlar üçün bu cür açıqlayır ki, bəlkə çəkinsinlər”.

Bu ibadəti yerinə yetirənlərdən tələb olunur ki, onlar üç gün gecə-gündüz məscidə qapansınlar və zəruri tələbatlarının ödənilməsini çıxmaq şərtilə oranı tərk etməsinlər. Xətainin bu üç anlayışın vəhdətini bu ibadət növünə aid etməsi bir tərəfdən dini-etiqada dərin sayğısını göstərirsə, digər tərəfdən bir şair kimi bədii tapıntısı olaraq diqqəti çəkir.

Xətai şeirlərinin çoxunda Yezidi lənətləyir. Yuxarıda buna dair konkret nümunələr verilmişdir. Lakin, Mərvan ibn Həkəmin adının Yezidlə yanaşı çəkilməsi bu şeir üçün yeni haldır. Çünki, Kərbəla vaqiəsinin tarixinin də göstərdiyi kimi murdar və idbar Mərvan ibn Həkəm Kərbəla şəhidlərinə divan tutulmasında böyük rol oynamışdır.

Bəllidir ki, orta yüzilliklər müsəlman mədəniyyətinə sufizm son dərəcə böyük təsir göstərmişdir. Tovhid, Peyğəmbərlik və İmamlıq fəlsəfəsinin vəhdət halında dərkinin keçmiş ümmətlərin peyğəmbərləri üçün də bəlli və qüvvədə olması fikrini irəli sürməsi şairin mürəbbeyə gətirdiyi başqa bir yenilikdir. Rəsulullahın (s) və Həzrəti-Əlinin (ə) mədh və mənqəbəti zamanı biz Şah İsmailin onlarla peyğəmbərin həyat və fəaliyyətini bəhs mövzusuna çevirdiyini görmüşdük. Bu, məmduhların üstünlüklərinin tərənnümünü bir xeyli cəlbedici edirdi. Belə görünür ki, şair ayrı-ayrı şeirlərində xüsusi surətdə və tarixi planda verdiyi mətləbi

burada yığcam biçimdə ümumiləşdirmişdir. Bu isə Xətainin çox yaxşı lakonizm ustası olmasını bir daha sübuta yetirir.

Heç şübhəsiz, belə dolğun və tutumlu bir mürəbbe Tovhid, Peyğəmbərlik və İmamlıq fəlsəfəsinin vəhdətinin Əhli-beyt (ə.m) yönündə şairin şəxsiyyəti üzərinə köçürülməsi ilə bitməli idi.

Belə ki, Şah İsmail özü hökmdar ola-ola özünü Həzrəti Əlinin (ə) təbəəsi adlandırır.

Bu deyilənlərdən aydın olur ki, "Dəhnamə" poemasında Əhli-beyt (ə.m) anlayışının özünəməxsus yeri, bədii dəyəri və fəlsəfi çəkisi mövcuddur. Belə ki, bu məvhum əsərdə genişlənmə məqamlarına malik olub, bir çox baxış bucaqlarından əlvan və rəngarəng bədii əksini tapmışdır.

***

1. Ş.İ.Xətainin iri həcmli əsərlərindən biri də "Nəsihətnamə" məsnəvisidir.

Şah İsmailin bu əsəri əslində qızılbaşlara doğru yol göstərmək üçün Həzrəti-Əli (ə) və on iki imamın müqəddəsliyini andırmaq və həyat davranışı barədə öyüdlər verən bir məsnəvidir. Təsadüfi deyil ki, şair əsəri belə tamamlayır:

*Nəsihətnamə yazdım dərvişanə,*
*Cahanda olmaq üçün bir nişanə.*[1]

"Nəsihətnamə" adından da göründüyü kimi nəsihətamiz fəlsəfi poemadır. Burada süjet yoxdur. Daha doğrusu, ardıcıl nəql edilən hadisə yoxdur. Bir çox nəsihətamiz fəlsəfi şeirlərində olduğu kimi şair bu əsərində də vəhdətü-vücud fəlsəfəsinin müddəalarından çıxış edir. Həqqi-mütləqi bir dəryaya, dünyanı isə onun bir damlası-

[1] Mirzə Rəsul İsmailzadə. "Tərtibçidən" // Şah İsmail Səfəvi (Xətai) külliyyatı. Qəzəllər, qəsidələr, nəsihətnamə, dəhnamə, qoşmalar. (Tərtibatçısı: Mirzə Rəsul İsmailzadə). Bakı, Əlhuda, 2004. səh. 28

na bənzədir. Sonra isə bu dərya ilə damlanın eyni şey olduğu fikrini irəli sürür. Şairin fikrincə mövcud dünya Allahın, yaxud bütün varlığın güzgüyə düşmüş əksidir. Görən də, görünən də bir şeydir. Biri vəhdət, birlik, bütövlük aləmi, o birisi isə kəsrət, yəni bütövün zərrələrindən ibarət olan çoxluq aləmidir. "Günəş zərrəvü, həm zərrə günəşdir" deyən şair Allahla mövcud aləmi eyniləşdirir. Birini bütöv vücud, digərini onun zərrələri sayır. Zərrə bütövə ancaq eşq ilə qovuşa bilər:

*Olur bu eşq ilə can həqqə vasil,*
*Ki, eşqi olmayan candan nə hasil?*

– deyən şair insanı ilahiləşdirərək onu sevməyə çağırır. Burada insanın ilahiləşdirilməsi daha çox insanı ucaltmağa xidmət edir, onun sevilməyə layiq olduğunu sübut edən dəlilə, fakta çevrilir. Belə bir fəlsəfi müddəanı əsas götürən Xətai dünya və insan barədə öz humanist düşüncələrini şərh etməyə çalışır. Mövcud həyat və insanlar şairə div surətində görünür. Bu, dünyanın tərsinə dönməsi deyildirmi? Nikbin bir sənətkar olan Xətai bunu mənasız sayır və elə düşünür ki, bu xam xəyallar düz ola bilməz, gözlər həqiqəti görürlər. Xətai şərin, eybəcərliyin, divin üstün tutulacağına, qələbə çalacağına inanmır. Şərin hər yanı bürüdüyünü görsə də sabaha inamla baxır:

*Cahan əksinə döndü, ey bəradər,*
*Dilər div ola insana bərabər.*
*Xaçan dürüst ola bu xam xəyallar?*
*Yaxışmaz yol içində uş bu hallar.*

Xətaiyə görə insan gülşəndəki gül kimi saf və ətirli olmalıdır. Bunun üçün zülm yükünü atmaq, dünya qəmini vəhdətlə dəyişmək lazımdır. İnsan hər şeyə könül gözü ilə baxmalı, kamal sahibləri ilə oturub-durmalıdır ki, özünü və həyatın həqiqətini görə bilsin. Şair saf qəlbi əsl Allah evi adlandırır, könül yıxmağı yox, könül tikməyi məsləhət görür.

*Budur sözüm sənə məndən əmanət,*
*Könül yıxma, vəli, eylə imarət.*
*Dəxi yoldaş ilə qonşunu gözlə,*
*Ki, xalqın eybini sən açma, gizlə.*
*Xamu əməldən əfzəldi bir insaf,*
*Həqin öz evidir, olsa könül saf.*

"Nəsihətnamə" sufizm panteist müddəalarını mədh edən fəlsəfi bir əsər olmaqla bərabər insan haqqında qabaqcıl humanist düşüncələri də əks etdirir. Bəlkə də bu ikinci daha əsasdır. Ona görə o da böyük sələfi Nizami kimi dinləyicilərini birinci növbədə zülmdən uzaq olmağa çağırır. "Yükün zülm isə arxandan buraxgil" – deyən şair zülmkarlığı ən eybəcər bir sifət kimi rədd edir. Xətainin bu məsnəvidə irəli sürdüyü fikirlər dərin insanpərvərliyi ilə seçilir. Bu fikirlər və nəsihətlər yeni dövlət, yeni cəmiyyət, yeni düşüncə tərzi yaradan hökmdar şairin prqram sözləri kimi qarşılanır. Onlarda odlu, hərarətli bir çağırış ruhu duyulur".[1]

"Nəsihətnamə"də Əhi-beyt (ə) anlayışı özünün bütün tərəfləri ilə iştirak edir. Məsələn, əsərdə Peyğəmbər haqqında oxuyuruq:

*Cəmali-Mustafaya ver səlavat,*
*Olasan cümlədən sağü səlamət.*
*İbadətlər başıdır, dinlə, qardaş,*
*Salavat eşqlə gər ola yoldaş.*
*Kimin eşqinə yaratdı cahanı,*
*Budur eyni ibadət tani anı.*
*Təvəkkül qıl təfəkkür eylə idrak,*
*Nədür ol aləmi-mənidən "Lövlak".*

[1] Xəlil Yusifov. "Ş.İ.Xətainin həyatı və sənət dünyası" // Şah İsmayıl Xətai. "Keçmə namərd körpüsündən" (Şeirlər və poemalar). Bakı, "Yazıçı", 1988. səh. 19-20

*Məhəmməd ümməti qalmaz damuda*
*Salavat ver, canın yanmaya oda.*[1]

(Hamıdan daha artıq əqli-mənəvi yetkinliyə, bitkinliyə və kamil imana malik olmaq istəyirsənsə Peyğəmbərin (s) gül camalına salavat gətir. Ey qardaş, əgər haqqına arif olmaq, mahiyyətini dərindən bilmək şərtilə desən salavat zikr etmək bütün ibadətlərin başıdır. Bəs, Ulu Yaradan kainatı kimə bəslədiyi məhəbbətə görə xəlq etmişdir? İbadətin məğzini məhz, bu sualın cavabı təşkil edir. Odur ki, Peyğəmbər (s) özünün buyurduğu kimi, Məhəmməd ümməti heç vaxt köməksiz qalıb əbədi olaraq cəhənnəmdə yanmaz. Əgər belə olmağını istəmirsənsə, gərək mütləq Peyğəmbərin (s) gül camalına salavat gətirəsən ki, cəhənnəm odu sənin bədənini yandırmasın).

Göründüyü kimi burada "Salavat", "Lövlak" qüdsi hədisi və şəfaət motivləri qabarıqdır ki, bunların üçünü də yuxarıda ətraflı surətdə şərh etmişik.

Qurani Kərimdə möhkəm əsaslandırılan salavat motivi ("Bəqərə", 157, "Əhzab", 56) istər klassik kitab, istərsə də folklor danışıq üslublu klassik ədəbiyyatımızda geniş yer tutur:

*Güldür ərəqi ruyi-Məhəmməd, gülü görcək*
*Göndər salavat Əhmədi-Muxtar ilə Alə.*

və ya:

*Əzbəri mimi-Mühəmməddi, şüarım salavat,*
*Neyləyim mən belə dərs almışam ustadımdan.*
*(S.Ə.Şirvani)*

---

[1] Şah İsmail Səfəvi (Xətai) külliyyatı. Qəzəllər, qəsidələr, nəsihətnamə, dəhnamə, qoşmalar. (Tərtibatçısı: Mirzə Rəsul İsmailzadə). Bakı, Əlhuda, 2004. səh. 374

***

*Mehdinin şəninə gəlibdir ayət,*
*İsminə möminlər verir salavat.*
*Yovmül-ərasətdə etmə xəcalət,*
*Yandırma odlara qul Ələsgəri.*

*(Aşıq Ələsgər)*

Ş.İ.Xətai başqa əsərlərində olduğu kimi "Nəsihətnamə"də də beş kimsənənin aparıcı siması kimi Həzrəti-Əlinin (ə) mədh və mənqəbəti aparıcı yer tutur:

*Nəbi meraca getdi, kimi gördü?*
*Məqami müntəhada kimə irdi?*
*Yol üstündə duran aslanı gördü,*
*Çıxardı xatəmini ona verdi.*
*Dedi kim: aramızda bu nişanə,*
*Bu sözlərə məvalilər inanə.*
*Munu fəhm eylə kim, özgə xəyaldur,*
*Xəyal içrə xəyali hali haldur.*
*Dəxi sirr var, diləməz xəlq içində,*
*Yenə söz var deyəsi xülq içində.*
*Yürü şahın müdam könlü açılsın.*
*Lətif söylə, dilindən dürr saçılsın.*
*Nişan göstər ki, olasan şaha qul,*
*Ki, dəymə kimsə olmaz şaha məqbul.*
*Nədir söylə mənə şahın nişanı,*
*Əgər mömin isən sən şahı tanı.*
*Onun əmri ilə cizginir fələklər,*
*Ona səcdə qılur göydə mələklər.*
*Mürüvvətlə kərəm lütfü səxavət,*
*Nişani şahın ey əhli səadət.*[1]

[1] Şah İsmail Səfəvi (Xətai) külliyyatı. Qəzəllər, qəsidələr, nəsihətnamə, dəhnamə, qoşmalar. (Tərtibatçısı: Mirzə Rəsul İsmailzadə). Bakı, Əlhuda, 2004. səh. 374-375

(Parça Peyğəmbərin (s) meracının bir mərhələsinin təsviri ilə başlanır. Şair bildirir ki, Rəsulullah (s) göyün ən yüksək təbəqəsində Həzrəti-Əlini (ə) aslan cildində görüb, özünün peyğəmbərlik möhürünü barmağından çıxararaq ona verir və ona belə söyləyir ki, qoy bu üzük aramızda bir rəmz, bir simvol olsun ki, bütün Əhli-beyt (ə.m) sevənlər bu hadisənin doğrudan da baş verdiyinə dərindən inansınlar. Sən bütün varlığınla bu hadisənin məğzinə varmağa can at. Çünki, bu sirr içində sirr olan çox məxfi bir mətləbdir. Elə söz var ki, çox məxfi saxlanmalıdır. Elə söz var ki, onu camaat arasında dilə gətirmək olmaz). Həmişə şaha, yəni Həzrəti Əliyə (ə) doğru addım atmağa cəhd göstər. O böyük şəxsiyyətin yanında öz ədəbini saxlayaraq, incə sözlər danışmağa çalış ki, ağzından inci tökülsün. Həzrəti-Əlinin (ə) əsl tərəfdarı olmaqdan ötəri özünün şiə mövqeyini ortaya qoy. Çünki, dəymədüşər adamlar, hər yoldan ötən şəxs Həzrəti-Əli (ə) tərəfindən qəbul edilməz. Planetlər ondan güc alaraq hərəkətə gəlir. Göyün bütün mələkləri məhz, ona baş endirir. Bilin ki, insaflılıq, əliaçıqlıq, böyüklük Həzrəti-Əlinin (ə) başlıca əlamətləridir. Göründüyü kimi Ş.İ.Xətai çox böyük ustalıqla burada Həzrəti Əlinin (ə) parlaq portretini yaratmışdır. Bu da "Nəsihətnamə"ni yazarkən şairin "Nəhcül bəlağə"dən bilavasitə ilham aldığını sübuta yetirir. Ş.İ.Xətai özünün bu əsərinin üzərində işləyərkən Həzrəti-Əli (ə) ilə bağlı tarixi məxəzləri diqqətlə öyrənmişdir. Bu motivlərin bir çoxuna Aşıq Ələsgərin, Növrəs İmanın, Aşıq Şəmşirin və s. yaradıcılığında da rast gəlirik.

*Aslan olub merac yolunda yatan,*
*Əbu Cəhlin başın havaya atan,*
*Xurma lifəsiynən barmağın çatan,*
*Ağ divi zindana salan ya Əli!*[1]

---

[1] Aşıq Ələsgər. "Gözüm bir alagöz xanıma düşdü". Bakı, "Yazıçı", 1993. səh. 100

və ya:

*Can fəda qıldım yolunda*
*Ya Əmirəl-möminan!*
*Tutdun Rəsulun irahın,*
*Xatəbin aldın nişan;*
*Yunisə munis olub,*
*Nuha oldun gəştiman;*
*Xızr ilə urhana girdin,*
*Sirrini etdin nihan,*
*Nuri-pakın zülməti,*
*Göstərdi hər yerdən Ağa!*[1]

Əsərdə "Həsəneyn" motivinə dair qeydlər də vardır.

*Həsən, Hüseyni sev, candan həmişə,*
*Zehi dövlətli can şahə ulaşə.*[2]

(Həmişə İmam Həsənlə, İmam Hüseyni ürəkdən sev, Nə xoşdur, nə gözəldir ki, insanın xoşbəxt varlığı və səadətli ruhu sevdiyi böyük şəxsiyyətlərə qovuşa bilsin).

"Həsəneyn" motivi ədəbiyyatımızda tez-tez üz tutulan motivlər sırasındadır. Məsələn:

*Çağırın gəlsin aşığı,*
*Aləmə salsın işığı,*
*Həsən-Hüseynin beşiyi,*
*O da ki, var, ağacdandır.*[1]

---

[1] Aşıq Ələsgər. "Gözüm bir alagöz xanıma düşdü". Bakı, "Yazıçı", 1993. səh. 103

[2] Şah İsmail Səfəvi (Xətai) külliyyatı. Qəzəllər, qəsidələr, nəsihətnamə, dəhnamə, qoşmalar. (Tərtibatçısı: Mirzə Rəsul İsmailzadə). Bakı, Əlhuda, 2004. səh. 375

Şairin lirik şeirlərində və "Dəhnamə" poemasında olduğu kimi, "Nəsihatnamə" məsnəvisində də Əhli-beyt (ə.m) imamlarının mədh və mənqəbəti yer alır. Müxtəlif hissələrdə bu barədə ətraflı söz açdığımızdan burada bu cəhət üzərində dayanmırıq.

Beləliklə, aydın olur ki, Əhli-beyt (ə.m) anlayışı özünün bütün göstəriciləri ilə Ş.İ.Xətai yaradıcılıcının hər bir qatını zərrə-zərrə əhatə edir, onun bütün əsərlərində boy göstərir.

[1] Qurbani. Bakı, Bakı Universiteti Nəşriyyatı, 1990. səh. 55

# IV FƏSİL

## ŞAH XƏTAİ AŞIQLARIN MÜRŞİDİ KİMİ

Həyat və fəaliyyəti keçdiyi ömür yolu ilə ətrafında çox geniş bir ictimai mədəni mühit yaratmış Şah İsmail Xətai XVI yüz illik ozan-aşıq sənətində də əsl yol göstərəninə çevrilmişdir. Bu yol göstərmənin məhvərində də Əhli-beyt (ə.m) məhəbbəti durduğundan onun aşıq yaradıcılığına göstərdiyi güclü təsir haqqında ayrıca danışmağa böyük ehtiyac duyulur.

Bütün qaynaqlarda yekdilliklə bildirilir ki, muasiri olan aşıqlar Şah İsmail Xətaini özlərinə mürşid bilmişdir.

"Rəşədə" kökündən gələn "murşid" sözü "irşad etmək", "doğru yol göstərmək", "hidayətə qovuşdurmaq", "əqli-mənəvi yetkinliyə çağırış" və sair mənalarını verir. Vaxt otdukcə söz yüksək işlənmə tezliyi əldə edərək yeni-yeni anlam incəlikləri qazanmışdır, belə ki, yozumların ən başlıcası leksemin "təriqət başçısı" "fəlsəfi cəryan banisi" "çoxlu muridləri olan şeyx" mənalarına gələn murşid şəklini almasıdır. Məsələn, Xətai bu sözü dəfələrlə Həzrəti-Əli (ə) haqqında işlətmişdir.

*On səkkiz min aləmin sirri sənin sirrindədir,*
*Murşidi-bina imişsən, ya Əli, səndən mədəd!*

*(Q.40.səh.44)*

Və ya

*Bu söz Əli sözüdür, ey Xətai,*
*Mənim bu sözdə ustadım Əlidir!*

*(Q.116.səh.106).*

Başqa şeirlərində şair mürşidlik anlayışının cəmiyyət həyatında böyük rol oynadığını da qələmə almışdır

*Şah Xətai, sənin dərdin deşilməz,*
*Dərdi olmayanlar dərdə tuş olmaz.*
*Mürşidsiz, rəhbərsiz yollar açılmaz,*
*Mürşid ətəgində əlin varmıdır?*

*(Q.15, s.314).*

Allah-təala "Bəqərə" surəsinin 186-cı ayəsində belə buyurur: "Bəndələrim Məni səndən soruşanda (de ki,) Mən (onlara) yaxınam. Məni çağıranda çağıranın səsinə səs verirəm. Onlar da Mənim çağırışımı qəbul edib Mənə iman gətirsinlər ki, doğru yolu tapsınlar (məqsədə çatsınlar)".

Əvvəlki bölümdə mürşidlik haqqında və həmin bu ayənin izahı barədə geniş və ətraflı məlumatı verdiyimizdən yenidən burada geniş izaha ehtiyac duymadıq.

Foklorşunaslıq elminin birmənalı surətdə təsdiq etdiyinə əsasən, Şah İsmail Xətainin ilk aşıq muasiri dirili aşıq Qurbani olmuşdur. Aşıq Qurbani XVI əsirin əvvəllərində yaşamış və zəmanəsinin adlı-sanlı şair aşığı olmuşdur. Qurbaninin anadan olması və ölməsi tarixi məlum deyildir. Lakin bəzi şeirlərində və "Qurbani" dastanından çıxış edilən onun Şah İsmail Xətai hakimiyyəti illərində yaşadığı və Azərbaycanın Cəbrayıl rayonunun Dirili kəndindən olduğu güman edilir. "Qurbani" dastanında istifadə edilən lirik, ictimai, siyasi və əxlaqi nəsihətamiz şeirlər şair aşığın qüvvətli və kamil sənətkar olduğu göstərir.[1]

Aşıq Qurbaninin Şah İsmail Xətaini öz mürşidi olaraq hər tərəfli surətdə tərənnüm etdiyi məhşur bir qoşması var:

*Murşidi-kamilim, şeyx oğlu şahım,*
*Bir ərzim var qulluğuna, şah, mənim!*
*Əziz başın üçün, oxu yazğumu,*
*Agah ol halımdan, qibləgah, mənim!*

[1] "Azərbaycan aşıqları və el şairləri". II cilddə, I cild. Bakı, "Elm", 1983. səh. 19

*Dərin-dərin dəryaları boyladı,*
*Xəncər alıb qara bağrım peylədi,*
*Oğlu ölmüş vəzir qəza eylədi,*
*Getməz dimağımdan dudi-ah mənim.*

*Şair olan dərsi alır pirindən,*
*Baş açmadım seyrağıbın sirrindən,*
*Qolubağlı keçdim Xudafirindən,*
*Üzüm gülməz, heç açılmaz, ah, mənim!*

*Qurbani der: "Bahar olur, gəlir yaz,*
*Göllərdə üzüşür ördək ilə qaz,*
*Sərim təvəlladır, üzüm payəndaz,*
*Yoxdur bundan qeyri bir mətah mənim!"*[1]

Şeirdə bir çox söz və ifadələr (mürşidi-kamil, şeyx oğlu, şah, şah əziz başın üçün, qibləgah, pir) inkar olunmaz surətdə sübuta yetirir ki, Aşıq Qurbani bütün varlığı ilə Şah İsmaili özü üçün sarsılmaz güvənc yeri bilmişdir. onu da qeyd edək ki, professor Qəzənfər Kazımovun apardığı araşdırmalarda da bu cəhət geniş şəkildə elmi baxımdan əsaslandırılmışdır.[2]

Aşıq Qurbani digər şeirlərində də Şah İsmaili özünün mürşidi adlandırır:

*Mən haqq aşiqiyəm, haqq yola mail,*
*Kitabım Qurandır, olmuşam qail.*
*Ey mənim Sultanım, ey Şah İsmail,*
*Dərdimin əlindən fəryada gəldim.*[3]

---

[1] Qurbani. Bakı, Bakı Universiteti Nəşriyyatı, 1990. səh. 113
[2] Qəzənfər Kazımov. "Ön söz" // Qurbani. Bakı, Bakı Universiteti Nəşriyyatı, 1990. səh. 4-13
[3] Qurbani. Bakı, Bakı Universiteti Nəşriyyatı, 1990. səh. 149

Yarımçıq olmasına baxmayaraq bənd Aşıq Qurbani və Şah İsmail Xətaini birləşdirən başlıca amilin Əhli-beyt (ə.m) məhəbbəti olduğunu göstərir. Belə ki, "haqq yola mail, kitabım Qurandır, olmuşam qail", "sultanım" ifadələri bu fikri söyləməyə yol açır.

Lakin hər iki sənətkarı Əhli-beyt (ə.m) baxımından birləşdirən başlıca əsər aşağıdakı divanidir.

*Fələk, sənlə vuruşmağa bir qabil meydan ola,*
*Tut əlimi, fürsət sənin, kaş belə ehsan ola.*
*Getmiş idim mürşidimə, dərdimə dəva qıla,*
*Mən nə bilim, mən gəlincə xak ilə yeksan ola.*

*O şahın kəlmeyi-kəlamın zikr etmək gərək,*
*Tabutu sərv ağacından, kəfəni yarpaq gərək.*
*Tez yuyun, tez götürün ki, məzara çatmaq gərək,*
*Bar-ilahim, necə qıydın, bir belə cavan ölə.*

*Ey könlüm, geygilən qarayı, xəndan eyləmə!*
*Bar-ilahi, böyük xanədanı viran eyləmə!*
*Haqq-təaladan səda gəldi: "Qurbani, çox qəm yemə!*
*Heç ola bilməz xanədanı-Şəfi viran ola!"*[1]

Divaninin birinci misrasından şairin "fələk" deyə işarə etdiyi mürtəce qüvvələrin XVI əsr mühitindən Əhli-beytin (ə.m) hörmətini kifayət qədər saxlamadıqları aydın olur. Bu isə müdrik el ağsaqqalı olan aşığı dərindən narahat edirdi. Mürşidlik anlayışı ilə bağlı üzərində durulması ehtiyac duyulan cəhətlərdən biri də aşığın mürşidi bütün çətinlikləri həll edə biləcək kamil bir şəxsiyyət kimi görməsidir. Bu isə təriqət müstəvisi ilə məhdudlaşmayan və kökü dərin qatlara gedib çıxan incə bir ruhi-mənəvi

[1] Qurbani. Bakı, Bakı Universiteti Nəşriyyatı, 1990. səh. 187

əlaqədir.

“O şahın kəlmeyi kəlamın zikr etmək gərək” misrası aşıq Qurbanini Xətai poyeziyasına möhtərəm təriqət mətni kimi baxdığını göstərir. Qətiyyən ötəri deyildir ki, Həmid Araslı Sayat Novanın divanı yaradıcılığından danışarkən yazır: “Məncə şairin divani adlandırdığı heca vəznində qəzəlləri bir növ ustadnamədir. Aşıq öz ustadının əsərini oxumazdan əvvəl ustada həsr olunmuş divanı ilə məclisə üz tutur. Bu divanı bir qayda olaraq, Şah Xətaiyə xitabən başlayır. Bu, təkcə Azərbaycan dilində yazılan divanilərdə deyil, erməni və gürcü dilində yazılan divanilərdə də belədir”.[1]

Divaninin Əhli-beytə (ə.m) məhəbbət yükü baxımından daşıdığı bir incəliyə toxunmaq yaxşı olardı. Nəşrlərdə şeirin sonuncu misrası belə gedir “Heç ola bilməz xanadani-Şəfi viran ola” – burada “xanadanı şəfi” ifadəsi havadan asılı qalaraq anlaşılmır. İfadəni uzaq başı “şəfaət xanadanı kimi” – Peyğəmbər (s) soyundan gəldiyinə və Seyyid olduğuna görə təriqət şeyxləri ocağı kimi başa düşmək olar. Ancaq bu olduqca uzaq bir fərziyyədir. Zənnimizcə ifadənin əsli “Xanadani-Səfi”dir. Belə olan surətdə ifadə Səfəvilər nəsli, bu nəslin qurduğu dövlət kimi başa düşülə bilər ki, bu daha doğrudur. Səfi sözünün Sufi kimi anlaşılması isə bu ehtimalı biraz da gücləndirir.

Aşıq Qurbani mürşidlik anlayışını bəzəndə “pir” sözü ilə də ifadə edir:

*Kufə əhli bihəyalar şərmü həyanı atdılar,*
*Adəm olan yoldan çıxıb, bir-birin aldatdılar.*
*Qazilərə rüşvət verib, şəri batil etdilər,*
*Bu divan ki, divan deyil, ədalət divan gərək.*

---

[1] Həmid Araslı. “Müqəddimə” // Sayat Nova. Bakı, “Azərnəşr”, 1963. səh. 10-11

*Axşam olcağın məğribdə batdı şəms, doğdu qəmər,*
*Yer üzünə qulqulə düşdü ki, ta oldu səhər.*
*Ağlım itirdim, əlim titrər, göz ağlar, sər əsər,*
*Pirim girib ol niqaba, getməyəydi cavan gərək.*

*Gərək biçarə Qurbani, sən bu cəbrə dözəsən,*
*Əl uzadıb, o yasəmən bağdan bir gül üzəsən.*
*Yaşın yetirdin əlliyə, indi üz tut yüzə sən,*
*Əslimiz turabidəndir, məskənimiz kan gərək.*[1]

Haqq aşiqi Şah şairə məhəbbətini daha açıq şəkildə bildirməkdən çəkinməmişdir. Aşağıdakı gəraylı buna parlaq örnəkdir.

*Gözəl şahım şeyx oğludur,*
*Şah Xətai, Şah Xətai!*
*Şahi-Mərdana bağlıdı,*
*Şah Xətai, Şah Xətai!*

*Bu dünyada bir haq divan,*
*O dünyada cənnətməkan.*
*Qoy var olsun türki zəban,*
*Şah Xətai, Şah Xətai!*

*Qurbani tək qul pənahı,*
*Qibleyi-aləmin mahı,*
*Ol cahanın qibləgahı,*
*Şah Xətai, Şah Xətai!*[2]

Göründüyü kimi Şah Xətai rədifi burada "mürşid" və "pir" sözlərinin yerlərində işlənmişdir. Şah Xətainin şahi-Mərdana – Həzrəti-Əliyə (ə) bağlılığını ayrıca vurğulaması aşıqla şair ara-

[1] Qurbani. Bakı, Bakı Universiteti Nəşriyyatı, 1990. səh. 188
[2] Qurbani. Bakı, Bakı Universiteti Nəşriyyatı, 1990. səh. 53

sında Əhli-beyt (ə.m) məhvərinin son dərəcə möhkəm olduğunu bir daha təsdiq edir.

“Qoy var olsun türkü zəban” – misrası bəlli mənaları ilə yanaşı Əhli-beytin (ə.m) türklük anlayışı ilə bağlığına işarə kimi də yozula bilər. İmam Cəfəri Sadiqin (ə) şiəliyin yayılmasında İran və Turan amillərinə Fars və Türk xalqlarına təsirini qabartması ilə bağlı qeydlərin qaynaqlarda yer alması bu ehtimalı az - da olsa gücləndirir. Xətai irsi ilə orta əsr aşıq yaradıcılığı arasında ideya-mövzu yaxınlığı da diqqəti çəkir. Məsələn, Xətai təsəvvüfdə dörd qapı sayılan şəriət, təriqət, mərifət və həqiqəti geniş tərənnüm etmişdir:

*Şəriətdir, təriqətdir, həqiqət,*
*Mərifət bir gözüdür can içində. (Q.309, s.166).*

Və ya,

*Şəriət sancağı gəldi dikildi,*
*Təriqət yolunda güllər əkildi.*
*Mərifət dəryası daşdı, töküldü,*
*Həqiqəti piri-pirandan aldım.*

*Həqiqət yolunda gör savaşımı,*
*Axıtdım gözümdən qanlı yaşımı,*
*Pirlər eşiginə qoydum başımı,*
*İcazət ol dəmdə meydandan aldım.*[1]

Mənbə olaraq göstərdiyimiz “Sazım” kitabında misal gətirilən birinci bəndin ikinci misrası “Təriqət yolunda güllər saçıldı” şəkilində getmişdir. Ancaq poetik qanuna uyğunluqlar (qafiyə sistemi, axıcılıq, qulağa xoş gəlmə və s.) nəzərə alındıqda misra-

---

[1] Şah İsmayıl Xətayi. “Sazım” (Qoşmalar, bayatılar, qəzəllər). Bakı, “Gənclik”, 1973. səh. 23

nın “Təriqət yolunda güllər əkildi” – şəkilində oxunması daha doğru görünür.

Başqa bir bədii nümunəyə diqqət yetirək:

*Mən də bildim, mənlik yoxdur özümdə,*
*Mənligim mürvətə satdım əzəldən.*
*Tutduğumuz iman, iqrar qapusu,*
*Bir pirin ətəgin tutdum əzəldən.*

*Şəriət ögrəndim min bir ad üçün,*
*Həqiqət ögrəndim eyni-zat üçün.*
*Mərifət ögrəndim bu sufat üçün.*
*Təriqətə xidmət etdim əzəldən.*

*Şəriətin incə yolları vardır,*
*Həqiqətin dərin gölləri vardır.*
*Mərifətin qönçə gülləri vardır,*
*Bülbüləm, gülşəndə ötdüm əzəldən.*[1]

Qurbani Şah İsmail Xətainin müasiri, həmçinin Xətai sarayına yaxın olmuş, şeiri, ədəbiyyatı sevən, özü də gözəl şeirlər yazan, bu şair – hökmdarla şəxsən tanış olmuşdur. Bəs bu yaxınlıq və tanışlıq haradan gəlmiş, hansı münasibətdən doğmuşdur. Bu barədə bizə az-çox yenə də Qurbaninin öz şeirləri, “Qurbani” dastanı və el arasından yazıya aldığımız rəvayətlər kömək edir.

Qurbaninin Şah İsmaylla yaxınlığı haqqında ilkin doğru və dürüst məlumatı yenə də S.Mümtaz vermişdir: “Bildiyimiz bir şey varsa o da budur ki, Qurbani Şah İsmail Səfəvi Qafqazı aldığı zamanda yaşayıb, şahın vəzirlərindən birinə xoş gəlmədiyindən Qurbanini qolubağlı Qarabağ tərəfindən Xudafərin körpüsündən keçirərək İrana sürgün etmişdir. Qurbani də bu əhvalatı

[1] Şah İsmayıl Xətayi. “Sazım” (Qoşmalar, bayatılar, qəzəllər). Bakı, “Gənclik”, 1973. səh. 49

şeirlə yazıb Şah İsmailə yolladığından Şah onu bağışlayıb azad etmişdir”.[1]

*Bülübül idim, ayrı düşdüm gülümdən,*
*Fələk vurdu, cüda saldı elimdən.*
*Qurbaniyəm, qara vəzir əlindən,*
*Şeyx oğluna şikayətə gəlmişəm.*[2]

***

*Vəzir, sana qarğayıram,*
*Haqq diləyin yetirməsin!*
*Göydən min bir bəla ensə,*
*Birin səndən ötürməsin!*

*Evindən düşəsən naçar,*
*Sağ gözünə batsın bıçaq,*
*Oğul-uşaq düşsün qaçaq,*
*İstədiyin gətirməsin!*

*Oturubsan ağ otaqda,*
*Qan qusasan laxta-laxta,*
*Səni görüm ölən vaxta,*
*Dilin kəlmə gətirməsin!*

*Qurbani qaldın burada,*
*Çağır, xudan yetsin dada!*
*Meyitin qalsın arada,*
*El yığılıb götürməsin!*[3]

[1] Tariyel Abbaslı. “Qurbaninin poetik irsi”. Bakı, 2004. səh. 38
[2] Qurbani. Bakı, Bakı Universiteti Nəşriyyatı, 1990. səh. 114
[3] Qurbani. Bakı, Bakı Universiteti Nəşriyyatı, 1990. səh. 49

***

XV-XVI əsrlərdə Azərbaycan poeziyasının ən görkəmli simalarından biri Seyyid Hüseyn Miskin Abdaldır. O, təqribən 105 illik ömrü (1430-1535) boyu həm xalq kütlələri arasında, həm də Şah İsmail Xətai sarayında özünə böyük şöhrət və nüfuz qazanmışdır. Tarixi mənbələrə görə Miskin Abdal Şah İsmail Xətai ilə çox yaxın şəxsi, eyni zamanda ruhi-mənəvi bağlılıq içində olmuş, sarayın ən nüfuzlu ictimai-siyasi xadimlərindən biri kimi hadisələrin gedişinə əhəmiyyətli təsir göstərmişdir. Digər tərəfdən bu görkəmli el sənətkarı dərin dini bilikləri və elmi-fəlsəfi görüşləri ilə öz müasirlərindən fərqlənmişdir. Onun şah sarayındakı nüfuzunda və xalqımız tərəfindən bu qədər sevilməsində bu məsələnin də, yəni şəxsiyyətindəki elmi-fəlsəfi çəkinin də böyük rolu olmuşdur.

Uzun müddət tənha gəzən Miskin Abdal ata-anasının təkidi ilə təxminən, 50-51 yaşında yenidən ailə qurur.

Azərbaycan Səfəvilər dövlətinin banisi Şah İsmail Xətai Göyçəyə gələndə Miskin Abdalla tanış olur, ona Dağıstan səfirliyini və orada "Quran"ın, Əhli-beytin (ə.m) təbliğini həvalə edir. Bir müddətdən sonra ata-anasının ölüm xəbərini eşidən Miskin Abdal Dağıstandan Göyçəyə qayıdanda meşədə çovğuna düşərək iki oğlunu itirir. Sənubərin vəfatından sonra bu böyük el sənətkarı daha böyük bir zərbə almış olur.

Miskin Abdal Ş.İ.Xətai əlaqələri Əhli-beyt (ə.m) yönündə "Qırxlar" anlayışının bədii tərənnümündəki yaxınlıq baxımından da özünü göstərir:

*"Qırxlar piri" özü verib dərsimi ümman mənim,*
*Çətin girə ürəyimə ləini-şeytan mənim,*
*Seyyid Miskin Abdal mənəm, söz mənim, meydan mənim,*
*Qoruyanım, özün qoru xain dostlaran məni.*[1]

[1] Miskin Abdal. Bakı, "Səda", 2001. səh. 48

İlk iki misrada müəllif malik olduğu elmi və dini-biliklərin ona ilahi qaynaqlar tərəfindən verildiyini söyləyir. "Qırxlar piri" deyərkən şair-aşıq böyük ehtimalla Həzrəti-Əlini (ə) nəzərdə tutur. Bu motivlə həm divan ədəbiyyatımızda, həm də aşıq şeirində qarşılaşırıq. Bir örnək verək:

*Piri-meyxanə Əlidir, odur ənvari-cəli,*
*Aşinanı tanı, seyr eyləmə biganə üçün.*[1]

Miskin Abdal özü də yaradıcılığı boyu "Qırxlar piri" mövzusuna dəfələrlə müraciət etmişdir. Məsələn, "Narın üzə bilmərəm" rədifli divanidə bu motiv başqa bir bədii çalarda işlənilmişdir:

*Ey dost, sənin bağın cənnət, narın üzə bilmərəm,*
*Ha silkinsəm, dəryan dərin, narın üzə bilmərəm.*
*"Qırxlar piri" özü düzüb ayağıma atəşi,*
*Alışaram Səməndər tək, narın üzə bilmərəm.*[2]

Böyük şair "Qırxlar piri"ni – Həzrət Əlini (ə) öz məşuqu, hikmət və həqiqətdə, elm və irfanda ölməz ustadı sayır, özünü isə ölümsüz Səməndər quşuna bənzədərək daim bu müqəddəs, bu şirin eşq və mərifət odunda yandığını və bundan sonsuz, bitib-tükənməyən ilahi bir feyz aldığını rəngarəng bədii ifadə vasitələri ilə (cinas, bənzətmə və s.) dilə gətirir. Miskin Abdal sevimli Peyğəmbərimizi (s) və onun "Elm şəhərinin qapısı" adlandırdığı İmam Əlini (ə) özünə mənəvi elmlərin, qəlbi inkişaf yolunun rəhbəri, mürşidi bilir. Buna görə də hər zaman şeytandan və şeytan xislətli insanlardan uzaq olduğunu iddia edir. Doğurdan da, "Quran" və Əhli-beyt (ə.m) vəhdətindən doğan bütün elmi həqi-

---

[1] S.Ə.Şirvani. "Seçilmiş əsərləri". 3 cilddə, I cild. Bakı, AMEA nəşriyyatı, 1967. səh. 489
[2] Miskin Abdal. Bakı, "Səda", 2001. səh. 49

qətlər və mənəvi-əxlaqi yüksəliş mərhələləri hər bir haqq aşiqinin, paklıq və gözəllik carçısının qəlbini İblisdən və onun insanlar arasındakı dostlarından qoruyur. Bu bizə Uca Yaradanımızın müqəddəs kitabı vasitəsilə buyurduğu birbaşa göstərişdir: “Ey Adəm övladları! Məgər mən sizdən əhd almadımmı ki, şeytana ibadət etməyin? O, sizin açıq-aydın düşməninizdir”. “Mənə ibadət edin! doğru yol budur!” (“Yasin”, 60-61).

Aşığın Ş.İ.Xətaiyə məhəbbəti gör nə qədər böyük olmuşdur ki, sonralar bu barədə ayrıca bir dastan da meydana gəlmişdir. Bu dastan “Miskin Abdal və Şah İsmail” dastanı adlanır. Aşağıdakı gəraylı aşığın Şaha olan məhəbbətini bariz surətdə göstərir:

*Bu tac, bu taxt qılsın vəfa,*
*Şıx oğlu Şah İsmayıla.*
*Xızır Nəbi, ol Mustafa,*
*Olsun pənah İsmayıla.*

*Haxdan yerə gəlir bir səs,*
*“Bəxtin üzü dönməsin tərs”.*
*Qır qazana düşər nakəs,*
*Etsə günah İsmayıla.*

*Abdal telə mizrab vurar,*
*Gün gələr ki, dastan qurar,*
*Yerdə Əli kömək durar,*
*Göydə Allah İsmayıla.*

Miskin Abdal əlini sazdan ayırmamış hər yandan “Afərin”, “əhsən” səsləri göyə bülənd oldu. İsmail ayağa qalxıf ucadan dedi:

Məni istiyən, ustada xələt!

Şah İsmailin ağzından bu söz çıxmamış meydana bir xələt, bir nəmər töküldü kü, gəl görəsən. Qızıl pul, başqa hədiyyələr meydanda üst-üstə qalaqlandı. Bunu görən Miskin Abdal şahın qarşısında təzim eliəyib dedi:

Qibleyi-aləm sağ olsun. Mənim dünya malında tamahım yoxdu. Hörmət-izzətinə görə var ol, səni min yaşa. Məsləhət görürəm ki, yığılan bu nəmər kasıb-kusuba paylansın.

İsmail üzünü Hüseyn Lələyə tərəf tutub dedi: "Lələ, düz deyirmişsən, doğrudan da Göyçənin Miskini də, Abdalı da şahlığa layiq adamlardı".

Sonra üzünü Miskin Abdala çevirib dedi: "Ustad, məsləhətinə görə var ol. Dediklərini qəbul eləyirəm.[1]

***

Ş.İ.Xətainin müasiri olmayan aşıq və el şairləri də onu özlərinə mənəvi mürşid bilmişlər. Aşıq Abbas Tufarqanlı və Tikmədaşlı Xəstə Qasımın əlimizdə olan irsi də bunu söyləməyə yol açır.

Azərbaycan aşıq şeirinin ən qüdrətli simalarından biri olan Aşıq Abbas Tufarqanlı təxminən XVII yüzillikdə dünyaya gəlmişdir. Bu haqq aşığının həyatı haqqında mənbələrdə dəqiq məlumat yoxdur. Lakin əsərlərindən belə qənaətə gəlmək olur ki, aşığın doğulduğu yer Təbriz yaxınlığındakı Tufarqan kəndidi. Bu haqq aşiqinin barəsində aparılan tədqiqlərdən aydın olur ki, Abbas Tufarqanlı XVII yüzillikdə, Azərbaycanda aşıq poezyasının çiçəkləndiyi bir dövrdə yaşamışdır.

Abbas Tufarqanlı əsasən qoşma və gəraylıları ilə şöhrət qazanmışdır. Onun lirikasında xalq ruhu, el duyğuları, öz dərin ifadəsini tapmışdır.[2]

Aşıq Abbas Tufarqanlının şeirləri bizə tam şəkildə gəlib çatmamışdır. Lakin Abbas Tufarqanlı irsinin mühüm hissəsi ustad aşıqlar tərəfindən mühafizə olunmuşdur. Məsələn, professor Məhərrəm Qasımlı "Ozan-aşıq sənəti" kitabında qeyd edir ki Tufarqanlı Abbasın hələlik çap olunmamış bu şeiri Aşıq Aslan Kosalıdan 1990-cı ildə yazıya alınıb:

---

[1] Miskin Abdal. Bakı, "Səda", 2001. səh. 228

[2] Araz Dadaşzadə. "Ön söz" // Abbas Tufarqanlı. "72 şeir". (tərtib edəni: Araz Dadaşzadə). Bakı, "Gənclik", 1973. səh. 3

*Bu gün durdun vardın könlün şəhrinə,*
*O şəhərdə gördün şahlar şahı var.*
*Üç yüz altmış küçəsinə dolaşdım,*
*Qırx səkkiz yerindən bəndirgahı var.*

*Bir dükançı gördüm müdam oyaqdı,*
*Məhşər günü möminlərə dayaqdı.*
*Şəriət, təriqət, mərifət haqqdı,*
*Əsl həqiqətin mənzilgahı var.*

Bu şeirdən aydın olur ki haqq sirrinə dərindən bələd olan və islam dininin dörd qapısından söhbət açan Abbas Tufarqanlı haqq aşiqlərindən biri olub. O, haqq aşiqi olaraq səmimi qəlbdən möminlər ağası Həzrəti-Əliyə (ə) bağlı olan şəxsdir.

Haqq aşiqi olaraq səmimi-qəlbdən möminlər ağası İmam Əliyə (ə) bağlı olan Abbas Tufarqanlı dar günündə Həzrəti-Əlini (ə) dadına çağırır və Həzrəti-Əli (ə) Abbasın dadına yetişir, ona ən çətin məqamda nicat verir. Rəvayətə görə, Aşıq Abbas Tufarqanlı bağda yatır və yuxuda Mövla-Əli (ə) ona eşq butası verir. Bundan sonra Abbası iki dəfə quyuya salırlar. Birinci dəfə Becan onu su quyusuna, ikinci dəfə isə Şah Abbas onu zəhər quyusuna saldırır. Hər iki halda Aşıq Abbas Həzrəti-Əlini (ə) dadına çağırır və hər ikisində də öz qəhrəmanına eşq badəsi içirən Həzrəti-Əli (ə) onu dardan qurtarır, özü isə qeybə çəkilir.

“Abbas və Gülgəz” dastanında həmin hissəyə diqqət yetirək.

Birinci dəfə Abbas quyudan xilas olmaq üçün Həzrəti-Əlini (ə) köməyinə çağırır və quyunun dibindən yanıqlı-yanıqlı belə oxuyur:

*İstərəm Şirri-Xudanı,*
*Ağamı, Şahi-Mərdanı.*
*Mən Abbası-binəvanı,*
*Ağlar qoyan hara getdi?*[1]

---

[1] “Azərbaycan məhəbbət dastanları”. Bakı, “Elm”, 1979. səh. 293

İkinci dəfə zəhər quyusundan xilas olmaq üçün yenə mərdlər ağası Həzrəti-Əlini (ə) dadına çağırır:

*Müşküldə qalıb çağırram səni,*
*Yetiş bir dadıma, ay ağa, haray.*
*Pərvanə tək yandım şəmin oduna,*
*Piltə tək qovruldum o yağa, haray.*[1]

Abbas bu sözləri quyunun dibində qəmli-qəmli oxuyarkən gördü ki, quyunun ağzındakı daş kənara getdi və quyunun içərisi işıqlandı. Aşıq Abbas başa düşdü ki, bu iş Həzrəti-Əlinin (ə) işidir. Çox sevincək olub dedi:

*Ağalar ağası Səlli Əla Muhəmməd,*
*Ərənlər sərvəri gəldi, ha gəldi.*
*Düldülün sahibi, Qənbər ağası,*
*Cansıza can verən gəldi, ha gəldi.*[2]

Bu zaman nurani bir şəxs quyunun başında hazır olub, Abbası səslədi və buyurdu: "Ey Abbas! Əlini uzat, əlimi tut." Abbas əlini uzadır, Həzrəti-Əli (ə) öz mübarək əlini ona uzadır və Abbası quyudan çıxarır, sonra buyurur: "Abbas, məni tanıyırsan?" Abbas dedi: "Kor olsun o göz ki, səni tanımayır, qulaq as, gör, tanıyıram, yoxsa tanımıram:

*Məzhərul-əcaib, tibbül elətyab,*
*Behiştdə maliksən saqeyi-Kövsər.*
*Natiqi-Quransan, elmin bəyanı,*
*Sənin əlindədir hesabi-dəftər.*[3]

[1] "Azərbaycan məhəbbət dastanları". Bakı, "Elm", 1979. səh. 299
[2] "Azərbaycan məhəbbət dastanları". Bakı, "Elm", 1979. səh. 301
[3] "Azərbaycan məhəbbət dastanları". Bakı, "Elm", 1979. səh. 304

Sonra Həzrət Əli (ə) buyurur: "Abbas, salavat çevir və atımın rikabından tut".

Abbas gözlərini yumub bir salavat çevirir və İmam Əlinin (ə) atının rikabından tutub, bir göz qırpımında İsfahan darvazasına yetişdi. Həzrəti-Əli (ə) buyurdu: "Ey Abbas, yeddi günə qədər filan abidə qonaqsan. Ondan sonra hara istədin, gedərsən".[1]

"Abbas və Gülgəz" dastanından da açıq-aydın görünür ki, həqiqətən Abbas Tufarqanlı haqq aşiqi olub və ömrünün sonuna kimi öz əhdinə sadiq qalıb. Aşığın "Edibdi" rədifli qoşmasında bunun bir daha şahidi oluruq:

*Damadı-Peyğəmbər, zinəti-mənbər,*
*Məhşərdə şiəyə imdad edəndi.*
*Kərəmin kanidir, sahibi-Qənbər,*
*İmamət vəchində irşad edəndi.*[2]

Aşıq Abbas Tufarqanlının "Şeşaşeş" rədifli ustadnaməsinə diqqət yetirək:

*Əvvəl ibtidadan nurdan yaranmış,*
*Çəkiliydi nuri-ayə şeşaşeş.*
*Abu-atəş, xaku-baddən yaranmış,*
*Ayda ondan qılar sayə şeşaşeş.*

*Əzəl gündən sənə demişəm Əli,*
*Peyğəmbər yerində vəsisən, vəli,*
*Çəkdin Zülfüqarı, böldün Əntəri,*
*Şahlıq gəldi sən Mövlaya şeşaşeş.*

---

[1] "Azərbaycan məhəbbət dastanları". Bakı, "Elm", 1979. səh. 305

[2] Abbas Tufarqanlı. "72 şeir". (tərtib edəni: Araz Dadaşzadə). Bakı, "Gənclik", 1973. səh. 36

*Abbasın şəstində çoxdur hünəri,*
*Övliyalar, ənbiyalar mürsəli,*
*Yədullah əliylən yıxdın Xeybəri,*
*Əhsən gəlib bu sənayə şeşaşeş.*[1]

Abbas Tufarqanlının poeziyasında İmam Əli (ə) sevgisi sıx-sıx rast gəlinən motivdir.

Göründüyü kimi, Aşıq Abbas bütün sınaqlardan mürşidi Həzrəti-Əlinin (ə) sayəsində ləyaqətlə çıxır və bir daha "Deyə-deyə" rədifli gəraylısında Həzrəti-Əlini (ə) belə mədh edir.

*Könlüm istər o Allahı,*
*Dilim Mövla deyə-deyə.*
*İkinci də surullahı,*
*Dilim Mövla deyə-deyə.*

*Zülfüqarı çaldı daşa,*
*Bir cüt bulaq çıxdı qoşa,*
*Əjdahanı başdan-başa,*
*Böldü Mövla deyə-deyə!*

*Dinlə Abbasın səsini,*
*Tökər könüllüər pasını,*
*O Xeybərin qalasını,*
*Aldı Mövla deyə-deyə!*[2]

Göründüyü kimi məhəbbət dastanlarımızda İmam Əli (ə) surəti, ona böyük sevgi təkcə Aşıq Abbas Tufarqanlı ilə bağlı deyil. Bu haqda M.H.Təhmasib yazır: "Qurbani, Tufarqanlı Abbas

---

[1] Abbas Tufarqanlı. "72 şeir". (tərtib edəni: Araz Dadaşzadə). Bakı, "Gənclik", 1973. səh. 41

[2] Abbas Tufarqanlı. "72 şeir". (tərtib edəni: Araz Dadaşzadə). Bakı, "Gənclik", 1973. səh. 47

kimi aşıq tərzində yazıb-yaradan savadlı el şairləri "buta" məsələsini daha da möhkəmləndirməyə, müsəlman gənclərin sevişməsinə icazəni Əlinin (ə) adı ilə bağlamağa, onun nüfuzundan, hörmətindən istifadə etməyə başlamışlar. Çünki bu gənclərə "abi-kövsər"dən, yaxud "nur"dan ibarət olan badəni də, butanı da, haqq aşığının qüdrətini də Həzrəti-Əli (ə) verirdi".[1]

Aşıq Abbas Tufarqanlının poetik irsi həm Azərbaycan aşıq şeiri tarixində, həm də XVII yüzillikdəki ədəbiyyatda silinməz izlər buraxmışdır.[2]

***

Azərbaycan ədəbiyyatının görkəmli nümayəndələrindən biri də XVIII əsrdə dünyaya göz açmış Tikmədaşlı Xəstə Qasımdır. Aşığın yaradıcılığından məlum olur ki, o, öz dövrünün müdrik və ziyalı şəxslərindən olmuşdur. Şeirlərində tərənnüm olunan fikirlər onun bilik və düşüncə çərçivəsinin nə qədər geniş və əhatəli olduğunu açıq-aydın şəkildə göstərir.

Professor Sədnik Paşayevin də qeyd etdiyi kimi Ş.İ.Xətaiyə qədər aşıq yaradıcılığı demək olar ki, yalnız xalq arasında mövcd idi. Xətainin hökmdar olduğu dövrdə isə saz və aşıq şah sarayına yol tapmışdır. Ş.İ.Xətai özü də ana dilində, aşıq şeiri tərzində, heca vəzni ilə əsərlər yaratmışdır. Bizcə aşıq divanisinin ilk mükəmməl formasını sazın köməkliyi ilə Xətainin müasiri, bəlkə də yaxın müsahibi olan Dirili Aşıq Qurbani yaratmışdır. Hazırda Qurbaninin elm aləminə yeganə nümunə kimi məlum olan "Olar" rədifli divanisindən əlavə daha iki "Gözəl" və "Kərimdir" rədifli divanilərini də əldə edə bilmişik. Bu divanilərdə Xətai ilə Qurbaninin yaxınlığını təsdiq edən işarələrə rast gəlirik. Hətta, elə bil "Kərimdir" rədifli üçbəndlik divani Çaldıran müharibəsində məğlub olmuş Ş.İ.Xətaiyə təsəlli və təskinlik ver-

---

[1] Məmmədhüseyn Təhmasib. "İlk söz" // "Azərbaycan məhəbbət dastanları". Bakı, "Elm", 1979. səh. 6

[2] Məhərrəm Qasımlı. "Ozan-aşıq sənəti". Bakı, "Uğur", 2007. səh. 145-148

mək üçün yazılmışdır.[1]

Bu görkəmli el sənətkarının əsas təxəllüsü "Xəstə Qasım" olsa da o, "Şikəstə Qasım", "Biçarə Qasım" və "Molla Qasım" təxəllüsləri ilə yazıb-yaratmışdır.[2]

El arasında dolaşan rəvayətlərə görə isə Xəstə Qasımın beş adı, beş təxəllüsü olmuşdur. Din xadimi, ruhani kimi məclis apardığı zaman ona Molla Qasım, şənlik məclislərində, toy-düyündə çalıb-çağırdığı zaman Aşıq Qasım, şagird yetişdirəndə Ustad Qasım, xeyir -şərdə öyüd-nəsihət edərkən, müdrik məsləhətlər verərkən Dədə Qasım, el-obanın dərd-qəmini, ağrı-acısını dilə gətirəndə isə Xəstə Qasım deyirlərmiş. Professor S.Paşayev şairin təxəllüsündəki "Xəstə" sözünü Ş.İ.Xətainin "Xəstə Xətai" təxəllüsü ilə əlaqələndirmiş və bunu Xəstə Qasımın şah ustadına dərin və sonsuz məhəbbəti ilə izah etməyə çalışmışdır.[3]

Xəstə Qasımın mənəvi dünyasından gələn tükənməz işıq və ilahi eşq fəlsəfəsi özündən sonrakı dövrlərin aşıq yaradıcılığına da işıq salmışdır. Haqq aşiqi öz yaradıcılığında sazın və sözün xalq arasında buraxdığı mənəvi imkanlardan gen-bol bəhrələnmişdir. Eyni zamanda Qurani-Kərimdən və İslami elmlərdən bəhrələnmiş, İslam dinin dörd mərhələsini birər-birər keçmiş, insanın son dərəcə məhəbbətə, saflığa, təmizliyə, eşq və həqiqətə necə çatdığını yaradıcılığında əks etdirmişdir.

Təsəvvüfün dörd mərhələsi Xəstə Qasım yaradıcılığında da müstəsna yer tutur. Haqq aşığı özü dəfələrlə təsəvvüfün dörd mərhələsinə şeirlərində aydınca toxunmuşdur:

---

[1] Sədnik Paşayev. "Ön söz" // Xəstə Qasım. "46 şeir". Bakı, "Gənclik", 1975. səh. 3

[2] Sədnik Paşayev. "Ön söz" // Xəstə Qasım. "46 şeir". Bakı, "Gənclik", 1975. səh. 9

[3] Sədnik Paşayev. "Ön söz" // Xəstə Qasım. "46 şeir". Bakı, "Gənclik", 1975. səh. 4

*Həqiqət, mərifət haqdır, qanıram,*
*Təriqət, şəriət qoşa yazıldı.*

Və ya

*Həqiqət bəhrində ğəvvasəm deyən,*
*Ğəvvassansa, gir dəryaya üz ha üz.*[1]

Bəs Təsəvvüf nədir? – Təsəvvüf bir başa Allaha ehtiyac və bu ehtiyacı ödəmə hissi, eyni zamanda ali həqiqət axtarışı yoludur. Həqiqətə çatmaq üçün zahiri cəhətdən üz döndərib, fiziki mövcudluqdan xilas olmaq lazımdır. Yəni o, bu yolu başa vurduqdan sonra özü olur. Onun məqsədi əslində özünə çatmaq, özünə qovuşmaqdır.

Təsəvvüf dörd mərhədlədə məqsədə gedən yoldur:

1. Şəriət – din tərəfindən qəbul edilmiş qanun və vəzifələri yerinə yetirmək mərhələsi.
2. Təriqət – Yol deməkdir. Bu mərhələ insanın mənəvi cəhətdən artma, daxili özü ilə (nəfsi ilə) mübarizə mərhələsidir.
3. Mərifət – Daxili zəlillik, köləliklə mübarizə aparıb Tanrı quluna, Tanrı köləsinə, ilahi eşq xəstəsinə çevrilmə mərhələsidir.
4. Həqiqət – ucalar ucası qarşısında zərrəyə döndüyünü və bu ucalıqdan bir zərrə olduğunu dərk etmək mərhələsidir.

Bu mərhələdə sirrlər insanın qarşısında öz pünhanlığını itirir. Bu mərhələdə insan bəxtiyarlığa və sonsuzluğa qovuşur.[2]

Son mərhələ olan Həqiqətə vaqif olamaq elə bir ucalıqdır ki, Xəstə Qasımdan öncə yaşayıb-yaratmış klassiklərimizin və aşıqlarımızın, o sıradan Ş.İ.Xətainin yaradıcılığında da onun möhtəşəmliyinin şahid oluruq.

---

[1] Məhəmməd İbadi Qaraxanlı “Alışıq”. “Ön söz” // Xəstə Qasım. Bakı, “Folklor İnstitutu”, 2010. səh. 10

[2] Məhəmməd İbadi Qaraxanlı “Alışıq”. “Ön söz” // Xəstə Qasım. Bakı, “Folklor İnstitutu”, 2010. səh. 10

*Şəriət yolunu Mühəmməd açdı,*
*Təriqət gülünü Şah Əli seçdi,*
*Şu dünyadan neçə yüz min ər keçdi,*
*Onlar ittifaqda, Mehdi yoldadır.*[1]

və yaxud:

*Şəriətdir, Təriqətdir, Həqiqət,*
*Mərifət bir gözüdür can içində.*

Məşhur bir hədisdə deyilir ki, Allaha tərəf gedən yollar insanların sayı qədər çoxdur. Ona görə də təriqətlər arasında fərq təbiidir. Lakin, onların hədəfi birdir. Bu hədəfə yetişmək üç mərhələdə gerçəkləşir.

**1. Şəriət;**
**2. Təriqət;**
**3. Həqiqət.**

Buna uyğun olaraq yəqinliyin üç mərhələsi vardır.

**1. Elmul-yəqin;**
**2. Eynul-yəqin;**
**3. Həqqul-yəqin.**

Yəqinin nə olduğu soruşulduqda İmam Baqir (ə) belə cavab verib: "Yəqin Alaha təvəkkül etmək, Onun qarşısında təslim olmaq, hökmünə razı olmaq, bütün işləri ona həvale etməkdir".

Bəzi təfsirçilər Qurana əsaslanaraq "Yəqin"i üç mərhələyə bölmüşlər.

1. Elmül-yəqin – insan dəlil və sübutlar əsasında nəyinsə varlığına əmin olur. Məsələn, tüstünü görməklə yanğının olduğuna əmin olur.

[1] Şah İsmayıl Xətai. "Keçmə namərd körpüsündən" (Şeirlər və poemalar). Bakı, "Yazıçı", 1988. səh. 316

2. Eynül-yəqin – müşahidə mərhələsinə deyilir. Buna misal olaraq qeyd edilən yanğını birbaşa göstərmək olar.

3. Həqqül-yəqin – oda daxil olub, onu bütün varlığı ilə hiss etmək, odun xüsusiyyətlərini özündə ehtiva etmək. Bu, yəqinin ən yüksək mərhələsidir. Əslində birinci mərhələ ümumi səciyyə daşıyır. İkinci mərhələ təqvalılara, üçüncü mərhələ isə Allahın xüsusi və yaxın bəndələrinə xas olan mərhələdir.

Allah-təala "Təkasur" surəsinin 5-7 ci ayələrində buyurur: "Xeyr! (Siz düşündüyünüz kimi deyil). Əgər yəqininiz olsaydı, çoxa hərisliyiniz Alahı sizə unutdurmazdı; Siz cəhənnəmi mütləq görəcəksiniz! Sonra ona daxil olmaqla öz gözlərinizlə görəcəksiniz!".

Bir gün Peyğəmbərə (s) deyirlər. Eşitdiyimizə grə İsanın (ə) səhabələrindən biri suyun üzündə yeriyirmiş. Peyğəmbər (s) buyurur:

"Əgər yəqini daha çox olsaydı havada gəzərdi".

Əllamə Təbatəbai bu hədisi qeyd etdikdən sonra belə yazır: "Hər şeyr Allaha olan qəti inam və yəqin, dünyadakı səbəblərin heç birinin müstəqil təsirə malik olmamasına inam çevrəsində dövrə vurur. Allahın mütləq qüdrətinə inam və etiqadı nə qədər yüksək olarsa, bütün dünya insana o qədər müti və qul olar.[1]

Fəridəddin Əttar öz "Təzkirə"sində Şibliyə istinad edərək göstərir ki, "Elmül-yəqin" – Peyğəmbərin (s) bizə verdiyi bilgidir. "Eynül-yəqin" Tanrının bəxş etdiyi hidayət nurudur. "Həqqül-yəqin" isə arifin öz "mən"ini fəna etməsi və bəqaya qovuşmasıdır. Həcviri bu üçlüyü sadə dillə izah etməyə çalışır: şəriət yol göstərəndir, buradakı əxlaq qanunlarını yerinə yetirmək insanı düz yola yönəldir, onda ruhi-batini hazırlıq yaradır. Təriqət – kamilliyə aparan yoldur, Həqiqət isə son mənzildir. Şəriət – tibb kitabı, Təriqət – dava-dərman, Həqiqət isə dərddən nicat tap-

[1] Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017. səh. 600

maqdır. Həqiqət hər ikisindən yüksəkdə dayanır, hər kim peyğəmbərin (s) görə bildiyini görürsə həqiqət əhlidir.

İbn-Bəzzaz həmin üçlüyü belə izah edir: "Şəriət Məhəmməd (s) qanunu, Təriqət – hərəkət və əməl, Həqiqət isə haldır. Təriqət haqqa doğru aparan düzgün yoldur. Süluk əhli yüksəliş (Merac) halındadır. Həqiqət haqqın müşahidəsi və mərifətidir. Təriqət şəriətsiz, Həqiqətsə təriqətsiz gerçəkləşmir. Şəriət meyvənin qabığıdır, onu qoruyub saxlayır. Təriqət meyvənin içi və kütləsidir. Həqiqətsə onun məğzi və mahiyyətidir".

Bu üç mərhələyə (Şəriət, Təriqət, Həqiqət) uyğun Elmul-yəqin kəsb və təlim əldə edilir. Burada insan nəfsi aza bilər. Eynul-yəqin saleh (düzgün) əmələ yiyələnməkdir, burada insan nəfsi aza bilməz. Həqqul-yəqin həqiqət anlamıdır. Elmul-yəqin bəsirət gözüdür. Həqqul-yəqin isə məna gözü ilə görür.[1]

Yuxarıda deyilənlərə və hədislərə əsasən imanın ən üstün dərəcəsi Yəqin mərhələsi (Həqqul-yəqin) hesab edilir. İmam Məhəmməd Baqir (ə) buyurmuşdur: "İman İslamdan, Təqva imandan, Yəqin isə Təqvadan bir dərəcə yüksəkdir. İnsanlar arasında Yəqindən az bölünən bir şey olmamışdır".

Çox qədim bir əfsanədə deyilir: "Üç pərvanə şamın ətrafında uçub onun mahiyyəti, onun nə olduğu haqda düşünürlər. Pərvanələrdən biri bir az şama yaxınlaşıb deyir:

– O, işıq saçır.

İkinci pərvanə daha çox yaxınlaşıb deyir:

– O, istidir. Soyuqda da qızdırır.

Lakin üçüncü pərvanə alovun tam içinə girib yox olur və geri qayıtmır. O, sualının cavabını tapır. Amma, bunu başqalarına deyə bilmir. Həmin pərvanə kimi həqiqəti tapanlar onu insanlara deyə bilmir. Ona görə bilməyənlər danışır, bilənlər isə susur".[2]

---

[1] Nəsib Cümşüdov. "Füzulinin sənət və mərifət dünyası". Bakı, Tehran, 1997. səh. 22-23

[2] V.Almasov, H.H.Hüseyni. "Nəsimidən nəsimlər". I cild. Bakı, "Ecoprint", 2020. səh. 62

Klassik və aşıq ədəbiyyatında da belədir. Elə buna görə də S.İ.Nəsimi deyir:

*Bulmuşam həqqi, "Ənəlhəqq" söylərəm,*
*Həqq mənəm, həqq məndədir, həqq söylərəm.*
*Gör bu əsrarı nə mütləq söylərəm,*
*Sadiqəm qövlümdə, səddəq söylərəm*[1].

Bu həqiqət isə Əli (ə) həqiqətindən başqa bir şey deyildir.

Necə ki, İslam Peyğəmbəri Həzrəti-Məhəmməd (s) "Vida" həccindən qayıdarkən (18 Zilhiccə, 632) Ğədir-Xum çölündə uzun xütbə etdikdən sonra Həzrəti–Əlini (ə) öz yanına çağırmış və mübarək əlini göyə qaldırmış və buyurmuşdur: "Ey camaat, Allah mənim Mövlamdır, Mən isə sizin mövlanızam. Mən hər kimin Mövlasıyamsa Əli də onun Mövlasıdır. Əli həqq ilədir, həqq də Əli ilədir".[2]

"Xəstə Qasım" dastanında daha maraqlı və cazibədar bir seçim-situasiyanın şahidi oluruq. Adi bir çoban olan, sayılıb-seçilməyən Xəstə Qasım qoyun otararkən qəbristanlıqda yatır. Yuxuda ona alimlik istedadı və şairlik təbi verilir. Alimlər, qazilər, ruhanilər qarşısında elm və sənət imtahanı verən və bu imtahandan qalib çıxan müctəhid (ictihad sahibi-yəni şəriət məsələlrində hökm verən) məclisə layiq ən gözəl söz söyləməyi xahiş edir. Məclisə və insanlığa layiq ən gözəl söz nə ola bilər? Xəstə Qasımın nəzərincə Həzrəti-Əlinin (ə) şəninə söylənmiş vəsfdən gözəl söz yoxdur. Ona görə də o, öz poetik inamını belə ifadə edir:

---

[1] İmadəddin Nəsimi. "Rübailər". Bakı, "Azərnəşr", 1973. səh. 95
[2] H.H.Hüseyni. "Müqəddəs Zilhiccə bayramları". Bakı, "Ekoprint", 2020. səh. 50-53

*Ərşi-zəmin, lövhi-qələm yox ikən,*
*Varlığa hamıdan tez gələn Əli.*
*Ustadlar ustadı olubsan özün,*
*Cəbrail məqamın düz bilən Əli.*

*Sənin hörmətinə quruldu varlıq,*
*Həyatın Zəm-zəmi, o suyi-dirlik.*
*Səndə nəqş olundu elm və birlik,*
*Cəmi dillər ilə söz bilən Əli.*

*Xəstə Qasım, zərbi-danəndən Əli,*
*Aləmi-zərridə demişəm bəli.*
*Bir ismin Əlidi, bir ismin Vəli.*
*Cəmi pünhan dərdi tez bilən Əli.*[1]

Ş.İ.Xətai ilə bağlılıq aşığın ömür yolundan da aydın görünür. Xəstə Qasım Tikmədaşda molla məktəbini başa vurduqdan sonra təhsilini davam etdirmək üçün Ərdəbil şəhərində olan Şeyx Səfi məscidinə getmişdir. Məlum olduğu kimi Ş.İ.Xətainin babalarından olan Ərdəbilli Şeyx Səfiəddin özü təriqət sahibi olmuşdur.Ərdəbildə məsciddən başqa "xanqa" qurub dövrəsinə bir çox müridlər yığmış və bu xanqa uzun illər fəaliyyət göstərmişdir. Ərdəbil isə təsəvvüfün ocağı olan müqəddəs bir şəhər kimi tanınmışdır. Xəstə Qasım orada təriqətlə tanış olmuş, təriqətin qanunları ilə maraqlanmış və sonda Şeyx Səfi xanqahına daxil olmuşdur. Xəstə Qasım ilk mərhələdə təriqət ayinlərindən sayılan "çillə" tutmuşdur. Çillə fars sözü olub "çehellə" – 40 gün deməkdir. Təriqət mərhələsinə daxil olan şəxslər bu zikri arasıkəsilmədən 40 gün əzində yerinə yetirirlər və yuxarı qatlarına yüksəlirlər. Təriqətin son dərəcəsi "Vəhdəti vücud" – yəni Allaha

[1] Xəstə Qasım. "46 şeir". Bakı, "Gənclik", 1975. səh. 376

qovuşmaqır.[1]

Bu bilgilər aşığın ədəbi irsində də öz parlaq əksini tapmışdır:

*Xəstə Qasım deyir dəsti-rəst oldum.*
*Şah əlindən badə içib məst oldum.*
*Sayılı qırx gün Şeyx Səfidə bəst oldum.*
*Onda bəyan oldu dörd kitab mənə.*[2]

Bu bənddən məlum olduğu kimi Xəstə Qasım 40 gün Şeyx Səfi xanqahında təriqət ayinlərini yerinə yetirəndən sonra yuxuda Həzrəti-Əlini (ə) görüb ondan badə almışdır.

*Dəstindən içmişəm badə,*
*Cahana salmışam səda.*
*Qasımam, yavmul cəzada,*
*Əl mənim, damən Heydər.*[3]

Məlumdur ki, ənənəvi ədəbiyyatşunaslıqda Kərbəla vaqiəsi və Kərbəla şəhidi Hürrün qəbrinin açılması motivindən tez-tez danışılır. Xətainin və Xəstə Qasımın aşağıdakı şeirləri arasında ortaq nöqtələri görməmək olmaz:

*Ey Müsəlmanlar, əsiri-zülfi-yarəm, doğrusu,*
*Bu siyahkarın əlində biqərarəm, doğrusu.*

*Derdim, ol dilbər yanında etibarım var mənim,*
*Yoxladım, etdim yəqin, bietibarəm, doğrusu.*

---

[1] Məhəmməd İbadi Qaraxanlı "Alışıq". "Ön söz" // Xəstə Qasım. Bakı, "Folklor İnstitutu", 2010. səh. 4-5
[2] Xəstə Qasım. Bakı, "Folklor İnstitutu", 2010. səh. 61
[3] Xəstə Qasım. Bakı, "Folklor İnstitutu", 2010. səh. 94

*Bir quru candan nolur, qurban edim cananimə,*
*Ol pəri rüxsardən çox şərmsarəm, doğrusu.*

*Şah Xətai seyrə çıxdı, açdı Hürrün qəbrini,*
*Bar-İlahi, əfv qıl kim, tövbəkaram, doğrusu.*
*(Q.357. səh.187).*

*Bir gün oldu Şah Xətai Qazıylə çıxdı seyrə,*
*Açdı o Hürrün qəbirin, günahkaram doğrusu,*
*Üç əlif, bir dal yazmışlar, diqqət eylə, xəttə bax,*
*Söylə sözün, açma sirrin, tövbəkaram, doğrusu.*

*Sidqi-dillə Nəcəf şahı, o Mövlaya yalvardım,*
*Üzüm tutdum, bu dünyada Mustafaya yalvardım.*
*Üz çevirdim Kərbəlaya, şühədaya yalvardım,*
*İndi məni xəta tutub, xətakaram, doğrusu.*

*Yetmiş iki cana qurban, bir-birindən mötəbər,*
*Səqqayi-Kərbəlaya bax, şühədaya verər xəbər,*
*Xəstə Qasım Hürrün qəbrin görən kimi bərk əsər,*
*Gecə-gündüz ağlayaram, günahkaram, doğrusu.*[1]

Beləliklə, aydın olur ki, Şah İsmail Xətai irsilə orta əsrlər aşıq yaradıcılığı Əhli-beytə (ə.m) məhəbbət yönündə üzvü vəhdət təşkil etməkdədir.

[1] Xəstə Qasım. Bakı, "Folklor İnstitutu", 2010. səh. 122

# V FƏSİL

# ƏLAVƏLƏR

## 5.1. I ŞAH İSMAİL DÖVRÜNDƏ QIZILBAŞ ƏMİRLƏRİ

(“Tarix-i aləmara-yi Şah İsmail” əsəri əsasında)

**Ustaclu tayfası (13 nəfər):** Məhəmməd xan, Qaraxan xan, Abdulla xan, Xızır xan, Süleyman bəy, Şahrux sultan, (Kor Şahrux), Sarı Pirə, Köpək sultan, Mahmud bəy, Məntəş sultan, Murad bəy, Çayan sultan, Məhəmməd sultan Sufioğlu;

**Şamlu tayfası (9 nəfər):** Hüseyn bəy Lələ, Əhməd sultan, Əxi sultan, Əbdi bəy, Durmuş xan, Zeynal xan, Musa bəy, Həsən bəy, Süleyman bəy;

**Türkmən tayfası (8 nəfər):** Əlişəkər bəy Baharlu, Məhəmməd xan Baharlu, Mənsur bəy Pornak, Əmir xan Mosulu, Gülabi xan Mosullu, Abdal sultan Türkmən, Qızıl Məhəmməd Türkmən;

**Rumlu tayfası (6 nəfər):** Div sultan, Nurəli xəlifə, Xəlil ağa, Sufiyan xəlifə, Badıncan (Badımcan) sultan, Qaragünə sultan;

**Təkəlü tayfası (6 nəfər):** İlyas bəy Halvacıoğlu, Həsən bəy Halvacıoğlu, Yaqub bəy Halvacıoğlu, Üləma sultan, Sarı Əli bəy Möhürdar, Burun sultan;

**Qacar tayfası (5 nəfər):** Qara Piri bəy, Rüstəm bəy, Əhməd sultan, Mahmud bəy, xəlil xan;

**Əfşar tayfası (4 nəfər):** Sultanəli bəy, Məhəmməd xan, Danə Məhəmməd sultan, Vəlican sultan;

**Zülqədər tayfası (4 nəfər):** Xəlil xan, Əlixan sultan, Zöhrab sultan, vələdxan bəy;

**Talış tayfası (4 nəfər):** Abdal bəy Dədə, Xadim bəy Xüləfa, Mirzə Məhəmməd, Pirqeyb xan;

**Qaramanlu tayfası (3 nəfər):** Bayram xan, Hüsam bəy, Əlican sultan;

**Varsaq tayfası (3 nəfər):** Yusif xəlifə, Qasım xəlifə, Həsən xəlifə;

**Qıpçaq tayfası (1 nəfər):** Mənsur bəy.[1]

[1] Namiq Musalı. "I Şah İsmayılın hakimiyyəti" ("Tarix-i aləmara-yi Şah İsmayıl" əsəri əsasında). Bakı, "Elm və təhsil", 2011. səh. 386-387

## 5.2. ATALAR SÖZLƏRI VƏ ZƏRB-MƏSƏLLƏR

(“Tarix-i aləmara-yi Şah İsmail” əsərinin mətnindəki atalar sözləri və zərb-məsəllərdən nümunələr)

Allahın yandırdığı çırağı üfürüb söndürmək istəyən öz saqqalını yandırar.

Aman mürvət şərtidir.

Aman vermək imandandır.

Aman vermək mərd adamın işidir.

Döyüşün gedişi gah qələbə olar, gah məğlubiyyət.

Dünya intiqam evidir.

Eşitmək hara, görmək hara?!

Əcəli çatan tələsər.

Əcəli çatmış seyd (ov heyvanı) səyyada (ovçuya) sarı üz tutar.

Əgər məşuqə tərəfindən bir səy olmasa, biçarə aşiqin səyləri kifayət etməz.

Əl mənimdir, ətək sənin.

Əsla biqeyrətlik etmə ki, dünyada və axirətdə işə yarayan bircə şey varsa, o da qeyrətdir.

Əyan olan işə bəyan nə lazım?!

Günahdan əvvəl cəza verilməz.

Günəşin qabağında zərrə nədir ki?!

Heç iki oldu ki, üç də olsun?!

Hər gülün minnətini yüz xar çəkər.

Hər yoxuşun bir enişi də var.

İlanla tovuzquşu cütləşməz.

İnsaf mərdanəlik əlamətidir.

Kafir hamını öz əqidəsində görər.

Kim bişirdi, kim yedi.

Kişi vədindən dönməz.

Mərdliklə namərdliyin arası bir addımdır.

Mürşidin zəhməti rəhmətdir.

Nə əkərsən, onu da biçərsən.

On dərviş yerləşər bir kilimə, iki padşah sığışmaz bir iqlimə.

Sufiliyin qaydası söz eşitməkdir.

Təvazökarlıq alicənab üçün üstün cəhət, gəda üçün adi xüsusiyyətdir.

Yaxşı oğul dayısına oxşayar.

Yaxşıya yaxşılıq düşər, pisə də pislik.[1]

---

[1] Namiq Musalı. "I Şah İsmayılın hakimiyyəti" ("Tarix-i aləmara-yi Şah İsmayıl" əsəri əsasında). Bakı, "Elm və təhsil", 2011. səh. 387-388

## 5.3. ON DÖRD MƏSUMUN XRONOLOGİYASI

Şah İsmail Xətainin ulu babası Şeyx Səfiəddin Ərdəbilidən tutmuş Səfəvilərin sonuncu şahına qədər (1501-1736) bu sülalənin on dörd məsumə (ə.m) olan sonsuz sevgi, məhəbbət və məvəddətlərini nəzərə alıb, bu kitabda on dörd məsumun ömür yolu xronologiyasını da təqdim edirik.

| **14 Məsumun adları** | **Atası** | **Anası** | **Təvəllüdü** | **Vəfatı** | **Ömrü** | **Qəbri-Şərifi** |
|---|---|---|---|---|---|---|
| Hz Muhəmməd (s) | Əbdulla | Aminə | 17 rəbiəl-əvvəl | 28 səfər | 63 | Mədinə Məscidin - Nəbi |
| Hz Fatimə (s.ə) | Muhəmməd (s) | Xədicə (ə) | 20 cəmadiyyəssani | 20 cəmadiyuləvvəl | 18 | Gizlin |
| İmam Əli (ə) | Əbu Talib (ə) | Fatimə Əsəd qızı (ə) | 13 rəcəb | 21 ramazan | 63 | Nəcəfi -Əşrəf |
| İmam Həsən (ə) | Əli (ə) | Fatimeyi Zəhra (ə) | 15 ramazan | 28 səfər | 47 | Mədinə Bəqi |
| İmam Hüseyn (ə) | Əli (ə) | Fatimeyi Zəhra (ə) | 3 şəban | 10 məhərrəm | 57 | Kərbəla |
| İmam Zeynalabidin (ə) | Hüseyn (ə) | Şəhribanu | 5 şəban | 25 məhərrəm | 57 | Mədinə Bəqi |

| | | | | | | |
|---|---|---|---|---|---|---|
| İmam Məhəm-məd Ba-qir | Zeynala-bidin (ə) | Fatimə | 1 rəcəb | 7 zil-hiccə | 57 | Mə-dinə Bəqi |
| İmam Cəfəri Sadiq (ə) | Məhəm-məd Baqir (ə) | Ümmi Fərvə | 17 rəbiul əvvəl | 25 şəvval | 65 | Mə-dinə Bəqi |
| İmam Museyi Kazım (ə) | Cəfəri Sadiq (ə) | Həmidə | 7 səfər | 25 rəcəb | 55 | Kazımeyn |
| İmam Rza (ə) | Museyi Kazım (ə) | Nəcmə | 11 ziqədə | 30 səfər | 55 | Məş-hədi Müqəd dəs |
| İmam Məhəm-məd Təqi (ə) | İmam Rza (ə) | Xey-zəran | 10 rəcəb | 30 ziqədə | 25 | Kazımeyn |
| İmam Əliyən Nəqi (ə) | Məhəm-məd Təqi (ə) | Səmanə | 15 zil-hiccə | 3 rəcəb | 41 | İraq Sam-mira |
| İmam Həsən Əsgəri (ə) | Əliyən Nəqi (ə) | Səlil | 8 rəbiəs-sani | 8 rəbiəl-əvvəl | 28 | İraq Sam-mira |
| İmam Mehdi Sahib Zaman (əc.f) | Həsən Əsgəri (ə) | Nərcis Xanım | 15 şaban | - | - | - |

## 5.4. "TARİX-İ ALƏMARA-Yİ ŞAH İSMAİL" NÜSXƏLƏRİNDƏKİ MİNİATÜRLƏRİN SİYAHISI

(Tehrandakı Rza Abbasi Muzeyinə məxsus nüsxənin miniatürləri)

| Vərəq | Miniatürdə təsvir edilmiş mövzu |
|---|---|
| 11a | Şeyx Zahidin Şeyx Səfiəddini bir mürşid kimi öz varisi təyin etməsi |
| 13a | Sultan Xoca Əli Siyahpuşun Əmir Teymurun qırmancını geri qaytarması |
| 17a | Əmir Teymurun Ərdəbildə Sultan Xoca Əlini ziyarət etməsi |
| 42b | İsmailin Sultan Hüseyn Baranini öldürməsi |
| 48b | Şah İsmailin 12 imam adına xütbə oxutdurması |
| 51a | Ağqoyunlu Əlvənd mirzənin Əlaüddövlə Zülqədəri ziyarət etməsi |
| 87a | Qızılbaşlarla Zülqədərlilər arasında döyüş və Sarı Qaplanın öldürülməsi |
| 94b | Şah İsmailin Barik sultanı öldürməsi |
| 114b | Murad bəy Ustaclunun həbəşlərlə döyüşü |
| 135b | Babur şahın Şahibəy xanı təqib etməsi |
| 165a | Şahibəy xanın elçisi Sultan Hüseyn Bayqaranın oğullarının hüzurunda |
| 186b | Halvaçıoğlunun Canvəfa mirzəni atın üzərindən qaldırması |

| | |
|---|---|
| 199b | Əxi sultanın Culi Özbəyi öldürməsi |
| 210a | Adi Bahadırın Şahibəy xanı bataqlıqdan çıxarması |
| 217a | Şah İsmailin elçisi Mazandaran hakimi Ağa Rüstəmin hüzurunda |
| 241b | Orta Asiyadakı Qərşi qalası uğrunda qızılbaşlarla özbəklər arasında döyüş |
| 273b | Özbək xanlarından Canibəy sultan Dəşt-i Qıpçaq hökmdarı Qasım xanın hüzurunda |
| 280a | Şah İsmailin Əbülxeyr xanı öldürməsi |
| 298b | Şah İsmailin Malqoçoğlunu öldürməsi |
| 332b | Canberdi Qəzzalinin Şah İsmailin hüzuruna gətirilməsi |
| 339b | Şah İsmailin Qəzzali-oğlunu qəbul etməsi[1] |

[1] Namiq Musalı. “I Şah İsmayılın hakimiyyəti” (“Tarix-i aləmara-yi Şah İsmayıl” əsəri əsasında). Bakı, “Elm və təhsil”, 2011. səh. 375-376

# 5.5. ŞAH İSMAİL XƏTAİNİN ÖMÜR YOLU XRONOLOGİYADA

| | |
|---|---|
| 1487-ci il, 17 iyul – (25 rəcəb 892 h.q.) | İsmail Səfəvinin anadan olması |
| 1488-ci il, 1 iyul | İsmailin atası Şeyx Heydərin ölümü |
| 1489-cu il martın sonları – 1493-cü il avqustun əvvəli | İsmailin anası və qardaşları ilə İstəxr qalasında (fars əyalətində) məhbəsdə qalması |
| 1494-cü ilin ortaları | İsmailin Ərdəbildə Səfəvi təriqətinin şeyxi təyin edilməsi |
| 1494-cü ilin sonu | İsmailin Lahicana (Gilana) gəlməsi |
| 1499-cu il 22 avqust | İsmailin Gilanı tərk etməsi, Ərzincana getməsi |
| 1500-cü ilin yayı | İsmailin Ərzincanda qalması |
| 1500-cü ilin axırları | Çobanidə (Gülüstan qalası yaxıllığında) İsmailin Şirvanşah Fərrux Yassarla vuruşması |
| 1501-ci ilin yazı | İsmailin Bakı qalasını alması |
| 1501-ci ilin ortaları | Şərurda (Naxçıvanda) İsmailin Ağqoyunlu padşahı Əlvəndlə vuruşması |
| 1501-ci ilin payızı | İsmailin Təbrizə daxil olması, Azərbaycan taxtına çıxması, şah elan edilməsi |
| 1503-cü il, 21 iyun | Şah İsmailin Ağqoyunlu Sultanı Muradla Alma Qulağı (Həmədan) yaxınlığında vuruşması |
| 1503-cü il, 24 sentyabr | İsmailin Şiraza daxil olması |
| 1503/1504-cü il | İsmailin Qumda qışlaq keçirməsi |
| 1504-cü il, 25 fevral | İsmailin Qaşandan Firuzgaha hərəkət etməsi |

| | |
|---|---|
| 1504-cü il, 17 mart | İsmailin Gülxəndan qalasına çatması və onu alması |
| 1504-cü il, 29 mart | Onun Firuzgaha çatması, ongünlük vuruşmada şəxsən iştirak etməsi, qalanın fəth edilməsi |
| 1504-cü il, 11 aprel | Usta qalası uğrunda döyüşün başlanması |
| 1504-cü il, 13 may | İsmailin Usta qalasını alması |
| 1504-cü il, 19 may | İsmayılın Sorluq yaylağına gəlməsi |
| 1504-cü ilin ortaları | İsfahan yoluyla Yezdə gəlib, bir aylıq mühasirədən sonra oranı zəbt etməsi |
| 1504/1505-ci ilin qışında | İsfahanda qışlaqda olarkən Sultan Bayazidin elçilərini qəbul etməsi |
| 1506/1507-ci ilin qışında | İsmailin Kürdüstana Şir Sarıma qarşı yürüşü |
| 1507-ci il, may | İsmailin Ərzincana səfəri, Əlaüddövlə Zülqədərlə mübarizəsi, Qeysəriyyədən keçib, Əlbistana gəlməsi, Diyarbəkirə yürüşü. |
| 1507/1508-ci ilin qışında | Xoya qayıtması və orada qışı keçirməsi |
| 1508-ci il, 21 oktyabr | İsmailin Bağdada daxil olması |
| 1508-ci il, 25 oktyabr | Kərbəlanı ziyarət etməsi, Nəcəfə gəlməsi |
| 1508/1509-cu ilin qışı | Şirazda olması |
| 1509-cu ilin yayı | İsmailin İsfahandan Həmədana getməsi, sonra Təbrizdən Xoya getməsi |
| 1509/1510-cu ilin qışı | İsmailin Kürü keçib Şirvana daxil olması, Bakı, Şabran və Dərbəndin təslim olması |
| 1510-cu ilin yazında | İsmailin Təbrizdə olması, yayın əvvəlində Xorasana hərəkət etməsi |
| 1510-cu il, 2 dekabr | Mərv yaxınlığında İsmailin Şeybani xanla vuruşması |

| | |
|---|---|
| 1510-cu il, 21 dekabr | İsmailin Herata gəlməsi |
| 1510-cu il, aprel | İsmailin Heratı tərk etməsi |
| 1511/1512-ci ilin qışı | Qum, Fərahən və Savədə ov etməsi, Qumda II Sultan Bayazid və Qansu Qurinin elçilərini qəbul etməsi |
| 1512-ci ilin yazı | İsmailin Sorluq yayağına getməsi |
| 1512-ci ilin yayın sonu | İsfahana getməsi, qışı orada keçirməsi |
| 1513-cü il, 3 mart | İsfahanda olması |
| 1513-cü ilin yazı | Oğlu Təhmasibin anadan olması, İsmailin Xorasana gəlməsi (Savə, Firuzgah, Soltan Meydan, Qalpuş, Məşhəd), Xorasanı özbəklərdən geri alması |
| 1513/14-cü ilin qışı | İsfahana qayıtması, qışı orada keçirməsi |
| 1514-cü il 23 avqust | Həmədana getməsi |
| 1514-cü il (920 h.) | Çaldıran döyüşü |
| 1515/1516-cı (921 h.) ilin qışı | İsmailin yayı Təbrizdə, yazı Ərdəbildə keçirməsi. Təbrizdə oğlu Əlqas Mirzənin anadan olması |
| 1516 (922 h.)-ci ilin yayı və qışı | Təbrizdə olması |
| 1517 (923 h.)-cü ilin yayı | Sorluqda olması, sonra Naxçıvana getməsi (Bir həftədə üç oğlu anadan olur: Sam Mirzə, Rüstəm Mirzə, Bəhram Mirzə) |
| 1517-ci ilin qışı | Naxçıvanda olması, Şirvanşah Şeyxşahın elçilərini qəbul etməsi |
| 1518 (924 h.) yayında | Sorluqda olması |
| 1518-ci il, 6 sentyabr | Quma gəlməsi |
| 1519 (925 h.) yayı | Qumdan İsfahana gəlməsi və orada qalması |

| | |
|---|---|
| 1519 (925 h.) qışı | Qumda olması |
| 1519 (925 h.) yazı | Üləngi Radiganda olması |
| 1520-ci ilin qışı (926 h.) | Sultaniyyədə olması |
| 1520/21-ci ilin qışı | İsfahanda olması |
| 1521-ci ilin yazı | Savəyə gəlməsi |
| (Həmədanda qızı Xanış xanımın Əmir Dübacla toy mərasimini keçirməsi, Marağada başqa qızının (?) Şirvanşah Şeyxşahın oğlu Sultan Xəlillə nigah mərasimini keçirməsi) Marağadan Təbrizə və sonra da Naxçıvana qışlağa getməsi. | |
| 1521/22-ci ilin qışı | Naxçıvanda qalması |
| 1522 (928 h.)-ci ilin yayı | Səhənddə və Ucanda olması |
| 1522-ci il, may | Ucanda qalması |
| 1522/23 (929 h.)-cü il qışın əvvəli | Təbrizə gəlməsi |
| 1523/24-cü ilin qışı | Naxçıvanda qalması |
| 1524-cü ilin yazı | Şirvana və Şəkiyə hərəkət etməsi, böyük ov təşkil etməsi, orada xəstələnməsi və Ərdəbilə qayıtması |
| 1524-cü il, 23 may | Təbrizdə vəfat etməsi. |

## 5.6. ƏRDƏBİL ŞEYXLƏRİ – SƏFƏVİLƏRİN AĞQOYUNLULARLA VƏ BİZANS KOMNEN SÜLALƏSİ İLƏ QOHUMLUQ MÜNASİBƏTLƏRİ



## 5.7. AZƏRBAYCAN SƏFƏVİLƏR DÖVLƏTİNİN BANİSİ Ş.İ.XƏTAİ HAQQINDA DEYİLƏN FİKİRLƏR

Şah İsmailin sarayı Azərbaycan türk ədəbiyyatının yaradıcı ocağı və bir akademiyası idi. Rəsmi Türk dövlətlərində misali yox ikən çevrəsindəki türkdilli şairlər Şah İsmailə "Türki-tacdar" (Taclı Türk) deyə xitab edərdi.

***Məhəmməd Əmin Rəsulzadə***

Məhəmməd Əmin Rəsulzadənin qurduğu Cümhuriyyət ordusu və müasir Azərbaycan Respublikasının ordusu Şah İsmail Səfəvinin varisidir.

***Əbülfəz Elçibəy***

Şah İsmail görkəmli sərkərdə, Azərbaycan şahı olmuşdur. Şah İsmail görkəmli dövlət xadimi, siyasi şəxsiyyət, Azərbaycanı birləşdirən insandır. Azərbaycanın qədim dövlətçiliyi Şah İsmailin adı ilə bağlıdır.

***Heydər Əliyev***

Şah İsmail Səfəvi Azərbaycan xalqının böyük oğlu, sərkərdəsi və şairidir.

***İlham Əliyev***

Xətai təxəllüslü hər hansı bir şeir oxunarkən məclisdə qadınlar ayağa qalxar, kişilər diz çökərdi.

***Abdülbaqi Gölpınarlı***

Biz azərbaycanlıların Şah İsmaillə fəxr etməyə, öyünməyə haqqımız var. Böyük şəxsiyyətdir, dünya şöhrətli siyasi xadim, dövlət başçısı və sərkərdə, böyük şair və görkəmli alimdir.

***Fuad Qasımzadə***

## 5.8. AXUND HACI SOLTANIN ŞAH İSMAİL XƏTAİYƏ İTHAF ETDİYİ ŞEİRLƏR

### XƏTAİDİR

Bu cahan mülkünü seyran eləyən Xətaidir,
Böyük Füzulini heyran eləyən Xətaidir.

Ömrünü dini-Mustafa yoluna həsr edib,
Əliyə canını qurban eləyən Xətaidir.

"Ənəlhəqq" elminə batində sahib olmaqla,
Nəsimi ruhunu əyan eləyən Xətaidir.

Kitab yazıb yaradan Kərimzadə Fərmanı
Tanıdıb aləmə Fərman eləyən Xətaidir.

Hər zaman düşməninə qarşı durub şir kimi,
Vətəni eşqinə ünvan eləyən Xətaidir.

Çaldıranda neçə məhbublərə meydan açıb,
Toplara sinəsin nişan eləyən Xətaidir.

Vətən oğullarının dar zamanda, bəd gündə,
Yerini səngərü meydan eləyən Xətaidir.

Gərçi İsmailə qoç qurban olub Minadə,
Özünü millətə qurban eləyən Xətaidir.

Ürəklər oynadan ali, ilahi hüsnü ilə,
Qönçənin bağrını xəndan eləyən Xətaidir.

Divan tutan hər hökmü ilə küfri-müşrikə,
Və həm də şeir ilə divan eləyən Xətaidir.

Həm az, kiçik, vəli həm ibrətamiz ömrü ilə,
Cümlə küffari müsəlman eləyən Xətaidir.

Sözündə və əməlində Məhəmmədi yaşadan,
Bizləri sahibi-Quran eləyən Xətaidir.

Onunla fəxr edən hər bir kəsi tutub yüksək,
Qaldırıb göylərə Soltan eləyən Xətaidir.[1]

**ŞAH XƏTAİ**
(gəraylı)

Azərbaycan hökmdarı,
Şah Xətai, Şah Xətai!
Adı könüllər şüarı,
Şah Xətai, Şah Xətai!

Qəhrəmanlar qəhrəmanı,
Həm cəng, həm söz pəhləvanı,
Vətəninin şöhrət-şanı,
Şah Xətai, Şah Xətai!

Şiri Xuda heyranıdır,
Şah Heydərin qurbanıdır.
Aləmlərin sultanıdır,
Şah Xətai, Şah Xətai!

Öz dilinə verdi qüvvət,
Ana vətən, bir də dövlət,
Üç şeyi etdi vəsiyyət,
Şah Xətai, Şah Xətai!

---

[1] Axund Hacı Soltan Hüseynqulu oğlu. “Məsumnamə”. Bakı, “Ozan”, 1999. səh. 47-48

Gəldi bahar Dəhnamədə,
Vəsf oldu yar Dəhnamədə,
Həqqə çatar Dəhnamədə,
Şah Xətai, Şah Xətai!

Ürfan onun ürfanıdır,
Ünvan onun ünvanıdır,
Divan onun divanıdır,
Şah Xətai, Şah Xətai!

Əmrinə olmadı hüdud,
Xaliqə eylədi sücud,
Yaratdı "vəhdəti-üqud",
Şah Xətai, Şah Xətai!

İndi geyib polad libas,
Gəl Qarabağı et xilas,
Cəngivi yox edən qiyas,
Şah Xətai, Şah Xətai!

Soltan sənin bir əsgərin,
Qəlbində alidir yerin,
Könlündə vardır əsərin,
Şah Xətai, Şah Xətai![1]

[1] Axund Hacı Soltan Hüseynqulu oğlu Əlizadə. "Duayi-Heydəri və ya Həzrəti-Əli (ə) zirvəsinə bir baxış". Bakı, "Tural-Ə" NPM, 2002. səh. 248

## NƏTİCƏ

Ədəbi irsi XVI əsrdə ictimai-mədəni qanunauyğunluqların qaçılmaz təzahürü kimi ortaya çıxmış Ş.İ.Xətai sələfləri və xələfləri içərisində yüksək eridusiyası ilə seçilən dahi şəxsiyyətdir. O, Azərbaycan tarixinin döyüşkən şiri olduğu qədər də Azərbaycan ədəbiyyatının da qayğıkeş himayəçisi idi. Heç şübhəsiz, bütün bunların formalaşmasında onun qail olduğu dinin və məzhəbin – İslamın və onun 12 imamçı şiəlik qolunu, eləcə də, bütövlükdə Əhli-beyt (ə.m) məhəbbətinin çəkisi böyük və yeri sarsılmazdır. Odur ki, şairin yaradıcılığını qətiyyən bu sahələrdən təcrid edilmiş surətdə öyrənmək olmaz. Bütün bunlar aşağıdakı nəticələri çıxarmağa imkan verir.

1. Ş.İ.Xətainin ədəbi irsinin böyük bir bölümü sırf dini mövzuda olan əsərlərdən ibarətdir. Belə ki, Ş.İ.Xətai divanındakı 418 qəzəldən 9-u Həzrəti-Mühəmmədə (s) həsr edilmiş nətdir. Şairin 12 qəsidəsindən biri Allah təalanın, üçü Əhli-beytin (ə.m), altısı isə Həzrəti-Əlinin (ə) eşqində yazılmış, 418 qəzəlindən 35-ə yaxını, qoşma, gəraylı və tuyğularının, eləcə də poemalarının önəmli bir bölümü Əhli-beyt (ə.m) məhəbbəti üzərində qurulmuşdur.
2. Şairin dünyəvi mövzulu əsərlərində də dini mündəricə geniş yer tutur. "Dəhnamə" poemasındakı "Allahü-Mühəmmədü-Əlidir" misralı mürəbbeni misal göstərmək olar.
3. Ş.İ.Xətai irsi bir çox məqamlarda yaşı əsrlərlə ölçülən Səfəvi ədəbiyyatının ayrılmaz, qopmaz bir parçası olaraq meydana çıxmışdır. Xətaiyə qədərki Səfəvi ədəbiyyatına müxtəsər nəzər salmaq bunu sübuta yerimək üçün kifayətdir.
4. Əhli-beyt (ə.m) faktoru şairə özünə təxəllüs götürməkdə də həlledici rol oynamışdır. Məsələn: Bu yöndə mübahisəli məsələlərin hələ də qalmasına baxmayaraq və biz də ehtimal və fərziyyələrimizin son söz olduğunu da təkid etməyərək vurğulamağı lazım bilirik ki, şair özünə təxəllüs seçərkən bu faktoru da əsaslı surətdə nəzərə almışdır.

5. Xətainin Əhli-beyt (ə.m) yönümlü əsərləri qədim və zəngin müsəlman mədəniyyətinin və şərq ədəbiyyatının XVI yüzilliyə qədərki dolğun və tutumlu analoji nümunələrinə söykənir.

6. Din böyüklərimizin Həzrəti-Mühəmmədin (s), Həzrəti Əlinin (ə), İmam Hüseynin (ə) və s. parlaq şəxsiyyətləri ömür yollarının, həyat və fəaliyyətlərinin başlıca məqamlarının tərənnümü şairin əsərlərində aparıcı yer tutur.

7. Xətai ədəbi irsində sırf şiəliklə bağlı Kərbəla vaqiəsi və İmam Hüseyn (ə) hərəkatının tərənnümü də öz geniş əksini tapmışdır.

8. Şair fürsət düşər-düşməz Əhli-beytin (ə.m) düşmənlərini (Yezid, Mərvan və s.) çox kəskin şəkildə ifşa edir.

9. Ş.İ.Xətai “Dəhnamə” və “Nəsihətnamə” epik və lirik poemalarında da ən müxtəlif münasibətlərlə özünün Əhli-beyt (ə.m) məhəbbətini dəfələrlə dilə gətirmişdir.

10. Şair etik-didaktik səpgidə yazdığı “Nəsihətnamə” məsnəvisində İslamla bağlı mənqəbəvi və əsatiri anlayışlar şiə məzhəbinin başlıca qaynağını təşkil edən “Kutubil-ərbəə”yə (dörd kitab) istinadlar özünü büruzə verir.

11. Əhli-beyt (ə.m) anlayışı şairin ədəbi irsində ən müxtəlif ideya-bədii keyfiyyətlər kəsb edir. Belə ki, şair Əhli-beytə (ə.m) bəslədiyi tükənməz eşqini yerinə görə ideya səviyyəsinə qaldırır, yerinə görə əlvan və rəngarəng bədii ifadə vasitələri – bənzətmə, istixarə, təlmih, mübaliğə, litota və s. ilə dilə gətirir, yerinə görə də fabola, süjet-kompazisiya kimi epik elementlərdən yararlanmaqla tərənnüm və təsvir edir.

12. XVI-XVII yüzilliklərin aşıq ədəbiyyatının yığcam araşdırması da göstərir ki, Azərbaycan aşıqları və el şairləri Xətaini özlərinə mürşid bilmişlər.

Bu deyilənlər də inkarolunmaz surətdə sübuta yetirir ki, Ş.İ.Xətainin ədəbi irsinin onun böyük şəxsiyyətinin ayrılmaz bir parçası olan peyğəmbərə (s) və Əhli-beytə (ə.m) məhəbbət motivləri ilə qırılmaz bağlılıq içində öyrənmək qaçılmazdır.

## ƏDƏBİYYAT

1. Qurani-Kərim. (Ərəb dilindən tərcümə edənlər: Z.M.Bünyadov, V.N.Məmmədəliyev). Bakı, 2005
2. Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı". (Azərbaycan dilinə tərcümə edən: Famil Şirvanov). Bakı, "Nurlar", 2017
3. Ayətullah-üzma Nasir Məkarim Şirazi. "Ya-Sin" surəsi. (tərcümə və təfsiri). (Mütərcim: M.Ağaverdiyev). Bakı, 1998
4. A.A.Bakıxanov. "Gülüstani-İrəm". Bakı, 2000
5. Abbas Tufarqanlı. "72 şeir". (tərtib edəni: Araz Dadaşzadə). Bakı, "Gənclik", 1973
6. Axund Hacı Soltan Hüseynqulu oğlu Əlizadə. "Azərbaycan dərvişləri və rövzəxanları". Bakı, "Boz Oğuz", "Nicat", 1995
7. Axund Hacı Kərbəlayi Soltan Hüseynqulu oğlu. "Şah İsmail Xətai" (xronoloji-tarixi məlumatlar). Bakı, "Ozan", 1997
8. Axund Hacı Soltan Hüseynqulu oğlu. "Xətaişünaslığa hədiyyə". Bakı, "Ozan", 1998
9. Axund Hacı Soltan Hüseynqulu oğlu. "Məsumnamə". Bakı, "Ozan", 1999
10. Axund Hacı Soltan Hüseynqulu oğlu. "Xətai və Füzuli". Bakı, "Ozan", 2000
11. Axund Hacı Soltan Hüseynqulu oğlu Əlizadə. "Duayi-Heydəri və ya Həzrəti-Əli (ə) zirvəsinə bir baxış". Bakı, "Tural-Ə" NPM, 2002
12. Anar. "Şairin zəfəri" // "Şah İsmail Xətai". (Məqalələr toplusu). Bakı, "Elm", 1988
13. Araz Dadaşzadə. "Ön söz" // Abbas Tufarqanlı. "72 şeir". (tərtib edəni: Araz Dadaşzadə). Bakı, "Gənclik", 1973
14. Aşıq Ələsgər. "Seçilmiş əsərləri". Şeirlər. Bakı, "Yazıçı", 1988
15. Aşıq Ələsgər. "Gözüm bir alagöz xanıma düşdü". Bakı, "Yazıçı", 1993
16. Aşıq Xındı Məmməd. "Meydanda mərdi-mərdana". Bakı, "Borçalı", 2001

